*Bu kitab "**Mehdi Hüseyn.** Əsərləri. On cilddə.
I, VII cildlər" (Bakı Azərnəşr, 1966, 1976) nəşrləri əsasında
tərtib edilib təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni və
ön sözün müəllifi: **Zivər Hüseynova**

**894.3613 – dc 21**
**AZE**

**Mehdi Hüseyn.**
**Seçilmiş əsərləri.** Üç cilddə. I cild. Bakı, "AVRASİYA PRESS", 2005, 320 səh.

XX əsr Azərbaycan ədəbiyyatının tanınmış nümayəndələrindən biri, yazıçı, dramaturq, ədəbiyyat nəzəriyyəçisi Mehdi Hüseynin bu kitabında ədibin hekayələri və "Yeraltı çaylar dənizə axır" romanı cəmlənmişdir. Yazıçının hekayələrində yaddaqalan insan obrazlarının, təsvir olunan hadisələrin ruhunda öz zamanının izləri açıq-aydın görünməkdədir. "Yeraltı çaylar dənizə axır" romanının qəhrəmanları öz mərdliyinə, iradəsinə, əqidəsinə, böyük amallar uğrunda mübarizə əzminə görə seçilirlər.

**ISBN-9952-421-13-1**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# ÖN SÖZ

Mehdi Əli oğlu Hüseynov (Mehdi Hüseyn) 1909-cu ildə Qazax rayonunun II Şıxlı kəndində ziyalı ailəsində anadan olmuşdur. 1929-cu ildə Azərbaycan Dövlət Universitetinin tarix fakültəsini bitirmişdir. 1938-ci ildə Moskvada Dövlət Kinematoqrafiya İnstitutunun nəzdində akademiya tipli kinossenariçilər kursunu bitirmişdir.

Mehdi Hüseyn əlli altı illik ömrünün qırx ilini XX əsr Azərbaycan ədəbiyyatının təşəkkülü və inkişafına həsr etmişdir. O, müxtəlif illərdə Azərbaycan Yazıçılar İttifaqının birinci katibi, Sovet Yazıçılar İttifaqının katibi kimi məsul vəzifələrdə çalışmışdır. Xalq yazıçısı Mehdi Hüseyn keçmiş SSRİ və Azərbaycan Ali Sovetlərinə deputat seçilmişdir. Böyük yazıçı, dövlət adamı, ictimai-siyasi xadim olan Mehdi Hüseyn xalqımızın çoxəsrlik ədəbiyyatını və zəngin mədəniyyətini dünyanın bir sıra ölkələrində layiqincə təmsil etmişdir.

Mehdi Hüseyn geniş erudisiyaya, ensiklopedik biliyə, güclü məntiqə, dərin müşahidə qabiliyyətinə malik böyük sənətkar idi. O, bütün varlığı ilə həyat hadisələrinə müdaxilə edən, böyük fikir, arzu və amallar uğrunda mübarizə aparan ehtiraslı, mürəkkəb səciyyəli, yenilməz insan surəti yaratmış mahir sənətkar idi. Yazıçının çoxillik ədəbi yaradıcılığı xalqının tarixi, taleyi və xoş gələcəyi ilə bağlı olmuşdur. Onda Vətən eşqi, vətənpərvərlik duyğuları daha güclü, daha ibrətamizdir. Heç şübhəsiz, kamil nəzəri biliyi, yüksək ziyalılığı ilə sayılan və seçilən Mehdi Hüseyn həmişə ədəbi mübarizələrin mərkəzində dayanmış, məfkurə saflığı uğrunda yalnız nasir kimi deyil, həm də mübariz bir nəzəriyyəçi kimi vuruşan geniş əhatəli sənətkardır. Yazıçının nasir, dramaturq və münəqqid kimi fəaliyyəti, ədəbiyyatımızın problemləri ilə bağlı mühakimələr yürütməsi həmişə böyük marağa səbəb olmuşdur.

Mehdi Hüseyn yaradıcılığa müxbir yazıları ilə başlamışdır. Bir-birinin ardınca müxtəlif mövzularda bir sıra məqalələr yazmış, çox keçmədən klassik irsə münasibət, yeni insanın təsviri, yeni mövzular aləmi ilə bağlı geniş müzakirələrdə çıxış etmişdir. Bu məqalələrdə uğurlar qazanmaqla yanaşı, müəllif tərəfindən bəzi yanlış mühakimələr də irəli sürülmüşdür.

Mehdi Hüseyn otuzuncu illərdən başlayaraq bir nasir kimi bədii əsərlərlə çıxış etmişdir. O, ilk olaraq 1930-cu ildə “Xavər” və “Bahar suları” adlı hekayələrini oxuculara təqdim etmişdir. Mehdi Hüseyn 1931-1937-ci

illərdə daha iri həcmli əsərlər yazmağa başlamış, bu sıradan üç hissədən ibarət olan və Azərbaycanda baş verən vətəndaş müharibəsinə həsr edilmiş, "Daşqın" romanını çap etdirmiş, kollektivləşmə dövründən bəhs edən "Tərlan" romanını yazmışdır.

İxtisasca tarixçi olan Mehdi Hüseyn bədii yaradıcılığında tarixi mövzulara zaman-zaman müraciət etmiş, bir sıra qiymətli əsərlər yazmışdır. Bu baxımdan yazıçının 1940-1941-ci illərdə Azərbaycan şairi Nizami Gəncəvinin həyatından bəhs edən "Nizami" dramı böyük marağa səbəb olmuşdur. Başqa əsərlərində olduğu kimi, bu dramda da tarixə müasirlik nöqteyi-nəzərindən yanaşmışdır. Əsərdə Nizaminin Ana Vətənə, onun füsunkar təbiətinə vurğunluğu qələmə alınmışdır.

Mehdi Hüseyn "Nizami" dramından sonra 1943-cü ildə "Odlu qılınc" hekayəsini yazmış, sonra bu mövzunu inkişaf etdirərək Azərbaycan tarixinin mübarizəli səhifələrini özündə əks etdirən "Cavanşir" dramını qələmə almışdır.Yazıçının qarşıya qoyduğu məqsəd Cavanşirin timsalında xalqımızın qəlbində vətənpərvərlik duyğularını alovlandırmaq, onu uğurlara, qələbələrə səsləmək olmuşdur.

Mehdi Hüseynin heç şübhəsiz, şah əsərlərindən biri 1947-48-ci illərdə yazdığı "Abşeron" romanıdır. Qırxdan çox xarici ölkənin dilinə tərcümə edilmiş bu əsər XIX-XX əsrlərdə Azərbaycan neft sənayesinin inkişafından bəhs edir. "Abşeron" romanı həm bədii, həm siyasi, həm də mənəviyyatca, məzmun və mahiyyətinə görə böyük uğurlar qazanan kamil, bitkin bir əsərdir və ona görə də minlərlə oxucuların hüsn-rəğbətini qazanmışdır.

Mehdi Hüseyn "Abşeron" romanından sonra neftçilərin həyatından bəhs edən "Qara daşlar" romanını oxuculara təqdim etmişdir. Bu roman – gərgin konfliktlər və zəngin xarakterlər romanıdır. Romanda insan təbiətinin bir-birinə zidd olan iki qütbü qarşı-qarşıya dayanmışdır. Mehdi Hüseyn özünə xas olan mahiranə ustalıqla, təbiətin kortəbii qüvvələrilə insanın çarpışmasını, gərgin mübarizə aparmasını, romanın qəhrəmanlarının bir tərəfdən təbiətlə, digər tərəfdən ictimai eybəcərliklərlə barışmaz mövqedə durmasını əks etdirən əsərdə insanların qarşılıqlı əlaqəsi, məhəbbət səhnələri, ailə və məişət məsələləri, onların ictimai həyatlarının tərkib hissəsi kimi tərənnüm edilmişdir.

Mehdi Hüseyn yaradıcılığının son anına qədər müsbət amal və ideya uğrunda vuruşan, ən çətin şəraitdə, gərgin anlarda belə sarsılmayan mərdlik və mətanət rəmzi kimi iradəli, əqidəli insanları əsərlərinə qəhrəman seçmişdir. Onun qəhrəmanları insanların səadəti və xoş gələcəyi uğrunda

özlərini məşələ çevirirlər. Bu baxımdan yazıçının "Alov" pyesi və son romanı olan "Yeraltı çaylar dənizə axır" buna misal ola bilər.

Mehdi Hüseynin "Abşeron", "Qara daşlar", "Alov", "Nizami", "Səhər", "Cavanşir", "Yeraltı çaylar dənizə axır" və başqa əsərləri ədəbiyyatımızın qızıl fonduna daxil olmuşdur.

Mehdi Hüseynin çoxcəhətli yaradıcılığında tənqidi fikir, Azərbaycan ədəbiyyatının inkişafına həsr edilmişdir. Zaman-zaman irəli sürülən və yaradıcılıq münaqişələrilə bağlı olan bu fikirlər həm ədibin yaradıcılığında, həm də Azərbaycan ədəbiyyatında böyük əhəmiyyət kəsb etmişdir. Yazıçının tənqidi də bədii yaradıcılığı kimi həm əhatə etdiyi mövzu, həm də janrları baxımından rəngarəngdir, çoxçalarlıdır. Onun tənqidi əsərləri içərisində ədəbiyyat tarixinə, müasir ədəbi problemlərə, teatr tənqidinə, aktyor sənətinə dair mülahizələrə, dünya ədəbiyyatı haqqında çox qiymətli fikirlərə rast gəlmək olur.

Mehdi Hüseyn Azərbaycan ədəbiyyatı və ictimai fikir tarixində əvəzsiz xidmətlər göstərərək, ümumxalq məhəbbəti qazanmışdır

***Zivər Hüseynova***

# QAN İNTİQAMI

## I

Onun arvadı, sağ tərəfdəki böyük taxtın üstündə oturub, namaz qılan ərinin üzünə baxırdı. Süleyman kişi tez-tez əyilib qalxır, dodaqlarını yavaşcadan qımıldadıb nə isə oxuyurdu...

Bir neçə dəqiqədən sonra namazını qurtardı. Arxalığının döşünü düymələyib qabağındakı kiçik, bəzəkli xalçanı götürdü.

O, arvadı ilə mühüm bir iş barəsində danışmaq istəyirdi. Bir an düşündü, sonra gözlərini qarının üzünə dikdi, titrək bir səslə:

– Əyə! – dedi. – Bizim oğlan haraya getdi? Bu gün gərək onunla danışaydım, bu qədər uzatmağın nə faydası var?

– Hər gün özünə deyirəm – çiynini çəkir, özünüz bilərsiniz deyir.

– Yox, yox! Qızın vaxtı keçir, sən də ki, qocalıb gücdən düşürsən, daha gözləmək əl verərmi? Mən o gün özünə demək istədim; ancaq məni hədələdi. Oğlun yaman acıqlıdır. Eh! Bu günün cavanlarını da dindirmək olmur... – deyə Süleyman kişi əvvəlcə arvadın üzünə, sonra da yerə baxdı.

Bu anda qapı açıldı; gələn Əhməddi. O, əlindəki ağacı qapının bir bucağına atdı, sol tərəfdəki taxtın üstündə oturdu.

Süleyman kişi onunla açıq danışmağa hazırlaşdı. Əhməd, ata-anası ilə çox pis rəftar edirdi. Ancaq indi onun üzü gülürdü. Bu, qocaların xoşuna gəldi. Onlar sevindilər. Süleyman kişi:

– Oğlum! – dedi, – biz qocalmışıq, bu gün sabah ölüb gedəcəyik... Sən də böyüyüb yekə oğlan olubsan, özünün də gözəl-göyçək nişanlın var, gəl sən bu qoca atanın sözünə qulaq as, bu həftə toy tədarükünü görüb səni evləndirək.

Əhməd qızardı. Gülümsünən dodaqları titrədi, başını aşağı dikib, bir müddət dinməz-söyləməz dayandı, cavab vermədi. Anası da yerindən qımıldandı.

– Niyə utanırsan? Atana cavab versənə!.. – dedi.

Əhməd başqa dəliqanlılar kimi hazırcavab deyildi. O, deməyə bir söz tapmayıb, qarşısındakı iydə çubuğunu götürdü, əlində oynatmağa başladı.

Süleyman kişi isə oğlunun cavabını səbirsizliklə gözləyirdi.

Əhməd başını yerdən qaldırmayıb:

– Ata! Mən hələ evlənmək istəmirəm, – dedi.

Qocanın gözləri doldu, dodaqları titrədi, bu cavabdan heç razı qalmadı.

– Oğul! – dedi. – İyirmi bir yaşına çatmısan, bundan sonra evlənməsən daha nə vaxt evlənəcəksən? Biz də bir zaman sənin kimi idik. Sən bizim heç birimizə oxşamırsan. Özün gözəl bilirsən ki, evlənməkdən məqsəd dolanacaq düzəltməkdir. Sən də xalq kimi oğul-uşaq sahibi olmaq istəmirsənmi?

Əhməd gəncliyinin ən böhranlı bir dövrünü keçirirdi. Savadı az olsa da, düşüncəsi, fikri o qədər məhdud deyildi. O ata-anasının yanında birdən-birə açıq danışa bilməzdi. O, Süleyman kişinin sözlərini dinləməsə də, hər halda ona yaxşı, müsbət bir cavab verməyə məcburdu. Əhməd çox səbirsiz bir halda üzünə baxan qocalara:

– Bir sözüm yoxdur, – dedi. – Mən sizin məsləhətinizə razıyam...

Qocalar sevindilər. Bu cavab onlara ürək-dirək verdi.

* * *

Tutqun bir yaz gecəsi idi. Qara buludlar göyün üzünü örtüb ayın işığını gizləmişdi. Araba yolu kənarındakı biçənəklər, hərdənbir əsən xəfif külək qarşısında hərəkətə gəlib dalğalandıqca bir dərya tərpənişini andırırdı.

Kəndin aşağısı sakitdi, ara-sıra qaraltılara hürən itlərdən başqa heç kim ayıq deyildi. Abdulla Qurban oğlunun koması bu məhəllədə idi.

Koma yerdən güclə seçilirdi.

Bu anda iki qaraltı göründü. Onlar atlarını kənarda saxlayıb, yoldaşlarını ətrafa dağıtdılar: komaya doğru irəliləyərək, otluqda gizləndilər və o tərəf, bu tərəfə göz gəzdirib sürünməyə başladılar. Onlardan biri yuxarı məhəllənin məşhur dövlətlisi Şərif oğlu Həmzə idi. O, Abdulla Qurban oğlunun Əhmədə nişanlanmış, qızını götürüb qaçmağa gəlmişdi.

Qapının sol tərəfində bağlanmış it yatırdı. Onlar gözlərini bərəldib komaya baxır və gizlin cığırla qapıya yaxınlaşırdılar.

İçəridəkilər yatmışdı. Həmzə, xəncərini qınından çıxarıb hazırladı. Səssiz addımlarla içəri girdi.

Ehtiyatla yeriyib, qızı aramağa başladı. Əlindəki yaylıqla onun ağzını sarımağa hazırlaşdı.

Daxmadakı sükut hələ də pozulmamışdı. Yalnız yuxuda olanların hənirtisi eşidilirdi.

İçəri girənlər o tərəf, bu tərəfə vurnuxur, qızı tapmağa çalışırdılar.

Nazlı həmişəki kimi rahatca uyumuşdu.

Bu anda uzaqdan atın kişnəməsi eşidildi. İçəri girənlər səksəndilər. Abdulla kişilə arvadı oyandı. Çox keçmədi. İki yoldaş Nazlını tutub ağzını bərk-bərk sarıdı. Qoca özünü Həmzənin üstünə atdı, ancaq onun əlində parlayan uzun xəncərdən qorxub geri çəkildi.

Həmzə pis vəziyyət törəyəcəyini düşünüb, hər iki qocanı, bir də yenicə oyanan uşaqları tez komanın ortasındakı dirəyə sarıtdı və cəld addımlarla dişarı çıxıb atlarını yanındakı yoldaşlarına tərəf yüyürdü.

Qapıdakı it hürməyə başladı. Nazlı, Həmzənin qucağında çapalayaraq əlini-ayağını oynatdısa da, bir nəticə çıxmadı. Onu atın üstünə bağlayıb apardılar. Nazlının fəryadını heç kəs eşitmədi.

Bir azdan sonra kənddə tüfəng atmağa başladılar. Atlılar buna heç fikir verməyib dərə yolu ilə irəlilədilər, kənddən uzaqlaşıb meşəyə doğru getdilər.

* * *

Onlar meşədə düşüb dincəlirdilər. Atlarını ayrı-ayrı bağlayıb hərəsi bir tərəfdə uzanmışdı. Meşədə dərin bir sükut vardı. Uzaqdan gələn qatarın fit səsindən başqa bir şey eşidilmirdi.

Həmzə çox şaddı. Nazlını isə kədər boğurdu. O, həyatında belə bir çətinliyə rast gəlməmişdi. O, bu zülmün qarşısında tab gətirə bilməyəcəkdi; o, qadın idi, Həmzənin iti xəncəri, qanlı silahı qarşısında özünü müdafiə edə bilməzdi. Bunu çox yaxşı düşündüyü üçün də bir iş görə bilməzdi. İndi o, qanlı göz yaşı axıdır, gözlərini yerə dikib, tez-tez köksünü ötürürdü.

Səhər olurdu. Günəş, dağın arxasından kəsik şüalarını yerə səpirdi. Böyük meşənin üzərini bürüyən qara buludlar parçalanır, göy üzü işıqlanırdı.

Nazlının yanaqlarında solğun bir yarpaq pərişanlığı vardı. O, özünü qaçırdan və səadətinə mane olan Həmzəyə boyun əydi. Bu hadisəyə qarşı qəlbində yalnız bir kin saxladı, yalnız bir intiqam duydu.

Atlılar çox yatmadılar, hazırlaşıb yaxın kəndə yola düşdülər.

* * *

Bu xəbər bütün kəndə yayıldı. Qızın qaçırılması Əhmədi çox kədərləndirirdi. O sabahkı toy hazırlığı əvəzinə şikayətə getmək üçün atı yəhərləməyə başladı. Süleyman kişiyə müraciətlə:

– Ata, – dedi, – mən qabaqcadan bilirdim ki, o nəsildən bizə xeyir gəlməyib, onların dostluğu üzdəndir. Sən məni inandırdın... Mən bu hayıfı onda qoymayacağam. Bu gün qəzaya gedib naçalniki görəcəyəm, – deyə Əhməd yəhərin quşqunlarını bağlayıb qurtardı.

– Oğlum! Keçənə güzəşt deyərlər. Şikayətdən heç bir şey çıxmaz. Onlara Məhəmmədli deyərlər. Oxuyanları, qulluq eləyənləri, divan yanında hörməti olanları çoxdur, bizim şikayətimizə kim qulaq asacaq?

– Bəs divan nə üçündür? Mən qubernatoru görərəm, o ki, baxar...

Əhməd atasının sözünü dinləmədi. Atı minib qəzaya yola düşdü.

* * *

Abdulla kişi qızı qaçırılandan sonra tərəddüd içində qalmışdı. O, kəndlilər arasında davam edən kin və ədavətin şiddətlənəcəyini indidən görməyə bilməzdi.

– Kasıbların günü belə gəlib, belə də gedəcək. Məhəmmədəlinin ağalığı bu gün sabahlıq deyil ha?.. – deyə Abdulla kişi öz-özünə şikayətlənirdi. Onun heç bir çarəsi qalmamışdı. Əlindən nə gələrdi?

O, qonşularından at alıb şikayətə getməli idi. Ancaq onun sözünə kim qulaq asacaqdı? Rüşvət vermək lazımdır. Bunun üçün kimdən pul alacaqdı?

Hər tərəfdən əli üzülmüş Abdulla kişi, arvadını çağırdı, qəmgin bir səslə:

– Qızın xalçasını buraya gətir! – dedi.

Arvadın rəngi ağardı. Bu əmri anlamamış kimi soruşdu:

– Xalçanı neyləyəcəksən?

– Rüşvət aparacağam... – dedi, – bu dünyada rüşvətsiz heç bir iş görmək olmaz, ay arvad...

Qoca Abdulla yolda Əhmədə rast gəldi. Onlar şəhərə yetişər-yetişməz atlarını bir yerdə bağlayıb naçalnikin dəftərxanasına yollandılar. Dəftərxana qarşısında bir yığın kəndli vardı.

Naçalnikin hüzuruna getmək üçün bir müddət gözləmək lazım idi.

İçəridə isə naçalnikdən başqa heç kəs yox idi. Sol tərəfdə qoyulmuş masanın üstündəki kağızlar darmadağın olmuşdu. Naçalnik yumşaq kürsüdə oturub, nə isə yazırdı. Bəzəkli divardan asılmış telefon drınq... drınq... səslənirdi. Naçalnik, trubkanı götürüb cavab verdikdən sonra, masanın arxasındakı zəngi basdı, əvvəlki qayda ilə yerinə oturdu. Naçalnik əlindəki kağızı içəri girən xidmətçiyə uzadıb:

– Bunu poçta apar! – dedi.

Xidmətçiyə verilən kağız teleqram idi. Bəzi kəndlərdə bəylər və mülkədarlar yerləri öz əllərinə keçirib, kəndliləri əvvəlkindən daha artıq incitdiklərinə görə bir neçə dairədə kəndli üsyanı qalxmışdı.

Naçalnik kağızda: "üsyanı – talanı yatırmaq üçün bir dəstə qoşun göndərin!" – deyə bir sətir yazmışdı. O, əlindəki papirosu alışdıraraq havanı dumanlatdı və bir müddət qabağına tökülmüş ərizələri yoxlayıb bağırdı:

– Süleyman Məhəmməd oğlu kimdir?

Qoca bir kişi irəli girdi. Əlləri əsə-əsə naçalnikin üzünə baxdı.

Naçalnik soruşdu:

– A kişi! Bu ərizəni kim yazmışdır?

O, bu sualın cavabını verməkdən acizdi. Öz-özünə: "Bunu nə üçün soruşur?" – deyə fikirləşdi, birdən cavab verdi:

– Süleyman əfəndi yazıb. Başına dönüm, ağa! Bir təhər elə, – deyə ona yalvarmağa başladı.

Ərizəni yazan əski müəllim idi. Naçalnikin yanında az-çox hörməti vardı.

Naçalnik kağızın o biri üzünə bu sözü yazdı: "udovletvorit"[1].

Ərizə verən adam şəhərin kənarında bir evi kirayə götürüb orada yerləşmək istəyirdi. Özü kərpic zavodunda fəhləlik edirdi. Ailəsi bir sahibkarın zirzəmisində yaşadığından uşaqlarının hamısı yel azarına tutulmuşdu. Bir neçə gün əvvəl pristava müraciət edib, ondan müsbət cavab almadığına görə, naçalnikin bu qərarı onu çox sevindirirdi. Ərizəni götürüb sevinə-sevinə düz pristavın üstünə getdi.

Dişarıda isə qalmaqal qopmuşdu. Kəndlilərin çoxusu torpaq işi üçün gəlmişdi.

İndi Əhmədlə Abdulla kişinin növbəsi yetişirdi. Əhməd uzun xəncərinin dəstəyindən tutub, cürətlə içəri girdi və naçalnikin qarşısında dayandı:

---

[1] Təmin edilsin.

– Hə, sən nə istəyirsən? – deyə naçalnik soruşdu.

O, öz başına gələn hadisəni qəmgin bir səslə danışdı və bu haqsızlığın qarşısını almağı rica etdi. Naçalnik bu işdən bir o qədər baş açmadı. Qoca Abdulla kişi içəri girən kimi onu danışdırdı və əhvalatı bir qədər anlayan kimi oldu.

– Mən bu işi suda verərəm! – dedi, – ancaq bir ərizə yazdırmalısınız.

Naçalnik, o qədər də sərt xasiyyətli deyildi. Əksinə onda bir soyuqqanlılıq vardı. Hər bir işə etinasız baxmaqdan həzz alırdı. Çox zaman şikayətə gəlmiş adamı dinləmək əvəzinə, ağzındakı papirosu dumanladaraq halqalarını sayardı. O, bütün bu hərəkətilə əski rus zabitlərini xatırladırdı.

Bundan başqa hər şeydən çox ona ruh verən, onun sevinc və nəşəsini artıran bir şey də vardı: rüşvət!

Abdulla kişi gətirdiyi təzə xalçanı torbadan çıxaranda, naçalnikin dodağı titrədi, gözləri parıldadı.

Bu zaman naçalnik sözünü dəyişdi:

– Hə! – dedi, – mən bu işi tezliklə yoxlaram. Ümidvaram ki, düzələ.

Əhmədlə Abdulla kişi dəftərxanadan çıxdı. Naçalnik isə xalçanı masa arxasında gizlətdi. Dişarıda gurultu yenə davam edirdi. Kəndlilərin həyəcanı artırdı.

Naçalnikin əmrinə görə pristavın göndərdiyi strajniklər, bu həyəcanı boğurdular.

Əhmədlə Abdulla kişi isə ağır addımlarla, atlarını bağladıqları yerə gedirdilər.

## II

Bu hadisədən bir həftə sonra, Nazlı ilə Həmzəni məhkəməyə çağırmışdılar. Əhmədlə atası da orda hazırdı. Hakim işin məzmunu ilə tanış olub, Həmzəni müqəssir gördü. Əhmədi danışdırmadı. Ancaq Nazlının kimə getməyə razı olduğunu bilmək istəyirdi.

– Özün bil... Mən atanı... Əhmədi bir gülləyə qurban eləyəcəyəm – deyə Həmzə onu hədələmişdi. Bu sözdən sonra Nazlı öz razılığını bildirəcək, iki adamı ölümə verməyə razı olmayacaqdı. Onun qoca, namuslu atası, öz sevgili qızına dərin bir ümid bəsləyirdi.

– Nazlı Abdulla qızı! – deyə məhkəmə sədri onu çağırdıqda, Nazlı atasının yanında yox, gizli danışdırılmasını rica etdi. Atasını, Əhmədi və başqa şahidləri dişarı çıxardılar. Nazlı: “Həmzəyə gedirəm!” dedi.

Bir azdan sonra hər ikisi əlləri-qoynunda içəri girdi.

Əhmədlə Abdulla kişiyə Nazlının cavabını söylədilər. Qızının bu hərəkəti qocanı çıxılmaz vəziyyətə saldı.

Əhməd isə qızardı, son dərəcə həyəcanlı bir hal aldı. Onun qəlbində bütün bu haqsızlığa qarşı bir üsyan alovlandı.

Abdulla kişi:

– Mən qızıma çəkdiyim əməyi istəyirəm. Onu mən bu yaşa çatdırmışam... – dedi.

Əhmədin Nazlıya etibarı çoxdu; o, Nazlının namuslu olmasına inanırdı. Ancaq Həmzənin işlədiyi qəbahətdən xəbərsizdi.

O, dinməz-söyləməz çıxdı, atını minərək Abdulla kişi ilə birlikdə kəndə yola düşdü.

Məhkəmə binası qarşısında duranlar arasında mübahisə davam edirdi. Çıxarılan qərardan razı qalan çox az idi.

* * *

Abdulla kişi:

– Əhməd! – deyirdi, – mən özüm dünya görmüş adamam. İndiyədək bir dəfə də görməmişəm ki, divanlarımız işi haqqına kəssinlər. Hamı bilir ki, Məhəmmədlilər bizim kəndin dövlətli, hörmətli, qüvvətli bir məhəlləsidir. Görünür ki, divan adamlarımız onlardan qorxurlar. Mən bu hökumətdən çox ümid gözləyirdim. Ancaq belə hökumət camaatı yola apara bilməz. Bunlar bu gün-sabahlıqdır...

– A kişi! Qız götürüb qaçmaqdan pis adət yoxdur; ancaq bu işdə təqsiri olana cəza veriləsi yerdə onun tərəfi saxlanır. Belə insafsız divana mən nə deyim? Biz dedik. Nikolay yıxıldı, kasıb-kusubun canı qurtuldu. Amma bu Nikolaydan da yaman oldu ki... – deyə Əhməd ona cavab verdi.

Əhməd özü də çoxdan tapdalanmış bir qızı ala bilməzdi. Alsa, o dəqiqə qohum-qardaşı arasında dedi-qodu qalxacaqdı. Onu namussuz adlandırıb hər yerdə abırdan salacaqdılar.

Günorta zamanı idi. Hava istiləşirdi. Yolun alt yanında parlayan Kür çayı, göydə uçuşan çəhrayı buludlar, böyük düzdə göyərən taxıllar, hər şey hərəkətdə idi.

– Bu belə getməz canım! Nikolayın yoğun boyunlu uryadniklərindən canımız yeni qurtarmışdı. İndi də kənd bəylərinin caynağına keçmişik... – deyə Abdulla kişi əlavə etdi.

Onlar kəndə yaxınlaşır, yorğun atları yavaş-yavaş sürürdülər.

Bu aralıq sahildə üç-dörd qaraltı göründü. Onları uzaqdan tanımaq olmazdı. Ancaq hər günkü kimi bu gün də səhər tezdən ta axşama qədər bir dəqiqə belə istirahət bilmədən əlləşən bu adamları kəndin uşaqları da tanıyırdılar. Onlar gəmiçilər idi.

Abdulla kişi:

– Əhməd! Bu gün Qarayazıya getsək, yaxşı olardı. Qoyunları yoxlayıb gələrdik, – dedi.

Əhməd razılığını bildirib əlavə etdi:

– Getsək, bir əmlik də kəsərlər! – dedi.

Onlar Kür sahilinə enərək atlarını gəmiyə çəkdilər.

Gəmi balaca idi. Hər tərəfi qovaq taxtalarından qayrılmış, üzəri də yaşıl rənglə rənglənmişdi. Gəmiçi cavan bir oğlandı. Gözlərində dərin bir səmimiyyət vardı. Bu günkü aclıq sanki ona təsir etməmişdi. O, öz atasından yalnız bu gəmini irs almışdı. Ev yox, yer yox, çörək yoxdu.

Hər zaman belə olur: yoxsulun həyatı onun qolunun qüvvətindən asılıdır. Cavan gəmiçi həyata olduqca nikbin bir gözlə baxırdı.

Müştərilərini görərkən sevinmiş kimi:

– Abdulla dayı! Uğurlar olsun, – dedi. – Haraya gedirsiniz.

– Sürüyə baxmaq istəyirik, oğlum! – deyə qoca istər-istəməz qımışdı.

Əhmədlə Abdulla kişi atlarının cilovundan yapışaraq o biri sahilə tərəf üzən gəminin altında dalğalanan Kürü seyr edirdilər. Kür bu gün sanki bir şeydən narazı qalmış kimi əsəbi dalğalarını sahildəki daşlara çırpır, gəmini o biri sahilə doğru sürüyürdü.

Onlar sahilə çıxanda atlarını mindilər və meşənin arasındakı cığırla getdilər. Qoyun sürüsünü tapa bilmədilər. Yenidən gəmi ilə keçib kəndə gəldilər.

Əhmədlinin qocaları, cavanları bu iki atlını yerə düşməmişdən qarşıladılar.

Abdulla kişi müztərib və qəmgin bir səslə:

– Qızı Həmzəyə verdilər, – dedi.

Bu xəbər hamını kədərləndirdi.

Əhməd o qədər qəmgindi ki, şəhərlə kənd arasındakı uzun yolu nə cür gəldiyini də bilmirdi.

Əhmədlə Abdulla kişi evə getdilər, bu qəmli xəbəri qonşularına da söylədilər.

* * *

Məhəmmədlidə öz qoçaqlığı ilə hörmət qazanmış Rəsul Hacı oğlu:

– Mən onları qırıb tükətməyi öz öhdəmə alıram, – dedi.

Bu sözdən sonra çöldə Əhmədli çobanlarını, araba yolunda odunçuları, əkin yerlərində qoca kişiləri incitməyə başladı. Ancaq əhmədlilər də o qədər qüvvəsiz deyildi. Onların da içində kəndlilərin yaxşı tanıdığı dəliqanlılar vardı. Süleyman Həsən oğlu bir az oxuyub-yazmağı bacarırdı. O, bir gün Rəsula belə bir kağız göndərdi:

"*Rəsul!*

*Biz əvvəlləri dost və qardaş kimi dolanırdıq. Əhmədli və Məhəmmədli kimi iki böyük nəslin düşmənçiliyi çox pis nəticə verər. Siz özünüzü kəndin ağası hesab edib, bizim çoban-quzuçuları, nökərləri və hətta bəzi cavanlarımızı döyüb, bizi camaat içində rüsvay eləyibsiniz. Mən, səni xəbərdar edirəm və çox təvəqqə edirəm ki, ağalığınıza hüdud qoyasınız, axırı çox pis olar.*

*Süleyman*"

Rəsul kağızı alıb məhəllədəki mollaya oxutdu. Məzmunu ilə tanış oldu. Ancaq Süleymanın təklifindən heç razı qalmadı. Bir qədər düşündü; Süleymanla əvvəlki dostluğunu xatırladı. Bu işdən vaz keçib heç kimi incitməməyi qərara aldı.

* * *

Bir neçə il əvvəl qulluq üçün şəhərə getmiş Şamil Qasım oğlu bu günlərdə kəndə qayıtdığına görə onun böyük qardaşı Cavad, ziyafət verib Əhmədli cavanlarını qonaq çağırmışdı.

Əhmədlə Süleyman da burada idi. Qonaqlıq o qədər də sadə deyildi. Otuz nəfərə qədər cavan, kefə məşğul olmuşdu.

Birdən dişarıda bağırtı qopdu. Onlar əvvəlcə buna əhəmiyyət vermədilər. Səs birdən kəsildi. Bir neçə dəqiqə də keçdi. Sonra daha müdhiş bir bağırtı qopdu.

Süleyman bu səsi eşidərkən Məhəmmədin səsini tanıdı və tüfəngini götürüb dişarı çıxdı. O, araba yolunun altındakı ətrafı qalın otlarla

çulğalanmış kiçik cığırla gedib söyüşənlərə yaxınlaşdı, bütün qüvvəsini toplayıb onların hərəsini bir tərəfə itələdi:

– Nə olub? Nə üçün bir-birinizə yaman deyirsiniz? – deyə soruşdu.

Süleyman onların cavabından anladı ki, Məhəmmədlidən iki nəfər adam, yolda Əhmədli çobanını döyüb yapıncısını alıblar, bu çoban sahibi Əsədi acıqlandırmış və belə təhqirlərin qarşısını almaq məqsədilə məhəmmədlilərin yolunu kəsib söyüşmüşdür.

Əsəd indi döyülmüş çobanın nə təqsiri olduğunu soruşur, ağzına gələni deyirdi:

– ...Uşaqlar, hamınızı bir gülləyə qurban edəcəyəm, – deyə bağırırdı.

Məhəmmədlidən Mikayıl adlı birisi, qırmızı osmanlı tüfəngini qaldırıb Əsədə doğru uzatdı. Onun kəlləsindən vurub yerə sərdi. Bunu görən Süleyman, səngərə bənzər bir yerə girib işin sonunu gözlədi. O, düşüncəli və ciddi olmasına baxmayaraq çox davam edə bilmədi, tüfənginin tətiyini basmağa məcbur oldu.

Süleymanı görə bilmədilər. O, məhəmmədlilərin arxasını kəsmişdi. Onlar da çuxurlara dolub, güllə yağdırmağa başladılar. Süleymanın arxa tərəfindəki damın üstünə çıxan qızlar və gəlinlər gizləndilər, ortalıq təmizləndi.

Bu məhəllədə Cavad Şamil oğlunun arvadı Məhəmmədli nəslindən olduğuna görə tez atası evinə qaçıb Süleymanın gizləndiyi yeri nişan verdi.

– O, bir adamı da sağ qoymayacaq. Hamınızı öldürəcək... – deyə xəbərdarlıq etdi.

Bir azdan sonra Süleymanın arxasından zəhərli güllələr yağdı. Əhmədli gənclərinin hamısına bərabər ola biləcək bu adamı qızıl qana boyadılar. Onun tüfəngi özündən iki addım kənara düşdü...

* * *

Yenidən başlanan bu ədavət, bir gün ara verdi.

Əhməd bu işə biganə qalmadı. O, bütün Əhmədlini öz düşmənləri əleyhinə qaldırmağa çalışır və ciddi hazırlıq görürdü.

Məhəmmədlilər, Əhmədin əmisi oğlunu və bir neçə Əhmədli çobanını tutub dama salmışdılar. Keçən gün çöldə mallarını otararkən, bir-iki heyvan biçənəyə düşüb, azacıq bir yeri ayaqlamışdı. Onları döydükdən sonra qollarını bağlayıb gətirmiş və iki gün ac, susuz saxlamışdılar. İndi də malları buraxmaq istəmirdilər.

Əhməd, cavanları öz başına yığıb gecə vaxtı məhəllənin ətrafını kəsmiş, dişarı çıxanları bir-bir vurub öldürmüşdü.

Ancaq məhəmmədlilər qüvvətli olduqlarına görə heç bir şeydən qorxmayaraq, malları buraxmamışdılar.

Hökumət də bu işə qarışmırdı. Onların bu hərəkətinə qarşı heç bir tədbir görmürdü.

Bu vəziyyət, məhəmmədlilər üçün daha əlverişli idi. Onlar istədiklərini edə bilərdilər.

Əhməd bunların hamısını görürdü. O, Məhəmmədli nəslindən qüvvəsiz olduğunu da anlayırdı.

Bir yaz səhəri, birdən Əhmədlini atəşə tutdular. Evləri mühasirəyə alıb, Əhmədi diri-diri tutaraq aparmaq istədilər. Ancaq o, bir neçə yoldaşı ilə bərabər, evlərinin qarşısında qazdığı səngərə girib üzərinə hücum edən düşmənləri güllələyirdi. Məhəmmədlidən üç nəfər, Əhmədlidən isə çörək aparmaq üçün qışlaqdan kəndə gəlmiş bir çoban öldürüldü. Toqquşma çox sürdü. Axşam qaş qaralanda məhəmmədlilər geri çəkilib gizləndilər.

Gecəyarı olmamışdı. Ay öz solğun işığını ətrafa sərib kənd üzərini işıqlandırırdı. Hər tərəfdə dərin bir sükut qanad gərmişdi. Əhmədin gözünə isə yuxu getmirdi. O, kiçik qardaşını göndərib, qonşularının ayıq olmasını tapşırdı. Atasını səslədi və yenə düşmənləri ilə vuruşmağa gedəcəyini söylədi. Atası əvvəlcə razı olmayıb dedi:

– Oğlum! Biz onsuz da qırılıb qurtardıq. Əhmədli kimi böyük bir nəslin əli tüfəng tutanlarını qara torpağa tapşırdıq. İndi sən, bir də ki, əmin uşaqları qalıb. Heç bir vuruşma lazım deyil. Qoy onlar sənin üstünə gəlsinlər.

Süleyman kişinin bu sözləri ona təsir etmədi. Əhmədin bir məqsədi vardı; ya ölmək ya öldürmək! O, atasının sözünə qulaq asmayıb cəld dişarı çıxdı və yoldaşlarını çağırdı.

Bir azdan sonra kənddə yenə də gurultu-partıltı qopdu. İtlər hürüşdülər. Evlər üzərində güllələr vıyıldayaraq uçdu.

Əhmədlə yoldaşlarının dayandığı yer möhkəm və dalda idi. Əhməd, Məhəmmədli nəslindən olan mülkədar Aslanın evinə yaxın bir çuxurda səngər qazmışdı. O, birdən irəli sıçrayıb, əlindəki tüfəngi yerə atdı, özü mal damına girdi. Tez dişarı çıxıb:

– Uşaqlar! Neft gətirin, evə od vuracağam! – deyə bağırdı.

Əhməd özünü itirmiş kimi idi, yanındakı yoldaşları bu əmri o dəqiqə yerinə yetirdilər. Aslanın evi alovlanır, içəridə yatanlar yanıb külə dönürdülər.

İndi məhəmmədlilər əzilir, tökdükləri qanın əvəzini verirdilər.

Ancaq çox keçməmişdi, onlar bu hücumun qarşısını almağa başladılar. Alovu sürətlə yararaq, ətrafı bürüdülər və Əhmədgili tez geri çəkilməyə məcbur elədilər...

III

Məhəmmədlilər su yolunda Əhmədli nəslindən iki qızı tutub tikə-tikə doğradılar.

İndi kimsə dişarı çıxa bilməzdi. Yalqız olaraq bir kəndə getmək, son dərəcə çətinləşdi. Bu günlərdə kənddən yaraqsız iki addım uzaqlaşmaq ölümə getmək kimi bir şeydi. Ona görə də hər iki nəsil, atlı dəstələr düzəltdi. Bir nəfər yola salınanda bütün dəstə yaraqlanır, atlanırdı.

Bir gün əhmədlilər yuxarı gedib qohumlarından birinin evinə düşmüş və bir az istirahət etdikdən sonra Qarayazı meşəsinə keçərək yoldaşlarının ikisini Tiflisə patron gətirməyə göndərmişdilər. İndi təkrar onları qarşılamaq üçün Kür qırağına yola düşürdülər.

Onlar bu kənddən bir neçə tüfəngli adam da apardılar. Kür sahilinə çatıb gəmiçiləri aradılar, tapa bilmədilər. O taya keçmək də mümkün deyildi. Atlılar geri dönüb şose yoluna çıxdılar.

Günorta zamanı idi.

Məhəmmədlilər, tez bunları görüb hazırlanmağa başladılar. Həmzə hamıdan əvvəl atlıları tanıdı və yoldaşlarını çağırdı:

– Gəlirlər, hazır olun! – dedi.

Bu zaman iki düşmən nəslin heç birinə qohum olmayan qoca bir kişi Məhəmmədliyə yaxınlaşırdı.

O:

– Ay bala, Həmzə, zəhmət çək, buraya gəl! – deyə səsləndi.

Həmzə ona yaxınlaşdı və salam verdi. Qoca kişi onun qolundan tutub kəndin ortasına apardı. Təpədə oturdular. Qoca qan intiqamına nifrət bəsləyən bir adamdı. Aradakı sakitlikdən istifadə edib, gənclərə nəsihət vermək və onları bu işdən saqındırmaq üçün gəlmişdi.

– Oğlum, atanı buraya çağır, yoldaşlarını da gətir, gəl! – dedi.

Həmzə elə bil düşmənlərini unutdu. Onun ricasını rədd etmədi. Bir dəqiqədə məhəllənin bütün başı papaqlılarını topladı. Qoca kişi öyüd verməyə başladı:

– Camaat! Ay camaat! Bu vuruşmaların bizə nə xeyri var? Divanın gözü yumulub, heç kimə bir söz deyə bilmir. Amma arada bizim qanımız tökülür, biz zərər çəkirik. Kəndin qiymətli cavanları tələf olub gedir, axır buna nə üçün razı olursunuz?

Dəliqanlılardan biri mırıldandı:

– A kişi! Burax, qoy işimizi görək!..

Qoca yenə sözünə davam etdi:

– Kəndimizdə düşmənçilik çox olub. Ancaq mən bu cürəsini ömrümdə görməmişəm. Əl çəkin bu qan tökməkdən, kəndin çox yarısını ölümə verməkdən əlinizə nə gələcək? Allaha baxın, yola gəlin!..

Qocalar başlarını yerə dikib onu dinləyirdilər. Geridə oturmuş dəliqanlılardan bəzisi onun bir kəlməsini belə eşitmək istəmirdi.

– ...Xalq uşağını oxudub adam eləyir, amma siz balalarınıza çapıb-talamağı, öldürüb-yıxmağı öyrədirsiniz, – deyə qoca bir qədər sükuta daldı, sonra üzünü Həmzəyə tutdu:

– Oğlum! Sənin xətrini oğlumdan çox istəyirəm. Səndən heç gözləməzdim ki, bu qədər cavana qıyasan. Axı canından niyə keçirsən? Sənin kimi cavanlar qulluğa girib, adam olub. Amma sən qan tökürsən, adam öldürürsən. Mənim Əhmədliyə qohumluğum çatmaz, oraya gedəcəyəm. Özümə söz vermişəm ki, o tərəfi də razı salım.

Qoca çox qəmli və məhzun görünürdü. Onun dodaqları və səsi titrəyirdi. O, çox çətin danışır, tez-tez dayanıb, müvafiq sözlər arayırmış kimi fikrə gedirdi.

– ...Siz mənim məsləhətimə qulaq asın, camaat! Kənd dağılıb gedir, kənardan sizə baxanlar gülürlər. Dost var, düşmən var. Onları niyə üstünüzə güldürürsünüz?

O, çox danışdı. Onun sözləri deyəsən təsirsiz qalmamışdı. Ancaq Həmzənin məqsədi isə Əhmədi öldürmək, Nazlının ümid qığılcımını söndürmək idi.

Qocalar sabah barışmağı məsləhət gördülər. Cavanlara ayrı-ayrılıqda öyüd verib onları da razı saldılar.

Atlılar isə kəndə yaxınlaşırdılar. Onlar da söhbət edib, atlarını qamçılayırdılar. Əhməd:

– Nə üçün bir-birimizi öldürüb tələf edirik? – deyə öz-özünə sual verirdi.

Hər kəs öz qoçaqlığından danışır, yoldaşından geri qalmamağa çalışırdı. Ancaq Əhmədli ağsaqqallarının yığıncağı hamının planını pozdu.

Əhmədin atası:

– A bala, Əhməd! Atlarınızı uşaqlara verin, gəzdirsinlər, özünüz buraya gəlin, – deyə səsləndi.

Əhməd yoldaşlarını çağırdı, yığıncağa gətirdi.

Hələ qocalar ucadan söhbət edirdilər. Yaxın məhəllələrdən də gələnlər vardı.

Bu arada cənub tərəfdən göy gurladı. Səmanı qara buludlar sardı. Günün işıqları buludlar arasında itib getdi.

Həmin qoca burada da əvvəlcə dediyi sözləri təkrar etdi. Sonra üzünü camaata tutub:

– Mən, – dedi, onları razı elədim, ümidvaram ki, siz də mənim məsləhətimə qulaq asacaqsınız.

Qocanın dediyi gənclərdən bəzisini narazı salsa da, hamı barışmağa razılıq verdi. Hər kəs öz evinə dağıldı.

* * *

Nazlının həyatı son dərəcə ağır keçirdi. O, Həmzədə heç bir sevgi nişanəsi görmürdü. Üç-dörd gün davam edən səmimiyyət də son günlərdə aradan silinib getmişdi. Həmzə kiçik bir şey üçün əsəbiləşir, bəzən də Nazlını döyüb qabırğalarını əzirdi. Nazlı bu evə gələn gündən bəri qaçmaq üçün müsaid bir vaxt arayırdı. Lakin o haraya, kimin yanına gedəcəkdi? O, belə bir sualı qarşısında qoymadığı üçün cavabını da tapmamışdı. Atası, “qızım var” demirdi, Əhməd isə Həmzə kimilərinin arvadını almayacaqdı. Nazlıya elə gəlirdi ki, onun bu işdə heç bir suçu yoxdur.

Bir yaz gecəsi idi. Hər tərəfi əsrarəngiz bir sükut bürümüşdü. Gediş-gəlişdən bir əsər yox idi.

Nazlı hamını yuxuda qoyub paltarını geyindi və səssiz addımlarla dişarı çıxdı: “Mən haraya gedirəm?” – deyə öz-özünə danışmağa başladı: “Atamın yanına gedə bilərəmmi? Yox, mən ancaq anamın yanına gedəcəyəm!” – dedi.

Nazlı, evin böyründən uzanan cığırla yüyürdü. Cığırın hər iki yanından uzanan yaşıl otlar Nazlının nəzərində böyüyür, nərəsi bir adam

kimi onu qorxudurdu. O, gözlərini qaranlığa zilləyərək dörd yanını nəzərdən keçirirdi, qulağını şəkləyib ətrafı dinləyirdi.

Nazlı zəif bir yarpaq kimi titrəyirdi, onun dodaqları əsir, ürəyi də şiddətlə döyünürdü. O, elə bil öz içindən belə bir səs eşidirdi: "Nazlı, yaxşı iş görürsən, qaç qurtar, əzizim!".

Nazlı evlərinə yaxınlaşdı. Səssiz addımlarla içəri girdi.

Evdə hamı yatmışdı. Yatanların zəif hənirtisindən başqa heç bir səs eşidilmirdi. Nazlı bu ailənin, əskidən, çox əskidən ən mehriban, ən istəkli bir üzvü idi. Onun buraya girməyə və istədiyi yerdə yatmağa ixtiyarı vardı. Ancaq o, atasının qorxusundan yenə də titrəyirdi. Nazlı bu qorxunu güclə unudaraq irəlilədi və anasının yanında oturdu. Titrək bir səslə:

– Ana! – dedi.

Çox sayıq yatan qarı bu səsə diksinərək qalxdı və qızını tanıdı.

– Bala! – deyə onu bağrına basdı. Bir müddət qolları arasında sıxdı, üzündən bir neçə dəfə öpdü. Nazlını yenə də buraxa bilmədi. O, qızını yırtıcı bir canavar pəncəsindən zorla almış kimi idi. Hisli çırağı yandırıb, yanında qızı üçün yer saldı. Bunların söhbətinə Abdulla kişi də oyandı. O, Nazlını görər-görməz özünü itirdi. Qocanın zəif vücudu titrədi; dişləri qıcırdadı; əvvəlcə Nazlını boğub parçalamaq istədi. Lakin... övlad məhəbbəti buna yol vermədi. O, qəmgin gözlərilə qızına baxdı:

– Nazlı, səndə təqsir yoxdur, bala! Müqəssir Həmzə kimi baş kəsən quldurlardır.

Nazlının kiçik qardaşı və bacısı da oyandı. Nazlı onları qucaqlayıb üzlərindən öpdü. Ailəni qaplayan kədər, elə bil bir an içində silinib getdi. Onlar sanki yenicə yaşamağa, yenicə şənlənməyə başlayırdılar.

* * *

Həmzə bu həqarətə dözə bilmədi. "Nazlının boğazını sərçə kimi üzəcəyəm" – deyə öz-özünə mırıldandı. Lakin o, düşmənçiliyin yenidən başlanacağını bildiyi üçün bu işə soyuqqanlı yanaşdı. O indi Nazlını sevmirdi. Ancaq onu ələ gətirmək üçün bütün kəndə çaxnaşma salmışdı. Sabah tezdən, Nazlının gecə vaxtı, ərinin qoynundan durub qaçdığını söyləyənlərə o nə cavab verəcəkdi?

Eşikdən Həmzəni çağırdılar. Yaxın yoldaşlarından bir neçə nəfər, onu görmək istəyirdi.

Həmzə onların yanına gedib, nə üçün gəldiklərini soruşdu. Onlar Həmzənin kefsiz olduğunu görüb, heç bir şey demədilər. Ancaq əziz yoldaşı belə ağır bir vəziyyətdə qoyub getmək olmazdı. Dəliqanlılardan biri:

– Həmzə! İndi nə cür tədbir görmək fikrindəsən? – deyə soruşdu.

Həmzə bir müddət dinmədi, yalnız çiynini çəkdi və sonradan-sonraya:

– Nazlını zorla alıb gətirməliyik! – cavabını verdi.

* * *

Tutqun havalı bir yaz gecəsi... Məhəmmədlilər tərəfindən Abdulla kişinin evinə doğru gedən üç-dörd qaraltı görünür. Onları daxmaya doğru dünənki əhdləri çəkib aparır. İndi Nazlını zorla gətirməyə gedirlər.

Həmzə dodağını çeynəyir, arvadına qarşı ürəyində düyüm bağlayan ədavəti boğub məhv etməyə çalışır.

– Kərim! – deyə yoldaşını səsləyir, – aşağıdan gedin, görən olar!..

– İndi hamı yuxudadır, kim var, kim görə?

Onlar irəliləyirlər... Ancaq Nazlını evdə tapa bilməyib kor-peşman geri qayıdırlar. Nazlı tövlədə kiçik qardaşı ilə qucaqlaşıb yatır. O, rahat yuxuda, bu adamların gəlməsindən xəbər tuta bilməz ki?..

Abdulla kişi də bu gəzintidən xəbərsizdir. O da yatır. Heç oyanmaq fikrində də deyil. Çünki insan oğrularını heç gözləmir...

* * *

Yenə bizdən nə istəyirlər? Kişi kimi barışıb əhd-peyman eləmədikmi? Nə üçün yenə də bizim çobanları incitməyə başlayıblar? – deyə Əhməd dünən olmuş hadisəni öz yoldaşlarına söyləyir.

Dəliqanlılardan biri:

– Canım baş tutmaz, bu barışığın axırı yoxdur! Onlar qandan əl çəkən məxluq deyillər, – deyə əlavə edir.

Əhməd:

Yox, yox! Buna cavab vermək lazımdır. Gedək Həmzəni çağıraq deyək! Görək bu nə əhvalatdır? – deyir.

Hamı bu məsləhətə razı olur, kəndin ortasına doğru gedirlər. Xəncər və tüfəngləri yanlarındadır. Onlar hər zaman ehtiyatlı tərpənirlər. Əhməd tüfəngini doldurub, xəncərini də sağ tərəfdən asmışdır. Başındakı qıvırcıq tüklü papağını gözünün üstünə basıb, ağır addımlarla gedir, Həmzəgilə yaxın bir yerdə durur, onu səsləyir. Kəndin başqa dəliqanlıları da yavaş-yavaş toplaşırlar. Əhməd gülərüzlə Həmzəyə:

– Sizin, – deyir, – çobanlarınız bizim qoyduğumuz şərtdən deyəsən xəbərsizdirlər, uşaqları döyüb qoyun aparıblar.

– Əhməd! Sən öləsən bizim xəbərimiz yoxdur. Mən onlara tapşırmışam, görünür nəyin üstə isə dalaşıblar, – deyə Həmzə onu qarşılayır.

Əslində bu Həmzənin işidir. O, çobanlara sifariş göndərib, aranı qarışdırmağı tapşırmışdır. Ancaq hər kəs razılıq edib, evə qayıdır. Məsələ sülh yolu ilə həll olunur.

IV

Qış girmək üzrədir. İki gün əvvəl seyrək-seyrək qar düşməyə başlamış, havalar soyumuşdur. Ancaq kənddən dava-dalaş, səs-küy azalmır. Kəndin ortasında yenə qalmaqal qopmuşdur.

Vəli Hacı oğlu adında bir qolu zorlu, əhmədlilərdən olan bir kəndlinin üstünə bağırır:

– Dörd ay gəldi keçdi verdiyim on manatı niyə geri qaytarmadın? Mən bu pulu divan gücünə sənin qabırğandan çıxardaram.

Dəliqanlılardan bəziləri də buradadır. Əhməd yenicə odun gətirib, çörək yedikdən sonra tez yığıncağa gəlmişdir. İndi Hacı oğlu dinmir. Kəndlinin cavabını dinləyir:

– Vəli dayı! Axır biz o qədər də etibarsız adam deyilik, uşaqlar şəhərə heyvan aparıblar, satıb pulunu gətirəcəklər. Sənin on manatını günü sabah verərəm.

Bu halda aşağıda hay-küy qopur. Bir tüfəng səsi eşidilir. Hamı söhbəti buraxıb o tərəfə yüyürür. Əhmədin əmisi oğlunu məhəmmədlilər öldürmüşlər. Onun meyiti kəndin ortasında qalmışdır.

İlxı otaran, xam atları sulamaqdan gətirərkən, bir neçə at biçənəyə düşür. Bir qədər yeri ayaqlayır. Ona görə at otaranı döyüb başını yarırlar. Əhmədin əmisi oğlunu öldürən ilxı otaranın qardaşıdır.

Bu hadisə köhnə düşmənçiliyin yenidən başlanmasına səbəb olur. Əhmədin qanı coşur, xəncərini çıxarıb onun dalınca yüyürür.

Çox keçmir, ətrafı gurultu bürüyür. Əhmədi tutub evlərinə aparırlar. O, adamların arasından çıxaraq əmisi oğlunun intiqamını almaq istəyirsə də, mümkün olmur.

– Mən bu binamusluğu qəbul edə bilmərəm. Siz məhəmmədlilər öz nəslinizin tərəfini saxlayırsınız, – deyə onu aparmaq istəyənləri hədələyir.

Həmzə ona qarşı durub nəsihət vermək istəyirsə də, qızmış adama bu sözlərin zərrə qədər də təsiri olmur.

– Burax deyirəm, canım! Burax! – kimi əmrlər verir, yenə də bir nəticə çıxmır. Onu dörd tərəfdən əhatə edib əllərini tutur və evinə aparırlar.

Kənd üzərini çulğayan axşam qaranlığı hər tərəfi sükuta qərq edir.

* * *

Kəndə göndərilmiş müəllim çox həvəslə uşaqları toplayıb dərsə başlamaq arzusu ilə hazırlıq görürdü. O hələ gənc və təcrübəsizdi. Lakin düşüncəli və ciddi bir adam olduğu üçün, kəndliləri avamlıqdan qurtarmaqla, bu kimi hadisələrin qarşısını alacağına əmindi. Ona görə gəldiyi gündən işə başlayıb, çalışırdı.

Ancaq bu zavallı da çox davam edə bilmədi. Kənddə açılan məktəb, iki düşmən nəsli maraqlandırmadığı üçün müəllimi birdəfəlik qovmaq və xalqın canını "qurtarmaq" üçün çalışırlar. Onlar məqsədlərinə də çatdılar.

Məhəmmədlilər bir adam göndərib onu hədələdilər.

Müəllim tutqun havalı bir gündə şəhərə yola düşdü. Onunla bərabər Əhmədli mollası da gedirdi. Müəllim bir daha kəndə qayıtmayacaqdı.

Gənc müəllim molladan utanmayıb sözünü açıqdan-açığa deyirdi:

– Xalqın avamlığı, səninçün əlverişlidir, deyilmi?

Molla dodaqaltı gülür, gözlərini tez-tez qırparaq cavab verirdi:

– Xalqı avamlıqdan qurtarmaq mənim vəzifəmdir. Bu riyalı sözlər, müəllimin yalnız acı-acı gülməsinə səbəb oldu.

İndi o həm avamlığın, həm də mollanın qarşısında məğlub olub şəhərə qayıdır, ağır düşüncələrdən ayrıla bilməyib tez-tez köksünü ötürürdü...

* * *

Günlər keçirdi. Yaz açılmaq üzrə idi. Əhməd ata-anasının təşviqilə Nazlını almaq fikrinə düşmüşdü. Ona "binamus" deyənlər olacaqdı. Ancaq Əhməd bu sözlərə bir daha fikir verməyəcəkdi!..

Əhməd Nazlını alıb evinə gətirdi. Bu günlərdə Nazlı çox düşünür, Həmzəni gün işığına həsrət qoymaq üçün bir vasitə arayırdı. Ancaq o, heç vəchlə çıxış yolu tapa bilməyir, kədərlənirdi. Bir gün Süleyman kişi taxt üstündə oturub təsbeh çevirirdi. Bu halda onu çağırdılar. Həmzənin və qardaşı oğlunu öldürən Şəmiddinin evə gəlmək istədiyini söylədilər. O, həyətə çıxıb:

– Buyurun! – deyə qonaqları qarşıladı və Əhmədi səslədi.

Onlar gəldilər və iki nəsil arasında yenidən başlanan ədavəti yatırmaq üçün məsləhətləşdilər.

Əhməd də içəri girib, yan tərəfdən o biri otağa keçdi. O, həyəcanla, silahını hazırladı. Bundan yaxşı bir fürsət tapa bilməyəcəkdi. Söhbətin şirin yerində otağı gurultu bürüdü. Yıxılan Şəmiddin idi.

Gurultunu eşidənlər Süleyman kişinin evinə tərəf yüyürdülər və bu halı görüb, məyus oldular.

Heç kim danışmaq istəmirdi. Süleyman kişi özünü saxlaya bilməyib oğlunu danlamağa başladısa da, çox gecikdiyini anlayıb o da susdu.

Həmzə öz köhnə arvadını görər-görməz yerindən sıçradı və Əhmədin bu hərəkətini bəhanə edərək belindəki xəncəri sıyırdı. Cəld Əhmədin üstünə şığıdı.

Ancaq xəncər, açılan güllə qarşısında çox tez məğlub oldu. Beşaçılanın səsi ikinci dəfə otağı bürüdü.

İndi yerə sərilən Həmzə idi...

*1928 – aprel, Bakı*

# BAHAR SULARI

## I

Qeysər, oğlunun ölümündən iki il sonra belə ağır və iztirablı düşüncələrdən ayrıla bilmədi. Qadın nümayəndələri iclası, savad kursu, əl işi dərnəyi, klub məşğələsi – bunlar hamısı onu gələcək həyatında baş verə biləcək bütün fəna hallara dair düşünməkdən saqındıra bilmədi. Çox zaman, maraqlı məruzələr eşitdikdə də, sevimli oğlu gözləri qarşısında canlanır, bütün xəyalını uzaqlara, ucsuz-bucaqsız dərinliklərə çəkib aparırdı. Qeysər, sifətdən çirkin idi. O, adamları yalançı baxışlarla aldada bilən iri qara, cazibəli gözlərdən məhrum olduğunu hələ oğlu ölməmişdən bilirdi. Qeysər, çirkinliyini özü üçün bir nöqsan saymır, hətta qadınlarla bu xüsusda söhbət edərkən, heç bir işdə gözəllərdən geri qalmadığını söyləyirdi.

On dörd illik bir həyat yoldaşı olan Hidayətin son hərəkətləri isə ona ikinci bir dərd olmuşdu. O, bir gün klubdan qayıdarkən, Hidayətin işdən çox tez gəldiyini görmüş, lakin heç əhəmiyyət verməmişdi...

İlıq havalı bir aprel günü idi. Qeysər ərinin bu hərəkətini düşünə-düşünə yenə evə qayıdırdı. Qapının zəngini çaldığı zaman, səs-səmir gəlmədi. Zəngi bir də basdı. Qeysər tez içəri girdi. Hidayət masa arxasında oturub, "ciddi" bir mütaliəyə dalmışdı. Qeysər bu mütaliənin mənasını anladı. Üzü sapsarı oldu, əlləri titrədi. Bir şey demək istədi. Udqundu, dili söz tutmadı. Hidayət başını qaldırdı, heç bir işdən xəbəri yoxmuş kimi yenə qarşısındakı kitaba göz gəzdirdi. Qeysər qulluqçusuna baxdı, ciddi və sərt addımlarla yataq odasına keçdi. Bu dəqiqə: "Özüm hər bir işi görə bilərəm!" – demək istəyirdi. Lakin bu sözü onların heç biri anlaya bilməyəcəkdi. Qeysər də bunu düşünüb, bir söz demədi.

Küçəyə baxan pəncərə qarşısında dayandı, nə edəcəyini bilmədi.

Hidayətin otağına açılan qapıya yaxınlaşdı, bir müddət səssiz durdu, ərinin vicdansız hərəkətlərini xəyalından keçirdi. Acı bir söz aradı, tapa bilmədi.

Bu halda Hidayət yerindən qalxdı, acıqlı və qızarmış gözlərilə ona baxan Qeysəri gördü. Qıpqırmızı oldu. Onun mənalı gözlərində öz xəyanətini oxudu, bugünkü işindən arvadının duyuqluğunu anladı, heç

bir şeydən xəbəri yoxmuş kimi, addım-addım yeriməyə başladı. Qeysər yerində heykəl kimi dayanıb, gözlərini Hidayətdən ayırmırdı. O, acığından yarpaq kimi əsirdi.

– Hidayət!

– Nə var?

– Mən dedim ki, bu xarabaya qulluqçu-zad lazım deyil.

– Nə demək istəyirsən?

– Onu demək istəyirəm ki, xalqın uşağını yazıq eləmə!

– Uşaq nədir, zad nədir?

– Sənin qulluqçun, İsməti deyirəm.

Bu söz Hidayəti ildırım kimi vurdu. O, yerində dondu, artıq deməyə bir sözü qalmadı.

– O, bu gün evdən çıxmalıdır!

– ...

– Hər gün burada birini bədbəxt eləməyə sənin ixtiyarın yoxdur, bilirsənmi?..

– ...

– Mən demirəm ki, o insan deyil, ancaq o yazığı bundan sonra kim alacaq?

– ...

Hidayət xam at təki fısıldayır, güllə kimi üstünə yağan bu sözlərə tab gətirə bilmirdi.

– Onu səbəbsiz bayıra tullamağa da bizim ixtiyarımız yoxdur, müqavilə bağlamışıq... bir də... onun heç kəsi yoxdur, hara getsin?

– Mən ona iş taparam!

– Yox... axı bir də...

– Nə demək istəyirsən?

– Belə olmaz ki!..

Aralığa dərin bir sükut çökdü. Hər ikisi gözünü yerə dikib, bir müddət baxındı. Qeysərin ürəyi hirsli-hirsli döyünürdü. O, qarşısında duran ərini ayağının altına salıb tapdalamaq istəyirdi. Ancaq bu işdə aciz olduğunu duyurdu. Bir addım irəlilədi, gözlərini tez qaldırıb, Hidayətin bozarmış yanaqlarına baxdı. Bu baxış son dərəcə həyəcanlı idi. Hidayət əsəbiləşir, ox kimi batan baxışların təzyiqi altında sıxılırdı.

O yaxşı hiss edirdi ki, Qeysər əvvəlki Qeysər deyil. Onun bu evdə heç bir alacağı qalmamış, ərlə arvadın canlı rabitəsi olan on yaşlı oğlu da, iki il bundan əvvəl qara torpaqların qoynunda basdırılmışdı. İndi

Qeysərlə ciddi danışmaq da mümkündü. Onun fikrincə iki ildə bir uşaq verməyən arvadın evdə rahatca oturması, müftəcə yeyib-içməsi, xoşa gedən bir iş deyildi.

Hidayət, qəti bir qərara gəlmiş kimi, ciddi bir tövrlə Qeysərə baxdı:

– O, bu evin adamı olacaq!..

Bu sözü eşidərkən Qeysərin gözündə od parladı, ağır bir şillə almış uşaq kimi az qaldı dalıüstə yerə yıxılsın, qapının örtülü qanadından yapışdı, özünü topladı:

– Olsun!..

## II

Hidayət yaxşı anlayırdı ki, o öz hərəkətləri ilə əski ailənin səmimi rəftarına mane olur. Ancaq bu, özü Hidayətə daha xoş gəlirdi. O, ürəyində heç ağıla gəlməyən bir arzu da bəsləyirdi. Bu arzu, Qeysərin bütün zəhmətini heçə çıxarıb, ona ağır bir zərbə endirmək idi.

Hidayət hər gün işdən gələndə, bir bəhanə arayır, Qeysərin hər bir hərəkətini izləyir, onu ən cüzi bir şeydə təqsirləndirməyə çalışırdı.

Hidayət arzusuna bu tezlikdə müvəffəq ola bilməyəcəyini gördü, başqa bir yol aramağa çalışdı.

“Kəndə yollaram, kənddəki evi şənləndirmək lazımdır deyərəm, özümün də hər həftə gələcəyimi vəd edərəm, vəssalam!”

O, özünün bu son qərarından razı qaldı, müvafiq bir dəqiqə gözlədi.

Bu dəqiqə, tezliklə gəlib yetişdi. Evdə oturub çay içdikləri zaman, kənd işindən söz düşdü. O, üzünü Qeysərə tutub, boğuq bir səslə dedi:

– Oranı da əldən buraxmaq doğru deyil!

Qeysər ərinin sözünü acı bir təbəssümlə qarşıladı, cavab vermədi. Onun nə demək istədiyini anlamışdı.

– Bir də... bəlkə məni qulluqdan çıxartdılar, o vaxt kəndə gedə bilərik.

Hidayətin qulluqçusu İsmət də bu söhbətə qasrşmaq istəyirdi. Ancaq Hidayət ona imkan vermir, mətləb üstə gəlməyə tələsirdi.

– Yaxşı olardı ki, özün gedə idin!

Hidayət qalın dodaqları arasından çıxan bu sözlərin, özü tərəfindən deyildiyinə təəccüb etdi. Hər halda fikrini söylədi, Qeysəri kəndə yollamaq istədiyini onun özünə anlada bildi.

Hidayətin bu sözünü eşidən kimi, Qeysərin dodaqlarında istehzalı bir təbəssüm oynadı.

– Mənmi? – deyə səndəlidən qalxdı.

Qeysər kəndə gedə bilərdi. Bəlkə bu təklifi də sevinclə qarşılardı... Ancaq bu fikrin arxasında gizlənən məqsəd, Qeysərə gün kimi aydındı. Qeysər belə təkliflərin mənasını çox tez anlayırdı.

– Yol açıqdır, – dedi, – sən özün gedə bilərsən. Mən evimdəcə qalmaq istəyirəm.

– Axı, mən vəzifəmi buraxıb gedə bilmərəm...

– Mənim də çox işim var, hələlik vaxtım da yoxdur. Kənddəki evin bərbad olmağını istəmirsən, get, özün otur mal-qaranı otar!..

Hidayət Qeysərin öhdəsindən gələ bilmədi, özünü çox sərt göstərməyə çalışdı. Amma bu da bir nəticə vermədi, dediyi sözlər ona heç bir təsir etmədi.

– Mən belə bilirəm ki, sənin kənddə olmağın yaxşıdır, qadası!..

– Mən özüm də belə düşünürəm ki, əvvələn kənddəki üç-dörd artıq heyvan mənə lazım deyil, burada çalışmağım həm özüm üçün, həm başqaları üçün xeyirlidir, ikincisinə qalan yerdə, kənddən xoşun gəlirsə get, mənə də baş ağrısı vermə.

Hidayət bu uzun danışığı kəsmək üçün nə edəcəyini bilmir, hiddətindən tut yarpağı kimi əsirdi.

O, boz və qurumuş dodaqlarını dili ilə isladır, dişini qıcırdadırdı.

– Qeysər, bilirsənmi, bunlar sənə baha oturar?

– Bilirəm, bilirəm, hi, hi, hi...

– Eybi yoxdur, getmə! Ancaq...

– Özün gedə bilərsən!..

## III

Hidayət Qeysərdən qorxdu; odur ki, İsmətin evdən çıxıb getməsini tapşırdı. Ancaq o, hamilə olduğunu, heç bir yana getməyəcəyini bildirdi.

Hidayət uzun get-gəldən canını qurtarmaq üçün yalnız bir yol tapdı. İsməti ikinci arvad kimi almaq!

Bu fikrini özü də bəyəndi. Kimsənin xəbəri olmasın deyə zaqsa belə getmədi. İsməti aldı, təzə bir qulluqçu gətirdi.

Qeysər bu hadisədən xəbər tutdu, ancaq kədərlənmədi. İlk dəfə qadınlar şöbəsinə getdi, Hidayətin bu işini olduğu kimi söylədi. Şöbə müdirəsi heç bir tədbir görmədi. Qeysərə:

– Evi burax, yalnız klubda çalış! – deyə məsləhət gördü.

Qeysər təəccüblə soruşdu:

– O halda mənim bütün əməyim itməzmi?

– Eybi yoxdur, onsuz da biz köhnə ev-eşikdən əl çəkirik... – deyə müdirə gülümsündü.

Qeysər başını buladı:

– Axır onun bu cür rəftar eləməyə haqqı varmı?

– Əlbəttə yoxdur, bu barədə tədbir görmək sonranın işidir... İş burasındadır ki, bizim bəzi kişilər əvvəlki qayda ilə dolanmaq istəyirlər... Bir vaxt gələr ki, bunlar hamısı düzələr.

Müdirənin son sözünü eşidərkən Qeysərin gözləri güldü. O, "hamısı düzələr" sözünü eşitdiyi zaman çox sevindi, öz-özünə deyindi:

"Hidayətin tərcümeyi-halı oxunacaq; onun paxırı açılacaq... Bunu söyləmək, bütün həqiqəti açıb-tökmək mənim vəzifəm idi. Nə etməli? Ailə əsarəti buna imkan vermədi! Eybi yoxdur, gələcəkdə bunların hamısı düzələr".

Müdirə:

– Siz gedin, – dedi, – rahat olun, biz bu məsələni aydınlaşdırarıq...

Qeysər səndəlidən qalxdı, sakit addımlarla qapıya yanaşdı. O, indi səhvini anlamağa başlayırdı. Əvvəlləri Hidayət ona, bütün keçmişini unutmuş, bir adam kimi görünürdü. Ancaq indi, Qeysər yanıldığını ürəyində etiraf etməyə məcbur oldu.

Hidayət əski bir zabit idi. Boş vaxtında qadınlarla əylənməyi sevən bir adamdı. Bunu Qeysər sanki birdən xatırladı: "Bu barədə heç kəsə bir şey demərəm" sözlərini fikrindən keçirdi. Sonra birdən:

– Yox, – dedi, – hidayətlər çoxdur, başqalarını əyləncə alətinə çevirmək istəyənlər çoxdur; stolundan, nüfuzundan şəxsi ehtirasları üçün istifadə edənlər, bizə əskidən yadigar qalıblar. Müdirənin dediyi günə də az qalıb...

– Əlbəttə biz belə adamları idarələrimizdən asanlıqla təmizləyəcəyik, – deyə müdirə, sürətlə qapını açan Qeysərə baxdı – indi sıra bizə gəlir...

Qeysər başı ilə bu fikri təsdiq edib, şöbədən çıxdı.

IV

O gün qəzetdə belə bir məqalə dərc olunmuşdu: “Okruq sığorta idarəsi müdiri Hidayət Xəlilov köhnə bir mülkədar ailəsindən olub, əski hərbiyyə məktəbində təhsil almış, üç il Nikolay ordusunda, Aprel inqilabına qədər də “müsavat” ordusunda hərbi vəzifə daşımış bir adamdır.

O, Gəncədə əks-inqilabi qüvvələrə yardım edərək, bolşeviklərlə mübarizədən çəkinməmişdir. 20-ci ildə Türkiyəyə qaçmış və 24-cü ildə qayıdaraq yerli hökumətə verdiyi ərizəsində bütün köhnə fikirlərindən əl çəkdiyini göstərmişdi. Əvvəlləri idarələrdə kargüzarlıq, sonralar da bəzi yaxşı vəzifələrdə işləmişdir. Bu yeni vəzifəsində o, iki ildən artıqdır ki, çalışır.

Xəlilovun indiki hərəkətləri də köhnə fikirlərindən daşınmadığını göstərir: evinə qulluqçu adı ilə gətirdiyi bir qızı, az yaşlı olmasına baxmayaraq, kimsənin xəbəri olmadan ikinci bir arvad olaraq almışdır. O, bu hərəkətlərilə Şura hökumətinin qadınlar haqqındakı siyasətinə zərbə vurmağa çalışır.

Xəlilov sığorta idarəsindən bir sıra qadınlara, xəstə olmadıqları halda, artıq pul vermiş və kurorta göndərmişdir”.

V

Qeysər artıq ailə haqqında əvvəlki qədər düşünmürdü. Yalnız, kluba gəlib-gedərkən yoldaşlarını başa salardı:

– Burada yalnız Hidayət deyil ki?! Belə adamlar çoxdur. Onları hamıdan artıq özümüz tanıyırıq. Heç qorxmayın! Daha biz kişilərdən asılı deyilik, öz əməyimizlə çörək qazana bilərik. Hərgah bu adamlar yenə də idarələrimizdə qalsalar, sizi əmin edirəm ki, gələcəkdə daha pis günlər görəcəyik.

Qeysər bu sözlərinə cavab ala bilmədi, qadınlardan bir neçəsi, onun fikrinə şərik olmadığını söylədi. O vaxt Qeysər, fikrinin səhv anlaşıldığını duydu:

– Müqəssir olmayanlarla belə rəftar eləmək olmaz, onları başqa qərəzlərdən müdafiə edin!.. Mən Hidayət kimilərini deyirəm. Bizə lazım olmayan belələridir.

Qeysər öz-özünə dedi: “Bu yazıqlar hələ də qorxurlar, mən tanıdığım bir neçə arvadın əri Hidayətdən də pisdir. Onlar bunu açıb söyləyə bilmirlər. Yəqin “Kişidir, hər halda onun ixtiyarı bizdən çoxdur,” – deyə düşünürlər”. Nə etməli? Sonra səhvlərini başa düşərlər”.

VI

İki may günü idi.

Qeysər təhkim olunduğu kənddən qayıdırdı; yolda dəstə ilə gedən yoldaşlarına rast gəldi. Onlar çayın qırağındakı meşəyə gəzməyə gedirdilər. Bu gün hamı gülür, hamı sevinirdi.

Qeysər faytondan düşdü, qozlada oturmuş qoca kişiyə:

– Mənim şeylərimi evimizə apar! – dedi.

Fayton yorğun atların ardınca şəhərə doğru sürünməyə başladı...

Onlar qarmon çalan bir qadının dörd yanını bürüyüb oynaya-oynaya meşəyə doğru getdilər.

* * *

May günəşi, uca dağların qarını əridib, çayları coşdurur, kanalları da bahar suları ilə doldururdu. Şəlaləli çaylar, dəli bir hiddətlə iri daşları, kökü çürümüş ağacları yerindən qoparıb axıdırdı. Buna heç fikir verməyən qadınlar meşəyə çatan kimi, dalda bir yerə çəkilib çimməyə hazırlaşdılar. Gətirdikləri yemək şeylərini, qazanları kölgəli bir ağacın dibində qoyub soyundular, köpüklü dalğalar arasında üzməyə başladılar. Qadınların mərmər vücudunu yuyub şütüyən sular, onları axıda bilmirdi. Bu sərt və coşqun dalğalar, uzaqlardan qoparıb gətirdiyi çörçöpləri aparır, qara torpağa qatırdı.

Qadınlar kölgədə toplandılar, tez paltarlarını geyindilər. Hərəsi bir iş ilə məşğul olmağa başladı.

Bu anda qadınlardan biri Qeysərə yaxınlaşdı, gülə-gülə soruşdu:

– Hidayətin işini sənə dedilərmi?

– Yox, nə oldu ki?

– Vəzifədən çıxartdılar, işini də məhkəməyə verdilər.

– Doğrudanmı?

– Doğrudan...

– Buna nə sözüm ola bilər? İndi bir az ağlı başına gələr.

Qadınların bəzisi suda yuyunarkən də Qeysərdən danışırdı. Ancaq o özü bu danışıqların fərqinə varmamışdı.

– O, evdən əl çəkməz, ev onundur!..

– Bu saat o, ev arayıb axtaran deyil ay canım!..

Bu cümləni söyləyən qadın haqlı idi; Qeysər bir də ev qadını olmayacaqdı. O, qadınlar şöbəsində işləyirdi, evi də unutmuşdu.

...Qeysər bu yeni xəbəri eşidəndə iyirmi dəqiqə əvvəl çimdiyi suların sərt dalğalarını, axıb uzaqlara gedən çör-çöpləri xatırladı. Onun fikrincə Hidayət bu xırda, lazımsız, çürük ağac parçalarından o qədər də fərqli deyildi...

*1929 – fevral, Bakı*

# QAYITMADI

I

Surxay kənddə menşevik ordusunun sınıq körpünü tutması xəbərini eşitdi, osmanlı əsgərləri qayıdan zamandan bəri mal damında saxladığı tüfəngini götürdü, cəbhəyə getdi. Bu zaman onun arvadı Şirmayı sağ-salamatdı. O, pendir-çörəyi də heybəyə öz əlilə qoymuş, titrək dodaqları arasından yalnız bu sözləri deyə bilmişdi.

– Allah qoysa, onların istədiyi baş tutmaz!..

Surxayın yaxın yoldaşlarından Qambay, ərzaq üçün kəndə gedib-gələndə, yeni bir xəbər də gətirdi, Şirmayının ağır xəstələndiyini Surxaya bildirdi.

Qambay qəmli bir səslə:

– Surxay! Şirmayı yazıqdır, ona bir əlac! – dedi, – sən olmasan da biz keçinərik.

Surxay bu sözləri istehzalı bir təbəssümlə qarşıladı, onun yumru yanaqları qızardı, yoldaşına cavab vermədi. Onun fikrincə Qambay çox yersiz bir təklifdə bulunurdu.

Cəbhə, hər dəqiqə, cəhənnəm kimi alovlar içində qaynayır, qara torpaq dəhşətlə havaya sovrulur. Sınıq körpünün şimalında səmaya yüksəlmiş qayalardan qopan daş parçaları ətrafa səpələnir, Şamaxı zəlzələsini xatırladırdı.

Surxay bu ağır xəbəri eşidəndən sonra da, qarşısındakı müdhiş mənzərəyə biganə qalmayır, hətta bəzən qəlbinə çox ağır təsir edən bu hadisəni unudurdu.

Buradakıların heç biri öz canından qorxmur, bəziləri ev-eşik əldən getməsin deyə zəhərli güllələrə köks gərirdilər. Ancaq Surxay bizim düşündüyümüz kimi ev-eşik sahibi deyildi. Onun yer altında, gün görməyən, bir qazma daxması, iki də xeyirsiz heyvanı vardı. Vuruşmada o yalnız Şirmayını itirə bilərdi. Nədənsə bu da, Surxayın inadını qırmırdı.

* * *

Bu tərəflərdə sığınacaq möhkəm bir yer yoxdu, körpüdən keçmək də xeyli çətindi. Dəstə başçısı "irəli!" əmrini verərkən, partizanlar köhnə arxın qırağında örüklənmiş atlarını mindilər.

Axşam qaranlığı qızıl partizanların yerləşdiyi dərəni öz ağuşunda ovundurmağa başladığı zaman, dəstə, Xıram çayının o tayına keçdi.

Dərədə çayın boğunuq uğultusundan başqa bir səs eşidilmirdi.

II

Günəş yenicə parıldamağa başlayanda, bir dəstə adam cənazə ilə qəbiristana doğru gedirdi.

Hamı kədərli idi. Hamının gözü bahar buludunu xatırladırdı. Hamı ağlayır, bu hadisəni bir qardaş, bir ana qəlbilə hiss edirdi.

– Oğlum, bu kimdir? – deyə yolun kənarında əli qoynunda durmuş dərdli bir qarı hamıdan sonra gedən bir nəfərdən soruşdu.

O dayandı, udqunaraq cavab verdi:

– Şirmayıdır...

III

Bu zaman cəbhədə böyük bir dəyişiklik oldu: Qızıl ordu cəbhəni yardı, partizanlar kəndə qaytarıldı. İki yüz nəfərlik dəstədən üç adam yaralandı, biri isə həyata vida etdi.

Onlar şenliyə döndülər. Ölən yoldaşı qəbiristana apardılar. Başqalarına nisbətən daha inadlı döyüşən bir fədakarın ölüm xəbəri ətraf kəndlərə də yayıldı. Bu adamı, səhər basdırılan Şirmayı ilə yanaşı qara torpağa tapşırdılar.

*1929 – noyabr, Bakı*

## QUZU

Şəhərin ucqar küçələrindən birində, hər zaman saralan kərpic evin qabağında gözəl bir bağça vardı. Yaz fəsli gələndə, bu bağçanı görən hər kəs azı bir neçə dəqiqə hərəkətsiz durub, yeni açılmış güllərə, çiçəklərə heyran-heyran baxardı. Oradan səhərdən axşama kimi əlləşən qoca bağban, kənarda duran tamaşaçılara nəzər salmasa da, qızların və oğlanların bu bağçaya daha ürəkdən vurulduğunu bilirdi.

Qoca bağban sərt təbiətli, əsəbi və daima savaşan, uzun, arıq bir kişi idi. Kənardan baxanlara sevindiyi halda, bağçaya girənləri söyüb qovardı.

Mən ondan qorxurdum. Bağçanın hansı tərəfindən girsəm, o məni görüb söyər, bəzən də ərinməz-ərinməz yüyürüb məni tutar, sümüklərim yumşalıncaya qədər əzişdirərdi. Dünyada sevmədiyim iki adam vardısa, onlardan birincisi bu qoca bağban idi. Çox vaxt mən öz-özümə təəccüblə deyərdim: “Belə kinli adam, nə əcəb belə gözəl çiçəkləri bəsləyib yetirə bilir?”

Bir gün kərpic evin ikinci mərtəbəsində yaşayan gözəl qıza vuruldum. Odur ki, bağçanı unutdum. Bir daha qocanı narahat eləmədim. Gözəl qızı ilk dəfə pəncərənin qabağında görmüşdüm. Onlar özgə şəhərdən gəlmişdilər. Bizim yerli olsaydılar, qızın kim olduğunu bilərdim. Şəhərimiz balaca idi. Məktəbə gedib-gələndə, o qız, nə təhər olsa, gözümə dəyərdi. Yox, o buralı deyildi... Çünki... Yox, buralı deyildi.

Bəzən heç özümün xəbərim olmadan, ona dikilən gözlərimi, o, pəncərə qabağından çəkilib gedəndən sonra da geniş açıb dayanardım. İndi bağdakı gülləri, çiçəkləri unudub, bu canlı, gözəl, qaragözlü bahar çiçəyinə vurulmuşdum...

Birdən küçəyə baxan pəncərə bağlandı, bir daha açılmadı. Mən onu görə bilmədim: axtardım, tapa bilmədim. Mənə nifrətmi edirdi? Məni görmək istəmirdimi, bilmirəm. Öz-özümə dedim: “Yəqin köçüb gediblər. Daha qayıtmayacaqlar”.

Ancaq yanılmışdım.

Bir gün qoca bağban xəstələnib öldü. Gözəl bağça sahibsiz qaldı. Nədənsə, bu hadisə məni sevindirmədi. İllərdən bəri nifrət elədiyim bu qocanın ölümündən kədərlənib ağladım da...

Sonra bağça mənim ixtiyarıma keçdi.

Bir səhər, bağçanın ortası ilə axıb gedən balaca arxda ayaqlarımı sallayıb bulanıq su ilə oynayırdım. Nə gördüm?.. O idi – gözəl bahar çiçəyi!

Tez ayağa durub ağacın dalında gizləndim, gözlərim yalnız bir nöqtəyə dikilib qaldı. O, yer üzünün insanlarına bənzəmirdi. O, böyük bir ideal kimi mənim təsəvvürümdə o qədər yüksəldi ki, dodaqlarımın bir-birindən aralandığını, gözlərimin böyüdüyünü, nəfəsimin tutulduğunu, ürəyimin isə, qeyri-adi bir şiddətlə döyündüyünü belə hiss etmədim.

O, ikinci mərtəbədə, bədənnümə güzgünün qabağında durub, uzun, qara saçlarını darayırdı. Məni görürdümü? Yəqin ki...

Yox, görürdü. Görməsə də, bir vaxt görməli idi.

Mən onun yalnız profilinə baxırdım. Qara gözlərinə isə həsrət qalmışdım. Nəvaziş axtarırdım. “Bir bəri bax, gözlərini məndən gizlətmə! – deyə yalvarmaq istəyirdim. Yox, belə kəmiltifat olma!..”

Yox, o məni görmürdü.

Mən isə inləyirdim: “Ah, qızlar, qızlar, niyə siz arxanızca gələn cavan adamın, pərvanə kimi başınıza dolanmaq istəyən bədbəxt bir insanın sifətini, hərəkətini aydın görmək istedadına malik olduğunuz halda, bircə dəfə dönüb onun üzünə baxmırsınız? Siz nə üçün bu qədər məğrursunuz? Fərqi nədir ki, o, üç-dörd sürətli addımdan sonra qabağınıza keçib sizə istədiyi qədər tamaşa edə bilməzmi? Dönüb geriyə baxsanız, o insanın ürəyində sizə qarşı mütləq mənfi bir fikir oyanacağındanmı qorxursunuz? Axı, bütün insanlar belə yüngül deyillər ki? Sevənlərin qəlbi geniş olmurmu? Onların gözü iti, baxışı dərin olmurmu?”

O, ayna qabağından çəkildi. Elə bil ay parçası qara buludların dalında gizləndi. Gözlərimin qarşısında nəhayətsiz, dərin bir boşluq açıldı...

Axşama qədər orada qaldım. Evdən məni çağıranlara hay vermədim. O yanlarda, xəlvət bir bucaqda oturub günün batmağını gözlədim.

Hər dəqiqə mənə ildən uzun görünürdü. Yenə də yer üzünü işıqlandıran bir ay parçasını gözləyirdim.

Evin o yanından, yaz buludlarının arasından çıxan ay mənə baxırdı...

Birdən yaxınlaşan ayaq səslərini eşitdim. Donub qaldım. Yuxumu görürdüm? Yox, ay göydən yerə enmişdi, yeriyirdi.

– Xanım, siz qorxmursunuzmu?

Düşünürdüm ki, o mənim burada olduğumu bilmir və sualımı eşidən kimi səksənəcək. Yox, onun gözləri, dalınca gələn oğlanı aydın görən qızlarınkından belə iti idi. O, məni görürdü.

O duruxdu.

Mənim böyümüş gözlərim, həsrətində olduğum qara gözlərə dikildi.

O:

– Yox, mən qorxmuram, – deyərkən mən onun incə dodaqlarına baxdım.

O gülümsədi.

– Gül dərmək istəyirəm. Evdəkilər solub.

– Buyurun, xanım, yaxşı qərənfillər var.

– Qərənfil? Mən qızılgül dərmək istəyirəm.

– Niyə, xanım? Bu saat qərənfillərin yaxşı vaxtıdır.

Onun incə dişləri parıldadı:

– Mən özüm Qərənfiləm, – dedi. – Mənə qızılgül lazımdır.

Utandımmı? Qızardımmı? Deyə bilmərəm. Vücudum tir-tir əsdi. Bunu xatırlayıram.

– Sən qoca bağbanın nəyisən? – deyə o, məndən xəbər aldı.

– Mənmi? Heç nəyi. Mən qonşunuzam. Siz olan evin alt mərtəbəsində yaşayıram. Zirzəmidə...

– Harda oxuyursan? Səhər gimnaziyasındamı? Atanı hər gün görürəm. Yaxşı adamdır... Gəl mənə gül dərməyə kömək elə... Mən də oxumaq istəyirəm, atam qoymur. Deyir ki, qız xeylağı oxuyanda azır.

Mən qoca bağbanın mirasını toplayıb böyük bir dəmət bağladım.

– Buyurun, xanım...

– Mən dedim ki, qərənfil istəmirəm.

Mən onun fikrini anlamadım.

– Adın nədir?

– Mənim adım, Rəhim...

O, nəsihət verməyə başladı:

– Oğlan qıza çox baxanda... Yox, bu yaxşı deyil... Sən nə üçün bu gün evinizə getmədin? Anan səni üç-dörd kərə çağırdı. Sən cavab vermədin. Ac qaldığından narazılıq edirdi. Yaxşı deyil...

Mən yalnız indi xatırladım ki, səhərdən bəri heç nə yeməmişəm.

– Pəncərəmizə çox baxma. Anamın acığı tutur, görmürsənmi, küçəyə baxan pəncərələri bağlayıb. Razı olmur... Sən onu daha da şübhələndirirsən.

Birdən Qərənfil addımlarını yeyinlətdi. Bağçadan çıxdı. Geriyə boylanıb, üzümə baxa-baxa dedi:

– Get, çörək ye, anam səni görməsin deyə, bağçaya axşamlar çıx. Yaxşımı?

Mən nə qədər xoşbəxt idim. Sevincimdən dilim söz tutmurdu.

– Yaxşı, xanım, yaxşı... – dedim.

Ayrıldıq. Birinci görüşümüz bununla qurtardı.

Evdə məni danladılar. Anam söyləndi. Atam bağırdı. Mən heç birinə cavab vermədim. Səadət mənim dilimi qurutmuşdu.

Yerimə uzandım.

Gecə saat iki idi. Hələ də gözümə yuxu getmirdi.

"Bağçaya axşamlar çıx..." – Hə, hə, axşamlar... Necə yatdığımı xatırlamıram... Bir də səhər oyandım. Qapı döyülürdü.

Anam cəld qalxıb qapını açarkən, bir qadın səsi eşitdim. Qərənfilin anası idi.

– Dünən sizin oğlan səhərdən axşama kimi bağçada idi. Orada bizim quzumuz bağlanmışdı. İtib... Onu sizin Rəhim oğurlamayıb ki?

Mən yerimin içində donub qaldım.

Dinmədim.

Qərənfillə ilk görüşüm, son görüş oldu. Quzu mənim sevgimi oğurladı...

*1938*

# KOR AT

Kənd toyu qurtarırdı.

Oğlan evindən gəlmiş dəliqanlılar geri qayıtmağa hazırlaşırdılar. Gəlinlər, qızlar, nişanlının cehizini həyətin ortasında duran ikitəkərli arabaya yükləyirdilər. Hamı əl-ayağa düşmüşdü. Arabanı rəngbərəng xalılarla bəzəyənlərin sevinci yerə-göyə sığmırdı. Onların hamısı bəzənmişdi. Bəziləri, ayaqyalın da olsalar, qanovuzdan don geyinmişdilər.

Birdən, ipək paltarla bəzənmiş, dikdaban tufli geymiş, Gəncə kəlağayısı örtmüş qamətli gəlini atası evindən çıxardıb arabaya sarı gətirməyə başladılar. Zurnaçıların qabağında məharətlə süzən yengə, toy sahiblərinə uzun və xoşbəxt bir həyat arzulayırdı.

Bəy özü isə, kənarda dirəyə söykənib oğrun-oğrun nişanlısına baxırdı. O, sevgilisinin üzünü görə bilmirdi: gəlinin üzü indi də örtülü idi. Onun tir-tir əsən göy haşiyəli uzun ağ kəlağayısı başından dizinə kimi uzanmışdı.

Həyətdə iynə salınsa, yerə düşməzdi. Toy adamları gülür, oynayırdılar. Amma çox təəssüf ki, bu yerlərin sevimli şairi Vaqif, vətəninin gözəl toylarına çoxdan vida edib, bülbül kimi ötmür, sənəmlərə meydan oxumurdu, sağ qalan yalnız aşıq idi. O, zurnanın kiridiyini görəndə, telli sazını döşünə basdı, bütün kənddə eşidilən zil və gözəl səsi ilə ötməyə başladı:

Görüm ay, bəy, toyun mübarək olsun,
Sağdışına, solduşuna borc olsun,
ay borc olsun.

O ötürdü, telli sazını məharətlə çalırdı və özü də sevinə-sevinə oynayırdı.

Sonra, quyruqları səliqə ilə düyülmüş cıdır atlarını həyətə çəkib gətirdilər. Onların çoxu məğrur başlarını dik tutaraq, yerlərində oynayır, bəzən də şahə qalxırdılar.

Kənd toyu qurtarırdı...

Yeddi gün, yeddi gecə yorulmadan çalmış zurnaçılar, qonşu damın üstünə qalxdılar. Koroğlunun cəngi havası dağlara, dərələrə səs saldı. Çərkəzi yəhər altında qızmış atlar, cənginin ahənginə uyaraq, daha da coşurdular.

Bir azdan sonra bəyin də atını yedəkləyib gətirdilər. Hamının gözü ona zilləndi. Kor at bütün şənlikdə ad çıxarmışdı. Zahirən çox da gözəl

olmayan bu atın balaca başı, uzun-nazik boğazı, uca boyu, dümdüz beli, dartılmış qarnı vardı. Üstündəki yəhər də köhnə idi. Bəziləri ona baxıb: “eh, – deyirdilər, – onda tərifə dəyən heç nə yoxdur, üz-gözündən kifirlik tökülür”. Amma kor at bütün cıdırlarda həmişə birincilik qazanırdı. Son illərdə onu ötən bir at olmamışdı. Çoxları bu fikirdə idi ki, yəqin Qıratın nəslindəndir.

Bəy ata yaxınlaşdı, əli ilə onun yalınını tumarladı, qayışlarını yoxladı, səliqəsiz görünən tapqırını düzəltdi. Atın yanına bir şillə vurdu. At sahibindən aralanıb, cənginin get-gedə ucalan səsindən daha da cuşa gələrək, kənarda, adamlardan xeyli aralı, dairə vura-vura oynamağa başladı. O gah əllərini göyə qaldırır, gah başını sinəsinə endirir, gah da dal ayaqları üstündə fırlanaraq oynayırdı. Bu oyun bir neçə dəqiqə sürdü. Amma heç kəs gözünü atdan çəkmirdi. Hamı onun xasiyyətləri ilə maraqlanırdı.

At getdiyi yolla da qayıdıb sahibinə yanaşdı. Bəy onun kəkilini sığalladı, səkil ayaqlarının tozunu təmizlədi. İndi onu istədiyi yerə, istədiyi qədər səyirdə bilərdi. Kor at belə kor at idi.

Bəy adlandırdığımız oğlan nə bu gün bəy idi, nə də sabah bəy olası idi. Keçmiş əyyamda bizim kəndlərin bu cür bir günlük bəyləri çox olardı. Toylarından bir gün sonra onlar bu rütbədən istər-istəməz istefa verir, ya cütün dəstəyindən yapışıb yer şumlayırdılar, ya da onun-bunun qapısında nökərçilik edirdilər.

Bizim bəyin əsil adı Kərəm idi. Amma o nə xan Əslinin Kərəminə oxşayırdı, nə də Qaçaq Kərəmi xatırladırdı. O, ən adi kənd cavanlarından biri idi. Atası, bəylərdən birinin qapısında mehtərlik edərdi. O, öləndə oğlu üçün yalnız arıq, bir gözü də kor bir dayçanı yadigar qoymuşdu. Heç kəsin ağlına gəlməzdi ki, bu arıq və kifir dayça böyüyüb gözəl bir at olacaq. Atası öləndən sonra Kərəm çobanlığa getdi, kor dayçanı ilxıdan ayırmadı. Onun dünyada ən çox sevdiyi şey bu ürgə idi. Atası demişdi ki, “Yaxşı saxla, əsil igid malıdır!”.

Kərəm bir neçə ildən sonra onu tutub öyrətdi, özünə ram elədi. Çobanlıqdan aldığı qoyunun bir neçəsini satıb çərkəzi yəhərə verdi.

Kor böyüdükcə, Kərəmin də qüruru artırdı.

Ay keçdi, il dolandı, Kərəm bir qız sevdi, qazandığı qoyunların hamısını pula döndərib yeddi gün, yeddi gecə toy çaldırdı.

İndi qurtaran toy onun toyu idi...

Kərəm yenicə geydiyi ağ çuxasının ətəyini qatlayıb gümüş kəmərinə keçirdi. Şikari papağını sol qulağına tərəf əydi. Təzə paltarı ona

çox yaraşırdı. Dünən sağdışının bağışladığı qamçı, uzunboğaz çəkməsinin üstündən aşağı sallanırdı.

O, atının qantarğasından tutub ürəyində ona belə deyirdi: "Bilirsənmi nə var, əzizim? Bu gün mənim toyumdur. Xələti özüm alsam, yaxşı düşməz. Amma sən gərək məni utandırmayasan. Süleyman bəy təzə at alıb. O, dəridən-qabıqdan çıxıb birinciliyi qazanmaq istəyəcək. Onu ötməsən, bir də üzünə baxmaram!".

Kərəm gülümsəyib, kor atın üzünə baxdı. Onun yalını bir də sığalladı. Toy adamlarının gözü yenə Kərəmdə idi. Bəziləri onun qız evinə gəlməsindən narazı idilər (bəy, qız evinə gəlməməli idi!), bəziləri də bu çirkin ata baxa-baxa, təəccüblə çiyinlərini çəkir, yəqin ki, belə düşünürdülər: "Kifirdir, amma nə olsun ki, kişinin bəxti vurub".

Birdən cavanlar atlandılar. Onlar indi Koroğludan da məğrur görünürdülər. Onların sümük vəznəli çuxaları, gümüş qaşlı xəncərləri, gündə yanmış sifətlərində sevinclə parıldayan ala gözləri, xüsusi bir əda ilə geyilmiş şikari papaqları nəyə dəyməzdi.

Kərəm də adəti üzrə, cəld atın belinə sıçradı. At şahin kimi irəli şığıdı.

Qazma damların üstünə çıxmış kəndlilər, gözlərini Kərəmdən ayırmayıb öz aralarında deyirdilər:

– Kor ata ömründə qamçı dəyməyib.

– Bax, bax, Kərəm heç ayağını tərpətmir. Yaxşı minicidir.

– Kor ata mahmız vursa, xətrinə dəyər.

– Amma qızışanda, Allah göstərməsin, yaman qızışır ha...

– Bu gün korun köpünü alacaqlar. Süleyman bəyin kəhəri yaman atdır. Əvəzində dörd at verib. Kürdoğlu nəslindəndir... Yəqin Kərəm özü də baş qoşmaz. Bir də öz toyudur, xələti özü almayacaq ki.

– Onu de... Yoxsa, kor da yaman kordur! Ömründə dizini yerə qoymayıb.

Gəlinin qohumları zurnaçıları arabalara mindirdilər. Yenə dağları, dərələri titrədən cəngi səsindən deyilən sözləri eşitmək olmurdu.

Üç araba dalbadal yola düşdü.

Cıdır başlandı, amma nə başlandı! Elə bil eyni zamanda yüz ox birdən atıldı.

Kərəm atını Süleyman bəylə yanaşı səyirtdi. Atlılar bir anda kənddən çıxıb geniş düzə səpələndilər.

Evlərin üstündə duran tamaşaçıların ürəyi şiddətlə döyünürdü. Onlar dərin bir həyəcanla düzə sarı baxır, lap qabaqda ildırım sürətilə uçan kor atdan gözlərini çəkmirdilər. Kərəm yəhərin qaşına sinmişdi.

Əlləri, ayaqları hərəkətsiz idi. Səs-səmir də çıxmırdı. Buna ehtiyac da yox idi. Kor öz işini bilirdi. O, qabağına çıxan xəndəklərdən məharətlə atılır, balaca qulaqlarını qısaraq çapırdı.

Birdən evlərin üstündəki tamaşaçılar bağırışdı.

– Süleyman bəy keçdi!

– Hə, hə, keçdi!..

Düz deyirdilər. Süleyman bəy Kərəmi keçdi. Amma hələ mənzilə çox vardı. Bir də Kərəm atının xasiyyətini hamıdan yaxşı bilirdi. O, birdən korun dalına tərs bir şapalaq vurdu. Kor at çənəsini aşağıya sarı əyərək, qulaqlarını şəklədi və yenə irəliyə şığıdı...

Atlılar gözdən itdilər. Kimin üstün gəldiyi bəlli olmadı.

Oğlan evi tərəfdən damların üstünə çıxmış kəndlilər arasında da qızğın mübahisə gedirdi:

– Kor at qalar.

– Yox, inanmıram.

– Deyirəm qalar.

– Mən deyirəm qalmaz.

– Bax, bax, qabaqdakı Süleyman bəydir, görürsən?

Əşi, bundan sonra korun ağzı nədir...

– Aha, gördün... Kor onu göz açmağa qoymaz. At deyil, od parçasıdır!..

Bu anda tamaşaçılardan müdhiş bir çığırtı qopdu. Üz-gözünü cırmaqlayıb qanadan kim, saçını yolan kim, "Ah vay" edib inləyən kim... Yalnız bir an əvvəl gülən üzlərdə, sevinclə parıldayan gözlərdə birdən qəzəb, kin, intiqam alovları parıldadı.

Elə bil hamı qeyri-adi və olduqca qorxulu bir röya görürdü.

Kərəm, yəhərlə bərabər yana sarı yıxılmışdı, onun ayaqları üzəngidən asılı qalmışdı, başı yolun daşlarına dəyərək qızıl qana boyanmışdı.

Müqəssir kim idi?.. Hamının kini, qəzəb və intiqamla parıldayan gözü, – ona, – dörd at verib bir at almış Süleyman bəyə, qəsdən Kərəmi itələyib onun müvazinətini pozan paxıl adama zillənmişdi.

Kərəmin qapısında durmuş adamlardan qopan ah-nalə səsi göylərə ucaldı.

Kor at daxmaya çatıb dayandı. Onun qantarğasından tutub saxladılar. Kərəmin ayaqlarını üzəngidən çıxarıb yerə uzatdılar.

Ananın fəryadı hamını titrətdi.

Kor at sahibinə yanaşıb qəmgin və titrək bir səslə ucadan kişnədi.

Bir günlük bəyin toyu belə qurtardı. Kərəmə bir kor atı da çox gördülər.

*1938*

## KONSERT

I

Balaca otaqda iki yoldaş oturmuşdu. Səbri piano çalırdı, Ədhəm isə papiros çəkə-çəkə onu dinləyirdi.

Səbrinin barmaqları o qədər sürətlə hərəkət edirdi ki, pianonun dillərinə dəyib-dəymədiyini görmək çətin idi. O, birdən dayandı. Piano kiridi. Səbri tələsmədən, nota vərəqini çevirdi və gözlərini məchul bir nöqtəyə zilləyib yenə çalmağa başladı. Onun yaratdığı ahəng xəyal deyildi. Həqiqət idi. Bunu Ədhəm də hiss edirdi. Damağındakı papiros sönmüşdü. Onun da gözləri qeyri-müəyyən bir nöqtəyə zillənmişdi. O da duyur, o da yaşayırdı.

Balaca otaqdan qopan səslər, tez-tez ahəngini dəyişirdi. Ədhəm bir yerdə sakit otura bilmir, gah ayağa qalxıb gəzinir, gah da Səbriyə yaxınlaşıb hərəkətsiz dayanaraq, həyəcanla dinləyirdi.

Səbri bütün diqqətini toplayıb son akkordları vurdu. Pianonun dilləri qeyri-adi bir qüvvətlə balaca otağı birdən titrətdi və birdən də kiridi.

Səbrinin o qədər də cazibəli olmayan qalın dodaqları arasından incə dişləri göründü. O, çaldığı əsərinmi, yoxsa ürəyinə axan sevincinmi təsirindən nəşələnib bir xeyli yoldaşının üzünə baxdı.

Ədhəm yalnız bir neçə dəqiqə sükut etdikdən sonra fikirdən ayrıldı:

– Çaldığın əsər hansı kompozitorundur? – deyə Səbridən xəbər aldı. – Mən bu cür əsəri xatırlamıram. Kimindir?

– Sənin fikrincə kimin olar?

– Ya Bethovenin, ya da...

Səbri qaqqıltı ilə gülüb yoldaşının sözünü kəsdi:

– Deməli, biz ya Bethovendən oğurlamışıq, ya da...

Bu cavabı eşidəndə, Ədhəm qızardı:

– Yox, yox mən elə demək istəmədim. Qəhrəmanlıq simfoniyasını xatırladan bir üslubda yazılmışdır. Mənə elə gəlir ki, bu əsər dinləyənləri titrədəcəkdir – deyə. Ədhəm əvvəlcə Səbrinin üzünə baxdı, sonra gözlərini aşağı dikib dırnaqlarını qurdalamağa başladı.

Səbrinin qalın dodaqlarına nisbətən çox yaraşıqlı görünən inci dişləri yenə parıldayırdı. O, pianonun dalından qalxaraq, əli cibində gəzinmək istərkən, özü haqqında Ədhəmdən çoxdan eşitdiyi bir sözə işarə ilə qəsdən soyuqqanlı bir tərzdə dedi:

– Məndə yüksək və mənalı əsər yaratmaq istedadı yoxdur, deyilmi?

Ədhəmin ürəyi necə döyündüsə , alnı və yanaqları qan kimi qızardı. O, küskün bir səslə cavab verdi:

– Sən nə yaman kinlisən, Səbri! Altı il əvvəl dediyim bir sözü hələ unutmayıbsan.

Yalnız adi bir sövq-təbii ilə yoldaşına baxan Səbrinin gözü incə bir təfərrüata ilişdi. Ədhəmin papiros tutan barmaqları xəfif-xəfif titrəyirdi.

Səbri doğrudan da kinli imiş. O, əlbəttə xatırlayırdı və öz barəsində deyilmiş acı sözləri uzun illər boyu inadla yadında saxlayıb, yeri gələndə üzə vurur, Ədhəmdən intiqam alırdı:

– Məni yalnız bir şey qorxudur: Həsəd!.. Heyfsən, Ədhəm...

Ədhəm bu sözlərin ağırlığına dözə bilmədi:

– Yox, yanılırsan. Mən yalnız sevinə bilərəm...

İstəkli dostumun bu cür qüvvətli əsərini dinlərkən, ürəyimdə yalnız iftixar hissi...

Lakin o fikrini tamamlaya bilmədi. Udqundu. Səbrinin gözləri indi də bu qeyri-səmimi sözləri deyən dodaqlara zillənib qaldı.

## II

Səbri təhsildən qayıtdığı gündən iki il keçirdi, amma yoldaşı Ədhəmlə birinci dəfə görüşürdü. Bunun səbəbi vardı. O, Ədhəmi həmişəki kimi yox, olduqca fövqəladə bir şəraitdə, gözəl bir əsər yazdıqdan sonra görmək istəyirdi. Çünki Səbri hələ Moskvaya yola düşəndə, Ədhəm ona istehza edirdi: “Təhsil gücünə kompozitor olacaq!” deyirdi. Həm deyirdi, həm də nəşə ilə gülürdü.

Ədhəmi bütün şəhər tərifləyəndə, Səbrini pisləyirdi. Ədhəm onun hər bir əsəri haqqında acı lətifələr düzəldirdi. O, istedadlı bir təlxək idi: həm özü gülürdü, həm də başqalarını güldürürdü. Bəzən Səbri özü də gülməyə məcbur olur və bu lətifələri uydurmağa vaxt tapan Ədhəmi alqışlayırdı. Bəlkə də səhv edirdi. Amma Ədhəm bu alqışlara layiq bir təlxək idi.

Hələ məşhur tənqidçi Ağazadə elə bil onunla əlbir idi. Hər şeyə dair məqalə yazmağı bacaran, teatrı, estradanı, sirki, tarixi, Azərbaycan ədəbi dilini və hətta ədəbiyyatını öz doğma ixtisası bilən bu tənqidçi musiqi haqqında az yazmamışdı. O, məşhur fransız ensiklopedisləri kimi geniş sahələri qavramaq istəyən, lakin onların qapısında süpürgə

çəkməyə layiq olmayan bir tip idi. Qəzet sütunlarını, teatrın bahalı lojalarını, operanın bahalı cərgələrini böyük bir ehtiramla Ağazadəyə təqdim edənlər də vardı. Müxtəsər, "məşhur tənqidçinin" qələmi aləmə qan uddurduğu kimi, Səbriyə də göz verib işıq vermirdi. Cavan istedadları böyük məharətlə qəbrə gömən bu tənqidçidən kompozitorla dirijor arasındakı fərqi soruşsaydılar, o, sümüklü eynəyini düzəldib, ötgün səslə cavab verərdi:

– İkisi də bir sözdür. Mədəni ölkələrdə kompozitor deyirlər, amma yarımmədəni ölkələrdə dirijor.

Həmin bu məşhur tənqidçi, uzun müddət Səbrinin yazdığı əsəri dinləyənlər üzünə həsrət qoydu; ona məsləhət gördü ki, "aqronomluğa, bəlkə də ondan daha mədaxilli olan baytarlığa getsin".

Səbri gənc idi. Təcrübəsiz idi. Təlxəkliyi bacarmırdı. Ancaq onun, "məşhur tənqidçi" qədər olmasa da, hər halda özünə görə qənaəti vardı:

– Mənim biliyim çatışmır, Moskvaya gedib oxuyacağam.

O Ağazadə ilə məsləhətləşmədən təhsil almağa getdi. Dörd il oxudu, iki il də məşhur musiqi ustaları ilə birlikdə işlədi. Onların təcrübəsi ilə yaxından tanış oldu. Səbrinin qüvvətli istedadını görən qoca ustalar ona məsləhət gördülər ki, yenə vətənə qayıdıb yaradıcılığa başlasın.

Beynəlxalq yarışlardan böyük qələbə ilə çıxan gənc ustalar yetirmiş qoca müəllim Səbrinin alnından öpüb deyirdi:

– Xalqınızın zəngin musiqisi var. Böyük rus kompozitorları çox vaxt sizin musiqinizdən istifadə edərək, ölməz əsərlər yaratmışlar. Siz də bu yolla gedin. İlk əsərlərinizdə xalq ruhunun aydın izləri görünür. Yalnız bir nöqsanı vardır ki, səviyyəcə yüksək deyil. Gedin əziz vətənə, bir neçə ildən sonra yenə görüşərik...

Səbri Bakıya qayıdandan sonra iki il də rayonları gəzdi, kəndləri dolaşdı, tütək çalanları dinlədi, zurnaçılara qulaq asdı, aşıqları oxutdurdu, toy məclislərində, el bayramlarında böyük bir həvəslə iştirak etdi. Xalq dastanlarını, el qəhrəmanlarının maraqlı sərgüzəştlərini öyrəndi və şəhərə dönərkən, özü ilə bərabər insanı heyrətə salan zəngin materiallar da gətirdi. Bu gün çaldığı əsər, onun yazdığı "Azad insan" simfoniyası idi.

O, istehzalı təbəssümlərə məruz qalan balaca əsərlərdən sonra, müəllimlərini və dostlarını sevindirən bir simfoniya yaratmağa müvəffəq olmuşdu. Səbri dərin bir sevinc hissi duymağa haqlı idi...

III

Ədhəm, pianoda çalınan parçaların orkestrdə necə qüvvətli gurlayacağını düşünüb, Səbridən qat-qat zəif olduğunu gördü. Özü də duymadan, onun papiros tutan barmaqları xəfif-xəfif titrəyirdi.

– Əlbəttə, Səbri, – deyirdi, – mən də şəxsən sənin istedadlı bir gənc olduğunu bilirəm. Amma Ağazadə yenə sağdır. O, qəzetlərdə yenə yazır.

Səbri yoldaşının fikrini o dəqiqə başa düşdü.

– Mən şöhrət dalınca qaçmayacağam. Gecə-gündüz işləyib əsər yazacağam. Ağazadəyə gəlincə, o, sənin düşündüyün qədər də böyük təhlükə deyil.

Ədhəm cavab verməyə tələsdi:

– Axı hər halda tənqidçidi, tamaşaçılara istiqamət verir.

– Yanılırsan, dostum... Pis tənqidçilər tez unudulur, amma yaxşı əsərlər qalır. Mən çalışıb əsərlərimlə dinləyicilərə istiqamət verəcəyəm. Onun bədii zövqünü korlayan mahnılardan yüksək xalq musiqisinə doğru geniş bir yol açacağam.

Ədhəm bu dəfə istehza ilə qımışdı. Dostunun üzünə baxdı, sonra gözlərini yerə dikdi. O, nədənsə, istəyirdi ki, qarşısındakı adamın yenə də heç bir nüfuzu olmasın: hər addımda istehza ilə qarşılansın, onun şöhrətini kölgələndirməsin. Bu gün eşitdiyi əsəri xatırlayıb həyəcanlanır, ürəyinin dərinliklərində onu narahat edən bu yeni hadisəyə soyuqqanlı baxa bilmədiyini ixtiyarsız büruzə verirdi.

Birdən Səbri nəyi isə xatırlayıb gülümsündü. Ədhəm təəccüblə soruşdu:

– Niyə qımışdın? Olmaya elə düşünürsən ki, mən paxıllıq edirəm?

– Yox, qətiyyən! Yadıma bir şey düşdü.

– Nə?

– Əfşan hardadır? Düz üç il olar ki, görməmişəm... Aranız necədir?

– Əfşan?.. Buradadır. Həkim olub. Məni əvvəlkindən yüz qat çox sevir. Necə, nə üçün xəbər aldın?

– Maraqlanmaq olmazmı?

– Nə üçün olmaz. Təəccübümə səbəb odur ki, birdən soruşdun.

Səbri dinmədi. Üzündəki təbəssüm izləri yavaş-yavaş silinib getdi.

– Deyirsən çox sevir?

– Sualların qəribədir...

– Yaman qısqanc olubsan, Ədhəm, yaxşı deyil... Bu sənin üçün ayıbdır.

Səbri danışığına ara verib pianoya yaxınlaşdı, bir az əvvəl çaldığı əsərin bir hissəsini yenidən təkrar etdi. Sonra üzünü Ədhəmə çevirib üst-başına işarə ilə gileyləndi:

– Tələbəlik məni bu kökə saldı, özümə hələ də yeni bir kostyum almamışam... Qızlar yüz dəfə bismillah deməmiş üzümə baxmırlar... Bilmirəm konsert verəndə, belə çıxsam ayıb, olmaz ki?

Ədhəm təəccüblə soruşdu:

– Konsert verəcəksən?

– Olmaz?

Ədhəm çiyinlərini çəkdi.

– Nə deyim?

– Məsləhət görmürsən?

Ədhəmin ən çox qorxduğu da bu idi. Deməli, Səbri altı illik təcrübəsini diqqətlə hazırladığı bir konsertlə nümayiş etdirəcək, dinləyənlərdə dərin bir təsir buraxacaqdı. Bu, Ədhəmin ürəyinə qorxu saldı, amma o, yenə özünə təsəlli verməyə başladı: “Eh, bəlkə də onu dinləyən olmadı. Mənim şöhrətimi kölgələndirmək üçün uzun illər lazımdır”. Ədhəm darıxan kimi oldu. Dərindən nəfəs aldı. Ayağa qalxdı. Gəzinə-gəzinə papirosunu tüstülədib fikirləşdi. Çox fikirləşdi. Amma yenə də ürəyindəki həsədi əzib yox edə bilmədi. O boydan uca, enli kürəkli, yeriyərkən döşünü məğrur tutmağa çalışan bir gənc idi. Adəti belə idi ki, dayaz baxışlı mavi gözlərini həmişə qabağındakı adamın çiyni üzərindən məchul bir nöqtəyə zillərdi.

– Səbri, – konsertin müvəffəqiyyət qazansa, mən çox şad olaram. Ancaq... – O, yenə çiyinlərini çəkdi, xoruz pipiyi kimi qızarmış yanaqlarını ovxaladı, dodaqlarını büzdü. – Ancaq əvvəldən haqqında elə fikir yaradılıb ki, qorxuram tamaşaçılar gəlməyə.

Səbri duruxdu, udqunaraq cavab verdi:

– Nə olar ki?.. Birinci dəfə gəlməsələr də, yaxşı əsər yazdığımı biləndən sonra gələrlər.

– Eh, sən qəribə adamsan, haradadır bizdə elə qanacaqlı tamaşaçı?!

## IV

Lakin konsert salonunda oturmağa yer yox idi. Çox adam cərgələrin arasında, geridə ayaq üstündə durur, gənc kompozitorun səhnəyə çıxmasını dərin bir intizar içində gözləyirdi. Bugünkü qəzetlərin axırıncı səhifəsində, Səbrinin yeni əsərinə dair bəzi qeydlər vardı. Məqalə yazanlardan biri sevinclə göstərir ki, cavan kompozitor zəngin xalq musiqisindən istifadə edib dərin, orijinal, sarsıdıcı bir simfoniya yaratmışdır. Bu fikri söyləyən, əlbəttə, "məşhur tənqidçi" Ağazadə deyildi. Görünür o, konsert günündən sonra yazacaqdı. Tamaşaçılar isə, Ədhəmin düşündüyü kimi, heç də kinli deyildilər. Onlar bəlkə Səbrini tamam unutmuşdular, yaxud altı il əvvəl eşitdikləri əsər haqqında Ağazadənin yazdığı sözləri etirazla qarşılayıb, Səbrini bir də dinləmək istəmiş, amma buna imkan tapmamışdılar. Səbrini də, əsərlərini də dinləyənlər üzünə həsrət qoyan o olmuşdu. Xalq isə, həmişə olduğu kimi, indi də sevməyi bacarırdı. O özünün böyüdüb yüksəltdiyi gənc oğlandan daha mənalı, daha istedadlı nəğmələr eşidib zövq almağa gəlmişdi.

Hələ konsertin başlanmasına yarım saat qalmış gələn Səbri, köhnə kostyumunda idi; o yalnız qara qıvrım saçlarını səliqə ilə darayıb, üzünü tərtəmiz qırxmışdı. O hər şeyi unutmağa səy edib, xeyli dalğın görünürdüsə də, konsert başlanan vaxtın elə bil qeyri-adi bir sürətlə yaxınlaşdığını duyub, ürəyi döyünə-döyünə estradanın yanındakı ağ məhəccərə söykənərək, oğrun-oğrun tamaşaçılara baxırdı. O, yenə birinci cərgədə Ağazadəni gördü. Yalnız intiqam üçün yaranmış bu insan, sümüklü eynəyinin altından dik-dik baxır, Səbri haqqında əvvəlcədən qərar hazırlayırdı.

Səbri tamaşaçılar içərisində yaxşı tanıdığı köhnə məktəb yoldaşlarını, qoca müəllimlərini, tanış qızları görəndə əllərinin titrədiyini, dərin və anlaşılmaz bir sevinclə dolan ürəyinin daha da şiddətlə döyündüyünü hiss edib, özünü toplamağa çalışdı və sonra qoca çalğıçıya dönərək soruşdu:

– Başlayırıqmı?

Uzun illərdən bəri dirijoru yalnız səhnədə, xeyli intizardan sonra görməyə vərdiş edən qoca, Səbrinin adi iclasa yaxud, gündəlik yaradıcılıq mübahisələrinə gələn adamlar kimi heç bir xüsusi hazırlıq görmədən, heç kəsi dalınca gəlib "Vaxtdır, buyurun" deməyə məcbur

etmədən gəldiyini xəfifcə bir təbəssümlə qarşıladı, mehriban və titrək bir səslə:

– Vaxtdır, – deyib Səbridən uzaqlaşdı.

Səbri yenə məhəccərə söykəndi. Ancaq indi tamaşaçılara yox, Bakının düz üstündən dənizə enmiş ayın sularda əks edən gümüş pullarına, böyük bir qurşaq kimi şəhərin boynuna dolanmış sayrışan sahil işıqlarına baxırdı.

Bu gün Bakı daha gözəl idi. Böyük Qorkinin Sovet Neapolu adlandırdığı bu şəhərin axşamlarını Səbri ta uşaqlıqdan sevirdi. Yalnız bircə dəniz, onun sahili döyən möhtəşəm dalğaları, qəşəng bir dairə kimi uzanan sahil boyu nəyə dəyməzdi.

Səbri elə bil hər şeyi unudub, yalnız doğma şəhərinin əfsanəvi gözəlliklərini daha yaxşı duymaq üçün buraya gəlmişdi.

İşıqlar dənizdə üzür, Bakı isə, sahillərdə dalğalana-dalğalana parıldaşan işıqlar dənizində alışıb yanırdı.

Bakı nə gözəl idi!..

Birdən kim isə Səbrini fikrindən ayırdı:

– Sizi gözləyirlər.

Konsert salonunu dolduran insan kütləsi, onu baş əyməyə məcbur edə bilmədi: “İndi yox, əsərimi ifa edəndən sonra alqışlarsınız!” – deyə fikirləşən Səbri dirijor çubuğunu yuxarı qaldırarkən, salon kiridi: alqışlar dərin və mənalı bir sükuta çevrildi. Gözlər bir nöqtəyə dikildi.

Səbrinin əsərində bir insanın taleyindən bəhs edilirdi: təbiətin dilbər qoynunda azad böyümüş insan rütubətli, dar və qaranlıq bir məhbəsə düşmüşdü. Uzun illər boyu sevinc üzünə həsrət qalmışdı. O düşünürdü, həyəcanlanırdı. Güclü yumruqları ilə məhbəsin dəmir qapılarını döyəcləyirdi, haqsızlığa qarşı üsyan edirdi. Amma yenə də zindanın qatı zülməti əksilmirdi. İnsan günəşdən, həyat işığından məhrum qalmışdı. Sonra o, birdən əzəmətli şəhərin küçələri ilə axıb gedən xalqın nəğməsini eşitdi: azadlıq nəğməsini!.. Bu nəğmədə əvvəlcə ona yad olan bir həyat eşqi çırpınırdı. Məhbus yenə çəmənləri, düzləri, zümrüd yamacları, yalqızlıqda keçirdiyi azad dəqiqələri xatırladı. O, atılmış pambıq tayaları kimi görünən ağ buludlar arasından solğun çöhrəsini göstərən ayı, dərədə ayın işığını əks edən şır-şır suları gördü... Sonra çobanın tütəyi inlədi. Sevdiyi nəğmə dağlara, dərələrə səs saldı. Küçələri dolduran xalqın nəğməsi daha güclü idi. Məhbəsdə inləyən insan da bu nəğməni dinləyirdi. Çoban tütəyinin əvəzinə minlərlə insanın

zindanı titrədən dəmir marşı səslənirdi: qaranlıq məhbəs elə bil yavaş-yavaş sarsılırdı. Məhbusun gözlərində birdən ümid qığılcımları parıldadı; o da, küçələri dolduran insan dənizinin nəğməsini duyaraq, sonra hamıdan gözəl, hamıdan qüvvətli bir ehtirasla bu nəğməni oxudu, səsini azadlıq gətirən xalqın qalib səsinə qatdı...

Ədhəm salonda idi. Onun da gözləri Səbriyə zillənmişdi. Onunla yanaşı oturan gözəl qız durna boğazını yuxarı qaldırıb, özünü də, salondakıları da, Ədhəmi də unutmuş kimi, birdən onun xəyalını alıb uzaqlara aparan bu yeni əsərə heyran qalmışdı.

– Əfşan, sənə nə olub, rəngin niyə ağardı?

Bu sualı verən Ədhəm idi. Amma Əfşan onun səsini eşitmirdi.

– Söz soruşuram, rəngin niyə ağardı?

– Yoldaş mane olma! – deyə arxadan kim isə nəzakətlə pıçıldadı.

Əfşan sualı eşitdisə də, cavab verməyə ehtiyac qalmadı: birdən böyük salon zəlzələyə düşmüş kimi titrədi. Alqış səsləri ta uzaqlara qədər yayıldı...

Əfşan ayağa qalxdı. Təəccüblə baxan Ədhəmi görmürmüş kimi, ona sarı baxmadan irəli yüyürdü.

– Səbri, Səbri!

Bu çağırış, sevgidən çox heyran olmuş insanın etirafına bənzəyirdi.

Səbri dönüb baxdı, qızı tanıya bilmədi. Lakin Əfşan lap yaxınlaşanda, Səbri onun əlini sıxıb, gülə-gülə göy haşiyəli yaylığı ilə alnını silərək dedi:

– Nə qədər dəyişmisiniz!.. Bəs Ədhəm hanı?

Əfşan bu sualdan inciyib gözlərini yerə zillədi.

Sualına cavab almayan Səbri çiyinlərini çəkdi. Sonra hər ikisinin gözü bir-birinə dikildi. Əfşan dərindən köksünü ötürdü, əlindəki gül dəməti də xəfifcə titrəyirdi. Bu nə idi? Etirafmı idi?!

Səbri yenə də alqış səslərini eşidir, utandığından bucağa çəkilir, nə isə demək istəyirdi.

Görəsən o sevinirdimi?..

*1938 – oktyabr, Bakı*

# ÇARPAYI

İsfəndiyar yuxudan oyanıb sakit-sakit ətrafına boylandı. Evdə ondan başqa heç kim yox idi. Qapı örtülü idi. Həyətə baxan balaca pəncərədən buludlu səmanın kiçik bir parçası görünürdü.

– Ana, ay ana!..

Bu iniltili çağırışa cavab verən olmadı. İsfəndiyar yerində dirsəklənib oturmaq istədi. Amma bədəninin şiddətli ağrısından gözləri yaşardı.

– Ana, ay ana!..

Onun ayağının ucunda, köhnə yorğanın üstündə büzüşüb rahatca yatan məstan pişik də yuxudan oyandı. O, zil qaranlıq otaqda xırdaca elektrik lampaları kimi parıldayan gözlərini açıb İsfəndiyara baxdı.

İsfəndiyar, bədəninin sızıltısını azaltmaq üçün böyrü üstə uzandı. Hərəkətsiz qalıb Məstan pişiklə xeyli müddət gözləşdi. Evin sükutu elə dərin idi ki, Məstan pişiyin xorultusu lap aydın eşidilirdi.

İsfəndiyar yaşarmış qara gözlərini ondan ayırmayıb, hər gün təkrar olunan adi söhbətinə başladı. Onun səsi titrəyirdi. Üz-gözündə ağır iztirabla dolu bir ifadə çırpınırdı. Bəzən onun gözlərində parıldayan sevinc bir an qədər qısa və insafsız idi. Bir an qədər...

– Məstan, ay Məstan, sən məndən xoşbəxtsən... Vallah hə... bax, görürsənmi, qıçlarımın ağrısından göz aça bilmirəm... Nə qədər istəyirəm yerimdən qalxım, olmur, ki, olmur... Hər yerim ağrıyır... Məstan, nə yaman xoşbəxtsən... Niyə bəs mən bədbəxtəm, Məstan?.. Yəqin indi uşaqlar məktəbə gediblər, bülbül kimi oxuyurlar... Həyətdə oynayıb gülürlər. Niyə mən belə yazığam, Məstan!

Birdən qapı cırıldayaraq açıldı. İçəri axan işıq, balaca otağın yarısını aydınlaşdırdı.

– Bu evdə yel xəstəliyindən başqa nə ola bilər ki?

Ayağı dolaşıb yıxılacağından qorxan doktor qaranlıqda ayağının altına baxa-baxa, ehtiyatlı addımlarla içəri girdi. Onun qabağınca gələn Badam xala, doktorun sözlərini eşitmədi.

– Nə dedin, doktor?

– Yel xəstəliyi rütubətli evlərdə olur...

Doktor buludlu gecədən belə qaranlıq olan bucaqda, yerə uzadılmış İsfəndiyarı görmürdü. O, əlini alnına dayadı və bir neçə saniyə dayanıb qaranlığa alışmaq istədi.

Sevincindən yerə-göyə sığmayan Badam xala donunun uzun ətəkləri ayağına dolaşa-dolaşa, cəld oğluna yanaşdı.

– Qadan alım, bala, doktor gəlib.

İsfəndiyar bir dəqiqəliyə hər şeyi unutdu. Əvvəlləri yalnız bir an üçün gözlərində parıldayan sevincin də ömrü uzandı.

– Eviniz rütubətdir, xala, çox rütubətdir!

– Bu azarın dərmanı yoxdurmu? – deyə. Badam xala səbirsiz xəbər aldı və geriyə dönüb doktora baxanda, üzünə düşən zəif işıqda onun gözləri təəccüblə parıldadı, – yoxdurmu, qadan alım?

Yalnız indi-indi qaranlıq evə alışan doktor qəmgin-qəmgin Badam xalaya baxdı. Onun baxışlarında yenə eyni sualı oxudu: "Bu azarın dərmanı yoxdurmu?"

– Dərmanı? Var, xala... Niyə yoxdur? Onun birinci dərmanı günəşli otaqdır...

Doktorun böyük bir ümidlə dediyi sözləri axıra qədər dinləməyən Badam xalanın bütün ümidləri alt-üst oldu. Yalnız doktoru çağırmaq üçün onun-bunun qapısında dörd-beş gün paltar yuyub üççə manat qazanmış arvad, günəşli otağı nə ilə ala bilərdi.

– Bəli, xala, günəşli otaq...

– Bahalı dərmandır, oğul...

Doktor xəstəyə yanaşdı. Yalnız indi şüşələrini yaylıqla silib taxdığı eynəyinin dalından İsfəndiyarın üzünə baxdı. İsfəndiyar zahirən çox sağlam görünürdü. Totuq yanaqlarından az qala qan damırdı, amma xəstə idi, özü də çox bərk xəstə idi.

Doktor dərindən köksünü ötürdü. Elə bil "heyf" deyə səsləndi. Sonra müayinəyə başladı.

– Şiddətli revmatizmdir. Heç olmasa, çarpayı alın... bəli, bəli, çarpayı... evinizin döşəməsi də yoxdur, xala... Oğlunuz yazıqdır... Yaxşı uşaqdır... Gələcəyi var... heyf olmasın.

İsfəndiyar eşitməsin deyə, doktorun pıçıltı ilə söylədiyi bu sözlər Badam xalanın ürəyinə ox kimi sancılırdı. "Heç olmasa çarpayı alın..."

Badam xala dünəndən köhnə kəlağayısının ucuna bağlayıb saxladığı göy üçlüyü çıxartdı, utana-utana, əli titrəyə-titrəyə doktora uzatdı.

– Lazım deyil, xala, almayacağam...

Doktor getdi, amma üçlük də qaldı, zindandan belə qaranlıq olan rütubətli otaq da qaldı. Günəş isə, yox idi. Çarpayı da yox idi.

Doktor getdi. Amma gözləri yaşarmış Badam xalanın: "Ay Tanrı, sən özün balama kömək ol!" deyən iniltili səsi də qaldı.

Məstan pişik yenə xorul-xorul yatırdı. Otaq yenə sakit idi. Qapı da örtülmüşdü.

– Çarpayı?.. Ana, çarpayı nədir?

Badam xala çarpayını pulla almadı, üç manata çarpayı verməzdilər: onun hər gün işlədiyi əlləri sağ olsun. O, çarpayını ana məhəbbəti ilə aldı. Amma hər halda aldı. Özünü də çiynində gətirib oğlunun yerini onun üstündən səliqə ilə saldı, sonra yenə hara isə getdi.

– Çarpayı... Ana, ay ana, mən sağalacağam, elə deyilmi?

* * *

Evdə heç kəs yox idi. Badam xala oğlundan xəbərsiz onun-bunun qapısında əlinin əməyini satmağa getmişdi. Namusunu qoruyan böyük ananın qolları hələ gücdən düşməmişdi.

– Məstan, ay Məstan, mən sağalacağam, elə deyilmi?

İsfəndiyar yenə darıxırdı. Uzun qış gecələrində bu cansıxan yalqızlığa dözmək olardı. Amma indi yaz idi. İsfəndiyar yenə də Məstanla gözləşir, yenə onunla söhbət edirdi. Pişik onun səsini eşidəndə, hər bir şeyi anlayırmış kimi, gözlərini ona zilləyir, yerindən qımıldanmayaraq, diqqətlə dinləyirdi.

– Ay Məstan, eşikdə qərənfil açılıb, dur, heç olmasa, sən get... Dur, dur,... sən ki, xoşbəxtsən...

Məstan yerindən qalxmadı, o yalnız dinləməyi bacarırdı. Pişik yenə büzüşüb xorul-xorul yatdı. İsfəndiyarı da yuxu apardı. Çarpayının üstü elə rahat idi ki...

* * *

Amma satın alınmış səadətin ömrü uzun deyilmiş. Birdən atışma səsləri Məstanı da, İsfəndiyarı da oyatdı.

– Məstan, ay Məstan, anam haradadır?

Bu həyəcanlı sualdan qorxmuş Məstan, çarpayıdan yerə atıldı.

– Qorxma, Məstan, qorxma... çarpayı məni sağaldacaq... Niyə qorxursan?..

Hər gün əldən-ələ keçən balaca şəhərdə vuruşma gedirdi. Top-tüfəng atırdılar. Nə üçün? Yəqin ki, insanlar gözəl həyat arzulayırdılar. Yazın təmiz havasından nəfəs almaq üçün əlləşirdilər.

Məstan pişik qapının ağzında durub yazıq-yazıq boylanırdı. Onun gözləri təəccübdən böyümüşdü. O, İsfəndiyar kimi, çarpayıya vurulmamışdı. Qapı açılsa, o dəqiqə eşiyə yüyürərdi.

Birdən qapı açıldı. Gələn Badam xala idi. Məstan onun böyründən sivişib eşiyə çıxdı.

– Dur qaçaq, oğlum!..

– Hara?

Ana ilə oğlun gözləri bir-birinə sancıldı. İsfəndiyar bir də soruşdu. Badam xala isə, onu tez geyindirib çarpayıdan yerə saldı. İsfəndiyar ağlaya-ağlaya çarpayının ayağını qucaqlayıb dizi üstə çökdü.

– Ana, ay ana, mən getmirəm, çarpayımdan ayrılsam, sağalmaram. Ana... Axı doktor deyirdi ki, yelin dərmanı çarpayıdır...

– Dur qaçaq, oğlum... Düşmənlər öldürərlər!

İsfəndiyar ancaq yaşamaq arzusu ilə çırpınırdı.

– Öldürərlər!

İsfəndiyar çarpayının ayağını necə tutmuşdusa, uzun dırnaqları ovcunun ətini qanatmışdı.

– Yox, ana, yox!..

Badam xala oğlunu sürüdü. Çarpayı da onunla bərabər sürünməyə başladı. Qapının ağzında İsfəndiyarın əli çarpayıdan üzüldü. O, yazıq anasının dalınca ağlaya-ağlaya iməklədi.

Silah səsləri yaxınlaşırdı. Məstan pişik çoxdan qaçıb harada isə gizlənmişdi. Adamlar isə yüyürüşürdülər. Dallarına baxmadan, ağlaşa-ağlaşa, bir səmtə doğru yüyürüşürdülər. Hamı şəhərdə üsyan qaldırmış ağ zabitlərin təqibindən qaçırdı. İnsanları qovub, ölümlə onları hədələyirdilər. Amma İsfəndiyar yenə də ölümün nə olduğunu bilmirdi. Onun gözləri yaşamaq arzusu ilə parıldayırdı.

– Ana can, məndən nə istəyirsən?

Badam xala onu sürüyürdü. Qucağından sıçrayıb yerə dəyən oğlunun uzun ətəyi yenə də onun əlində idi. Bəli, bəli Badam xala onu heç vaxt əlindən buraxmayacaqdır. İndi İsfəndiyarın bütün bədəni ağrıyırdı. Qıçları, əlləri, kürəyi, boynu necə ağrıyırdısa, gözlərinə qaranlıq çökmüşdü. İsfəndiyar heç kimi görmürdü. Hətta elə bil dəstə-dəstə qaçıb uzaqlaşan insanların asimana ucalan ağlaşma səslərini də eşitmirdi.

O ən əziz dostu, ən yaxın sirdaşı Məstan pişiyi də unutmuşdu. İsfəndiyarın qorxudan böyümüş məsum gözləri yalnız evdə qoyub getdiyi çarpayını görürdü.

– Ay ana, mən getmirəm!..

İsfəndiyar sürünürdü. Bədəninin sızıltısından daha da çox yaşarmış gözlərini silə-silə, toza-torpağa bulaşa-bulaşa, anasının dalınca sürünürdü.

Kimsəsiz arvada kömək edən yox idi. Hər kəs öz canının hayında idi. İnsanlar hər şeyi unutmuşdular.

Elə bil dünyada sədaqət, məhəbbət deyilən yüksək hisslərdən bir əsər belə qalmamışdı.

Badam xala yenə iniltili bir səs eşitdi:

– Ana can, mən yazıq deyiləmmi?

Birdən top mərmisi partladı, qara torpağı göyə sovurdu. Badam xala ağzıüstə döşənib toz-torpağın arasından keçdi. Ətrafı çulğamış qatı toz dumanları seyrəkləşəndə, Badam xala həsrət və intizar dolu gözləri ilə İsfəndiyarı aramağa başladı. O, görünmürdü. O, yox idi. Hara getmişdi? Məlum deyildi.

– Bala, İsfəndiyar!..

Badam xala İsfəndiyarın öldüyünü yəqin edib dörd yanına boylana-boylana, top gülləsinin dağıtdığı yerə sürünərək, dırnağı ilə torpağı eşələdi:

– Oğlum!..

Qara torpaqdan cavab gəlmədi. Badam xala tək qalmışdı. Bir irəliyə baxdı, bir də dönüb geriyə. İrəlidə, ondan xeyli uzaqda, yaşıl çəmənlərin arasından uzanan əyri-üyrü tozlu yolla böyük bir insan dənizi axır, dolu kimi yağan güllənin altında seyrəkləşə-seyrəkləşə, şəhərdən uzaqlaşırdı. Geridə isə qaçanların dalınca güllə yağdıranlar gəlirdi.

– İsfəndiyar, bala, haradasan?

Badam xala dizi üstə döşənib yenə süründü, süründü, hönkürtü ilə ağladı, onun arıq çiyinləri qalxıb endi, sonra birdən geriyə atıldı, ayaqlarına dolaşan uzun ətəklərini çırmayıb yüyürdü. O, heç nədən qorxmurdu. İnsanın bütün varlığını titrədən qorxu, ana məhəbbətinə təslim olmuşdu. Elə bil ki, Badam xala qulağının dibindən vıyıltı ilə uçuşan güllələrin səsini eşitmirdi. O, yüyürüb qabağındakı xəndəyə yıxıldı, otların içində görünməz oldu.

– İsfəndiyar!

Bu səs, çağırışdan artıq əks-sədaya bənzəyirdi. Yalnız bir neçə addım ondan aralı duran pulemyot, birdən-birə yox olmuş xəstə uşağını dörd gözlə axtaran anaya qəhqəhə ilə gülürdü. Ana gözləri isə, qovan və qovulan insanlar arasında yalnız birini, yalnız İsfəndiyarı axtarırdı. Nə üçün ondan səs çıxmırdı, "ana" deyə inləyən uşaq harada gizlənmişdi, o, isinməyə, ana qucağından isti yer tapa bilərdimi!

"Vəfasız oğul, məni tək qoyub haraya qaçdın? Ay bədbəxt bala, niyə məni gözü yaşlı qoydun!"

Badam xalanın fəryadını yalnız özü eşidirdi. Vurhavurdan qulaq tutulan ölkədə ananı dinləyən kim idi? Heç kim onu dinləmirdi.

Badam xala birdən donub qaldı. O da İsfəndiyar kimi ətrafındakı şeyləri unudub yalnız çarpayını görürdü.

– Çarpayı, hə, hə çarpayı. İsfəndiyar, hardasan? Gəlirəm, bala, gəlirəm...

Ana gözlərində sevinc yaşları parıldadı; o, İsfəndiyarı tapmamışdısa da, onun harada olduğunu bilirdi...

Göydən dolu kimi yağan güllələrə mərdliklə sinə gərib yüyürən kim idi? O qayaları, dağları yerindən oynatmağa qadir olan ana deyildimi, ananın ölməyən məhəbbəti deyildimi?

İsfəndiyar yox idi. Amma Badam xala sevinirdi. O, xoşbəxt idi. O indi İsfəndiyarın harada olduğunu yəqin bilirdi.

Badam xalanın uçuq, rütubətli və qaranlıq daxması yenə də öz yerində idi. Onun pəncərəsindən işığını salmayan günəş də, ağ-çəhrayı buludlar arasında üzürdü. Hər şey, hər şey öz yerində idi. Amma İsfəndiyar görünmürdü, bağların, bağçaların yaraşığı olan insanlar da görünmürdü. Nagahan qopan fırtınadan sonra, şəhərə əsrarəngiz, qərib, bir az da cansıxan, dərin bir ölüm sükutu çökmüşdü. Bir neçə dəqiqə əvvəl uzaqlardan arabir gələn güllə səsləri də indi artıq eşidilmirdi.

Məstan pişik qapının ağzında durub uçunurdu. Qorxudanmı, yalqızlıqdanmı, soyuqdanmı – demək çətindir.

Badam xala onu görmədi. Tez qapını açıb içəri girdi. Məstan pişik də onun dalınca yüyürdü. Badam xalanın gözləri qaraldı. Açıq qapının ağzında qoyub getdiyi çarpayı görünmürdü.

Badam xala bir dəqiqədən çox hərəkətsiz qaldı. Onun gözlərinə bir şey dəydi: çarpayı həmişəki yerinə qayıtmışdı:

– Oğlum!..

Ananın fəryadı sevincdən də qüvvətli idi. İsfəndiyar çarpayının üstündə uzanmışdı. Badam xala həyəcandan titrəyən qolları ilə onu qucaqlayıb bir an üzünə baxdı, sevincindən ağladı.

– Oğlum, İsfəndiyar, qadası, dur, dur... gəlib öldürərlər!

Ana oğlunun üzündən, gözlərindən öpdükcə, bayaqdan bəri çəkdiyi iztirabların ağırlığını unudub, neylədiyini bilmirdi.

– İsfəndiyar!

Yox, İsfəndiyarın yuxusu əbədi idi. Ölüm kimi əbədi.

– Bala, nə yaman ağır yatıbsan?..

Məstan pişik sıçrayıb çarpayının üstünə çıxdı. Həmişəki yerində çömbəlib İsfəndiyarın üzünə baxdı. O, görünür, dostunun söhbətinə qulaq asmağa hazırlaşırdı.

Badam xalanın gözləri böyüdü: İsfəndiyar al qan içində donmuşdu.

Ananın müdhiş fəryadı az qala bütün şəhərə səs saldı.

Məstan pişik dik-dik baxdı. Onun gözləri daha da böyüdü.

Məstan. ay Məstan, sən nə yaman xoşbəxtsən!.. Sənin balan yoxdur... sənin İsfəndiyarın yoxdur... Görürsənmi, onun anası vərəmləyib öləcək. Onun yeganə ümid çırağı söndü...

İsfəndiyarı kim öldürdü: – Çarpayımı?!

Yox, o, yaşamaq istədiyi üçün ölmüşdü, təqsirlərin də hamısı insanlarda idi. Zalım insanlar, bir çarpayını da ona çoxmu gördünüz?

*1938*

# MARAL ƏFSANƏSİ

*Əhməd Cəmilə ithaf*

Meşədə boğuq bir güllə səsi eşidildi. Sahil boyunda ağacların xırdaca budaqları titrəşdi. Saralıb solmuş yarpaqlar bir müddət havada qanad çalaraq, yerə səpələndi. Bu anda elə bil ağaclar arasında saysız-hesabsız kəpənəklər uçuşurdu. Sonra hər tərəfə qərib, əsrarəngiz bir sükut çökdü.

Meşəni gümüş xəncər kimi iki yerə bölmüş Kür çayı sakit-sakit axırdı. Arabir xəfif külək əsir, xəzan yarpaqların xışıldadırdı. Ətrafın dərin sükutunu pozan bu xışıltı birdən qüvvətləndi və çox keçmədi ki, güllə səsi gələn tərəfdən bir maral çıxıb özünü sahilə verdi. Hündür palıd ağaclarının arxasında yavaş-yavaş gizlənən axşam günəşi də sarımtıl bir rəngə çalırdı. Maral sahilə endiyi zaman artıq Kür suları da sapsarı olmuşdu. Maral yüyürdükcə, tez-tez büdrəyir, şax-budaqlı buynuzları ağaclara toxunurdu. Yenə də xəzəllər uçuşaraq, yerə qonurdu. Maralın keçib gəldiyi yerdə sarı yarpaqlar üzərinə qan damlaları çilənirdi. Bu qan, maralın döşündən axırdı. Birdən maral buynuzlarını bir az da yüksəyə qaldıraraq, ürkək nəzərlərlə ətrafına boylandı. Onun yaşla dolmuş iri qumral gözlərində bütün ümidləri puça çıxmış yazıq bir insan baxışının qəmgin ifadəsi vardı. Onun göz yaşları da günün ziyasını əks edib sarıya çaldı.

Təbiət nə üçün saralmışdı? Bəlkə bu, həyatın əbədi qanunu idi. Maralın göz yaşları daha da çox parıldadı. O, səssiz-səmirsiz dayanaraq, bir neçə an ətrafı dinlədi. Xəfifcə xışıldayan xəzəllərdən başqa heç nədən səs çıxmırdı.

Maral çoxdan bələd olduğu cığırla suya endi. Od içində yanan dodaqlarını Kürə söykədi. Bir xeyli müddət içdi. Yalnız bir kərə dərindən nəfəsini dərib yenə suya döşəndi. Onun sinəsindən axan iri qan damlaları sakit dalğalara qarışır, bir göz qırpımında su rənginə dönüb görünməz olurdu.

Birdən maralın sağ tərəfindən bulanıq sular arasından bir tısbağa başını çıxarıb onu salamladı.

– Xoş gördük, maral qardaş, – dedi, – səndən nə əcəb, bu gün belə tez gəldin? Hələ ki, şər qarışmayıb.

Yarasının sızıltısını indi daha çox hiss edən maral, həmişəki qüru-runu pozmadı. Çoxdan tanıdığı bu tısbağaya könülsüz bir cavab verdi.

– Heç... Bu gün hava çox isti oldu...

Tısbağa sudan büsbütün çıxdı. Sahilin payız otlarına sürtündü.

– Maral qardaş! – dedi, – mən bir az bundan əvvəl yenə sudan çıxıb günəşdə qızınırdım. Güllə səsi eşidib suya atıldım... Ovçu uzaq-dadırmı?

Maral dinmədi. Bu sözlər bir azca könlünə toxundu. İnsanları sev-məsə də, onların tısbağaya güllə atmadığını yaxşı bilirdi.

Birdən tısbağanın gözləri maralın döşünə zilləndi. O, təəccüblə baxdı və qorxudan titrəyərək, bir neçə kərə udqundu:

– Bu nədir, maral qardaş? Deyəsən yaralanmısan...

Maral yenə də qürurla cavab verdi:

– Bəli, – dedi, – çox ağır yaralanmışam. Ovçu məni dörd gündən bəri izləyirdi. O, məni çox axtardı. Dünən axşamüstü məni itirib Kürün o tayına, kəndə qayıtdı. Bu gün mən arxayın olub talaya çıxdım. Səhərdən rahatca otlayırdım ki, birdən güllə açıldı. Mən başımı qaldı-rıb baxdım, atan həmin ovçu idi. Düz sinəmə nişan almışdı.

Tısbağa marala daha yaxın gəldi. Diqqətlə onun yarasına baxdı.

– Eh, – dedi, – bilmirəm bu ovçu gözü tökülmüş sən maralnan mən maraldan nə istəyir?

Bu sözü eşidərkən məğrur maralın dizləri büküldü. İndiyədək damcı-damcı axan qanı birdən fəvvarə vurmağa başladı. Maral yerə yıxıldı.

Tısbağa ona daha da təəccüblə baxdı.

– Nə oldu, maral qardaş? – dedi.

Maral dərindən köksünü ötürdü və artıq qürub etmiş payız günəşi-nin son şüalarına həsrətli bir nəzərlə baxaraq dedi:

– Zalım ovçunun gülləsindən mən ölməzdim. Amma sənin sözün məni öldürdü...

*1939*

# NİŞAN ÜZÜYÜ

## I

Hələ gün çıxmamışdı. Təkdənbir əsən meh, həyətdəki badam ağacının xırdaca yarpaqlarını tərpədirdi və bu yarpaqlar tərpəndikcə, elə bil iki sevgili haradasa gizlənib yavaşcadan pıçıldaşırdı.

Bir az bundan əvvəl samovara od salıb yan tərəfdə oturmuş Əminə xala, yarpaqların pıçıltısını eşidirsə də, buna əhəmiyyət vermirdi: onun gözləri yol çəkirdi.

"...Ana! Dünən çox vuruşduq. Qabağımızdakı faşistlərin sayı bizdən beş dəfə çox olardı. Onların pulemyotları yağış kimi güllə yağdırırdı. Mən komandirimizin sol tərəfində durmuşdum. O bərk yaralandığına baxmayaraq, həmişə bizə ürək-dirək verirdi. Mənə də tez-tez, – Qorxma, Salman, – deyirdi, – gözlə, lap yaxına gələndə atarsan.

Mən əlimdəki qumbaranı hazır tutub düşmənin daha da yaxınlaşmasını gözləyirdim. Onlar sürünə-sürünə qabaqkı dikdirə çıxdılar. Mən az qala nəfəs almayıb komandirin əmrini gözləyirdim. Komandir əli ilə "Səbr elə!" işarəsini verə-verə, gözlərini düşmən gələn tərəfdən çəkmirdi. Birdən faşistlər ayağa qalxıb üstümüzə şığıdılar. Mən əlimdəki qumbaranı atdım. Bilmirəm dördümü, beşimi toz-torpağa qarışıb qaldı.

Ana! Mənim gülləm qurtarmışdı. Süngü davası başlandı. Gərək özün burada olub görəydin. Yalan olmasın, hərəmiz bir aslana dönmüşdük. Vuruşurduq, nə vuruşurduq... Faşistlər zərbəmizə dözməyib geri qaçdılar. Ax, ana, bu vaxt pulemyotumun bircə daraq patronu olaydı, gör onda heç bir faşist də sağ qaçıb qurtula bilərdimi!.."

Əminə xalanın gözləri yol çəkirdi. Oğlunun məktubunu azı yeddi-səkkiz adama oxutdurub tamam əzbərlədiyi halda, bir də təzədən oxutmağa bir adam axtarmaq fikrinə düşdü. Onun xəyalında ancaq bu sözlər dolanırdı: "Bircə daraq patron... Neyləyim?.. Bu iş əlimdən gəlmir, oğul... Yoxsa, bir daraq nədir, lap yüz daraq yollardım. Qalın corab deyil ki, gündə üç cüt toxuyam. Neyləyim?.."

Əminə xala samovarın səsinə fikrindən ayrıldı, tez durub samovarın qapağını götürdü, yanaqlarına dəyən isti buğdan üzü, alnı tərlədi. "Neyləyim, oğul, samovar deyil ki, o dəqiqə çayını dəmləyib hazır eləyim!"

Ananın xəyalından qəribə bir fikir keçdi: "Yox, sənə patron yollamayacağam. Onu hökumətimiz verər. O, heç vaxt sənin darda qalmağına

razı olmaz. Mən səndən ötrü qiymətli bir şey saxlamışam. Var-dövlətdən kasıb da olsam, dar gündə düşmənə möhtac olmaram".

Əminə xala tez çaynikə su aldı, samovarın qapağını yerinə basdı, "sonra yadımdan çıxar" deyə fikirləşib evə girdi.

Divar şkafının lap yuxarı gözündən alabəzək bir boğça çıxarıb döşəməyə qoydu; əli titrəyə-titrəyə boğçanı açdı. Burada hər nə desən vardı: ipək, şal, müxtəlif rəngdə qadın corabları, krep-deşin... Hamısını oğlunun nişanlısı üçün saxlamışdı. Boğçadakı şeyləri Əminə xala düz on ildə alıb yığmışdı. Hər dəfə açıb baxanda, ürəyi tel-tel olurdu. Ölməyib o günü görsəydi, heç dərdi olmazdı.

Əminə xala parçaların arasından nə isə götürüb yaylığa bükdü, qoynunda gizlətdi, sonra gəlib samovarı mizin üstünə qoydu. Uşaqlarını səslədi.

– Qalxın, bu qədər də yatmaq olar?

Yayın isti gecəsindən sonra bir qədər sərinləşən havada uşaqlar rahat nəfəs ala-ala yatırdılar. Əminə xalanın zil səsi, onların halına təfavüt etmirdi. Yalnız sonbeşiyi ağzını marçıldatdı , üzünü divara sarı çevirdi. Əminə xala onları çox istəsə də, uşaqlarını ərköyün böyüdən analardan deyildi. Elə-belə çağırıb oyada bilməyəcəyini görəndə, cəld onlara yanaşdı, hərəsinə bir dürtmə ilişdirdi; əlbəttə, bərkdən yox, yavaşcadan. Uşaqlar qalxıb geyindilər. Bir dəqiqədə sual-cavab başlandı:

– Ana, dünən samovarı aparıb fonda vermədin?

– Ana, mis qazanı aparmadın?

– Uşaqsınız oturun yerinizdə... Onu mən billəm.

– Özün demədin aparacağam?

– Dedim, amma aparmıram.

– Niyə ki, ana?

Bu suallar verilənə qədər bir az hirsli olan ana xeyli yumşaldı. Əvvəlcə balacalardan biri soruşdu, amma indi ikisi də gözünü ona dirəyib kirpiklərini qırpmadan cavab gözləyirdi.

– Samovardan nə olacaq? Soruşdum, dedilər, ondan cəmi-cümlətanı üç-dörd top gülləsi çıxar. Azdır də... Ayıb deyilmi?.. Nə var, nə var, Əminə arvad fonda dörd top gülləsi verib... Yox aparmıram...

– Eh, ay ana, sən bizi yoldaşlarımızın yanında niyə utandırırsan... Dünən bütün aləmə dedik axı...

Əminə xala yenə hirsləndi:

– Deməyəydiniz...

II

Əminə xalanın işlədiyi corab arteli fəhlələrinin yığıncağı uzun çəkdi. Çıxışlar qurtarandan sonra kim isə xəbər aldı.

– Bəs Əminə xala müdafiə fonduna bir şey vermir?

Ağız əyənlər oldu:

– Əşi, kasıb arvaddır nə verəcək...

Ömründə söz alıb danışmayan Əminə xala, elə bil bunu gözləyirdi. O, yerindən partladı.

– Niyə, nə olub, kasıbın qeyrəti olmaz?!. – Başladı, nə başladı. – Mənim toxuduğum corablar həmişə birinci sorta düşüb... Daha mükafat almaqdan yorulmuşam... Kasıb niyə oluram?

– Niyə hirslənirsən, Əminə xala?..

– Hirslənirəm, ona görə ki, haqqım var... Adam danışanda, bir az fikirləşsə, yaxşı olar!..

O bu sözləri deyə-deyə, əlini qoynuna saldı. Oradan səhər yaylığa bükdüyü şeyi çıxartdı, hələ açıb göstərməmiş, sözünü deyib qurtarmağa çalışdı:

– Dava qurtaranatan hər ay beş günlük məvacibim, bir mis qazan, bir mis samovar... Yaz də, nə durmusan, üzümə niyə baxırsan? Bir də ki... – Yaylıq açıldı.

– Bir də ki, bu üzük... Oğlumun nişan üzüyü... Üç min manat vermişəm... Yaz!

Əminə xalanı yaxşı tanıyan müdir razı olmadı:

– Yox, onu saxla, ağır olar. Axı o, sənin ən qiymətli şeyindir, xala.

İndi artelin bütün fəhlələri bu savadsız, az danışan, yalnız işini görüb o dəqiqə evinə qayıdan, sadə qadına baxırdı, ondan cavab gözləyirdi...

Əminə xala duruxdu, müdirə sərt cavab verməkistəmədi:

– Deyirsən ən qiymətli şey?.. Yox, bundan da qiymətli şeyim var...

– O nədir, xala?

Əminə arvadın səsi birdən titrədi, o indi bir ana kimi cavab verdi:

– Oğlum... Ona patron lazımdır... Bildin?..

*1941*

# DOST

## I

Boş qalmış kəndlərdə bir dəstə alman piyadasına kəndlilərdən Mariya Karpovna adlı bir qadın bələdçilik edirdi. Onun qırış-qırış olmuş üz-gözü qan-tərə batmışdı. Ayaqlarını güclə atırdı. Görünür çox uzun yol gəlmişdi. O, arıq, uzun, soyuq baxışlı, həmişə dartınaraq yeriyən, yalnız təkdənbir çox könülsüz bir tərzdə gülümsəyən alman zabiti ilə yanaşı gəlir, onun suallarına tez-tez, elə bil tələsə-tələsə cavab verirdi.

Zabit bu qadından evlərdə, həyətlərdə qalmış ən xırda şeylərin sayını belə öyrənmişdi. Kolxozçular kəndi tərk edib uzaq meşələrə çəkilərkən, özləri ilə tutub apara bilmədikləri toyuqlar, çolpalar, orada-burada gizlənmiş çoşqalar, meyvəsi dərilməmiş bağlar-bağçalar bütün dəstəni sevindirirdi. Üç gündən bəri yarıtox, yarıac yol gəlmiş soldatlar Mariya Karpovnanı dinlədikcə, ağızları sulana-sulana, daha da həvəslə addımlayırdılar.

Zabit kəndin girəcəyində dəstəni saxlayıb "farağat" komandası verdi. Onun fikrincə başıpozuqlar kimi belə nizamsız və dağınıq halda kəndə girmək yaxşı təsir bağışlamazdı. Soldatların üst-başı və yaraqları kimi, addım səsləri də kənardan tamaşaya çıxanları ilk baxışda heyran etməli idi.

Dəstə yenidən hərəkətə gələndə, zabit özü qabaqda, Mariya Karpovna isə, ondan iki addım aralı sağ tərəfdə, yenə danışa-danışa irəliləməyə başladı.

İndi bütün kənd görünürdü. Cərgə ilə tikilmiş təzə ağ evlər, küçənin hər iki yanından sakit-sakit axan balaca arxlar, göz işlədikcə uzanan dümdüz şose yolu, hər addımda rəng verib, rəng alan güllü-çiçəkli bağçalar – bir sözlə, illərdən bəri insan əli ilə cənnətə çevrilmiş geniş düz, ətirlə nəfəs alan gözəl dilbər bir guşə görünürdü.

Amma hər tərəf sükut içində idi. Səhərlər, günəş uzun şam ağacları arasından kəndə baxanda, səs-səsə verib ötüşən, pırıltı ilə budaqdan-budağa uçuşan balaca quşlar, indi nizamlı yürüşü pozmadan şose yolu ilə yeriyən piyadaların ayaq səsindən hürküşüb qaçışır, yoldan xeyli kənarda, meşənin dərinliyində gözdən itirdilər. Bundan sonra ətraf daha da sakitləşirdi.

Zabitin təəccüblə kəndə baxdığını görən Mariya Karpovna onun nə axtardığını bilmək istədi, həmişəki kimi qorxa-qorxa soruşdu:

– Nə olmuşdur, cənab zabit?

– Bəs hanı kəndlilər, nə üçün bizi qarşılamırlar?

Qorxudan gözləri daha da böyüyən Mariya Karpovna tələsik cavab verdi:

– Qaçmışlar, cənab zabit!

Bu sözlərdən qaşı çatılan zabit öz batqın səsi ilə bir az da ucadan xəbər aldı:

– Haraya?

– Partizanlığa...

– Nə? Partizan?.. Bu nə sözdür?

Zabitin gözləri kəlləsinə çıxdı. Ona elə gəldi ki, elə bax, bu dəqiqə sağdan-soldan, daldan-qabaqdan üstlərinə güllə dolu kimi yağacaq və hamısı bir-bir düzün ortasında uzanıb qalacaqdır. Amma yenə də hər tərəf sakit idi. Yalnız uzaqlara qaçmış quşların həzin nəğmələri eşidilirdi.

– Demək hamısı partizan? – deyə zabit udqunaraq hər iki yanına boylandı, qəzəbini gizlədə bilməyib təkrar soruşdu:

– Demək hamısı?

– Yox, burda qalanı da var, cənab zabit.

– Elə isə, nə üçün bizi qarşılamırlar, xanım?

Mariya Karpovna başını aşağı saldı, dinmədi.

– Burada qalanlardan qaçanların yerini xəbər alarıq, deyilmi?

Mariya Karpovna bu sualı da cavabsız qoydu. O xeyli fikrə getdi. Sonradan-sonraya, zabitin gözü kənd evlərinə zillənərkən, o yalnız özünün eşidə biləcəyi bir səslə dedi:

– İnanmıram deyən olsun... Mən özüm də onların yerini bilmirəm, cənab zabit.

Ətrafdan bir an belə gözlərini çəkməyən zabit, heç kimə müraciət etmədən, kinli-kinli, hətta bir az rəsmi cavab verdi:

– Mən dedirdərəm!

Bu sözlər Mariya Karpovnanı təəccübləndirdi. "Bunun qulağı nə yaman itidir" deyə sürətlə xəyalından keçirtdi və dəstəni birbaş kənd sovetinin iki mərtəbəli daş evinin qabağına gətirdi.

Zabit soldatlardan bir neçəsini yollayıb, kənddə qalmış adamları buraya toplamalarını əmr etdi, özü isə divara söykədilmiş skamyada oturub, çəkməsinin toz basmış boğazını yuxarı çəkdi və cibindən papiros çıxarıb yandırdı.

Mariya Karpovna onun yanında oturmağa cəsarət etmirdi; izin istəməyə də üzü gəlmirdi. Amma, doğrusu qıçları yamanca sızıldayırdı. Ayaqlarının altı yəqin sudur olmuşdur. Zarafat deyildi, pay-piyada on-on iki verst yol, özü də qadın xeylağı, hələ zabitin bir-birindən çətin sualları – xülasə indi hər şey yaddan çıxmışdı: yorğunluq güc gəlirdi. Zabit iltifat edib “otur” desəydi, Mariya Karpovna ona dönə-dönə təşəkkür edərdi. Lakin nə zabit “otur” dedi, nə Mariya Karpovna təşəkkür edəsi oldu.

Soldatlar bütün evlərin altını üstünə çevirib əllərinə keçən xırda-xuruşları və kənddə qalan qarıları toplayıb gətirdilər. Soldatların birinin qoltuğunda iynə-sapla dolu balaca bir qutu vardı. O biri köhnə bir qadın tuflisi gətirmişdi. Üçüncüsünün əlində balaca, kök bir çoşka çır-çır çığırırdı.

Mariya Karpovna gətirilən adamları saydı. Hamısı altı nəfər qadın idi.

O, Zabitə yanaşdı, tərli alnına yapışmış saçını geriyə tərəf sığallayaraq, “raport” verdi:

– Kənddə bunlardan başqa bir nəfər də qalmışdır, cənab zabit... – sonra soldatlara müraciətlə soruşdu: – Bəs o hanı?

Zabit qəzəbindən ayağa qalxıb, adəti üzrə, dartılmış bir vəziyyət aldı:

– Bu nə cəsarətdir?

– Yəqin hardasa gizlənmişdir. Yaxşı axtarın. Bax, o evi görürsünüzmü, kolxozun anbarıdır. Orada tapmasanız, klubun dalını axtarın... Suflyor budkasına baxın.

Zabit soldatları bir də yolladı. Onlar çox axtardılar. Yenə tapa bilmədilər.

– Bəlkə qaçmışdır?

Mariya Karpovna təkid elədi:

– Buradadır, buradadır, mən getsəm taparam...

O, soldatların qabağına düşüb anbarı, klubun zalını, evləri gəzməyə başladı gümanı gələn yerləri daha diqqətlə, dönə-dönə yoxlatdı. Qulluğunda sona kimi sədaqət göstərəcəyinə and içmişdi. Bağlara, bağçalara qədər, hər yeri gəzdilər, lakin o adam tapılmadı.

Mariya Karpovna pərt oldu. Bu vaxtacan səbirlə gözləyən zabit, ona bərk təpindi:

– Onu tap! – dedi, – yəqin duyuq düşmüşdür.Təqsir səndədir!

Mariya Karpovnanın bədənindəki sızıltı yox olub getdi, zabitin qabağında əyilərək, səsi titrəyə-titrəyə yalvardı:

– Xahiş edirəm, bir saat möhlət verin, mən onu yerin dibində də olsa, tapıb gətirəcəyəm.

– Yaxşı, olsun, – deyə zabit cavab verdi. – o tapılmasa, siz cəzalanacaqsınız.

Mariya Karpovna bir nəfər soldatla bərabər getdikdən sonra, zabit altı nəfər qadının üstünə gözətçi təyin edərək, kənd soveti sədrinin kabinetinə girdi. Yazı stolunu yemək stoluna çevirdi. Yarım saat belə keçməmişdi ki, bütöv qızardılmış çoşqanı gətirdilər.

## II

Bir saata qayıtmağı vəd edən Mariya Karpovna, üç saatdan sonra da qayıtmamışdı. Yanınca getmiş soldatın təkid etməsinə baxmayaraq o, inadından dönmədi və meşənin qalın yerlərini, xəndəkləri gözdən keçirərək, nəhayət meşə gözətçisinin daxmasına gəlib çıxdı.

– Burada da olmasa, demək, qaçıb partizanlara qoşulmuşdur... – deyə Mariya Karpovna pıçıldadı, üzünün tərini silməkdən qara əskiyə dönmüş yaylığını çıxartdı, bir də alnının tərini sildi, – amma çox ehtiyatlı tərpənməliyik, meşə gözətçisinin tüfəngi var, o buradadırsa, ikimizi də öldürər. Özü köhnə partizandır. Faşistləri görməyə gözü yoxdur...

Soldatın rəngi dümağ oldu. Onun fikrinə gəldi ki, birdən Mariya Karpovna partizanlarla əlbir olar, qəsdən onu aparıb təslim edər, onlar da kəndə hücum çəkib bütün dəstəni qırar. Odur ki, Mariya Karpovna "bəri gəl" deyib meşə gözətçisinin daxmasına tərəf addımlayanda soldat yerində mıxlanıb qaldı, onun xırdaca gözləri bir an içində böyüyüb hədəqəsindən çıxmaq dərəcəsinə gəldi.

– Bəri gəl, cənab, – deyə qadın təkrar edərkən, soldat bir neçə addım da gerilədi, cəld tüfəngini atəşə hazırladı:

– Siz baxın, – dedi, – mən burada gözləyəcəyəm qorxmayın, xanım, nədən qorxursunuz? Gedin, içərini yoxlayın, lazım gəlsə, mən sizi müdafiə edərəm... Qorxmayın, xanım, qorxmayın!..

Mariya Karpovna daxmanın qapısını açdı, astaca addımlarla içəri girdi. Xəyalından min cür fikir gəlib keçən soldat isə, tüfəngini irəliyə sarı uzatmış olduğu halda, yerində donub qalmışdı.

Birdən Mariya Karpovna göründü və səsini çıxarmadan soldata əl elədi: "Bəri gəl, buradadır".

Onlar birlikdə içəri girərkən, soldat əvvəlcə zil qaranlıqdan başqa heç nə görmədi. Bir qədər duruxdu. Gözləri qaranlığa alışdıqdan sonra, dibdə oturmuş bir qadın kölgəsi nəzərini cəlb etdi: onun qabağında dalıüstə uzadılmış bir uşaq vardı.

– Ölmüşdür, – deyə Mariya Karpovna sevincini gizlədə bilməyib gülümsündü, – bolşevik özündən sonra onu bizim başımıza bəla eləmək istəyirdi, amma vaxtında ölmüşdür.

İndi ölmüş körpənin cavan anası lap aydın görünürdü. O, danışılan sözləri yaxşı eşidirdisə də, üzündəki ölgün ifadə zərrə qədər də dəyişmədi. Dolğun, ağ yanaqlarına tökülmüş qonur saçları, qeyri-müəyyən bir nöqtəyə dikilmiş iri gözləri, yalnız bir şeyi ifadə edirdi: Kədər...

– Dur, biz səni aparmağa gəlmişik, – deyə soldat ucadan əmr verdi.

– Uşağını da götür, hə, hə bəlkə səni də, onu da bir qəbirdə basdırdıq...

Bu ana kimi daşdan yonulmuş bir heykəli andıran qadın, birdən sərt bir hərəkətlə Mariya Karpovnaya tərəf döndü, qəzəblə alışıb yanan gözlərini ona zillədi:

– Bu sənin köhnə sənətindir, – dedi və onun səsi titrədi, – indiyə kimi özünü satırdın, indi də bizi satırsan...

– Mən gizlətmirəm, beş günlük dünyadır, kefini çək, vur başa! Hərənin bir şeyə xoşu var, mənim də buna...

– Amma yenə də gözün kişilərdən doymadı, bundan sonra soldatları görərsən.

– Görərəm, niyə görmürəm... Səndən istəsələr, razı olma, ancaq mən zabitlə dünəndən dostlaşmışam...

– Ax, fahişə! – deyə qadın nifrətlə tüpürdü.

Soldat onun qolundan tutub ayağa qaldırdı.

– Gedək.

Mariya Karpovna uşağı göstərərək:

– Qoy götürsün, – dedi. – ana ilə balanı bir qəbirdə basdırmaq daha maraqlı deyilmi?

– Sənin kimi namussuz yaşamaqdansa, ölmək yaxşıdır...

Mariya Karpovna isə gülərək:

– Bu gün mənim bayramımdır, – dedi.

Ana ehmalca uşağı qucağına aldı. Eşiyə çıxdılar. Qüvvətli gün işığında, onun üzündəki qurumuş yaş zolaqlarını Mariya Karpovna da, soldat da aydın gördü.

## III

Onlar qayıdana kimi zabit də, soldatlar da yeyib-içib, bərk hallanmışdılar. Bayaq qışqıraraq həyəti başına götürmüş çoşqa, indi həzmrabedən keçmişdi.

Mariya Karpovna sevincindən bütün yorğunluğunu unutmuşdu. Ona bir belə əziyyət verən qadın, artıq zabitin hüzurunda idi.

Zabitin əmri ilə əsir qadınları da həyətə gətirdilər, sıraya düzdülər. İndi onlar yeddi nəfərdi. Zabit hər biri ilə ayrı-ayrı tanış olmaq istədi.

– Bu kimdir?

– Köhnə mülkədar qızıdır. Özü müəllimədir. Amma bizim adamdır, cənab zabit!

– Kolxozda varmı?

– Yox, yox, yazıq deyil?!

– Aha, demək kolxozdakıların hamısı yazıqdır?

– Əlbəttə, cənab zabit!

– Niyə ki?

– Çünki kolxoz...

Zabit onun sözünü kəsdi:

– De görüm, – füreri sevir, ya yox?

– Siyasətə qarışmır, cənab zabit... Dərsini deyib evinə qayıdır...

– Aha, bu yaxşı olmadı... Siyasətdən uzaq gəzmək yaxşı deyil.

– Bundan sonra qarışar, cənab zabit.

Zabit o biri qadına yanaşdı:

– Bu kimdir?

– Duldur... Məktəbin xidmətçisi idi...

– Bizə münasibəti necədir?

Mariya Karpovna qərəz işlətdi (o, meşədə cavan bir oğlanla mazaqlaşarkən, həmin qadın bu əhvalatı görüb aləmə bildirmişdi), hayıf aldı:

– Kommunistlərin quyruğudur.

– Çox gözəl!

Zabit papiros yandırdı. Dərindən bir qullab vurub Mariya Karpovnanın gətirdiyi qadını göstərərək, qaşqabağını turşutmuş halda soruşdu:

– Bəs bu kimdir?

– Kommunistdir, cənab zabit... Həmişə dram dərnəyində oynardı.

– Çox maraqlıdır... Demək, kommunist qadınlar belə olurmuş?!

Zabitin papirosu əlindən yerə düşdü. O bilavasitə qadının özünə müraciət etdi:

– Adın nədir, cənab kommunist?

O dinmədi, gözlərini qucağındakı uşağın göyərmiş yanaqlarına dikib qaldı.

– Adı Tatyanadır, – deyə Mariya Karpovna cavab verdi.

Zabit gülümsünərək, ona lap yaxın gəldi:

– Mən aktrisaları çox sevirəm, – dedi, – müharibədən əvvəl hər gün teatra gedərdim. Sən hansı rolları yaxşı oynayırsan?

Tatyana yenə dinmədi.

– Amaliyanın rolunu... – deyə Mariya Karpovna böyürdən qabağa soxulmaq istədi.

– Amaliya? Bu ad mənə tanış deyil. Görünür, sovet pyeslərinin qəhrəmanlarındandır.

Tatyananı gülmək tutdu. "Yazıq Şiller" – deyə fikirləşdi, nə isə demək istərkən, gözləri yenə uşağına sataşdı, dodağının ucundakı xəfif təbəssüm birdən söndü.

Zabit qadınların hamısını danışdırdıqdan sonra təzədən geri qayıdıb Tatyananın qabağında durdu:

– Məni maraqlandıran bir məsələ var; nə üçün sən partizanlara qoşulmamısan?

Bu dəfə Tatyana dilləndi:

– Uşağım xəstə idi, doktor demişdi açıq havaya çıxmasın.

– Yalandır, o qəsdən qaldı, casusluq etmək üçün...

– Doğrudanmı?

Tatyana cavab vermədi. Onsuz da heç kim sözünə inanmazdı.

Birdən zabit soldatlara bağırdı:

– Divara söykəyin!

Tatyananı uşağı ilə bərabər qarşıdakı evin divarına söykədilər. Həyətdəki qadınların hamısı, elə bil komanda ilə, birdən ona sarı baxdı. Ortalığa dərin bir sükut çökdü. Hamıdan əvvəl dindirilən müəllimə, sıradan bir addım qədər irəli çıxdı. Amma heç kim onun bu hərəkətini görmədi. Tatyana yenə də qızının donmuş yanaqlarına baxırdı. Onun ölümə belə laqeyd olduğunu görəndə, zabit də özündən çıxdı, cəld addımlarla ona doğru getdi:

– Sən qorxmursanmı? – deyə hirsindən boğula-boğula soruşdu.

Tatyana qızının dodağından öpdü:

– Nata, – dedi, – bax, Ukraynanı sevdiyi üçün ananı öldürürlər. Olsun! Amma bizim qanımız yerdə qalmayacaq... qızım...

Güllə açılanda, Nata anasının əlindən yerə düşdü; onun sinəsində üç-dörd yerdə xırdaca qan ləkəsi göründü. Tatyana isə, bütün vzvodun güllələrindən deşik-deşik olub, Natadan bir addım geridə ağzıüstə yerə sərildi.

Hamının gözü onda idi, heç kim, müəllimənin yanaqlarında parıldayan yaş damlalarını görmürdü. O, yaylığını çıxartdı, gizlincə gözünün yaşını sildi. Onun ürəyini bir söz qılınc kimi yardı: "İntiqam!"

Sonra Mariya Karpovnaya yanaşdı:

– Sağ ol! Biz yəqin yenə görüşəcəyik... – dedi.

– Əlbəttə, Anna İvanovna, bundan sonra bir yerdə olacağıq.

Bayaqkı səs isə, yenə ona rahatlıq vermir, qulağında təkrar olunurdu: "İntiqam!"

IV

Gecə idi. Hamı yatmışdı. Axşamdan kəndin üstünü bürümüş çiskinli duman, şimaldan əsən soyuq küləyin qabağınca yavaş-yavaş çəkilib getdikdən sonra, şam ağaclarının üstündə qızıl rəngə çalan, orağa bənzər bir ay doğmuşdu.

Hamı yatırdı. Bütün kənddə yalnız iki adamın gözünə yuxu getmirdi. Bir növbədə duran faşist soldatının, bir də... Anna İvanovnanın.

O, doğrudan da mülkədar qızı idi. Alman zabiti də hamıdan çox ona inanırdı. Axşamüstü əsir qadınları dama doldurduqları zaman, zabit demişdi:

– Onu buraxın!.. Evinə gizləyir, ürəyinə, əsəblərinə, beyninə rahatlıq vermirdi.

O birdən ayağa qalxdı, paltarını cəld geyindi, eşiyə çıxdı. Onun ilk dəfə gözünə dəyən, evin düz pəncərəsində əks edən ay oldu. O nə gözəldi! Hələ səma!.. Anna iyirmi dörd illik həyatında belə saf, belə dərin Ukrayna səmasını görməmişdi. Bu nə üçün belə idi? Bəlkə Annaya belə gəlirdi? Hələ göyün üzünə inci dənələri kimi səpələnmiş saysız-hesabsız ulduzlar, gecənin möhtəşəm sükutu içində yatmış kimi görünən şam ağacları, meh əsdikcə xoş bir ətir verən bağçalar nəyə dəyməzdi!..

Yox, bunlar doğrudan da gözəl idi. Anna həmişə gördüyü bu dibsiz fəzanı, bu uzun şam ağaclarını, ətrafda gözə dəyən hər şeyə xüsusi bir lətafət verən bu sükutu sonsuz bir məhəbbətlə sevdiyini elə bil yalnız indicə anladı və dərindən köksünü ötürdü.

Onun ayağı qapı ağzındakı velosipedə toxundu. Bir əlli ondan yapışıb Tatyananın güllələndiyi həyətə sarı addımladı. Gözətçini görərkən duruxdu, evin böyrünə qısıldı. Gözətçi uzaqlaşan kimi geriyə qayıtdı. Səssizcə yeriyərək şose yoluna çıxdı. Ətrafına boylandı. Nəfəs almadan bir neçə an yerində dayanıb qulaq verdi, ürəyinin şiddətli döyüntüsündən başqa heç bir səs eşitmədi. Yenə irəlilədi. Kənddən bir kilometr qədər uzaqlaşdıqdan sonra, velosipedi minib sürdü...

## V

O çox aradı. Amma yorulmadı. Yalnız gecənin qeyri-adi bir sürətlə keçəcəyindən qorxurdu. Vaxtın ətəyindən tutub saxlamaq mümkün olsaydı, Anna heç bir şeyini əsirgəmədən məmnuniyyətlə bu işi görərdi.

Birdən:

– Dayan! – dedilər.

Bu səsi Anna tanıdı; işlədiyi məktəbin müdiri Semyon Burmenko idi.

– Mənəm, Semyon Tarasoviç.

– Sən kimsən?

– Anna!

O, velosipeddən düşüb Burmenkoya tərəf addımladı. Partizanların bir dəstəsi, yolun altında, ağacların dalında, səngər tutmuşdu.

– Nə var, Anna İvanovna?

– İntiqam! – deyə müəllimə hönkürərək müdirinin qolları üstünə düşdü. – Bax! Mən...

Annanın dili söz tutmurdu. Hamı dinməz-söyləməz dayanaraq başçılarının əmrini gözləyirdi.

Burmenko heç bir kəlmə də danışmadı. Cibindən yaylığını çıxarıb Annanın göz yaşını sildi, sonra yoldaşlarına baxdı, tüfəngini yoxladı, papirosunu yandırıb ovcunun içində çəkə-çəkə, dəstədən aralandı.

– Ölümə ölüm!.. – deyə xırıltılı bir səslə dilləndi. – Gedək, yoldaşlar...

## VI

Vuruşma uzun çəkmədi. Partizan davasının qaydası belədir. Zabitlə soldatlar hələ dünənki içkidən ayazımamış, həyatla vidalaşmalı oldular.

Mariya Karpovnanı güllə səsləri yuxudan oyatdı.

Onu Tatyananın güllələndiyi yerə gətirdikləri zaman günəş yenicə doğurdu... Ukrayna səması yenə də saf və dərin idi...

– Mariya Karpovna, özünüz deyin, sizin cəzanız nə olmalıdır? – deyə Burmenko xəbər aldı.

Ondan səs çıxmadı.

Hamının gözü onda idi.

– Siz deyin Anna İvanovna!..

– Mən?.. Nə deyim? Xalqın qərarı daha ədalətli olar.

Burmenkonun tapançası açıldı.

Sonra ana ilə balanın qəbri üstünə dəstə-dəstə çiçəklər səpələndi.

*1942*

# QARA GÖZLƏR

## I

Qərargah, top mərmilərinin xarabaya döndərdiyi kiçik bir Ukrayna kəndində idi. Səhərdən bəri aramsız atılan güllələr vıyıltı ilə uçuşaraq harada isə yerə düşür, kim bilir, bəlkə də insan ətinə dəyir, gurultu ilə başladığı halda inilti ilə qurtarırdı.

Aslan çoxdan cəbhədə idi. Hələ Baltik sahilləri yay səhərinin xəfif dumanlarından sıyrılıb çıxmamış alman təyyarələrindən yağan bombalar hər yanı oda qalayanda, o da yoldaşları ilə bərabər hissələrinin dayandığı qəsəbədə hövlnak yuxudan oyanmışdı. Qırx birinci ilin iyun ayında qopan bu fırtına zamanı alman təyyarələri lap aşağıdan uçur, mavi rəngli pəncərələrin bərabərinə enərək, şığıya-şığıya evlərin içərisini atəşə tuturdu...

O vəfasız gündən düz iki il keçmişdi.

İndi Aslan Ukrayna düzlərində vuruşurdu. O ağır, qanlı rücətdən sonra, daha ağır, daha qanlı bir əks-hücum başlanmışdı. İnsanların üzü gülməsə də, ürəyi gülürdü. Rücət günlərində hər qarış torpaq üçün verilən qurbanların xatirəsi indi birdən-birə canlanır, qızıl cəngavərlərin geri atdığı hər bir ev öz qoynunda ziqiymət dəfinə gizlədən böyük saraydan belə əzəmətli görünürdü.

Aslan, xarabalar arasında salamat qalmış bu evlərdən birinə yanaşdı. Albalı ağaclarilə əhatə olunmuş bu kənd evinin divarları uzun, inadlı vuruşmaların yaxın xatirələrini yadigar saxlamışdı: mərmi qəlpələri bu divarlardan qopardığı daş parçalarını kənara atmış, bir az o yanda irili-xırdalı çuxurlar əmələ gəlmişdi. Albalı ağaclarının dibdən zədələnmiş budaqları yerə sarı əyilmişdi. Ancaq meyvə bağı hər tərəfə yenə də məstedici bir ətir saçırdı. Ucu yerə dəyən qırıq budaqlar üzərindəki bol meyvə də rəng verib rəng alırdı. Yaralı torpaq həyat, gələcək ümidlə dirçəlirdi. Sanki qırıq budaqlar da doğrulub yerlən qalxmaq üçün qüvvə toplayırdı.

Aslan, yaşamaq istəyən insanla, təbiətin bu inadı arasında qəribə bir müşabihət görürdü. Ona elə gəlirdi ki, bu qırıq budaqlar bir az sonra yerdən üzülüb yuxarı qalxacaq, bu pozulmuş tənasüb yaxın bir zamanda müvazinət kəsb edəcəkdir. Əslində o, bu ümidlə yaşayır, bu ümidlə vuruşurdu. O, iki ildən bəri öz gözüylə gördüyü hadisələri, müharibənin

qanlı səhnələrini heç bir zaman unutmasa da, bu qəribə ümid onun əsəblərinə xeyli təskinlik verir, bəzən həyata, insanlara nifrət təlqin edən müharibənin özü də bu ümidin qarşısında kiçilib haradan, necə qopduğu məlum olmayan bir borağan məqaminə enirdi... Hətta meyvə ağaclarından ətrafa yayılan ətir belə onun nəzərində kəndlərə, şəhərlərə ölüm gətirən ən müdhiş qüvvələrdən də güclü idi!..

Aslan od, alov içindən yeni çıxmışdı. O tərəflərdə, sahil boyunda vətən torpağının hər qarışı üçün yenə də irəli atılan dostları bir an belə onun xəyalından çıxmırdı. Bir səs onu fikrindən ayırdı. Qapı ağzında görünən zabit – Aslan Haşımzadə!.. – deyə onu çağırdı.

Aslan əlindəki albalı budağını yerə atdı. Sürətlə qapıya yanaşdı. İçəridə ağsaçlı ordu komandanı ilə üz-üzə gəldi. Çoxdan tanıdığı bu qoca əsgər qürurla parıldayan mavi gözlərini Aslanın üzünə dikdi, hərarətlə onun əlini sıxdı:

– Sağ ol, Azərbaycan balası! – dedi. Qocanın üzündəki təbəssüm izləri birdən-birə çoxalıb, öz doğma oğlunun rəşadətindən xəbər tutmuş bir atanın sevinci qədər qüvvətli bir ifadə aldı. Bu anda onun gözləri haraya isə məchul bir nöqtəyə zilləndi, bir neçə ay əvvəl şahidi olduğu bir hadisə sürətlə onun xəyalından gəlib keçdi.

O gün Aslan köhlən at belində dörd nala çaparaq qıy vurur, ildırım kimi şığıyan igid süvarilərin qabağınca əlində siyirmə qılınc çapır, düzə səpələnmiş düşmən piyadalarını biçib-tökürdü. Ordu komandanı uca bir təpədə, müşahidə məntəqəsində idi. Əlindəki durbinlə Aslanın hər bir zərbəsini aydın görürdü. Öz gənclik illərini xatırlayır, hələ qorxunc silahlar icad olunmamış zamanlarda əsgərdən cəsarət, mərdlik, çeviklik tələb etdiyi günlər yadına düşürdü: "Əsil müharibə o idi!.." – deyə fikirləşir, qeyri-ixtiyari gülümsəyirdi.

– Sağ ol!.. – deyə ordu komandanı daha da ucadan təkrar etdi. – Sən özün o gün sarı almanlardan yüzünü vurub yerə sərdin... Yeddi ölümcül yara alsan da, köhlən atından yıxılmadın, bax, indi sağalıb yenə də vuruşursan... Al, oğlum, qoy bu şöhrət nişanları sinəni bəzəsin. Sədaqətlə döyünən ürəyin bir dəfə də titrəməsin!

Aslan Qızıl Ulduzla qırmızı lentalı nişanı alıb təşəkkür edərkən, komandan kimi onun da gözləri sonsuz bir qürur, hədsiz bir sevinclə parıldayırdı. O, nə isə demək istəyirdi. Lakin sözlər elə bil boğazında tıxanıb qalırdı.

O, bir neçə an sükutla qocanın üzünə baxdı. Sonra özünü toplayıb, sağ əlini yuxarı qaldırdı, rəsm-təzimə durdu.

– Əziz vətənə qulluq etmək borcumdur, yoldaş general-leytenant, – deyib, əlini yanına saldı. Belə hallarda hamının təkrar etdiyi sözü – "Sovet İttifaqına xidmət edirəm" sözünü xatırlamadığına təəccübləndi. "Eybi yoxdur" – deyə özünə təsəlli verdi. Sonra yenə komandana müraciətlə çoxdan bəri ürəyində qövr edən bir fikri söylədi:

– Məni bağışlayın, yoldaş komandan... bəlkə də bu sözün yeri deyildir. Mən intiqam almaq üçün yox, elə belə məlumat üçün deyirəm.

Komandan yenə gülümsəyərək, Aslana lap yaxın gəldi, əlini onun çiyninə qoydu:

– Söylə, çəkinmə, – dedi.

Aslan bu mehriban insana ürəyinin ən gizli sirlərini də aça bilərdi:

– Məni əlbəttə...

Onun səsi titrədi... Sözünün dalını unutdu. Komandan Aslanın həyəcanlandığını görüb təəccüblə baxdı:

– Yoxsa evə getmək istəyirsən?.. – dedi.

– Yox... mənim deyəcəyim söz Azərbaycana və azərbaycanlılara aid olacaqdır...

– Buyur, buyur, mən dinləyirəm.

– Mən bilirəm ki, siz Azərbaycan əsgərlərini layiqilə tanıdınız. Artıq hamı görmüşdür ki, biz azərbaycanlılar müharibədə ən vəfalı yoldaşıq. Lakin bu böyük sözün mənasını təhqir edənlər də vardır.

– Mən buna şübhə etmirəm!.. – deyə ordu komandanı sərt bir ifadə ilə əlavə etdi... – yoldaş sözü qüvvət, qələbə timsalına dönəcəkdir!..

Aslan bu sözdən sonra komandanın artıq vaxtını almamaq üçün getməyə izin istədi. O, razılığını bildirdi. Aslan yenə sağ əlini yuxarı qaldırdı, dabanı üstə geriyə dönərək, əsgəri addımlarla otaqdan çıxdı.

Təltif olunmuş dostları onu albalı bağında gözləyirdilər. Ağızları qırmızı rəngə boyanmış bu əsgərlər Aslanı salamlayır, təbrik edirdilər. Hərənin əlində qırmızı bir qutu vardı, hamı sevinirdi. Uzaqdan atılan ağır top gülləleri haradasa yerə düşüb gumbuldayır, komandanın yaşadığı bu balaca evi titrədirdi.

Aslan bayaq yerə atdığı albalı budağını yaşıl otların arasından tapdı, iri-şirəli albalıları bir-bir yeməyə başladı. Onun da dodaqları qızardı.

Bu halda gülərüzlü, qısaboy, sarışın bir əsgər ona yanaşıb salam verdi. Aslan onu keçən ildən tanıyırdı. Şaxtalı qış günlərində, yazın

palçığında, yayın cırcıramasında səngərlərə məktub, əsgərlərə sevinc gətirən bu oğlanı ordu qərargahında tanımayan yox idi. O, bəzən qəmgin-qəmgin baxar, dərindən köksünü ötürər və:

– Heç olmazsa siz sevinin, – deyərdi, – mənim atam-anam o yanda qalıb. Nə mən onlara məktub yazıram, nə də onlar mənə... Sizə sevinc gətirməklə təsəlli tapıram.

Aslan əlini onun çiyninə qoydu. Yenicə yuyulmuş köynəyə qırmızı ləkə vurdu:

– Dostum, darıxma, – dedi, – bu gün nə təhər olsa sizin kəndə girəcəyik. Hə, mənə bir şey gətirmisən, ya yox?..

O, gülə-gülə cavab verdi:

– Mixail İvanoviç sizə qəhrəman adı verib... mən də bu münasibətlə sizi öz tərəfimdən iki məktubla mükafatlandırmaq istəyirəm...

Aslanın sevinci birə yüz oldu, məktubları tez alıb açdı. Kağızların arasından sürüşüb düşən şəklə baxdı. Doqquz yaşlı oğlu Aydın anasının sağında, ondan iki yaş kiçik qızı Gülüş isə solunda ayaqüstündə durmuşdu. Hər ikisi qərib bir həsrətlə Aslanın üzünə baxırdı. Onların ortasında oturmuş Gülcamal çox qəmgin idi. Bunu görərkən Aslanın üzündəki təbəssüm izləri birdən silinib yox oldu. İri, qara gözləri doldu. O biri məktubu açdı. Bunu yazan Gülcamal deyildi. Bir anda Aslanın sifətindəki bütün qırışlar elə bil toplanıb qaşları arasında cəmləşdi.

Azacıq əvvəl ümidlə şadlıq vəd edən bu kağız parçasında, nə isə çox qəmgin bir söz yazıldığını yalnız indicə duyan qızıl əsgərin də qaşları çatıldı. Onun da gözlərinə məyusluq ifadəsi qondu. Vuruşmalarda aldığı yaraların ağrısından bir kərə də olsun uf deməmiş Aslanın sinəsindən qeyri-ixtiyari bir inilti qopdu; o, sarsılaraq ağaca söykəndi.

Yoldaşlarından biri tez onun qolundan yapışdı. Məktub daşıyan əsgər isə təəccüblə soruşdu:

– Nə oldu, yoldaş kapitan, yoxsa bir bədbəxtlik üz verib?

Aslan gözlərini yumdu. Kətan kimi ağarmış yanaqlarını əlilə örtdü. Solğunlaşan dodaqlarını tərpətdi.,

– Oh... Gülcamal... Saşko, sən nə yaman acı xəbər gətirdin?..

Qızıl əsgər necə bir xəbər gətirdiyini bilsəydi, yəqin ki, bu uğursuz məktubu gizlədər, belə şad dəqiqələrində Aslanı qəm dəryasına qərq etməzdi. O, artıq iş-işdən keçdiyini görüb kədərdən qəddi bükülmüş halda bir də soruşdu:

– Gülcamal kimdir, yoldaş kapitan, ona nə olub ki?..

Hamının sualla dolu intizar gözləri böyüyüb Aslanın dodaqlarına dikildi. Onun sinəsindən daha iniltili bir səs qopdu:

– Ölmüşdür...

Bu sözü eşidərkən hamı ufuldadı. Elə bil ki, hamıya birdən, eyni yerdən yara vuruldu.

Aslanın günəşdə yanmış sifəti iztirablı bir ifadə ilə büzüşdü. Yanaqlarından aşağı süzülən yaş damlaları əlində titrəyən şəklin üstünə düşdü.

II

Bu hadisədən xəbər tutan ordu komandanı onu tez yanına çağırtdırdı.

– Sən bu gün getməlisən, əzizim... – dedi, – uşaqları sahibsiz qoymaq olmaz.

Aslan gözlərini yerə dikmişdi. Komandanın dəruni bir səmimiyyətlə titrəyən səsi onun ürəyini daha da kövrəltdi.

– Mən ayrı cür getmək istəyirdim, – dedi. – Görünür taleyim belə imiş. Nə etməli?

– Görürəm, ağlamısan... – Komandan ona daha yaxın gəlib mehriban bir ata nəvazişilə əlini Aslanın çiyninə qoydu. – Məhəbbətdəndir. Nə eybi var?.. Qəhrəman insanların ürəyi nə qədər qüvvətli olsa da, məhəbbətin gücü qarşısında təslim olmaya bilməz... Lakin, unutma, əzizim, göz yaşı faydasızdır. Mən üç uşağın atasıyam. Onlar da kiçik yaşlarından yetim qaldılar. Bilirəm bu nə deməkdir.

Komandan, Aslanın əlindəki şəkli gördü, alıb diqqətlə baxdı. Gülcamalın bir azca süzgün baxışlı, qara badamı gözlərini bəyəndi:

– Çox təəssüf, çox təəssüf... – deyə dərindən köksünü ötürdü. – Bu uşaqları bir kəsə tapşırıb arxayın olmamış vuruşmaq çətindir. Bilirsənmi, soldat zahirən qaba görünür, lakin əslində onunku qədər zərif ürək az-az adamda olur... Bəli, dostum, bu gün mütləq yola düşməlisən. Qatarla getsən uzun çəkər. Mən səni təyyarə ilə yola salacağam...

Aslan həyatının bu ağır dəqiqələrində qoca komandanın qayğısından təsəlli tapdı:

– Bilmirəm sizə mən necə təşəkkür edim? – dedi.

– Borcumdur, əzizim, borcumdur. Biz gələcək üçün vuruşuruq... Uşaqlarını unudan əsgər, əlbəttə həqiqi əsgər deyildir...

Bu halda komandanın yavəri gəlib təzim etdi. Qoca, Aslandan aralandı:

– Bu gün kapitanı Bakıya yola salınız... – dedi, – "U-2-"ni diqqətlə yoxlasınlar.

Yavər əmri təkrar etdikdən sonra ordu komandanı fikirli-fikirli Aslana baxdı, əlilə çal bığlarını tumarladı, xəyalında nəyi isə hesablayırmış kimi səssizcə dodaqlarını tərpətdi, Aslandan o tərəfdə qırmızı məxmərlə örtülmüş masanın arxasına keçdi.

– Məncə bir ay möhlət kifayətdir... lazım olsa yenə izin verərəm, – dedi.

Aslan dönə-dönə təşəkkür edərək qocanın əlini sıxdı, tələsik addımlarla çıxdı. Onu qapı ağzında gözləyən dostlar, indi təbrik əvəzinə başsağlığı verirdilər:

– Aslan, qardaşım, Allah kərimdir!..

– Aslan, əzizim, başın sağ olsun!..

– Dünyadır, gah güldürür, gah ağladır... Qəm yemə, dostum, görünür alnımıza belə yazılıbmış... Əhdimiz vardı: müharibədən qayıdanda sənin evinə yığışıb Cülcamal bacının plovunu yeyəcəkdik... Qismət olmadı. Ah, dünya!

Bu sözləri deyən zabit başını tərpətdi, əməli sərab olmuş bir insan kimi çox dərindən köksünü ötürdü.

Hər yoldaşın kədərini öz şəxsi dərdi kimi yaşayan bu dostlar, gözə görünməyən, lakin qırılmaz ürək tellərilə bir-birinə bağlı idilər. Onlar Aslanı ortaya alıb hissənin dayandığı kəndə gətirdilər.

Hücum qabağı idi. Yay fəslinin bu ilk ayında dərələr, təpələr gül-çiçəklə bəzənmişdi. Göz işlədikcə uzanan düzlərdən sünbül qoxusu gəlirdi. Səs-səsə verən toplar təbiətin qərib sükutunu pozsa da, onun əzəmətinə xələl gətirə bilmirdi. Dəniz kimi ləpə vuran taxıl zəmiləri, yaşıllıqlar içindən şütüyüb bir xeyli uzaqda gözdən itən çay, yenə də öz yerində baqi idi. Lakin qızıl döyüşçülər məyus olmuşdular.

Birdən elə bil təbiət də bu məyusluqdan xəbər tutdu. Çay üzərindəki ağ-çəhrayı buludlar arasında üzən günəş də tutulub qaraldı. Lap yuxarılarda isə göy kişnədi. İki-üç dəfə şimşək çaxdı, qaralan buludları çalın-çarpaz doğradı.

Aslan yoldaşlarının arasında oturub sükut edirdi. Onun gözləri yerdən üzülməyirdi. O, nə görür, nə də eşidirdi. Təsəvvüründə yalnız Gülcamal, Aydın və Gülüş canlanırdı, gözü də onlara baxırdı, fikri də onlarda idi. Gülüş: “Tez gəl, atacan” – deyə-deyə Aslanı çağırır, uzaqdan ayaqları dolaşa-dolaşa ona sarı yüyürür, birdən nəyə isə toxunaraq üzüstə sərilib bərkdən ağlayırdı. Sonra isə Aydın görünür, kövrək nəzərlə atasına baxır, heç bir söz demirdi, kirpiklərini bir an belə qırpma-

dan məzəmmət dolu gözlərini Aslandan çəkmirdi. Lakin Gülcamal artıq onların yanında deyildi. Görünür o küsmüşdü, uşaqları tək qoyub harasa getmişdi.

Aslanı bir xeyli müddət fikir apardı. Xəyalən Gülcamalı axtarmağa başladı. Gülüşün səsini eşidə-eşidə ətrafına göz gəzdirdi. Uzun bir yolla gedən yalqız bir qadın gördü. Yerişindən onu Gülcamala oxşatdı. Aslan uşaqları burda qoyub onun ardınca yüyürdü. Nəfəsi darıxa-darıxa yoxuşu dırmandı. Birdən Gülcamal yox oldu. Uzun yol sakit, boş bir səhradan keçib uzaqlarda gözdən itirdi. Burada Aslandan başqa heç kim yox idi...

Təyyarə səsi Aslanı xəyalatdan ayırdı. Onun təsəvvüründən yol da, boş səhra da silinib getdi. Aslan təəccüblə çiyinlərini çəkdi. “Bəs o hara gedirdi?” – deyə öz-özündən xəbər aldı. Bu suala cavab tapmadı: “Yox, – dedi. – Gülcamal, uşaqlardan küsüb heç yana getməz, o, məni də, uşaqları da çox sevir. Axı bir də onlar bu boz səhrada nə gəzirlər?”

Aslan cəld ayağa qalxdı:

“U-2” təyyarəsi kənd üzərində dövrə vuraraq, süvarilər dayanan yerdən qırx-əlli addım kənarda, yaşıl otlarla örtülmüş düzə endi.

Aslan yoldaşları ilə vidalaşmağa başladı.

– Sağ olun, uşaqlar... – dedi. – Sifarişiniz olsa apararam. Məktub yazanınız varmı?

Hamı kədərli idi. Heç kimdən səs çıxmırdı.

Aslan sükutla baxan əsgərləri süzdü. Nə üçünsə dinib-danışmaq istəyən yox idi. Sonra o, köhlən atını göstərdi:

– Ondan muğayat olun... Sizə tapşırıb gedirəm...

Vəfalı yoldaşdır. Özünüz hücuma keçəndə onu da aparın. Çox hirslidir. Getməsə ürəyi partlar.

Qızıl əsgərlərdən biri cavab verdi:

– Siz arxayın olun, yoldaş kapitan... Bir qaşov öz atıma vuranda ikisini ona vuraram...

– Çox gözəl... Hə, nə oldu? Məktubunuz yoxdurmu?.. – deyə Aslan yenə gözlərini dolandırdı, – yazsanız gözlərəm.

Onun böyründə duran qısaboy bir ləzgi əlindəki üçkünc kağızı Aslana uzatdı:

– Bakıdan poçta qutusuna salın... Zaqatalaya göndərirəm. Mənim də arvadım ölüb...

– Ölüb?!.. – deyə Aslan təəccüblə ləzgiyə baxdı – nə vaxt?.. Bəs niyə mənə deməmisən?

– Bəli, ölüb... mənim üçün ölüb?.. Qızıma yazıram...O vəfasız anasına qoşulub getsə, mən ona qızım deməzəm.

Aslanın qəlbində, qeyri-ixtiyari qara bir şübhə oyandı, "bəlkə Gülcamal da bu cür ölüb?.."

Bu fikirdən o, daha da sarsıldı. Vuruşan əsgərin iradəsini qadın vəfasızlığından çox heç nə zəiflədə bilməz. Ətə dəyən güllə adi bir sızıltıya səbəb olur, bu güllə isə daha incə bir nöqtəyə dəyir. Bu güllədən insanın ürəyi yaralanır. Qəlb yarası ağır, sağalmazdır.

Aslan bu qara şübhəni özündən tez rədd etdi: "Yox, mən buna dözmərəm, Gülcamal məni sevir. O, mənim həqiqi ömür yoldaşımdır. Heç bir zaman bu böyük sözün təhqir olunmasına razı olmaz".

– Baş üstə!.. – deyərək, Aslan ləzginin məktubunu aldı, döş cibinə qoydu. Bu zaman gənc zabitlərdən biri titrək səslə, ucadan dedi:

– Bizdən Bakıya salam söylə! Biz ona vəfalıyıq. O da bizi unutmasın!.. Məni bağışla, yoldaş kapitan, vaxt tapa bilsən, dəniz qırağına get, bizim də əvəzimizdən Xəzər sularına doyunca bax. – De ki, bir vaxt bu sahillərdə şair olmaq istəyən bir gənc səni ölənədək unutmayacaq... eh...

Gənc zabit kövrəldi. Aslanın yaxşı tanıdığı bu oğlan bütün hissədə hamının ehtiramını qazanmış lirik bir şairdi. O, səngərdə də yazırdı: vuruşma zamanı bəzən öz şeirlərilə yanındakı yoldaşlarına ürək-dirək verirdi. Qılınc oynadarkən qəzəbli, şeir oxuyarkən kövrək idi...

Aslan onun əlini sıxdı:

– Şeirlərini çantamda aparıram... Üzünü köçürüb çapa verəcəyəm... Salamını Bakıya yetirərəm... Ancaq bu ümidsizlik sənə heç yaraşmır...

– Ümidsiz deyiləm, kədərliyəm, yoldaş kapitan... – deyə şair gözlərini yerə zillədi.

Aslan yoldaşlarının hamısı ilə qucaqlaşdı. Buraya toplaşmış yeddi nəfər, onun qan qardaşları – cəbhə dostları idi.

Hələlik, uşaqlar... – deyə o, arxasına baxmadan təyyarəyə sarı getdi. Hamının gözü Aslanda idi. Doluxsunanlar da vardı. Hücum zamanı titrəməyən ürəklər indi qəribə bir həyəcanla döyünürdü.

Təyyarə buludlu fəzaya qalxıb süzməyə başlarkən, igid süvarilərin kədər dolu həsrətli nəzərləri də göyə zilləndi. "U-2" qara bir nöqtə kimi kiçilib gözdən itincəyə qədər heç kimdən səs çıxmadı.

Sonra hücum əmri verildi. Atlılar hərəkətə gəldi.

## III

İki ildən bəri görmədiyi doğma şəhərinə çatarkən, hər səhər tezdən Aslanın pəncərəsinə düşən günəş yenicə tülu edirdi. O, mərmər pilləkənlə ikinci mərtəbəyə qalxdı, şüşəbəndli qapıya yanaşıb dayandı, bir xeyli nəfəsini çəkməyib ətrafı dinlədi. Dönüb geriyə boylandı. Gənc şairin salam yolladığı böyük şəhəri, sakit-sakit dalğalanaraq günəşi əks edən mavi Xəzəri, buludsuz əngin üfüqləri gördü. Bakı doğrudan da gözəl idi. Yanıb külə dönmüş əzəmətli binalardan, uçulub dağılmış şəhərlərdən sonra belə abad, belə sakit bir yeri seyrə dalmaq, təyyarələrin, partlayan bombaların gurultusuna hövlnak yerlərindən sıçrayıb harada isə gizlənməyə qaçarkən, müdhiş bombardman nəticəsində heç tikəsi də tapılmayan uşaqlar kimi öz balalarının həlak olmadığını düşünmək nə qədər böyük təsəlli olsa da, Aslan öz-özünə: “o yoxdur!..” deyə fikirləşdi, uzaqlara üzərək gözdən itən yelkənli gəmidən gözlərini çəkdi. Onun kədəri daha da artıb qurğuşun ağırlığı ilə qəlbinə çökdü.

Bir zamanlar, hələ o cəbhəyə getməmişdən hər gün sübh tezdən artırmaya çıxar, məhəccərlərin dibində cərgə ilə düzülmüş dibçəkləri sular, dənizdə çimən günəşi hamıdan əvvəl görər, radionu qurub bədən tərbiyəsi məşqinə girişərdi. Aslan birdən o keçmiş günləri xatırladı: Gülcamalı oyatmamaq üçün ayaqlarının ucunda yeridiyi əziz dəqiqələri bir röya kimi xəyalından keçirəndə onun könlündən yenə inilti qopdu.

Aslan pəncərədən içəri baxdı. Onu elə bil ildırım vurdu. Qoşa çarpayılar bomboş idi. Gülcamal doğrudan da görünməyirdi. Lakin otaqda yenə də heç bir şeyin səliqəsi pozulmamışdı. Aslan onun ölümünə inanmaq istəmədi: “yox, o sağdır!..” – deyə düşündü, cürətini toplayıb qapını döydü.

Evdən səs-səmir çıxmadı.

O, yalnız indi yəqin etdi ki, Gülcamal, füsunkar bir mələk qədər cazibəli görkəmi ilə qapıya gəlmiyəcək. Aslanın çoxdan, lap çoxdan arzuladığı xoşbəxt vüsal baş tutmayacaqdır. Aslana elə gəldi ki, bu səssiz-sədasız evdə yalnız kədər adlanan bir qüvvət hakimdir. O, qapını bir az da bərk döyməyə başladı. Oğlunu səslədi:

– Aydın!..

Yenə cavab gəlmədi. Sonra qızını səslədi:

– Gülüş!..

Bu anda yuxulu bir səs eşitdi:

– Kimsən?

– Ana, dur aç qapını.

Aslanın qoca anası qapıda göründü. O bir qədər duruxdu, gözlərini döydü, deyəsən gördüyünün həqiqət olduğuna inanmırdı. Qarının baxışlarından Aslan çox şey oxudu. Bir an içində, həyatla ölüm arasındakı ölçülməz bir məsafə qədər qısa olan bir anda bütün həqiqət Aslana bəlli oldu. Qoca arvad gülümsəyirdi. Öz ürək pərisinin bu gözlənilməyən gəlişi onu sevindirirdi. Lakin üz-gözündə çoxdan nəqş bağlamış kədəri gizlədə bilmirdi. O, yalnız analara xas olan hərarətlə Aslanı qucaqladısa da, özünü saxlaya bilməyib birdən hönkürdü, bütün vücudilə uçunmağa başladı.

Sonra Gülüş yüyürüb gəldi. Balaca, tumbul qolları ilə Aslanın qıçlarına sarıldı. Aslan anasının isti ağuşundan çıxdı, aşağı əyilib Gülüşü qolları arasında yuxarı qaldırdı.

...Atanın göz yaşları Gülüşün yanaqlarını, Gülüşünkü isə atanın dodaqlarını islatdı. Böyük bir sevinc, ağır bir kədərə qarışdı...

– Ah, ata, sən gecikdin, anam səni gözləmədi... Uzağa getdi.

Aslan dünən cəbhədə, yoldaşlarının yanında ikən xəyalında canlanan o boz səhranı, birdən gözdən yox olan Gülcamalı xatırladı...

Əlləri qoynunda durub baxan qoca arvadın göz yaşları dərd əlindən daha da qırışmış yanaqlarında parıldadı.

## IV

İçəri girəndə, ilk dəfə Aslanın gözünə sataşan divardan asılmış böyük portret oldu. Hələ Gülcamalla yenicə evləndikləri zaman böyüdülmüş bu şəkildə, Gülcamal doğrudan da çox gözəl düşmüşdü. Onun uzun, gur hörükləri döşündən aşağı sallanmış, boynu azca yana sarı əyilmiş, süzgün qara gözləri məlul-məlul baxırdı. Bu gözlər, Aslanın ilk sevgisindən yadigardı. Hələ ali məktəbdə oxuyarkən, foyedə gəzişən tələbələr arasında birinci dəfə gördüyü o qara gözlər, indi də Aslanın xatirindən çıxmamışdı. Hələ o gün Aslan bu qara gözlərə həsrətlə baxa-baxa əlindəki papirosu biixtiyar yerə salmış, kənardan bu hadisəyə diqqətlə baxan tələbə yoldaşlarının qəhqəhəli gülüşünə səbəb olmuşdu...

Aslan bir də Gülcamalın şəklinə baxdı. Onun öldüyünə inana bilmədi: “Mən röya görürəm” – deyə fikirləşdi. Elə bil Gülcamal bu

dəqiqə dillənəcək, uzun intizardan sonra yerə-göyə sığmayan bir sevinclə ərini qarşılayacaqdı. Hətta Aslana elə gəldi ki, bu dəmdə Gülcamalın gözləri tərpəndi, kirpikləri qırpıldı, həmişəki adəti üzrə xəfif bir tərzdə gülümsəyib utancaq nəzərlərini yerə dikdi...

Bu halda Aydın səsə oyandı. Gözlərini açıb bəriyə sarı boylandı. Təəccüblə baxdı: "Ata! Doğrudanmı sənsən? – deyə soruşmaq istədi. Cəld yerindən sıçrayıb qalxdı, ayaqyalın yüyürüb Aslanın qucağına atıldı.

– Atacan!.. Nə yaxşı oldu, gəldin!.. – dedi. – Sənsiz çox darıxırdıq...

Aslan balalarını öpüb oxşadı. Kədərini boğmağa çalışdı. lakin evin kədərini azalda bilmədi. O, indi hara baxırdısa Gülcamalın gözlərini görürdü, o məlul baxışların mənasını düşünürdü. Qoca anası, bir an içində sınıxmış Aslana çox təsəlli verdi, "Allah kərimdir", – dedi, amma yenə də evin üzərinə qara qanadlarını gərmiş ölüm həyulasının zəhmini azalda bilmədi... Gülcamal, yorulmadan, nəvazişli baxışlarındakı o ölçüsüz məhəbbəti azaltmadan Aslana baxırdı. Elə bil ki, o, insan ömrünün vəfa etdiyi uzun bir müddət qədər kirpiyini qırpmadan Aslanla gözləşəcəyinə and içmişdi...

Günlər keçdisə də, Aslan ona baxmaqdan yorulmadı. Bəzən səhərdən axşama kimi səssizcə dayanaraq ürəyində Gülcamalla dərdləşir, bütün həyatının unudulmaz dəqiqələrini xatırlayıb yalnız bununla öz könlünü ovundururdu.

Bir axşam, dərdini bölüşmək üçün bir dosta rast gəlmək ümidilə evdən çıxdı. Bayırdan qapını bağlayıb açarı özüylə götürdü. Aylı-ulduzlu bir yay gecəsi şəhər üzərinə qanad gərmişdi. Sərin bir meh əsirdi. Sahil boyundakı ağacların yarpaqları sakit-sakit tərpənir, yavaş-cadan pıçıldaşırdı. Sahildə gediş-gəliş çoxdan kəsilmişdi. Yalnız arabir kinoların qabağından ötüb-keçənlər, harasa tələsən adamlar qaralışırdı. Dostlardan, tanışlardan isə heç kim görünməyirdi. Deyəsən onların hamısı cəbhələrə gedib, uzaqlarda bu sakit şəhərin keşiyini çəkir, gecəni gündüzə qatıb, odlar-alovlar içindən keçərək bu böyük dünyanın nəhayətsiz üfüqləri arasında balaca, lakin hər şeydən qiymətli olan bir insan səadətini qoruyurdular.

Aslan isə indi yalnız o gözləri görürdü. O gözlər də həmin səadətin bir timsalı kimi hər yerdə, hər zaman inadla Aslanı təqib edirdi. Bir zamanlar ona həyatı, təbiəti, hətta bəzən dünyanın əziyyətlərini sevdirən Gülcamal, onun təsəvvüründən indi də bir an silinməyirdi. Bəlkə

Gülcamalın bu gözlənilməz ölümünə səbəb Aslan özü idi? Bəlkə o gözlər ömrünün sonuna kimi Aslanı indikindən də qüvvətli bir inadla izləyəcək, o məyus baxışlarındakı məna ilə onu daha çox həyəcana salacaqdı.

Aslan sahil boyu ilə xeyli getdikdən sonra aradığı dostlarından birini də tapa bilməyib dağ parkına doğru uzanan yola sarı buruldu, bu tənha küçə ilə yuxarılara dırmandı. Keçib-gəldiyi məsafəni gözəyarı təyin etmək istəyirmiş kimi, dönüb geriyə boylandı. Artıq bütün şəhər ayağının altında idi. Bədirlənmiş ay dənizin tən ortasında üzürdü. Bakının uzaq sahil boyunda tək-tək işıqlar yanırdı. Onlar da elə bil Gülcamalın gözlərini əvəz edib Aslana baxırdı. Sonra birdən ay yox oldu. Onun yerində, ağ buludlar arasında Gülcamalın o məsum, o gülümsər çöhrəsi göründü. Aslan indi də xəyal aləmində idi. Bir insanı eyni zamanda yerdə də, göydə də təsəvvür edə bildiyinə özü təəccübləndi. Gülcamal nə üçün səmada idi? Boz səhrada, aydın səmada, şəhərin göz qırpan tək-tək işıqları yanında görünən o sima artıq həyatda yox ikən, necə ola bilərdi ki, həm orada, həm burada Aslanın gözünə görünsün?..

Bu suala cavab axtaran zaman, Aslanın bütün vücudundan soyuq bir cərəyan keçdi. O üşüyürdü. Havanın xəfif tərpənişindən, belə soyuq ola bilməzdi. Bir də Aslan buzlu-şaxtalı Rusiya iqliminə çoxdan öyrəşmişdi. Bəs onu üşüdən nə idi?

O, gözlərini yumdu. O tərəfə çevrildi. Addımlarını yeyinlədib şəhərdən daha da uzaqlaşdı. İndi artıq heç bir şey görünməyirdi. Onun bütün varlığına yalnız bir qüvvət hakim kəsilmişdi. Burada, bu tənhalıq içində də o qara gözlər onu təqib edirdi. Gözlərini yumanda belə, Gülcamalın azca süzgün nəzərləri Aslanın təsəvvüründən ayrılmayırdı. O qara gözlər elə bil bir-birinin arxasınca düzülüb nəhayətsiz üfüqlərə doğru hey uzanırdılar.

Aslan birdən anladı ki, Gülcamal da, onun gözləri də Aslanın təsəvvüründə deyil, könlündədir, onları bu könüldən heç bir zaman çıxarıb atmaq mümkün olmayacaqdır.

Aslan geriyə döndü. Canındakı üşütməni unudub yeyin addımlarla şəhərə qayıtdı. O, öz evinə yaxınlaşanda hər tərəf yuxuda idi. O yanda küçənin qurtaracağında gəzişən gecə növbətçilərinin ayaq səslərindən başqa hər şey sükuta qərq olmuşdu. Aslana elə gəlirdi ki, evdən çıxdığı vaxtdan bəri azı bir neçə saat keçmişdir. Ancaq əslində o, qırx-əlli

dəqiqədən çox gəzməmişdi. O, qapını səssizcə açıb, ayaqlarının ucunda içəri girdi. Yerini o biri otaqdan, uşaqlarının çarpayıları arasından salmaq istədi. Bu anda onun qulağına bir səs gəldi. O, yerində donub bir neçə dəqiqə bu səsi dinlədi: anası öz-özünə danışır, tez-tez köksünü ötürürdü. Qonşu otağın qapısı açıq olsa da, anası onun gəlişindən xəbər tutmamışdı.

Aslan gözlərini bir nöqtəyə zilləyib yerindəcə hərəkətsiz dayandı. Anasını dinləməyə başladı. Qoca arvad kəsik-kəsik danışırdı:

– İndi mən ona nə deyim, ilahi?.. Nədən öldüyünü soruşsa, mən ona nə cavab verim? Axı heç özüm də bilmirəm.

Qarı yenə dərindən köksünü ötürüb susdu. Aslan isə yerindən qımıldanmadı. Qarının üzünü görmürdüsə də, nəfəsini eşidirdi. O, gah iniltili bir ah çəkir, gah da zarıyan kimi olurdu.

– Kaş ki mənciyəz öləydim... Şir kimi oğul böyütmüşəm, gözümün qabağında fikirdən şam kimi əriyib gedir.

Aslan qeyri-ixtiyari yerindən tərpəndi. Onun ayaq səsi qarını fikrindən ayırdı.

– Hə, qadan alım, gəldin?

– Öz-özünə nə deyirdin, ana?..

– Eh, ay oğul, deyirdim ki, bu dünya bir pəncərədir, hər gələn baxıb gedir... Hamı öləcək... Çox fikir eləməyin də faydası yoxdur.

Aslan qarının bu sözlərinə güldü, onun dediklərini eşitdiyinə işarə belə etmədi. Anasına yaxınlaşıb özü ona təsəlli verdi:

– Əlbəttə, ana... Heç kim bu dünyanı tutub durmayacaq. Ancaq səbəbsiz ölüm yoxdur. Əgər mən Gülcamalın nədən öldüyünü bilməsəm, istər-istəməz fikir eləyəcəyəm...

– Mən də onu deyirdim... Vallah bu sirr məni də çaşdırıb... Doktorlar dedi ki, zəhər içib... yenə bunu bircə Allah bilir... Rayondan qayıdanda saçlarına dən düşmüşdü. Onda bildim ki, çox fikir eləyib... Ha soruşdum, bir söz demədi. Gecələr fikir verirdim, birdən hövlnak yerindən qalxıb dəli kimi oyan-buyana hərlənirdi, öz-özünə danışırdı...

Aslan kürsüdə oturdu, papirosunu yandırdı:

– Mən sabah rayona gedəcəyəm, ana... Doktorlar bu sirri açmayıblar, ancaq mən nə təhər olsa açacağam...

– Nə deyim vallah... bir də ki, bundan nə fayda?

Qarı gözlərini yerə dikdi. Yenə dərindən köksünü ötürdü. Bir daha dinmədi. Aslan qalxdı, uşaqlar yatan otağa keçdi.

## V

Aslan, qəsəbəyə yola düşdüyünü heç kimə xəbər vermədiyi halda, dəmiryol stansiyası onu qarşılamağa gəlmiş adamlarla dolu idi. Hətta yerli hissənin nəfəsli orkestrini də buraya yollamışdılar. O, vaqondan düşəndə güllər-çiçəklər səpələndi, tuş çalındı, gurultulu alqışlar qopdu.

İzdiham Aslanı ortalığa aldı. Təbrik səsləri ucaldı. Onun qəhrəmanlığı ilə öyünən dostlardan da gələnlər çox idi.

Stansiyanın geniş meydanında böyük bir yığıncaq quruldu. Aslanın məktəb yoldaşı Əziz Rəhimzadə iclası açdı. Nitq söylədi:

– Alman qəsbkarlarına qan udduran qəhrəmanımıza eşq olsun!.. – dedi...

Hamı urra çəkdi. Rəhimzadə Aslanı qucaqlayıb üzündən öpdü:

– Mən sənin kimi yaxın bir yoldaşımla ürəkdən fəxr edirəm!.. – deyə sevincindən yaşaran gözlərini sildi. Aslan qəsəbəyə gətirildi. Təntənəli iclaslardan sonra, o, bir dəqiqə belə itirmədən istintaqa girişdi...

Onun ilk görüşü, Rəhimzadənin evində oldu. O, ali məktəbdən tanıdığı bu yoldaşilə çox açıq danışdı:

– Yoldaş sözü mənim nəzərimdə hər bir sözdən yüksəkdir. Sən üzümdən öpdün, məni alqışladın. Demək biz ürəyimizi bir-birimizə aça bilərik... Səndən yalnız bir xahişim vardır. De görüm, Gülcamal nə üçün intihar etmişdir!..

Rəhimzadənin qaşları çatıldı. Doğrusu o, Aslanın belə tezliklə bu sualı verəcəyini gözləmirdi.

– Nə üçün?..

– Bəli, nə üçün?.. Sən bütün rayonun rəhbərisən, rəsmiyyətə də qalsa, bu suala sən cavab verməlisən!..Sərt bir ifadə ilə deyilən bu söz Rəhimzadənin təəccübünə səbəb oldu. Aslan bir an belə kirpiklərini qırpmadan onun gözlərinin içinə baxırdı:

– Nə üçün?

Rəhimzadə xeyli tutuldu. O hətta bir neçə dəfə udqundu. Aslana elə gəldi ki, bu, bir gün əvvəlki təntənəli görüşdən sonra, dost bir adamın, yalnız üzdən onun dərdinə şərik olduğunu bildirmək üçün uydurduğu bir hərəkətdir. "Yox, əzizim, sən Gülcamalın ölümünü çoxdan unutmusan... Belə təsəlliyə mənim ehtiyacım yoxdur. Əgər sən həqiqi yoldaşsansa, bu qəribə sirri açmaqda mənə kömək et..." – deyə

Aslan xəyalından keçirdi, bir də gözlərini Rəhimzadəyə dikdi. Yenə sərt bir ifadə ilə sözünə davam etdi:

– İntihar, adi bir hadisənin nəticəsi deyil... Görünür, onun başına nə isə böyük bir bəla gəlmişdir.

– Buna heç bir şübhə ola bilməz! Doğrudan da qəribə müəmmadır! – deyə Rəhimzadə onun sözünü kəsdi. – Lakin bilmirəm sən niyə elə güman edirsən ki, biz bu işlə heç maraqlanmamışıq!.. Ay yarımdan bəridir ki, bütün məhkəmə idarələri bunun səbəbini aydınlaşdırmaqla məşğuldur... Burada nə isə böyük bir cinayət olmuşdur. İpin ucu tapılsa, qalanı tez məlum olar... Bilirsənmi, Aslan, mənim zənnimcə bu günlərdə müstəntiqlər müəyyən bir qərara gələcəklər... Əlbəttə, burada ciddi siyasi məsələ vardır. Şəxsən mən özüm hər gün istintaqın gedişilə maraqlanıram... Gülcamala az-çox tanışlığı olan adamların hamısı danışdırılmışdır. Heç kəs müəyyən bir söz deyə bilmir.

Aslan qabağındakı çay stəkanını götürüb, bir qədər özünə tərəf yaxınlaşdırdı. Çay soyumuşdu. Rəhimzadə bunu duymuş kimi yerindən qalxdı:

– Bəri ver, çayını dəyişdirim, – dedi, – niyə içmədin?

– Lazım deyil, sağ ol... Ancaq bilmirəm Gülcamal hansı siyasi məsələlərə əl ata bilərdi?

Rəhimzadə yenə duruxdu, qaşlarını dartdı, fikirli-fikirli Aslanın üzünə baxdı. Onun hər kəlməyə böyük bir diqqətlə qulaq asdığını, hər işarəyə həddindən ziyadə fikir verdiyini görəndə öz-özünə dedi: “Bununla bir az ehtiyatlı dolanmaq lazımdır”.

– Sonra deyirsən ki, müəyyən bir şey söyləyən yoxdur. Elə isə müstəntiqlə, nəyin əsasında qərara gələcəklər? Çayı isti-isti içmək lazım idi...

Aslanın bu sözündən sonra Rəhimzadənin əlləri titrəməyə başladı: “Demək məni təqsirləndirir. İşi gecikdirdiyimə işarə edir” – deyə həyəcanla düşündü. Yanaqlarındakı qızartı birdən silindi, üzünün ortasında bozumtul ləkələr əmələ gəldi. Bu ləkələr də Aslanın gözündən yayınmadı.

– Bu sirri açmamış mən cəbhəyə qayıtmayacağam, – deyə Aslan ayağa qalxdı, – hələlik.

## VI

Rəhimzadə həyəcanlı idi. Əgər Aslan onun yalnız bir yoldaş, rəhbər kimi çox zəif hərəkət etdiyini düşünürdüsə də, Rəhimzadəni həyəcanlandıran tamamilə başqa bir səbəb idi. O, şəxsən özünün Gülcamalın ölümündə müqəssir olduğunu bilirdi. O, bilirdi ki, həyatında bundan sonra olduqca böhranlı günlər başlanacaq, xalq qəhrəmanı kimi tanınıb cəbhədən qayıtmış iradəli bir zabit öz sevimli qadının ölümünə bais olan adamı axtara-axtara nəhayət onu tapacaqdır. Bu zaman Aslan ondan müdhiş bir intiqam alacaq, yalnız bir yoldaş kimi deyil, hətta ictimai bir insan kimi onun bütün nüfuzunu qırıb, məharətlə gizlədiyi ikinci üzünü də açıb hamıya göstərəcəkdir. Bu fikir Rəhimzadəni dəhşətə saldı: "İmtahan saatı yaxınlaşır. Əsil vuruş meydanı budur. Burada da qalib gələ bilsəm, artıq mən heç bir zaman məğlub olmayacağam... Müstəntiqlərdən mənim zərrə qədər də qorxum yoxdur. Onlar canini uzaqda, çox uzaqda axtarırlar. Bütün iplərin ucu məndədir. Səbir! İradə... Kim məndən şübhələnməyə cəsarət edə bilər? Hətta Aslan özü belə bu cəsarətdən məhrumdur!.."

Rəhimzadə papirosunu yerə çırpdı. Otağında var-gəl etməyə başladı: "Əgər Gülcamal özü bir yadigar qoyub getməmişsə, bu sirr mənimlə bərabər qəbrə gömüləcəkdir. Yox, o da heç kəsə bir şey deməmişdir. Deyə də bilməzdi. Çünki o, namus ucundan özünü öldürdü..."

Qapını döydülər. Rəhimzadə səksəndi. Boğuq bir səslə soruşdu.

– Kimsən?..

– Mənəm!..

– Aha, Səlimə!.. Bu saat!

O qapıya yanaşdı. Gələn qızı gülərüzlə qarşıladı:

– Nə üçün gec gəldin, əzizim? – deyə xəbər aldı.

– Aslanla görüşməyə getmişdim... Yazıq çox qəmgindir. Zarafat deyil, axı o, Gülcamalı çox sevirdi. Məni yaman sorğu-suala çəkdi. Mən də bildiyimi dedim...

Rəhimzadənin nəfəsi tutulan kimi oldu...

– Nə dedin ki?

– Nə bilirdimsə... Dedim ki, bir məktəbdə dərs verirdik. Hamı onun xətrini istəyirdi. Gecə-gündüz məktəbdə olurdu. Uşaqlarını bağçaya aparıb-gətirirdi. Nə qədər ağır dolansa da onların üst-başını həmişə gül kimi təmiz saxlayırdı... Aslan müəllimlərin adını soruşdu.

Hamısını dedim. Sonra qəribə bir sual verdi: “Ona heç əyri gözlə baxan olmadı ki?” Mən güldüm, dedim: bu qısqanclıqdandır. “Yox, mən qısqanc deyiləm”, – dedi. – “Bilmək istəyirəm görüm işlədiyi məktəb necədir?”

Səlimə bir saatlıq söhbəti iki dəqiqənin içində belə qırıq-qırıq təkrar edib qurtardı. Onun səsində də, hərəkətində də saf, səmimi bir əda vardı. Gülcamal haqqında dediyi sözlər, Rəhimzadənin həyəcanını hər an artırırdı. O, “artıq ölmüş bir qadından nə üçün bu qədər danışırsınız?” – deyə Səlimənin sözünü kəsdisə də təmiz ürəkli, sadə təbiətli bu qız başqa bir mətləbə keçmədi, yenə Gülcamaldan bəhs etməyə başladı:

– O, doğrudan da mələkə idi. Müəllimlər onun başına and içirdilər. Mən də ona bənzəyə bilsəydim, ömrümdə heç dərdim olmazdı. Sən bilmirsən, o, Aslanı Allah bilirdi. Bu cürə sevgi mənim idealımdır.

Rəhimzadə Səliməyə lap yaxın gəldi. Onların nəfəsi bir-birinə dəydi:

– Mən yüz qat ondan qüvvətli sevməsəm, bir an da yaşamaram!.. – deyə Rəhimzadə dilləndi, onun səsi titrədi, – mənim sevgim Otellonu heç məqaminə endirəcəkdir!

Səlimə gülümsədi. Qızların adətidir: öz məhəbbətini belə açıq etiraf edən oğlanları çox bəyənirlər. Onlar üçün titrək nəfəslə həqiqi məhəbbət arasında elə böyük bir fərq yoxdur. Səlimə də bu sadə qızlardan biri idi. Ona elə gəlirdi ki, Rəhimzadənin hərarətli nəfəsi, hərarətli ürəyilə bağlıdır. O, güman edirdi ki, həqiqi sevgili bir nəvazişə yüz nəvazişlə cavab verə bilmirsə, demək onun qəlbi həqiqi məhəbbətlə döyünməkdən acizdir.

– Yox, əzizim, mənim üçün Gülcamal ən böyük idealdır!.. – deyə o yenə öz sözünə qayıtdı, – mən bilirəm ki, onun intihar etməsi də məhəbbətdəndir.

Rəhimzadə Səliməni qucaqladı. Dodağından öpmək istədi, o dartınıb Əzizin qolları arasından çıxdı.

– Sən Otellodan danışırdın... Unutma ki, bir nəzəriyyəyə görə o, Dezdemonaya toxunmamışdır...

– Bu nə sözdür, Səlimə?

– Demək istəyirəm ki, o nəzəriyyəyə görə Dezdemona öləndə də qız ölmüşdür...

Bu mübahisənin Rəhimzadəyə xeyri dəydi. Səlimə özü də fərqinə varmadan, mətləbi dəyişdi.

– Niyə təəccüb edirsən?.. Ərəb ona toxunmamışdı. Mən bunun nə dərəcədə doğru olub-olmadığını bilirəm. Ancaq belə bir nəzəriyyə varsa, demək Otellonun sevgisinin ilahi bir sevgi olduğunu güman edənlər də yox deyildir...

– Mən bu mübahisəyə qarışmaqdan qorxuram, – deyə Rəhimzadə acı-acı güldü, – çünki, ədəbiyyatda mən piyadayam. Siyasət başqa... Əgər məndən soruşsan, Otello kimi bir vəhşi, sən deyən kimi sevə bilməzdi...

– Onu Şekspirdən xəbər al... Ən qəddar insanların da qəlbində vicdan əzabı doğuran bir dühа bu məharətdən məhrum ola bilməzdi...

– Vicdan əzabı?..

Rəhimzadənin gözləri Səlimənin üzünə dikilib qaldı. “Vicdan əzabı” – sözünü eşidərkən, ürəyi az qala yerindən qopdu.

– Sən gəl, bu mübahisəni bir tərəfə qoy... – deyə Səliməni qucaqladı. Onu öpərkən birdən Aslan gəlib gözlərinin önündə durdu. Rəhimzadənin rəngi kətan kimi ağappaq oldu. Bunu dərhal sezən Səlimə həyəcanla soruşdu:

– Nə oldu sənə, Əziz?

– Heç... Başım hərlənir... Yorğunam...

O Səlimədən aralanıb divanda oturdu, başını arxaya sarı əydi, gözlərini yumub bir neçə dəqiqə səssizcə dayandı. Amma Aslan onun təsəvvüründən ayrılmadı. Sanki “gözümün içinə düz bax!” deyə dönə-dönə səslədi:

– Sənə nə oldu, Əziz?

– Heç... Gözüm qaralır... Bərk yorğunam...

## VII

Aslan Gülcamalın dərs verdiyi məktəbə yollandı. Müəllimlərin çoxusunu tanıyırdı. Bütün qəsəbədə öz nümunəvi əxlaqilə məşhur olan bu ziyalılar, gözəl bir məktəb yaratmışdılar. Buradan minlərcə xalq müəllimi buraxılmışdı. Respublikanın ən uzaq kəndlərində bu məktəbin tərbiyə edib böyütdüyü gənclərə tez rast gəlmək olardı. Aslan özü də orta təhsilini bu məktəbdə almışdı.

O, içəri girəndə bütün şagirdlər, müəllimlər toplaşdı, təbrik məclisi quruldu. Sevincdən gözləri yaşaran qoca bir müəllim Aslana yanaşdı:

– Oğlum, – dedi, – sən uşaq ikən də mənim tələbələrimdən seçilərdin. Səninlə ürəkdən fəxr edirəm. Mən bütün gənclik illərimi bu məktəbin divarları arasında keçirmişəm. Çəkdiyim əməyə heyfsilənmirəm. Doğma balalarımı bu mərtəbəyə yüksəlmiş görəndə öz-özümə deyirəm: "Yox, zəhmətim hədər getməmişdir".

Qoca müəllim o qədər ürəkdən danışırdı ki, dinləyənlər arasında da gözü yaşaranlar oldu.

– Biz, müharibənin bu ağır illərində heç bir çətinlikdən qorxmadıq, oğlum... – deyə qoca müəllim sözünə davam etdi. – Cəbhədə sizinlə bərabər biz də qalib gəldik. Alman müəllimi cəbhəyə cəllad ürəkli soldat böyüdüb yollamışdı, amma biz qəhrəman cəngavər yetişdirib yolladıq. Mən özüm də bir qəhrəmanam... Müəllim yoldaşlarım da qəhrəmandır. Dünyanın ən böyük yazıçıları mənim də, yoldaşlarımın da adına təşəkkür teleqramı göndərmişlər. Mən yenə də yaşamaq, çalışmaq istəyirəm. Xalqı yüksəldən gözəl məktəb, məktəbi yaradan da vicdanlı müəllimdir. Məktəbimiz səninlə fəxr edir, oğlum... Mənim təxmini hesabıma görə bizim tələbələrimizdən iki yüz əlliyə qədər təltif olunan, üç də Sovet İttifaqı Qəhrəmanı vardır. Biz öz məktəbimizlə fəxr edirik!..

Qoca müəllim sözünü bitirib Aslanın boynuna sarıldı. Onun titrək əlləri Aslanın çiyinlərində gəzindi. Onun ağ saçları, Aslana ordu komandanını xatırladırdı... Bu iki qocanın nəvazişində də qəribə bir bənzəyiş vardı. Hər ikisi eyni dərəcədə səmimi, eyni dərəcədə mehriban idi. Aslana elə gəlirdi ki, harda olursa-olsun tələbəni də, əsgəri də həqiqi qəhrəmanlığa sövq edən yalnız belə müəllimlərdir. Dəyənək gücünə tərbiyə olunan tələbələri də, əsgərləri də o, yaxşı tanıyırdı: Alman əsgəri bunun ən parlaq nümunəsi idi!..

Təbrik məclisi qurtardıqdan sonra Aslan yenə istintaqa başladı. Gülcamalın rəfiqələrindən biri ona belə bir əhvalat nəql etdi:

– Bir axşam dərsdən çıxanda Gülcamalı axtarıb tapmadım. Həmişə ya o məni, ya da mən onu gözlərdim. Evə birlikdə qayıdardıq. Yoldaşlardan soruşdum, onun yerini deyən olmadı. Evinə getdim. Orada da tapmadım. Uşaqlar ağlaşırdı. Gülcamalı soruşdum, dedilər ki, hələ evə gəlməyib... – Bəs haradadır? – bilmirik... – dedilər. – Doğrusu mən şübhəyə düşdüm. O tanışa, bu tanışa müraciət elədim, ondan xəbər-ətər çıxmadı. Bir gün səhər tezdən yenə onun evinə gəldim. Gördüm ordadır...

Soruşdum hara getmişdin? Dedi sonra deyərəm. Bir neçə kərə israr elədim, demədi. Amma çox kədərli idi, gözümə bir təhər dəyirdi. Bir az qocalan kimi olmuşdu. Əzab çəkmiş adamlara oxşayırdı.

– Bəs hara getdiyini öyrənə bilmədin? – deyə Aslan səbirsizliklə xəbər aldı.

– Bakıya qayıdana qədər ondan bir kəlmə qoparda bilmədim. O sirri, yazıq özüylə bərabər qəbrə apardı.

– Sənin fikrincə o hara gedə bilərdi? – deyə Aslan daha səbirsiz halda soruşdu.

– Nə deyim vallah?..

Aslanın gözləri böyümüşdü. Gicgahının damarları şişib bərk-bərk atırdı. Onun ürəyini qara bir şübhə gəmirməyə başladı: "bəlkə mənə xəyanət etdiyi üçün dözə bilməyib özünü zəhərləməyə məcbur olmuşdur?"

– "Həqiqəti məndən gizlətmə, Sürmə!.."– deyə Aslan nəfəsi darıxa-darıxa qəzəblə parıldayan gözlərini müəlliməyə dikdi. – Sən bilirsən, amma nə üçünsə gizlədirsən!..

– Yox, Aslan, əziz canına and olsun ki, nə bir kəlmə artırıram, nə də bir kəlmə əksildirəm.

– Gec-tezi var. Mən əvvəl-axır biləcəyəm. Nahaq gizlədirsən. Lap dəhşətli bir xəyanət eləmiş olsa da artıq mənim üçün fərqi yoxdur!

– Sən nə danışırsan, Aslan? Heç düşmən də onun barəsində bu sözü deməyə cəsarət eləməz. Gülcamalın adına söz çıxardanın dilini kəsərlər...

– Elə isə de görüm o hara gedə bilərdi?

– Nə üçün mənə inanmırsan, qardaşım? Vallah bilmirəm.

– Yox, yox, hamınız əsəblərimlə oynayırsınız... Bu yoldaşlıq deyildir. Nə üçün gizlədirsiniz, yoxsa elə zənn edirsiniz ki, bu mənim iztirabımı azaldacaqdır?

Aslan cəld addımlarla Sürmədən uzaqlaşdı. Sarmaşıqlarla örtülmüş eyvanda gözdən itdi. Sürmə onun dalınca küçəyə çıxarkən, Rəhimzadəgilə getdiyini görüb rahat oldu: "Lap ürəyim düşdü, dedim, görəsən nə fikri var? Rəhimzadə ona təsəlli verər".

## VIII

Aslan Rəhimzadənin qapısından içəri girəndə, onu telefonla danışan gördü. Üzü o tərəfə durub kimi isə danlayırdı.

– Bu gün də cani tapılmasa özün həbs olunacaqsan. Artıq bu səhlənkarlığa dözmək olmaz. Orasını özün bilərsən, yerin dibindən tap-çıxart!..

O, ayaq səsi eşidib Aslana tərəf dönəndə telefonun dəstəyi əlindən düşdü. Aslan bu hərəkətə o qədər də pis məna vermədi, adi bir təsadüf nəticəsində adam da büdrəyib yıxılar, nə olsun ki?

Rəhimzadə cəld aşağı əyilib dəstəyi yerdən götürdü, sözünü tamamladı:

– Axşam, idarədə işin nəticəsini mənə bildirməlisən, vəssalam! – deyib dəstəyi yerindən asdı.

Aslan ona salam verməyi unutdu:

– Mən bu gecə Bakıya yola düşürəm, – dedi, – bütün qəsəbəni danışdırdım. Mənə həqiqəti söyləyən bir adam tapılmadı. Görünür, bu sirdən heç kim xəbərdar deyildir.

Rəhimzadə; "bu daha gözəl" deyə xəyalından keçirərək Aslanın əlini sıxdı:

– Get, əziz dostum, ancaq mən yoldaşlığımızın xatirinə bu cinayəti son nöqtəsinə qədər açdırmamış bir dəqiqə belə rahat olmayacağam – Rəhimzadə Aslanın zəhmli baxışlarına dözə bilməyib gözlərini yerə dikdi – heç ömrümdə belə dolaşıq işə rast gəlməmişdim...

Aslan bir az əvvəl Sürmənin danışdığı əhvalatı ona söyləyəndə, Rəhimzadənin rəngi çox tutuldu, yenə əlləri titrəməyə başladı. Bu təfərrüat Aslanın diqqətli baxışlarından yayınmadı. "Mənim dərdimə şərik olduğunu göstərmək istəyir" deyə düşündü.

– O iki günün tarixini də Sürmədən öyrəndi. Aprelin on beşində, on altısında Gülcamal evdə olmamışdır. Müstəntiqlər bu nöqtəyə fikir veriblər, ya yox?

– Doğrusunu deyə bilmərəm – Rəhimzadənin nəfəsi tutulan kimi oldu – hər halda... Bu faktı onların yadına salmaq pis olmaz. Axşama kimi möhlət vermişəm. Əgər bir şey çıxmasa onların özünü həbs etdirəcəyəm. Onlar yəqin kimdənsə rüşvət alıb, məsələni ört-basdır etməyə çalışırlar. Mən bu rüşvətxorlarla mübarizədə qocalıram. Partiyanın siyasətini təhrif edən alçaqları yerindəcə güllələmək lazımdır!..

Aslan, ehtirasla deyilən bu sözlərə o qədər də diqqətlə qulaq asmırdı. Ona elə gəlirdi ki, bu nitqlərin faydası yoxdur. Gülcamalın ölümündə müqəssir olan cani hardasa gizlənib, yəqin ki, bu istintaqlara gülür, uzun-uzadı danışıqları istehzaya qoyub sevinirdi.

– İki gün məsələsi... – deyə Aslan yenə təkrar etdi. – Sən nə üçün bundan xəbərsizsən?..

– Yəqin kəndlərdə olmuşam... İşim o qədərdir ki, bəzən həftələrlə idarədə olmuram...

– Axı, sən mənim yaxın yoldaşımsan!..

– Buna şübhənmi var?..

– Yoldaş sözünü təhqir edən bir alay komandanını əsgərlərin qabağında güllələdilər.

– Heç bilmirəm, bununla nə demək istəyirsən, Aslan?

– Onu demək istəyirəm ki, mən cəbhədə idim, Gülcamalın həyatilə maraqlanmaq sənin yoldaşlıq borcun idi!..

– Əlbəttə əlbəttə... Maraqlanmadığımı sənə kim dedi?

– Kim?.. Mən deyirəm!..

Rəhimzadə incik halda masaya yanaşdı. Borjom şüşəsini açdı stəkanı doldurub birnəfəsə içdi.

– Mən bu danışıqları yersiz hesab edirəm, Aslan... Kənardan baxan olsa deyər ki, cani mənəm, müstəntiq də sən... Əgər məqsədin məni təhqir etməkdirsə, sözüm yoxdur. Məhz bir dost kimi xatirinə dəymirəm. Ancaq unutma ki, mən sənin uşaqlarına atalıq eləmişəm, səndən ölüm xəbəri gələndə əlimdən gələn köməyi əsirgəməmişəm.

Rəhimzadənin səsindəki titrəyiş Aslana da təsir etdi. O, həddindən artıq sərt danışdığını duymuş kimi, zəhmli nəzərlərini Rəhimzadənin üzündən çəkdi, pəncərəyə sarı getdi.

– Əgər sən mənim yerimdə olsaydın, – dedi, – güman edirəm ki, məndən mülayim danışmazdın.

Rəhimzadə bu cavabla kifayətlənib, divanda oturdu, qulluqçusunu çağırıb şam yeməyi hazırlamağı tapşırdı.

– Sorğu-suala başım qarışdı, səni heç qonaq da eləmədim, – deyə gülümsəyərək Aslana baxdı, papirosunu yandırdı.

Qulluqçu o biri otağa keçən kimi yenə qapı açıldı. Bir nəfər oğlan uşağı teleqram gətirib Rəhimzadəyə verdi: onu Bakıya çağırırdılar, mühüm bir müşavirə vardı, o:

– Çox yaxşı oldu. Bir yerdə gedərik!.. – deyə Aslana baxdı.

## IX

Aslanın səbirsizliklə gözlədiyi müstəntiqlər də gəlib çıxdılar. Lakin onların heç biri əsil müqəssiri tapa bilməmişdi. Bu mümkün deyildi. Vicdanla çalışan istintaq işçilərini danlayarkən, Rəhimzadə yalnız öz günahını məharətlə gizlətməyə səy edir, hər addımda onları çaşdırırdı. Onun əsil məqsədi ipin ucunu əlində daha möhkəm saxlamaq, sonra da müstəntiqləri ləkələyib həbsə aldırmaq idi. Lakin hələ əlində ciddi bir əsas olmadığı üçün, canfəşanlıq etdiyini heç olmasa Aslana göstərməli idi:

– Hamınız vicdansızsınız! – deyirdi. – Mən bu rayonda bir nəfər saf adama rast gəlmədim. Hamı öz cibini güdür. Caniləri ört-basdır edib ən yaxşı adamları ləkələmək istəyirsiniz! Bu nədir? – Rəhimzadə kağız qovluğunu açıb toplanmış materialları göstərdi. – Guya Gülcamal iki gün həbsdə yatmışdır. Bu nə axmaq sözdür! Prokurorun icazəsi olmadan kim onu həbs edə bilərdi? Belə boş istintaqdan nə fayda? Gedin, özünüzə iş tapın! Sizə insan həyatını tapşıranlar özü axmaqdır. Mən heç heyvanları da sizin ümidinizə buraxmaram!..

Rəhimzadə az qala ağzı köpüklənə-köpüklənə danışır, həm kəlməbaşı əlini masaya çırparaq onları hədələyirdi:

– Buyurub gedə bilərsiniz!.. Çox təəssüf ki, mən bir azdan Bakıya yola düşürəm. Qayıdanda bütün məhkəmənin altını üstünə çevirəcəyəm!..

Onlar son dərəcə məyus halda kağız-kuğuzlarını götürüb Rəhimzadənin kabinetindən çıxarkən Aslan ayağa qalxdı:

– O iki gün həbs məsələsini çox nahaq yerə axmaq iş adlandırırsan, Əziz... Məncə bu nöqtəyə diqqət yetirmək lazımdır!

Bu sözləri deyən zaman, Aslan yenə Rəhimzadənin rəng verib-rəng aldığını gördü. Üzündəki bozumtul ləkələr indi daha aydın seçilirdi.

– Yox, canım, – deyə tez özünü ələ aldı. – Bunlar hamısı fırıldaqdır. Gülcamalı həbsə almağa, kim cəsarət edə bilərdi. Mən ölməmişdim ki?

Bu söhbət zamanı Rəhimzadənin gözləri bir dəfə də olsun yerə zillənmirdi. O indi düz Aslana baxırdı.

– Mən güman edirəm ki, rayon istintaq orqanının bütün heyəti dəyişilmədikcə, istintaq düz istiqamət almayacaqdır... – deyə. o danışıqlara yekun vurdu.

Onlar şam yeməyinə oturanda Aslan əvvəlkindən də fikirli idi. O, Rəhimzadənin suallarına da könülsüz cavab verirdi. Artıq bütün ümidləri boşa çıxmışdı.

## X

Bakıya gələndə Aslan bir daha bu xüsusda düşünməyəcəyinə söz verdi. Lakin birdən yenə Gülcamalın portreti gözünə sataşdı. Bu dəqiqədən etibarən hər şey yenidən başlandı. O qara gözlər indi daha böyük bir məzəmmətlə baxır, elə bil Aslanın acizliyinə işarə edirdi.

– Nə oldu, qadan ürəyimə? – deyə qoca anası xəbər aldı. – Bir şey öyrənə bilmədinmi?

– Yox, ana... öyrənə bilmədim. Gülcamal bütün sirlərini özü ilə bərabər qəbrə aparıb... – deyə Aslan kövrək bir səslə cavab verdi.

Ana ilə balanın söhbəti uzun çəkmədi. Aslan uşaqlar yatan otağa keçdi. Əvvəlcə Gülüşə, sonra da aydına baxdı. Hər ikisinin üzünə yenə də kədər nişanələri qonmuşdu. Aydın ağlamsınan kimi yatırdı. Gülüş isə qaşlarını çatmışdı.

Aslan yerində uzanıb gözlərini yumdusa da, yata bilmədi. Qaranlıqdan yüzlərcə göz ona zillənmişdi.

O, qara gözlərin məyus ifadəsi Aslana o qədər tanışdı ki, bu zil qaranlıqda belə onları çox aydın görə bilirdi. Sanki Gülcamal birdən dilə gəldi, nə isə dedi. Aslan nəfəsini belə çəkmədən onu dinlədi. Lakin Gülcamal bir daha dinmədi.

– Ana, ana, bir yanıma gəlsənə!.. – deyə Aslan sağa tərəf buruldu.

Ancaq onun çağırışına səs verən olmadı. Görünür qoca arvad yorulub yatmışdı. O gözlər isə hələ də çəkilib getmirdi.

Aslan yorğanı başına çəkdi, gözlərini bərk-bərk yumdu. Yox, Gülcamal ondan ayrılmayırdı. “Bəs indi mən nə edim” – deyə Aslan həyəcanla düşündü. Az qala nəfəsi darıxırdı. Tez ayağa qalxdı, portret asılmış otağa keçdi, işığı yandırdı. Çoxdan açılmamış kitab şkafının açarını burdu. Bir zamanlar mütaliə etdiyi romanlar, fəlsəfi əsərlərə, qırmızı qələmlə səhifələrin kənarında yazdığı qeydlərə göz gəzdirdi. Bu evdə gördüyü hər şey, ona Gülcamalla keçirdiyi xoşbəxt ailə həyatını xatırladırdı. Hətta bu kitablardan belə Gülcamalın ətri duyulurdu. Birdən Aslanın xəyalından qəribə bir fikir gəlib keçdi. “Portreti aparıb böyütdürəcəyəm. Qoy bu şəkil Gülcamalın özü boyda olsun. Mən ona baxdıqca ölümünü unudacağam. O mənim qarşımda diri kimi görünəcəkdir”.

Həmin fikirlə də Aslan divara yanaşdı, portreti yerə endirdi.

...Bu halda portretin arxa tərəfindən bir qalaq müxtəlif biçimli kağızlar şırıltı ilə yerə töküldü.

Aslan portreti üsulluca masanın üstünə qoydu. Daha da həsrətlə ona baxdı. Elə bil gözləri nə isə yeni bir şey axtarır, neçə gündən bəri bütün varlığını sarsıdan sualların cavabını onlardan almaq istəyirdi

İndi Gülcamalın gözləri artır, milyonlar, milyardlarca gözə dönür. Təəccüblə Aslana baxırdılar.Ah, o bircə dəqiqə dilə gəlib bu ölümün sirrini özü söyləyə bilsəydi!.. Aslan ona çox baxdı, lakin yenə də hər şey müəmmalı olub qaldı.

Aslan birdən yerə tökülmüş məktubları xatırladı. Portretdən ayrıldı. Onları səliqə ilə topladı, yazı masasının üstünə portretin yanına qoydu. "Yəqin mənim məktublarımdır" deyə fikirləşdi. Qəlbinin ən alovlu dəqiqələrindən yadigar qalmış bu kağız parçaları indi onun nəzərində birdən-birə daha əziz, daha qiymətli oldu. Aslan onlardan birini açdı, nüfuzedici gözlərlə hər bir kəlməyə diqqət yetirdi. Buradakı xatirələr həyat qədər şirin, insan məhəbbəti qədər cazibəli idi. O birisi məktubu açdı. Gülcamalın xəttini görüb təəccüblə çiyinlərini çəkdi. Aslan öz adına yazılmış bu kağızı oxumağa başladı.

*"Vəfalı dostum!*

*Bu məktubu yalnız mən öləndən sonra oxuyacaqsan. Mən, səhər gün doğmamış, bədbəxt balalarımdan, səndən əbədi olaraq ayrılıram. Budur, iki gündən bəri döşümdə gizlətdiyim bu zəhəri içib həyatımla vidalaşıram. İndi artıq mənim yaşamağa haqqım yoxdur. Aslan! Bilsəydin, səni necə arzulayıram! Əgər burda olsaydın, ayaqlarına düşüb yalvarar, "könlümə vurulan bu qara ləkəni qanımla təmizlə" deyərdim. Amma nə edim ki, sən cəbhədə, məndən çox uzaqdasan.*

*Bir il bundan əvvəl sənin ölüm xəbərini gətirmişdilər. Sonra da məktublarının arası kəsildi. Qəhrəman adı almağını oxuyanda bildim ki, sən düşmən arxasında vuruşursan, yenə bir gün qayıdıb gələcək, bu məktubumu oxuyub mənim intiqamımı alacaqsan.*

*Etiraf edirəm ki, ürəyimə vurulan bu ləkəni yalnız mənim ölümüm silə bilərdi, əzizim... Məni tora saldılar. Mən onun zahirinə aldandım. Məsum körpələrimin nəfəsi qədər təmiz könlümə o ləkə vurdu.*

*Sən onun kim olduğunu öyrənmək istəyəcəksən.*

*Əhvalatı sənə lap başdan yazıram. Mən, ölüm xəbərini alandan sonra rayona getdim. Orda müəlliməlik edib uşaqlarımı dolandırırdım. Kaş*

*ki, heç getməmiş olaydım. Mən onunla əvvəldən tanış deyildim. Harada, nə vəzifədə olduğunu da bilməzdim. Bir gün ehtiyac məni məcbur etdi. Yoldaşlarım da dedilər ki, "Aslanın uşaqlarına kömək etmək onun vəzifəsidir. Get, dərdini ona söylə, yaxşı adamdır, köməyi dəyər" "Onu hamı Rəhimzadə deyə çağırırdı".*

Aslan gözlərinə inanmayaraq ayağa qalxdı. Yaxın dost bildiyi, hələ dünən axşam bir masa dalında duz-çörək kəsdiyi bir adamın familiyasını oxuyarkən, başından alov qalxdı. İpin ucunu tapdığına sevinsə də, oxuduğu sətirlərdən dəhşətə gəldi. Qəfəsə düşmüş aslan kimi sağa-sola vurnuxdu.

Sonra Gülcamalın məktubunu sürətlə oxumaqda davam etdi:

"Dərsdən çıxıb onun yanına getdim. Qapıda çox gözlətmədi. Məni tez çağırtdırdı. Bəzəkli bir kabineti vardı (mən indi anlamışam ki, səliqə ilə bəzənmiş bu otaq iş görülmək üçün deyilmiş).

Sən də, əzizim, insanlara iclasda söylədikləri odlu nitqə görə qiymət vermə. O da çox mahir bir natiq kimi məşhurdur. Hər yerdə, hər zaman ürəkdən, vicdandan, saf məhəbbətdən danışar, daşürəkli, dəftərxana məmurlarını söyər, "onların qəlbində xalq məhəbbəti əvəzinə qara yellər əsir" deyərdi. O danışarkən mən öz-özümə düşünərdim: "Xalqımız doğrudan da xoşbəxtdir ki, onun belə gözəl oğulları var". O məni gülərüzlə qarşıladı. Ərizəmi oxudu.

– Gülcamal xanım, – dedi. – Aslan mənim ən yaxın yoldaşlarımdandır. O yoxdur, biz ki, ölməmişik. Vətən yolunda həlak olan qəhrəmanların ailəsinə hər gün, hər saat kömək etmək borcumuzdur. Nəyə ehtiyacınız olsa, o dəqiqə mənim yanıma buyurun!

Doğrudan da o bizə kömək verdi. Bir dəfə hətta özü də maşına minib bizə gəldi. Hədiyyə gətirdi. Uşaqlarla görüşdü. Onun bu mərhəmətinə qarşı necə təşəkkür edəcəyimi bilmirdim. Telefonla kimi isə danladı: "cəbhəçi ailələrinə belə kömək etdiyin üçün səni güllələmək də azdır", – dedi. Mən əvvəlcə ondan çox razı qaldım.

Ah, keşkə mən onun üzünü görməmiş olaydım. Keşkə hədiyyələr əvəzinə balalarıma zəhər içirdəydim.

Bir gün o məni evinə qonaq çağırtdırdı. Nə qədər "Sağ ol, təşəkkür edirəm", – dedimsə, məndən əl çəkməlidir.

Özü gəlib çıxdı: Hələ bir məni danladı:

– Görən nə deyər, Gülcamal xanım?.. Vətən yolunda həlak olan yoldaşımın ailəsinə mən ehtiram göstərməsəm kim göstərəcək?.. Mənim xanımım Gülzar da xahiş elədi, getməsəniz o çox məyus olar...

İstər-istəməz razı oldum.

Süfrəyə hər cür yemək düzülmüşdü. Başqalarının çətinliklə tapdığı şeylər, elə bil burda toplanmışdı. Gözlərimlə Gülzar xanımı axtarmağa başladım: o, evdə görünmürdü.

Mən üzümü ona tutdum. Gülə-gülə nəzakətlə soruşdum:

– Bəs xanımınız hanı?

O da mənə gülə-gülə cavab verdi:

– Bu dəqiqə gələcək. Siz əyləşin, qonşuda bir az işi vardı.

Mən bu günəcən ona ürəkdən inanırdım. Birdən nədənsə qəlbimə şübhə damdı. Başımdan min cür xəyal gəldi keçdi.

O səndən söz saldı:

– Hayıf oldu. Mən onu ali məktəbdən tanıyırdım. O zaman mən tələbələr komitəsinin sədri idim. Aslan ən yaxşı tələbələrdən sayılırdı. Odur ki, sizə daima hörmət eləmək mənim vicdani borcumdur. Xalqın mərd oğullarına xüsusi qayğı lazımdır. Mən partiyanın əsgəriyəm. Bilirsinizmi, yoldaşlıq böyük şeydir. Ancaq mən köhnə qayda ilə yoldaşlıq eləmək tərəfdarı deyiləm. Əlbəttə bizdə xüsusi dostluq ola bilməz. Xüsusiyyətçi adamların dostluğu bizə heç bir zaman əl verməz.

Xülasə, deyəsən o məni qonaqlığa deyil, yoldaşlıq barədə əvvəlcədən hazırlanmış uzun bir mühazirəyə çağırmışdı.

Mən yenə səbir edə bilmədim:

– Bəs xanımınız nə yaman gec gəldi? – deyə xəbər aldım.

– Qonşudadır. Bu saat gələcək. Biz onu gözləməyib, başlaya bilərik... – dedi.

– Yox, nə üçün?.. Evin xanımı olmayan yerdə mən çörək yeməərəm, – dedim.

– O da sizin bacınız... Hər gün ona deyirəm ki, "Gülcamalla dost ol", bu rayondakıların hamısı çox geridə qalmış, qeyri mədəni adamlardır. Xalqımızı belə görəndə ürəyimdən od qalxır. Yanıram, yanıram, su içməkdən də lap təngə gəlirəm. Nə edəsən? Xalq üçün can yandırmasan, partiyanın necə əsgəri ola bilərsən?

Onun bu sözləri əlbəttə mənim xoşuma gəlmədi. Rayonumuzdakı adamları qeyri mədəni adlandıranda mənə çox toxundu. Müəllim yoldaşlarımı, tələbələrimi, şəhərimizin yüzlərlə ziyalılarını təhqir edərkən,

onun nə məqsəd izlədiyini başa düşürdüm. O, mənim nəzərimdə yalnız özünü mədəni, alicənab göstərmək istəyirdi. Daha bilmirdi ki, mən onun düşündüyü qədər də sadəlövh deyiləm.

O, süfrəyə yanaşdı. Bir qədəh götürüb qabağıma qoydu.

– Yaxşı deyil, səbir edin, – dedim, – xanımınızı gözləyək.

– Nə fərqi var ki? O da gəlib öz payını yeyər...

– Yox, yox, gözləyək, – dedim.

Nə qədər israr etdimsə olmadı. Qədəhimi doldurdu.

– Mən içmirəm. Zəhmət çəkməyin! – dedim.

– O nə üçün?

– Heç dilimə də dəyməyib.

O, qədəhini qaldırdı. Mənə yaxınlaşdı. Doğrusu bu an şübhələrim daha da artdı. O, qədəhini mənim qabağımdakı qədəhə vurdu.

– Gürcülərdə çox gözəl bir adət var, – mən özüm uşaqlıqdan internasionalist olduğum üçün başqa xalqların adətlərini də sevirəm. Gürcülər hər zaman vəfat etmiş əziz adamlarının xatirəsini yad etmək üçün, onların şərəfinə tost deyərlər. Bizim Aslan vətən yolunda canını qurban verdi. Birinci qədəhimizi Aslanın şərəfinə...

Mən dəli kimi ayağa qalxdım. Səni ölənlərin cərgəsinə yazan belə bir insan, mənə qızıl xəzinəsi bağışlasaydı da, mən ona yalnız nifrət edə bilərdim. O, məni elə bil dəhşətli yuxudan ayıltdı. Aclığım da, susuzluğum da yadımdan çıxdı. Ürəyim şiddətlə döyündü. Otaq başıma hərləndi. Gözlərimə qaranlıq çökdü. Elə bil kim isə qulağıma pıçıldadı: "Aldanma! Onun arvadı gəlməyəcək. O səni tora salmaq istəyir".

Qapıya sarı yönəldim. Açmaq istədim. Mümkün olmadı. Qapı bağlı idi. Açarı da üstündə deyildi.

– Açın! – dedim.

O gülümsündü. Mənə yanaşdı. Qolumdan tutdu. Mən sərt bir hərəkətlə ondan aralandım. – Toxunmayın mənə!.. – dedim. – Açın qapını!..

O açmadı. Mən elə qışqırdım ki, pəncərənin şüşələri səsləndi.

– Açın!.. – dedim.

O yenə də nəzakətlə mənə yanaşdı.

– Acıqlanmayın, Gülcamal xanım, – dedi, – mən aylardan bəri, lap rayona gəldiyiniz gündən, o qara gözlərinizin həsrətindən od tutub yanıram. İnsafınız yoxdurmu? Mən hələ yerli-dibli evlənməmişəm. Mən sizin məhəbbətinizlə yaşayıram. Bu sözləri eşidəndə elə bil başıma bir qazan qaynar su töküldü. O isə yenə deməyə başladı:

– Belə namuslu bir qadın, mənim kimi namuslu bir kişiyə layiqdir. Görürsünüz ki, mən özümü necə yaxşı aparıram?.. Heç ömrümdə başqa bir qadına gözümün ucu ilə da baxmaram. Siz nə üçün yaşamaq istəmirsiniz?..

Ürəyimin guppultusunu özüm də aydın eşidirdim.

– Açın, – dedim, – sonra axırı pis olar.

O, yenə qapını açmadı.

– Ölümə razı olaram burda oturmaram, – dedim.

– Nə üçün?

– Hələ bir soruşursunuz da...

O, birdən yumşaldı.

– Gülcamal xanım, – dedi, – mən sizə güldən ağır nə dedim ki?

– Rica edirəm, açın qapını!

O, məndən aralandı. Açarı gətirdi.

– Yaxşı, siz deyən kimi olsun, – deyib məni yola saldı.

Evə qayıtdım. Səhərə kimi ağladım.

Bu əhvalatdan bir gün sonra uşaqları evdə tək-tənha qoyub məni həbsxanaya apardılar. Məni gecəyarısı həbsə aparan adam xəbər verdi ki:

– Başqa yerə sürgün olunacaqsan!..

– Niyə? Nə üçün?

– Məlumdur, nə üçün. Aslan nemeslər tərəfə keçib...

– Yalandır! – dedim, – onun yoldaşlarından kağız almışam. O, vuruşmada həlak olub...

– Ancaq bizim əlimizdə məlumat var ki, o bir il bundan əvvəl könüllü olaraq düşmən tərəfə keçib...

– Bəs mənim uşaqlarım?

– Onları da sizə qatıb sürgün edəcəyik.

– Uşaqların günahı nədir?

– Xainin balaları da xain olar!..

Bu sözü deyən adam Rəhimzadənin yanında işləyirdi. Səsimünüm heç yana çatmadı. Ona nə dedimsə "yox" cavabını aldım.

– Bir parça kağız verin!..

– Yox, olmaz!

– Anama xəbər yollamaq istəyirəm. Uşaqlarım təkdir. Gəlsin, göz yetirsin!

– Yox, olmaz!

– Ərizə vermək istəyirəm.

– Yox, olmaz!..
– Nə üçün?
– Olmaz, vəssalam!
Bu adamdan qeyri heç kimi görmürdüm. Onda başa düşdüm ki, mənim həbs olunmağımdan nə prokurorun, nə Xalq Daxili İşlər Komissarlığı müvəkkilinin, nə də başqalarının xəbəri var.
Axşamüstü o özü mənim yanıma gəldi.
– Gülcamal xanım, – dedi, – görürsünüz ki, hökumət mənim əlimdədir. Sizinlə istədiyim kimi rəftar edə bilərəm.
Mən nifrətlə ondan üz çevirdim.
– Lakin bu müvəqqətidir, – dedim, – ölkə sahibsiz deyil. Mənim hayıfımı da alan olar.
– Bu dünya beş gündür. Sabah nə olacaq o məni maraqlandırmır. Bir də məni çoxdan tanıyırlar. Mənim sözümə hər yerdə inanırlar. Çünki...
– Çünki yaxşı tanımırlar. Əgər tanısaydılar, burada mən yox, sən oturardın.
– Ha, ha, ha!..
Ax, o nə qədər iyrənc idi!
Mən qəzəbimdən boğulurdum. Birdən o mənə yaxınlaşdı:
– Mən xalq yolunda can qoymuşam. Burada düşmənlər oturur – dedi.
– Sən ki, cavansan, dedim – xalqını sevən öz qüvvətini mənə deyil, cəbhədə düşmənə göstərər. Amma sən hələ küncdə-bucaqda gizlənirsən...
O yenə iyrənc bir səslə güldü:
– Belə lazım görülmüşdür!.. – dedi, – mən hələ xalqıma lazımam!..
– Cəbhədəkilərin hamısı lazımlı adamlardır. Mənim ərim səndən də böyük vəzifədə idi. Cəbhəyə könüllü getdi.
– O, xəyanət üçün getmişdir.
– Bu böhtan da sənə baha oturacaqdır.
– Aslan alman casusudur!
– Ən satqın casus sənsən!
O getdi. Ancaq bir Allah şahiddir ki, mən bir an sənin haqqında deyilənlərə inanmadım. Dünyanın o başına da sürgün olunsaydım, iradəm sarsılmazdı. Ancaq ürəyimə vurulan ləkə məni məğlub etdi, mən artıq yaşamaqda bir məna görmədim.
Sən təəccüb edəcəksən: "Ləkə nədir?" soruşacaqsan.

Bir gün sonra məni həmin adam Rəhimzadənin kabinetinə gətirdi. Mən düşündüm ki, yəqin nə isə soruşacaq, günahıma dair mənə yeni bir söz deyəcəkdir. O isə yenə nəzakətlə mənə yanaşdı:

– Olan olub, keçən keçib... – dedi, – gəlin, daşı ətəyinizdən tökün. Uşaqlarınız yazıqdır. Mən onlara atalıq edərəm... Mən sizi imtahandan keçirirdim. Belə namuslu qadın xalqımızın fəxridir.

– Çəkil!.. – dedim, – sənin tərifin mənim üçün ən böyük təhqirdir!.

– Elə isə həbsə gedəcəksiniz! – dedi".

Məktubun bu yerinə çatanda Aslanın gözləri qaraldı. Oxuduqlarına inanmaq istəmədi. Lakin Gülcamalın özünü yalnız bu hadisələr nəticəsində zəhərlədiyini xatırlayıb yenə qüvvətini toplayıb, məktubun son sətirlərini də oxudu.

"Məni ordan həbsxanaya yox, tanımadığım görmədiyim qaranlıq bir daxmaya apardılar. Mənim bu zaman necə dəhşətə gəldiyimi özün də təsəvvürünə gətirə bilərsən, əzizim... günahsız müqəssirlərlə belə rəftar edən bir rəzilin hələ yaşadığını düşündükcə öz-özümə deyirdim: "Yox, yox!". Lakin birdən acı həqiqət öz iti dırnaqları, quduz dişlərilə bərabər mənim qarşımda dayandı. Mənim nəzərimdə insandan çox heybətli bir kölgəyə bənzəyən o canavarın heykəli birdən-birə qarşımda göründü.

Mən bu dəfə necə çığırdığımı yazmaqda acizəm. Mənim səsim yalnız onu deyil, özümü də qorxutdu.

– Xoşluqla razı olmadınız, xanım, mənim zorum da yox deyil – dedi.

Yalnız bu sözləri eşitdim. Sonra nələr olduğunu xatırlasam da, yaza bilmirəm. Qələmimin ucu tez-tez kağıza batır. Gözlərimin yaşı mürəkkəb olub kağızın üstə tökülür. Ancaq mənim dərdimi mürəkkəb də, göz yaşı da ifadə etməkdən acizdir. Qolumun damarını kəsib, son sətirləri qırmızı qanla yazıram. Qoy, nələr çəkdiyim sənə əyan olsun, əzizim..."

Aslan qırmızı xətləri görəndə dəli kimi yerindən sıçrayıb qalxdı: "Yox, mən yuxu görürəm" – deyə fikirləşdi, əlini ürəyinin üstə qoydu. Birdən Gülcamal kimi onun da qarşısında bu həqiqət öz eybəcərliyi ilə dikəlib durdu.

Yox, o yuxu görmürdü.

Aslan səhərəcən yata bilmədi. O, intiqam saatını səbirsizliklə gözləməyə başladı. Qanlı vuruşma meydanlarında almanların arxasında,

qarda-yağmurda vətən torpağını qoruyarkən o, yalnız bir həqiqətə inanmışdı: "hayıf yerdə qalmaz", o buna əvvəlkindən çox inanırdı. Bəlkə elə bunun üçün də səbri tükənmişdi. Hər dəqiqə ona bir ildən belə uzun gəlirdi.

Sübh tezdən qalxıb çay hazırlayan qoca anası Aslanı bu halda görərkən təəccübdən böyümüş gözləri ilə baxdı:

– Bu nədir, ay oğul, sən hələ yatmayıbsan?.. – dedi.

Aslanın bədənində bir uçuntu vardı. Bəzən onun dişləri də bir-birinə dəyib şaqqıldayırdı.

– Sənə nə olub? – deyə anası bir də xəbər alanda, o heç bir söz deməyib cəld paltarını geyindi, tapançasını kəmərinə taxdı. "Mən ondan amansız bir intiqam alacağam. Yoldaş sözünü təhqir edən, böyük insan namusuna ləkə vuran o, xaindən yalnız mən deyil, bütün ölkə intiqam alacaqdır!" deyə həyəcanla düşündü...

## XI

Aslan, Bakının yuxarısında gecə-gündüz işləyən böyük bir binanın mərmər pilləkənlərilə yuxarı dırmandı. Çoxdan gəlmədiyi otaqlarda hər kəs bir işlə məşğul idi. Aslan əsəbi addımlarla hamının tanıdığı, sevdiyi bir adamın otağına yanaşdı.

– Mən Aslan Haşımzadəyəm, – dedi.

Masa arxasındakı qadın gülümsəyib, nəvazişlə onun üzünə baxdı:

– Sizə kim lazımdır?..

– Yoldaş Cəfərovu görmək istəyirəm, – deyə Aslan cavab verdi.

Qadın böyük salonu göstərdi:

– İclasdadır, – dedi.

Aslan, izin almadan qapını açdı. Salona daxil oldu. İçəridə boş yer tapmadı. Geridə, ayaq üstündə durdu. Xitabət kürsüsündəki adamı görərkən, Aslanın gözləri kəlləsinə çıxdı: danışan Rəhimzadə idi.

– Vətən yolunda həlak olan qəhrəmanların ailəsinə qayğı göstərmək bizim vicdani vəzifəmizdir!"... – deyərək odlu-odlu əllərini ölçürdü.

Aslanın alışıb yanan gözləri salondakıların üzündə gəzdi. Onun səbirsiz axtardığı Cəfərov iclasda yox idi.

O, bu dəmdə qonşu otaqda telefonla danışırdı. Kim isə Gülcamalın əhvalatına dair ona məlumat verirdi.

Cəfərov saysız-hesabsız dövlət işlərindən vaxt tapıb bu məsələni də yoxladırdı.

O, telefonda danışarkən əsəbi halda papiros çəkir, hirsindən qırıq-qırıq nəfəs alırdı.

Birdən telefonun dəstəyini yerinə qoyub çox tutqun halda iclas salonuna gəldi. Xitabət kürsüsündəki natiqə baxdı. Onun iri gözləri sonsuz bir qəzəblə alışıb yandı:

– Mən hələ bilmirəm ki, sən nə üçün bu vaxta qədər güllələnməmisən?

Aslan da qeyri-ixtiyari dilləndi:

– Mən də bilmirəm, nə üçün?

Hamının gözü Aslana zilləndi.

*Yanvar – Aprel, 1945*

## KƏRƏM ƏFSANƏSİ

Mən bu hekayədə köhnə bir igiddən danışacağam. Bir zamanlar böyük rus ədibi Maksim Qorki də onun mərdliyindən ilham almış, onun Qaf dağı kimi əyilməz, məğrur təbiətini tərənnüm eləmişdi. Bu igidi el arasında Qaçaq kərəm adı ilə tanıyırdılar.

Kərəm öz dəstəsilə bərabər dağlarda, dərələrdə yuva salmışdı. Onun qan düşməni İsrafil ağa da, özü kimi qüvvətli, cəsur bir adam idi. Yalnız bir fərqləri vardı: Kərəm çar divanından qaçaq düşmüşdü, İsrafil ağa isə çar himayəsində yaşayırdı.

Günlərin birində, hələ obalar yaylaqda ikən, Kərəm dəstəsini çəkib, arvad-uşağını görməyə gəlmişdi. Dostları dərələrə dağılışıb, paltarlarını çıxarmadan, aynalı tüfənglərini yanlarına qoyub yatmışdılar. Kərəm özü isə alaçıqda yorğan-döşək saldırıb, arvadının yanında uzanmışdı. Ağır və məşəqqətli səfərlərin yorğunluğunu unutmaq istəyirdi. Ancaq onun gözlərinə yuxu getmirdi. Düşmənini unuda bilmirdi. O, tez-tez sağa-sola çevrilir, sevimli arvadının ılıq nəfəsini duyduqca onun güngüzəranının olmadığına təəssüflənirdi.

Kərəm, gecədən xeyli keçmiş qalxıb, alaçıqdan eşiyə çıxdı. Gəzindi. Ətrafı yoxladı. Bütün oba sanki bir əbədi yuxuya getmişdi. Adətən sayıq yatan qapı itlərindən də səs-səmir gəlmirdi. Kərəm isə düşməninin hər dəqiqə qəfildən hücum edə biləcəyini düşünürdü. O, gəzinə-gəzinə, obadan bir az kənarda, hündür qayanın dalına girib keşik çəkən dostuna yanaşdı, qəsdən pıçıltı ilə soruşdu:

– Yatmısan ki, Mərdan?

Cavan qaçaq da yorğun idi, amma yatmamışdı:

– Xeyr, Kərəm dayı, – dedi. – Əgər yuxu məni üstələsə, barmağımı kəsib duz basaram!..

– Duzun varmı?

– Var, Kərəm dayı, – deyə Mərdan çuxasının vəznəsini göstərdi.

Yaralı barmağa duz basmaq, vəfalı dost nəzərində o qədər də böyük fədakarlıq deyildi.

Kərəm çəkməsinin uzun boğazından gümüş başlı çubuğunu çıxardıb, tənbəki doldurdu. Çaxmaq daşı itlə qov yandırdı, tənbəkini tüstülətdi. Kərəm Mərdana bir söz demədən, yenə gəzindi, yenə ətrafı dinlədi. Bu sakit, səssiz aləmdə hər şey rahat idi, yalnız Kərəmin ürəyi rahat

ola bilmirdi. Oba üzərini çən bürümüşdü, axşamüstü mavi göyün boşluğunda gözəl bir gəlin ədası ilə süzən ay indi hardasa gizlənmişdi.

Kərəm çox gəzib dolandı, tez-tez çəndən siyrilib çıxan yollara çox nəzər saldı, amma heç bir ins-cins gözünə dəymədi. Kərəm yenə də sakit ola bilmədi. "Görünür İsrafil ağa bizim gəlişimizdən xəbər tutmayıb, yoxsa indiyəcən harda olsaydı, dəstəsini çəkib üstümüzə gələrdi" – deyə düşündü və alaçığına qayıtdı.

Qaranlıqdan arvadının səsini eşitdi:

– Kərəm, gözümün nuru, gəl uzan, mən qalxıb keşiyini çəkərəm! – Vəfalı qadın köksünü ötürəndə, kədər dolu bir ah çəkdi. O, yaşarmış gözlərini göyə dikib Allaha yalvardı. – Ey böyük tanrı, mənim balalarıma rəhmin gəlsin!..

Kərəmin ürəyi poladdan möhkəm, ipəkdən yumşaq idi. Arvadının xeyir-duası onu da qəhərlənirdi:

– Qəm yemə, Gülsabah, – dedi, – yaman günün ömrü az olar...

Qadın dinmədi. Ərinin səsindəki qəm nidaları onun qüssəsini daha da artırdı. Kərəm uzandı. Tüfəngini yorğanını üstünə qoydu. Azca yatmaq və dünyanın dərdini-kədərini unutmaq istədi...

Gecə o qədər uzun, saatlar, dəqiqələr o qədər ağırdı ki...

Nəhayət, Kərəmin gözləri qapandı. Şirin yuxu o mərd, o qüdrətli igidi də məğlub elədi...

Kərəm nə qədər yatdığını bilmədi. O, yalnız hava işıqlanmağa başlayarkən oyandı. İndi artıq qorxu azalmışdı. İsrafil ağa gündüz hücum fikrinə düşə bilməzdi. Kərəm yerindən qalxaraq, alaçığı tərk etdi. Obanın şimalında, dünən keşikçinin dayandığı qaya dibindən pıq-pıqla qaynayan muncuqlu bulağa tərəf getdi. Hələ gənc yaşlarından sevdiyi bu gur çeşmə, ən əziz xatirələrlə bağlı idi. Kərəm tüfəngini qayaya söykədi, patrondaşını açıb, daşın üstünə qoydu, çuxasının ətəklərini qatlayıb, kəmərinə keçirdi, qollarını çırmadı. Buz kimi soyuq suda doyunca əl-üzünü yudu. Əgər bu dəmdə güzgüyə baxsaydı, geniş alnındakı xəncər yerinin qaraşın saqqalına, uzunsov, qırxıq başına, qalın burma bığlarına, nə isə daxili bir kədərlə yanan iri, tünd qara gözlərinə necə yaraşdığını duymamış olmazdı. At belinə qalxanda, saçaqlı papağı və qara yapıncısı onu nəhəng bir qartala oxşadırdı. Amma indi, bulaq başında yuyunan vaxt Kərəmi sadə və sıravi dəliqanlı kənd dəliqanlısından fərqləndirmək çətin idi. O, yaylıqla əlini-üzünü silib, daş üstündə oturdu, istər-istəməz dərin düşüncələrə daldı. Özünün, ailəsinin, dostlarının

taleyini fikirləşirdi və namərd zəmanəyə lənət oxuyurdu. Kərəm bilirdi ki, onu arvadından-uşağından, elindən-obasından didərgin salan da bu zəmanədir. İsrafil ağanı öldürsə də, həyat onun üzünə gülməyəcək. Kərəm gənclik illərində indiki kimi qaraqabaq deyildi. O, gülər, oynar, zarafatlaşardı. Qəhqəhə çəkəndə, qənd kimi ağ dişləri görünər, dağda-dərədə əks-səda verən səsi köhlən atın kişnəməyini xatırladardı. "Yox, görünür, alnıma belə yazılıbmış, eldən-obadan uzaqda, qürbətdə ömrümü başa vurmaqdan qeyri çarəm yoxdur", – deyə düşünərək, patrondaşını çiynindən aşırdı, tüfəngini də götürüb obaya qayıtdı.

Alaçığa girmək istəyəndə, qapıdan azca sağda çətənin dibində gözünə bir patron sataşdı. Kərəm duruxdu və dərhal, qeyri-ixtiyari patrondaşını yoxladı: "Bu, mənim deyil!" – deyə xəyalən yoldaşlarını danladı, böyük oğlunu yollayıb, onların hamısını çağırtdırdı. Bütün dəstə yığışandan sonra, əlindəki patronu yuxarı qaldırıb dostlarına göstərdi, töhmətli nəzərlərlə bir-bir onları süzərək, hamı eşitsin deyə ucadan soruşdu:

– Bu kimindir?

Qaçaqlar tez-tələsik patrondaşlarını yoxladılar. Kərəm bir də soruşdu:

– Kimindir, hə?

– Heç kəs patron itirməmişdi. Kərəmin rəngi kömür kimi qaraldı:

– Ay uşaqlar, – dedi, – bu gecə İsrafil ağa burdaymış... Məni vurmağa gəlibmiş... Ax, Mərdan, Mərdan... Bax, yaxşı gözdə-qulaqda olmamısan!

Mərdanın rəng-ruhu qaçdı: bir an belə onun gözünə yuxu getməmişdi.

Kərəm dedi:

– Məni o, çox asanlıqla vura bilərmiş, amma istəməyib... Bilirsinizmi niyə?

Qaçaqların gözlərində sanki eyni sual yazıldı: "Niyə ki?"

Kərəm öz sualına cavab vermədi. Onu dinləyənlər içərisində arvad-uşaq da vardı. Kərəm əmr elədi:

– Gedin, atlanın! Dağlara çəkilək. İsrafil ağa da, kazaklar da hər dəqiqə başımızın üstünü ala bilər...

Yoxsa Kərəm qorxurdu? Əlbəttə, yox. O, bütün obanın güllələbaran olunmağını istəmirdi.

Qaçaqlar atlanıb, yola düşdülər. Bir az gedəndən sonra oba görünməz olanda, Kərəm atının qantarğasını çəkdi, maralgözlü, ceyranyerişli

kəhər ayğır şahə qalxaraq yanakı dayandı, o biri atlıların yolunu kəsdi. On iki nəfərin gözü Kərəmə dikildi. Hamı diqqət kəsildi. Kərəm dedi:

– Ay uşaqlar!.. İsrafil ağa gecə ikən obaya gəlibmiş... Ancaq məni vurmayıb. Bilirsinizmi nə səbəbə, hə? O, mənim düşmənim də olsa, əsil igiddir... Məni arvadımın yanında gördüyü üçün fikrindən daşınıb... Bu patronu da o atıb... Demək istəyib ki, səni öldürə bilərdim, amma arvadına bağışlayıram. Mən ona bir borclu!..

Dəstə yoluna düzəldi, uzaq dağlara istiqamət aldı...

Ay keçdi, il dolandı. Kərəm İsrafil ağaya rast gəlmədi. Yaz günlərinin birində, obalar yaylağa köçməyə başlayanda, Kərəm öz dəstəsilə kəndə üz tutan zaman, yolda qəfildən çar kazakları ilə qarşılaşdı. Qanlı vuruşma oldu. Qaçaqlar yaxşı səngərlənə bilmədilər. Yoldaşlarından ikisi vuruldu. Kəndə girmək fikrindən əl çəkdilər, həlak olmuş yoldaşlarının meyitini götürüb, yenə dağlara qalxdılar. Kərəmin də, dostlarının da göz yaşı sel kimi axdı. Bundan sonra qaçaqlara batmaq çətin idi. Onların üstünə bir alay qoşun da yerisəydi, Kərəmin halına təfavüt eləməzdi, çünki qaçaqlar dallarını sıldırımlı bir dağa söykəmişdilər, hücuma keçən düşməni isə bircə-bircə biçib-tökə bilərdilər. Amma Kərəm buralarda çox dayanmaq fikrində deyildi. Dəstənin azuqəsi qurtarmışdı. Ac-susuz qalmamaq üçün uzaq bir yerə çəkilib hökumət adamlarının nəzərindən yayınmalı idilər.

Kərəm Arazın o tayına keçdi. Bütün yayı Təbrizdə qaldı. Arvadından-uşağından ayrı yaşamaq həm Kərəmin özü, həm də yoldaşları üçün çox çətin idi. Qaçaqlar sözü bir yerə qoydular, həmişəlik İranda qalmağı bu məqsədlə şaha namə göndərməyi qərara aldılar. Lakin təbrizli qardaşları bunu məsləhət görmədilər. İran şahı ilə Rusiya çarını nəzərdə tutaraq:

– İt-itin ayağını basmaz!.. – dedilər.

Bu sözlər Kərəmin beyninə batdı. O, yenə öz mahalına dönməli oldu. Qanundan kənar yaşamaq artıq onu təngə gətirmişdi. Ancaq o, nə edə bilərdi? Üzə çıxıb hökumətə təslim olsaydı, ya dar ağacından asılacaq, ya da ən azı qarlı Sibirə ömürlük sürgünə göndəriləcəkdi. kərəm bunu yaxşı bilirdi. Axı özü də, yoldaşları da yüzlərcə bəy, yasavul kazak öldürmüş, dövlətli mülkədarların xanımanına od vurmuş, tacirləri soyub, əlsiz-ayaqsız insanlara kömək eləmişdilər. Kərəm bilirdi ki, çar məhkəməsi onların günahını heç vaxt bağışlamayacaq, "Ədalət naminə"

zülmün, zorakılığın tərəfini saxlayacaq. Bəs Kərəm nə etməli idi? Bu sual onu bir gün yox, iki gün yox, aylarla, illərlə düşündürmüşdü.

Dəstə Arazın bəri tayına keçib, yenə yaylaqlara üz tutdu. Kərəm ömründə bu qədər qəmgin və ümidsiz olmamışdı. Obalar arana köçürdülər. Dağların döşü ilə uzanan dar, əyri-üyrü yolları qoyun sürüləri tutmuşdu. Hər tərəfdə hay-haray qalxmışdı. Yanıqlı mahnı səsləri yamaclarda əks-səda verirdi. Kərəm də, yoldaşları da bədbin idilər. Qürbət diyarlarda sərgərdan gəzməkdən artıq cana doymuşdular.

– Ən uzağı ölümdür!.. – deyə obalarına dönmək, heç olmasa arvad-uşaqları ilə son dəfə görüşmək istəyirdilər.

Birdən Kərəmin gözləmədiyi bir hadisə baş verdi. Dağ yolunda qan düşməni İsrafil ağaya rast gəldi. İsrafil ağanın obası dolama yolla dağdan enirdi. Göy mahuddan vəznəli çuxa geymiş, ceyrandan iti, maraldan göyçək, səkil atına minmiş İsrafil ağa, çiynində aynalı tüfəng, özü kimi silahlı dostlarının əhatəsində, köçün qabağında gəlirdi. Kərəm onu lap uzaqdan tanıdı. Yoldaşlarına dönərək:

– Atdan düşün, daşa girin!.. – deyə ucadan səsləndi.

Qaçaqlar bir göz qırpımında onun əmrini yerinə yetirdilər, özləri də, atları da görünməz oldular.

İsrafil ağa yaxınlaşırdı. O, at belində necə məğrur oturmuşdusa, Kərəmin ürəyində qibtə oyadacaq qədər qamətli və gözəl görünürdü. Kərəm intiqam saatının gəlib çatdığını düşündü, kinlə qarışıq bir sevinc duyaraq, tüfənglərini hazır tutmuş dostlarına müraciət elədi:

– Uşaqlar, mən deməyincə atmazsınız ha!..

İsrafil ağa qaçaqların düz bərabərinə çatanda, Kərəmin əlləri yanına düşdü:

– Atmayın, uşaqlar!.. – dedi, amma özü nə üçünsə tüfəngin şeytanından barmağını çəkmədi.

İsrafil ağa nəyə isə gülürdü. Dostları da onun kimi şad və xürrəm idilər. Kərəm isə qəzəbindən titrəyir, belə bir fürsəti əldən verməyə məcbur olduğuna hirslənirdi.

– Eyyy, İsrafil!.. – deyə qaçaq Kərəm boğuq və titrək bir nida ilə düşməni səslədi. – Mənəm. Borcumu verməyə gəlmişəm!..

İsrafil ağa bir an, yalnız bircə an özünü itirən kimi oldu, ancaq tezcə də tüfənginə əl atdı. Lakin artıq gec idi. Tərkindəki oğlan uşağı hərəkətini ləngitmişdi.

– Mən borcumu ödədim!.. – deyə Kərəm bu dəfə artıq fərəhini boğa bilməyib, dəli kimi qəhqəhə çəkdi, sanki onun atsayağı kişnədiyi gənclik illəri geriyə qayıtdı. – Mən də səni körpənə bağışladım!.. Sür atını, get. Lənət bu fani dünyaya! Lənət bu zəmanəyə!..

İsrafil ağa da əl saxladı. Yoldaşları da əl saxladılar. Hamısı Kərəmi tanımışdı. Üzünü görməsələr də, tanımışdılar. Bir də ki, güllə atmağın heç bir faydası yox idi. Onsuz da hədəfi görmürdülər. Kərəm də, yoldaşları da qaya dalında möhkəm səngərlənmişdilər.

Köç uzaqlaşdı. Kərəm, deyəsən, dərdini-qəmini unutmuşdu. O, qeyri-ixtiyari, saçaqlı papağını gözünün üstünə endirdi, məlahətli və zil səsi ilə bir-iki ağız bayatı dedi...

*1959*

# ŞEYTANIN BARMAĞI

*Təmsil*

Çox qədim zamanlarda yoxsul bir kəndli vardı. Onun cındırından cin hürkürdü. Özü də arıq və cılızdı. Ha əlləşirdisə, kasıblığın daşını ata bilmirdi, hətta taxılını döymək üçün də başqalarından qoşqu heyvanı istəməyə məcbur olurdu. Qonşusundan ikicə günlüyə aldığı öküzləri vələ qoşub, arpasını döydü, dənini ikitəkərli arabaya yükləyib, dağ ətəyindəki kəndin dəyirmanında üyütməyə apardı. Bir çətən külfəti acından batırdı. Fikri bu idi ki, necə olursa-olsun, bu axşam özünü dəyirmana yetirsin, yalvar-yaxarla dənini üyüdüb, gecə ikən də evinə qayıtsın. "Sən saydığını say, gör fələk nə sayır!" – deyiblər. Kəndli nə qədər tələsirdisə, öküzlər bir o qədər səbirli yeriyir, bəzən də üzə durub yolun ortasında dayanır, tənbəl-tənbəl quyruqlarını tərpədir, kəndlinin hay-hüyünü sanki eşitmirdilər. Kəndli qan-tər içində idi. Qırışlarla örtülmüş alnında tumurcuqlanan tər damcılarını əlinin tərsilə silməkdən yorulmuşdu. Günün istisindən az qala yazığın başı çatlayırdı. Öküzləri qırmancla döyəcləməkdən təngə gəlmişdi. Yolun kənarında kölgəli bir yer də yox idi ki, arabanı açıb, dincini alsın. Heç yerdə otdan, göyərtidən də gözünə dəymirdi ki, öküzləri bir az otarıb, sonra yola düşsün. Bu halda, tərs kimi, öküzlərdən biri soncuq atmağa başladı, arabanı o yan-bu yana dartaraq, yoldan qırağa çıxartdı, çökəyə tərəf sürüdü. Araba kəlləmayallaq aşdı. Kəndli özü də zərblə ağzıüstə yıxıldı və istər-istəməz "lənət sənə kor şeytan!.." – dedi.

Elə bu vaxt kor şeytan yoldan aralı, kiçik bir təpənin dalında oturub, balalarını yemləyirdi. Kəndlinin arabasını da görür, səsini eşidirdi. O öz-özünə deyirdi: "Ey xəbis insan, nə qədər ki, mən varam, sən heç vaxt öz həyatından razı qalmayacaqsan, əzab-əziyyət ömürlük sənin yoldaşın olacaq. Mən hər yerdə, hər zaman sənin keyfinə soğan doğramasam rahat ola bilməyəcəyəm. Mənə lənət oxuduqca, özünə ziyan verəcəksən!.."

Kəndli yıxıldığı yerdən qalxanda, üz-gözü qana bulaşmışdı. Nə qədər çalışıb-çapaladısa da, arabanı çökəkdən çıxara bilmədi. Öküzləri açdı. Arabanı qaldırıb, yola tərəf sürmək istədi. Amma gücü çatmadı. Yazıq-yazıq ətrafına boylandı, köməyə çağırmaq üçün adam axtardısa da, heç kəs gözünə dəymədi.

Şeytan onun fikrini dərhal başa düşüb, tez-tələsik insan cildinə girdi, təpənin dalından çıxıb, kəndliyə sarı gəldi, qəmgin bir görkəmlə salam verdi.

– Ay bədbəxt! – deyə başını bulayıb, nırçıldadı, kəndlinin dərdinə şərik oldu. – Axı, nə üçün gəlib bura düşmüsən? Düz yolla gedə bilməzdinmi? Mən olmasaydım kim imdadına çatacaqdı?

Şeytan kəndli ilə köməkləşib arabanı yola tərəf çəkməyə başlayanda, qəsdən təkəri daha dərin bir çökəyə saldı. Bu dəfə arabanın oxu xarıltı ilə dibindən qırıldı. Kəndli yanıqlı-yanıqlı əlini dizinə çırpıb, ucadan deyindi:

– Lənət sənə kor şeytan!.. Bu nə işdi mən düşdüm?

Şeytan yenə təəssüflə başını bulayıb, ah çəkdi:

– Doğrudan da adamın sənə yazığı gəlir. Neyləyim, qardaş? Əlimdən gələni əsirgəmədim. Günün bu istisində yoldan da qalıb, sənə kömək elədim. Başqa çarən yoxdur, gərək özünü tez kəndə yetirib, ayrı bir ox gətirəsən, mən də burda oturub, öküzlərin keşiyini çəkəm.

Kəndli yenə kor şeytana lənət deyə-deyə yola düzəlib, uzaqlaşdı. O, dərəyə enəndə, şeytan libasını dəyişdi, balalarının yanına gəldi. "O gedib-qayıdana kimi şər qarışacaq, sonra da boz qurd gəlib öküzləri təhərə çəkəcək" – deyə sevinclə düşündü.

Şeytanın balalarından biri məyus-məyus köksünü ötürüb, anasından soruşdu:

"Ay ana, de görüm sən niyə belə bədbəxtsən? Niyə insan övladı, bir balaca işi düz gətirməyəndə, sənə lənət oxuyur? Sən ki, burdaca oturub bizi yemləyirdin. Axı, günahın nə idi ki, o, səni yamanlayırdı?

Şeytan özünə məxsus bir hiyləgərliklə gülümsədi, tək gözünü qıyıb, uşağına mənalı-mənalı baxaraq dedi:

– Bala, kəndli tayfası çox bic tayfadır. O, öz düşmənini səndən də, məndən də yaxşı tanıyır. Doğrudur, mən burda oturmuşdum, sizi yemləyirdim, amma barmağım öküzün quyruğunun altında idi. Axırda onu elə qıdıqladım ki, soncuq atıb, arabanı yoldan kənara çəkdi. Mənə də elə bu lazım idi. Bəs necə eləyə idim? Gərək mənim barmağım bir iş görsün, ya yox? Əkin əkən deyiləm, biçin biçən deyiləm. Allahın dərgahından qovulalı ayrı sənət tapa bilmirəm. Bəs necə olsun? İnsan yaxşı-yaxşı işlər görsün, mən də durum baxım?

Şeytanın balası təəccübdən donub qaldı. Deməyə söz tapmadı. Amma fikir onu götürmüşdü. Sonradan-sonraya, ürəyinə nə gəldisə, yeməyinə ara verdi:

– Ana, – dedi, – belə çıxır ki, kəndli səni yerində söyürmüş. Olmazmı ki, bu çirkin əməlindən biryolluq əl çəkəsən, özünə başqa bir peşə tapasan?

Şeytan dedi:

– Olmaz, bala, olmaz. Əgər mən bu əməlimdən əl çəksəm, onda şeytanlıqdan çıxıb adam olaram.

*1959*

# RƏQİBLƏR

## I

– Necə, necə? Nə buyurdunuz? Usta Heybəti öldürsəniz də ürəyiniz soyumaz?

– Bəli, soyumaz! Niyə də soyusun? And olsun, əlimə fürsət düşsəydi, onu lap çarmıxa çəkərdim!..

Yox, inan mən bu sözlərin ürəkdən gəldiyinə inanan bilmirdim. Amma qəribə idi ki, usta Pirvəli nə əsəbiləşirdi, nə də hissə qapılırdı. Əksinə, həmişəki kimi, yenə də səbirli və soyuqqanlı idi. Eşitmişdim, görməmişdim: acığını üzə vurmayan insanların qəzəbi doğrudan da dəhşətli olurmuş. Usta Pirvəlini tanımayan bir adam bu dəqiqə onun sakit, lakin rəhmsiz baxışlarını görsəydi, düşünə bilərdi ki, bu qoca öz rəqibini çarmıxa çəksə uf da deməz. Elə əslinə baxsan, az qalmışdı mən də onun barəsində fikrimi dəyişim, sanki o, mənim nəzərimdə artıq indiyəcən yaxşı tanıdığım, xətrini istədiyim, hər dəfə görəndə ehtiramla salamladığım məşhur usta Pirvəli deyildi. Sadəliyinə, mehribanlığına və alicənablığına çoxdan bəri heyran olduğum bu insan birdən-birə nə üçün belə dəyişmişdi? Hansı təsadüfi və ya mühüm bir səbəb onu Heybət kimi köhnə bir dostundan üz döndərməyə məcbur eləmişdi? Bu barədə ona sual verməyə hazırlaşırdım ki, o gözləmədiyim halda, geriyə döndü, zorba pəncələrini ağır-ağır döşəməyə basaraq, qapıya doğru addımladı.

– Usta!.. – deyə mən əlimi qeyri-ixtiyari yuxarı qaldırıb, dayanmağını xahiş elədim.

O, çiyni üzərindən mənə baxıb, ayaq saxladı:

– Buyur!

– Buyurmaq yox, ərz eləmək istəyirəm, – dedim. Zahirən çox sakit görünsəniz də nədənsə qəzəblənmisiniz. Bayaqdan bəri danışdığınız sözlər də sizə heç yaraşmır. Nə olub ki?

Yuxusuzluqdan kiçilmiş və qızarmış göz qapaqları büzüşdü. Qalın dodaqlarında kinayəli bir təbəssüm titrədi, mis rənginə çalan, dolğun və ətli yanaqları dartıldı, bütün sifətinə boğuq bir qızartı çökdü, alnının sərt qırışla örtülmüş dərisi xal-xal oldu.

– Hımm... Guya bilmirsən? Lap yaxşı bilirsən, məndən də yaxşı... Ancaq mən qarnım üçün deyiləm, qədrim üçünəm. İndiyənətən belə

fikir eləyirdim, Heybət də mənimkidir, ona nə versələr, mənim də payım var. Amma indi baxıb görürəm, yox, məni gözdən salırlar. Bu cəhənnəm, mənim gördüyüm iş də gözdən düşür. Bu ədalətsizlik gərək Heybətin özünü qəzəbləndirəydi. Bir halda ki, o dinmir, deməli vicdanı təmiz deyil!..

– Bildim, usta, bildim nə deyirsən.

O, görünür, elə bu sözə bəndmiş. Bir an içində səbri də, təmkini də yox olub getdi. O, səsinə güc verdi:

– Bəs sən rəisimiz deyilsən? Niyə ağzına su alıb oturmusan?

– Usta, – dedim, – ordeni də, fəxri adı da mən vermirəm. Siyahıları mən düzəltmirəm... Özün bilirsən ki...

O, sözümü ağzımda qoydu. Yenə də ağır, amma zəhmli addımlarla stoluma yanaşdı, sağ əlini sırıqlı pencəyinin cibindən çıxartdı, mənə doğru meylləndi. Düşündüm ki, məni yalançı adlandırıb, vəl tayına bənzəyən zorba və qabarlı əlini çiynimə endirəcək, sümüklərim xurd-xəşil olacaq. Mən o dəqiqə müvazinətimi itirdim və özümü bu təhlükədən qurtarmaq üçün təsirli bir ifadə tapdığımı güman eləyib, kəkələdim:

– Aaa, usta, ömrünüzdə heç adam öldürmüsünüz?

Elə bunu demiş oldum. Qocanın dodaqları səyridi. Nəfəsi daralmış kimi kəsik-kəsik soruşdu:

– Nə?.. Nə?.. Nə dedin?

Mən cavab üçün söz tapmadım. Canımı üşütmə aldı. Udqunmaqdan başqa çarəm qalmadı. O, mənə lap yaxın gəldi.Saysız-hesabsız qığılcım saçan qonur bəbəklərindən gözümü ayırmağa məcbur oldum. Bu dəfə də səsini yavaşıtdı, lakin israrla tələb etdi:

– Bir də de görüm!

Aramızdakı gərginliyə dözmək üçün dəmir əsəb lazım idi. Bir neçə dəqiqə də susub ona cavab verməsəydim, usta Heybətim qisasını məndən alacağına heç bir şübhə ola bilməzdi. Onun hər səsində bir xırıltı da eşitdim:

– Bir də de!

Mən sualımı təkrar elədim:

– Soruşurdum ki, ömrünüzdə heç adam vurmusunuz?

O, gözlərimin içinə rəhmsiz bir hədə ilə baxdı. İki-üç dəfə başını buladı:

– Yox, – dedi. – Sən onu soruşmadın. Niyə belə tez yadından çıxdı?

Artıq hər bir sözümə irad tutduğunu görəndə, zorla gülümsədim.

– Usta, – dedim, – axı belə dostluq olmaz. Hər kəlməmdən yapışıb bu cür tərs danışmaq nə üçündür? Birdən-birə xasiyyətiniz elə dəyişdi ki...

Bu sözlərim də xətrinə dəydi. O, aramışdakı dostluq tellərini qırmağa təəssüflənmədən, səsinə daha yabançı bir ifadə verdi:

– Boş danışırsan! Kişinin xasiyyəti dəyişməz. Mən hər gün bir cildə girən, əldə qayırma kişilərdən deyiləm. Sən soruşdun ki, adam öldürmüşəm, ya yox? Doğrudur, sən universitet oxumusan, mən kəmsavadam, ancaq vurmaqnan öldürməyin təfavütünü bilirəm. Söz məsəli, məni heç kim vurmayıb, amma diri gözlü öldürmək istəyənlər olub... Mən adam vurmağına vurmuşam, ancaq bir Allah bəndəsini öldürmək xəyalına düşməmişəm. Bax. Bunu görürsən? – Usta sağ əlini irəli uzadıb gözümün qənşərində oynatdı. – Vuranda bərk vurmuşam. Mənim düdəmeyi-hindiyəmi yeyən çul kimi yerə sərilib, amma ölməyib... Ölməyini istəməmişəm. Mən sənin üçün nəyəm məgər? qulduram, yoxsa cəllad?

– Usta, – deyə mən ona cavab verəndə, nə qədər istədimsə, səsimin titrəyişini gizlədə bilmədim, belə görünürdü ki,canımdakı üşütmə hələ tamam yox olub getməmişdi. – Axı, mən nə quldur sözünü dilimə gətirdim, nə cəllad...

– Hələ bir gətirmək də istəyirdin?

Gözlərim onun əlinə zilləndi. Çiynimə dəyəcək zərbədən vaxtında yayınmaq üçün bir az da geriyə çəkilmək məsləhətdir. Deyəsən, o qorxduğumu yalnız indicə hiss eləyib, əlini şalvar cibinə saldı və qəhvəyi rəngli tütün qutusunu çıxardıb, uzun bir papiros bükdü, dodağı ilə kağızı yalayıb, zor-güc yapışdırdı, döş cibindən çıxartdığı patron çaxmaqla papirosunu alışdırdı, qəzet kağızının hisli tüstüsünü havaya buraxdı və yalnız bundan sonra ürəyini boşaltdı.

– Özgə vaxtı haqdan, ədalətdən dəm vurursunuz. Camaat qabağında danışanda, ağzınıza çullu dovşan sığışmır, bəs nə tövr olur ki, birinin haqqını verəndə, o birisi yadınıza düşmür?.. Bax, mən deyənə yaxşı mültəfit ol. Ömrümdə şöhrət və mükafat üçün işləməmişəm. Hələ bir yerdə bu barədə danışdığımı da görən olmayıb. Ancaq mənim yüzdən çox şagirdim var. Hərəsi bir peşə sahibidir. Orda-burda pıçıldaşırlar ki, yaxşı işlədik, olduq Pirvəli. Ona nə qiymət qoyublar? İndi gəl, əyri

oturaq, düz danışaq. Heybət məndən artıq neyləyib? O, əlli buruq qazıbsa, mən altmışını qazmışam. O, qırx il fəhlə olub, mən qırx iki il olmuşam. Dənizdə beş quyusu var, mənimki səkkizə çatır. Bəlkə uşağı çoxdur? Yox, burda da ondan geri deyiləm, intəhası mənimkilərin üçü qız, biri oğlandır. Heybətinkilərin biri qız üçü oğlandır. Nə olar ki? İndiki qızların hərəsi bir iyidə bərabərdir!.. Bəlkə o partiyanı, dövləti məndən çox istəyir. Bunu da deyəmməz!

Mən onun könlünü almaq üçün ürəkdən təsdiq elədim:

– Əlbəttə, usta, əlbəttə! Siz saçınızı xalq yolunda ağartmısınız. Siz bunu deməsəniz də, mən bilirəm!

– Sən bilirsən, görünür bilmiyənlər də var!

– Yox, usta, bu nə sözdür? Siz nə danışırsınız?

Bu təsəllim onu daha da haldan çıxartdı. Hirsli-hirsli papirosunu sümürüb, kötüyünü bükmələdi və mənim külqabıma atdı:

– Nə danışıram? Düz demirəm, vur başımı yar!.. Yoxsa mənə danışmağı da qadağan eliyəcəksən? Bəlkə, mən yığıncaqlarda az boşboğazlıq elədiyimə görə günahkaram! Bayram oldu, Heybət tribunada, qurultay oldu, Heybət prezidiumda! Qəzetdə Heybət, jurnalda Heybət, radioda Heybət, kinoda Heybət! Az qalıb ki, televizoru da Heybətin evinə köçürdələr. O gün qarım soruşur ki, "Ay Pirvəli, niyə sənin baxtın gətirməyib? Niyə sənin haqqını alıb, Heybətə veriblər?" Mən də özümdən çıxıb, ona dişimin dibindən gələni dedim... Sonra da peşman oldum. Uzun götür-qoydan sonra gördüm ki, yazıq arvadın heç günahı yoxmuş... Şəxsiyyət, şəxsiyyət deyib durursunuz. Elə o zamandan mənim başım qapazlı olub. Niyə ki, durub filankəsi tərifləməmişəm, deməmişəm ki, sən olmasan, biz batarıq... Görürsən ki, onsuz batmadıq!..

Mən onun sözlərinə qüvvət vermək istədim:

– Axı, ay usta, – dedim, – ancaq o, fikrimi düz başa düşməyib, az qala qışqırdı:

– Sözümü kəsmə! Ömrümdə bir yol da mən boşboğazlıq eləsəm, dünya dağılar?

– Usta, ay usta...

– Görünür, ustalıq azmış, gərək dil ustası olmağı bacarasanmış! – deyə o, yaşına o qədər də uyğun gəlməyən bir çevikliklə döndü və mənimlə vidalaşmadan çıxıb getdi.

II

O günün sabahısı usta Pirvəlinin dəniz buruğuna getməliydim. Ancaq dünənki söhbətimizdən sonra tərəddüd eləyirdim, düşünürdüm ki, indi o, hər sözümdən inciyir və əsəbiləşir. Aradan üç-dörd gün keçsə yaxşıdır, qoy bir az hirsi soyusun, mənim günahkar olmadığımı başa düşsün, görsün ki, mənə o cür ağır cavablar qaytarmaqla o qədər də haqlı deyil. Usta Pirvəli kimi adamlar adətən, hər növ saxta qürur hissindən uzaq olurlar, dünən tutduqları ədalətsiz işin bu gün dərin peşmançılığını çəkirlər, nahaq incitdikləri adamlardan bəzən hətta üzr belə istəyirlər. Mən buna inandığım üçün, bir qədər səbr eləməyi qərara almışdım, ancaq gündüz növbəsinin qazmaçısı Qürbət Kərim mənə zəng eləyib dedi ki, hələ dünən səhər gətiriləsi gematiti gözləməkdən gözümüzün kökü saralıb, avara-sərgərdan qalmışıq... Mən telefonda danışa-danışa ayrı bir səs də eşidirdim, başa düşürdüm ki, Pirvəli özü onun böyründə dayanıb, diktə eləyir, Qürbət Kərim isə onun sözlərini artırıb-əksiltmədən, tutuquşu kimi təkrar eləyir:

– Qazma idarəsində oturan tiplər, bizim sözümüzü bu qulaqlarından alıb o qulaqlarına verirlər. Siz niyə onlara demirsiniz ki, burdakı camaat öz atalarının xeyri üçün işləmir? Bax, Pirvəli dayı süründürməçilərin əlindən zəncir çeynəyir. Nə deyirsən, usta?.. Hə, deyir ki, məni cin atına mindirməsinlər, özüm telefonu götürüb, aləmi bir-birinə qataram!..

Dünəndən bəri mən də bu fikrə gəlmişdim ki, daha bu gündən sonra usta Pirvəli heç nədə güzəştə getməyəcək, əlinə fürsət düşən kimi, buruğun işini bir balaca ləngidənlərin hamısını qılınclayacaq, lap mənim özümə də aman verməyəcək. Qürbət Kərimə dedim ki, bu saat yoxlayım, görüm, nə üçün belə səhlənkarlıq eləyiblər. Dübarə daxili telefonla qazma idarəsinə zəng elədim, bununla da kifayətlənməyib, qayıqlarımız dayanan körpüyə getdim. Fəhlələr başqa avadanlıqla bərabər gematiti də gəmiyə yükləyirdilər. Mən onları salamlayıb gülə-gülə dedim ki, usta Pirvəlini tanımırsınız, niyə dünən söz verib onun yanında bu cür yalançı çıxmısınız? Onların bəzisi gülür, amma çoxusu işdən ayrılmayıb, eyni sürətlə yük qaldıran iri kranın çanağına avadanlıq hissələri bağlayırdılar. Gəminin kapitanı deyəsən, hamıdan çox tələsirdi.Bunun səbəbini özü açıb söylədi:

– Usta Pirvəli mənə ağır söz demir, ancaq elə tərs-tərs baxır ki, atamın goruna söysə, min pay bundan yaxşı olar... Dünən günah bizdə olmadı, yoldaş rəis, gəminin motorunda bir balaca təmirat aparmalıyıq. Pirvəlinin gematitini srağagündən gətirmişdilər. Ondan tək mən qorxmuram, Allah göstərməsin, əlinə girəvə düşsə, əcdadımızı qəbirdən çıxardar...

Mən bir saatdan çox gözlədim. Nəhayət hər şeyi yükləyib qurtardılar. "Nə olar, olar, cəhənnəmə ki!" – deyib, özüm də buruğa yola düşdüm.

Orada vəziyyət Qürbət Kərimin dediyi kimi deyildi. İşi dayandırmamışdılar. Heç kim də avara oturub gematit gözləmirdi. Usta Pirvəli bir növ profilaktik tədbir görmüşdü. Yəni sabah ona gərək olan ağırlaşdırıcı materialı indidən tələb eləmişdi. Bizi qarşılayan qürbət məni görəndə, pərtləşib gözlərini yerə dikdi. Hələ bir qızardı da... Yəqin ki, yalan danışdığına görə onu danlayacağımı güman eləyirdi. Ancaq mən, bu cür işləyən ustalara ürəyimdə haqq verirəm, çünki qazma sürəti çox vaxt təchizatın gecikməyi nəticəsində azalır. Mən Qürbət Kərimə bir söz demədim. Elə bil aramızda bu barədə heç söhbət olmamışdı.

Qürbət mənə təşəkkür elədi:

– Çox sağ olun, yoldaş rəis, – dedi. – Ehtiyatımız qurtarırdı. İndi ürəyimiz yerinə gəldi.

Usta Pirvəli gözümə dəymirdi. Hesabla gərək mən sevinəydim, ancaq istər-istəməz məndə onu görmək və dünənki söhbətdən sonra yumşalıb-yumşalmadığını öyrənmək arzusu oyanmışdı. Qürbət Kərimdən soruşdum:

– Bəs ustanız hanı?

– Papiros çəkməyə gedib...

Fikrimə gəldi ki, "Məni uzaqdan görüb, qəsdən gizlənib... Hə, deməli acığı soyumayıb..." Gözlərimi dolandırıb onu axtardım. Yox, görünmürdü. Buruğu gəzdim, fəhlələrlə salamlaşdım, hal-əhval bildim. Deyəsən burda usta Pirvəlidən başqa hamısı mənim xətrimi istəyirdi. On iki illik təcrübədən bilirdim ki, bilavasitə istehsalatda çalışan fəhlələr arasında yaltaq və riyakar adamların sayı yox dərəcəsində azdır. Əgər onlar sənə "Yoldaş rəis, sağ olun" deyirlərsə, bu yalnız ürəkdən gələn bir sözdür. Bu cəhətdən mən usta Pirvəlinin briqadasını nümunəvi sayıram, burda çalışan fəhlələrin heç biri mənim

də, başqa yoldaşlarımın da qüsurunu mərd-mərdanə üzümüzə deməkdən çəkinməz. Buradakıların bəzisi məni çoxdan tanıyır. Ali məktəbi qurtarandan sonra buruq ustası olmuşdum. O vaxt yalnız onlar mənə yox,mən də onlara isinişmişdim. Belə insanların etimadını qazanmaq çətindir, amma hədsiz dərəcədə xoşdur...

Köhnə adətim üzrə, buruqda hər şeyə nəzər saldım. Baltanın qət elədiyi məsafə ilə maraqlandım. Usta Pirvəlinin dili vardısa, dilçəyi də vardı. Bu günün normasından iki yüz metr də artıq qazmışdılar. Buruğun hər səliqə-sahmanı öz yerində idi. Bu cür briqadaları görəndə, adamın yorğunluğu yadından çıxır, papirosu bir-birinin oduna yandırmırsan, iştahan açılır, hər tərəf sənə gözəl, şairanə görünür, insanlara rəğbətin birə-on artır. Evə gələndə, arvad-uşaq da kefi kök olduğunu hiss eləyib sevinir.

Mən briqadanın işində irad tutulası heç nə tapmadım. Uşaqdan-böyüyə hamı öz yerində idi. Mexanizmlər yağ kimi işləyirdi. Usta Pirvəlinin məndən küsülü kimi ayrılıb getməyi, indi mənə daha çox yer eləyirdi.

– Sizə baxanda, adamın ürəyi dağa dönür, ay uşaqlar, – dedim. – Bəs usta Pirvəli gecə evinə getməmişdi?

Mən bunu Qürbətdən soruşdum, amma açarçı Yəhya cavab verdi:

– Yox.

– Niyə ki?

– Dünən axşam nəsə çox pərt idi. Gələn kimi hamımızı çağırdı. Cibindən qəzet çıxartdı. İyirmi ikinci qurultayın açılışı gününə dair birinci səhifədə iri hərflərlə yazılmış sətirləri ucadan oxudu. Dedi: "Raport-zad verməyəcəyik. Gurultu-partıltı qoparmayacayıq. Boynumuza öhdəçilik-filan da götürməyəcəyik. Amma qurultay açılan vaxt gərək normamızı ikiqat ödəmiş olaq. Kimin sözü var?". Biz heç nə demədik. Onun da, bizim də çox danışmaqla aramız yoxdur. Biz həmişə beləyik: Bizim əvəzimizə rəqəm danışır!.. – Yəhya harasa baxdı, dərindən nəfəs aldı: nəyə isə təəssüf eləyirdi. – Bilmirəm, ustaya nə olub, dünən axşamdan qaşqabağı heç açılmır... Elə hey öz-özünə deyinir: "Nahaq, lap nahaq... gərək bu barədə danışmayaydım. Bu cür axmaq iş tutduğum heç yadıma gəlmir". Bir yol özündən xəbər aldım ki, usta, nə axmaq iş, nahaq nəyə deyirsən? Gözümün içinə baxdı, sonra başını buladı, dedi ki, heç, bir səhv elədim, keçənə güzəşt deyərlər...

Bu söhbət əsnasında buruğa motorlu bir qayıq yan aldı. Hamımız o tərəfə baxdıq. Gələn usta Heybət idi. Ürəyim guppuldadı. Bir yol tapıb, rəqiblərin görüşməyinə mane olmalıydım. Qorxurdum ustalar cavanların yananda savaşarlar. Mən fəhlələrdən aralanıb, usta Heybəti özüm qarşıladım.

– Hara belə, usta?

– Yüz doqquza gedirəm. Dedim, bir Pirvəlinin də qulluğuna salam verim, ürəyimi boşaldım.

Mən özümü bilməməzliyə vurdum.

– Nə barədə?

Heybət mənmi böyrümdən adlayıb, fəhlələri salamladı:

– Ə, ağıllı ustanız hardadır? – dedi və mənə tərəf döndü... – Ay yoldaş rəis, gəl, sən də şahid ol. Pirvəliyə bir neçə yağlı sözüm var... Ə, hanı bu Pirvəli ağa?

Bu anda qoca usta elə bil yerin dibindən çıxıb, Heybətin qabağında dikəldi:

– Əleykəssalam, mən burdayam, – dedi. – Ağıllı, ya dəli, olanım budur. Mənə çoxdan ağalıq verilib.

Cavanlar gülüşdülər. Ustalarının hər sözündən xoşlandıqlarını görməmək mümkün deyildi. Deyəsən onlar bu söz güləşdirməkdə usta Pirvəlini qalib sayırdılar. Heybət də bunu görüb, azca tutulan kimi oldu. Pirvəlinin qolundan bərk-bərk yapışıb, mədəni budkaya doğru çəkdi, bir-iki addım gedib, yenə mənə sarı boylandı:

– Gəl, sən də şahid ol!.. – dedi.

Mən onların söhbətindən xeyir gözləmirdim. "Savaşsalar aralaşdıraram" fikri ilə mən də getdim. Yaxşı ki, növbənin fəhlələri o saat dağılışdılar və ustaların görüşünə maraq göstərmədilər.

Taxta divarları qəzet və jurnallardan kəsilmiş rəngbərəng şəkillərlə bəzədilmiş budkanın sağ küncündə, divara yaxın döşəmədə elektrik sobası qoyulmuşdu. İçəri isti idi. Üstünə qalın abı kağızdan süfrə salınmış balaca stolun qırağında elektrik çayniki pıqqıldayırdı. Lüləsindən fışqırtı ilə çıxan buxar, divarın kağızında əl boyda yeri islatmışdı. Usta Pirvəli çaynikin qapağını götürdü. Buxarın istisi üzünü yandırmasın deyə, başını yana sarı əydi. Sobanın böyründəki əl çantasından çay çıxartdı və bir ovuc götürüb, çaynikə atdı, yenə qapağı örtdü.

– Buyurun, bəyəndiyiniz yerdə oturun, – deyə stolun arxasındakı skamyada əyləşdi.

Mən də usta Heybətlə yanaşı onunla üzbəüz oturdum.

Söhbəti usta Heybət başladı:

– Orda-burda niyə kölgəmi qılınclayırsan, balam? Nə vaxtdan bəri dalda danışmağa öyrəşmisən?

Usta Pirvəli özünü eşitməməzliyə vurdu. Aşağı əyilib, çantasından təzəcə ütülənmiş, sarı haşiyəli çay dəsmalını götürdü və səliqə ilə qatlayıb, çaynikin üstünü örtdü. Mənə elə gəldi ki, qonaqlarına çay verməmiş söhbətə girişmək heç könlündən deyildi. Ancaq Heybət tələsirdi. O, heç birimizə müraciət eləmədən, yenə eyni incik halda soruşdu:

– Bilmək olmaz ki, mənim günahımın adı, nədir? Yaxşı, bu çayniki az qurdala. Mən bura çay içməyə gəlməmişəm, termosum doludur...

– Mən çayı özüm üçün qoymuşdum, sənə zorla içirtməyəcəyəm!.. – deyə Pirvəli də rəqibinin üzünə baxmadan tütün qutusunu çıxartdı, kəhrəba rəngli saçaqlı tütündən bir xışma götürüb, qəzet kağızında uzun və yoğun bir papiros eşdi. – O ki, qaldı kölgəni qılınclamağıma, bu barədə tamam yanılmısan, özün dura-dura kölgəni niyə qılınclayıram?

– Niyə, axı, nə səbəbə?

– Tələsmə, bu saat hamısını deyəcəyəm. – Pirvəli, qəsdən ağır-ağır, təmkinli bir əda ilə danışırdı, elə bil bununla da usta Heybətin səbir kasasını daşdırmağa çalışır və bundan qəribə bir zövq almaq istəyirdi. Papirosunu çaxmaqla yandırıb, iki-üç dəfə dərindən qullab vurandan sonra, yenə eyni arxayınlıqla sözünə davam elədi: – Bilmirəm sənə kim nə deyib, amma öz dilimdən eşitsən yaxşıdır.

Mən özümdən arxayındım. Usta Pirvəli ilə söhbətimizin məzmununu ona deməyə nə imkan tapmışdım, nə də belə bir fikrim vardı.

– Mənə xəbər verən öz qarın olub... Dünən zəng eləmişdim, deyirdi ki, radioda yüz yol səni tərifləyəndə, bir yol da Pirvəlini tərifləsələr, Allaha xoş getməz. Sonra da başladı ki, axırda bir-birinizə düşmən olacaqsınız... Əgər evdə bu barədə söhbətiniz olmayıbsa, qarın dünyasında belə deməzdi... Mənə hər dəfə ordendən, addan veriləndə, hamıdan əvvəl sən gələrdin, lap dənizdə də olsaydın, telefonla təbrik eləyərdin... On gündür poçtalyonlar evimin kandarını ağardıblar. Bəs niyə səndən səs çıxmır?

– Bura bax, a kişi... gəlsənə qanımı qaraltmayasan. Qara məni basınca, mən qaranı basım, buna deyiblər, ha... Nə düşmüsən üstümə?

Usta Heybətin sümükləri çıxmış yanaqları kül rənginə çalırdı. O, tez-tez müsahibinin sözünü kəsməyə meyllənir, amma deyəsən yalnız mənə hörmət üçün güclə özünü saxlayıb, barmaqlarını stola döyə-döyə yumru və qabarıq gözlərini rəqibinə zilləyərək, tez-tez hülqumunu qıldırıb-salırdı. Usta Pirvəli isə qərarından keçməyib, papirosunu bir də sümürdü:

– Bilirsən niyə məndən səs çıxmır? Ürəyimdən deyil, ona görə!..

– Paxıllıq eləyirsən? Deməli belə? Yaman tərs başlamısan!

– Tərs niyə? Bu saat lap düzünəqulu deyim, sən də eşit...

– Eşidirəm.

– Davanın vurhavur vaxtında dənizdəki buruğun güclü fontan vurdu, on gün keçməmiş Qızıl Bayraq ordeni aldın. Düzdür?

– Düzdür.

– Mənim də buruğum bütün Bakıya səs saldı-salmadı? Bəs mən nə aldım? Heç nə. Düzdür?

Heybətin gözləri aşağı dikildi. O, cavab verməyə söz tapmadı, əlini çəkib dizinin üstünə qoydu.

– Hə, niyə dinmirsən?

– Yaxşı, düzdür... Orden vermədilər. Kalan mükafat aldın. Əsginas!..

– Mən pul gözləmirdim. Qara günü üçün ehtiyat görən köpək oğlanlarından zəhləm gedir. Nə qədər mənim hökumətim var, mən kefin istəyən qədər qazanacağam. Mən də orden gözləyirdim. Başa düşdün, ya yox?

Pirvəli dirsəklərini stola söykədi və stol əlinin çeçələ barmağını qatladı:

– Deməli bu bir... Ondan bəri dörd quyu sən qazmısan, hamısının dərinliyi üst-üstə doqquz min metrdir, mən də dördünü qazmışam, dərinliyi on iki min metrdir. Bunlardan birini gematitsiz qazımışam. Düzdür?

– Düzdür, – deyə Heybət dodağının ucu ilə təsdiqlədi.

– Eşitmədim, bir az ucadan de!

– Canım-gözüm, düzdür! Mən bunu danmıram ki?

– Səni Sosialist Əməyi Qəhrəmanı elədilər. Döşünə Lenin ordeni, üstəlik də Qızıl ulduz taxacaqlar. Mənim adımı it dəftərinə salmadılar. Düzdür? – Usta Pirvəli o biri barmağını qatladı: – Bax, bu da iki... Düzdür, düz deyil?

Usta Heybət müsahibinin doğru ittihamlarına dözə bilməyib nəhayət bozardı.

– Əşi, bu adı mən verirəm? Nə düşmüsən mənim üstümə?

– Sən vermirsən, doğrudur. Amma de görüm harda, kimin yanında demisən ki, haqsız iş görürsünüz? Deməmisən ki?.. Yox, deməmisən! Yaxşı, bundan sonra sənin kişiliyinə inanmağa mənim nə haqqım var?

– Bura bax, Pirvəli, mən indiyətən səni tanımamışam. Nə yaman şöhrətpərəstsənmiş, buynuzun içindəymiş... – deyə Heybət nazik dodaqlarını bir-birinə bərk qısaraq, başını buladı.

Bu anda Pirvəlinin üzünə baxmaq və heç olmasa bircə dəqiqə ondan göz çəkməmək hər oğulun hünəri deyildi. Onun sir-sifəti, iynədən də bərk sancan gözləri od tutub yanırdı, hətta iri əlləri də xəfif titrəyirdi. mənə elə gəlirdi ki, o ordenlə təltif olunmamağından və şərəfli ada layiq görülməməyindən daha artıq Heybətin axırıncı sözlərindən incimişdi. Yox, onun şöhrətpərəstliyi haqqında deyilən sözlər, ədalətdən çox-çox uzaq idi və mən açıq-aydın hiss eləyirdim ki, usta Pirvəlini bu dəqiqə haqsız ittihamdan qorumasaydım, mənə özüm də ədalətsiz iş görmüş olacaqdım.

– Yox, ay usta, – deyə mən söhbətə qarışdım və əlimi Heybətin çiyninə qoydum. – Siz haqsızsınız. Tamamilə haqsızsınız. Dünən usta Pirvəli gözəl bir söz dedi: “Mən qarnım üçün yox, qədrim üçünəm”. Mən inanıram ki, bu doğrudan da belədir.

Görünür mənim bu cür müdafiəm də usta Pirvəlini razı salmadı. O, sönmüş papirosunu qabağındakı külqabına basıb, nə isə birdən kövrələrək, daha doğrusu, qəhərlənərək dedi:

– Yox, oğul, mən qədrim üçün deyiləm. Onu deyirəm ki, məndən cavan fəhlə yoldaşlarım var, şagirdlərim var. Onlar mənə baxanda, işdən soyuya bilərlər, belə fikir eləyərlər ki, bütün ömrünü camaat yolunda qurban verən bu kaftarın qədrini nə bildilər ki, bizim də yaxşı işimizə nə qiymət qoysunlar. İndi başa düşdün, bu qoca vaxtımda mən niyə xərifləmişəm?.. – Usta Pirvəli armudu stəkanlara çay tökdü. – Əşi, bu qan qaraldan söhbətləri buraxın, getsin...

Uzun və yorucu sükut zamanı aşağıdan dəniz ləpələrinin şırıltısı eşidildi.

– Doğrudan da xərifləmişəm, – deyə usta Pirvəli yenə əyildi və çantasından qənd qutusunu çıxardıb ortaya qoydu. – Buyurun, için. Hava soyuqdur, canınız qızsın...

Usta Heybət məyus-məyus dilləndi:

– Mən bura sənnən dalaşmağa gəlməmişdim. Yarış müqaviləsi bağlamaq istəyirdim.

Pirvəli stəkanını ovcunun arasına aldı, ağzına yaxınlaşdırdı:

– Yox, bağlamayacağam, – deyib, bir qurtum çay içdi. Mən təəccüblə soruşdum:

– Niyə ki, usta?

– Çünki mən ondan çox irəlidəyəm. Mən – yəni briqadam. Müqavilə bağlamaq üçün elə bir tayımız da yoxdur. Ancaq biz yarışmağına yarışırıq.

– Gəl indi bu tapmacanı tap... – deyə Heybət, yəqin ki, qeyri-ixtiyari stəkanı özündən araladı.

– Sən buna tapmaca deyirsən, ancaq mən demirəm.

Doğrusu, usta Pirvəlinin sözləri mənə də tapmaca kimi görünürdü. Deyəsən o, baxışlarımdakı sualı oxuyub, bu dəfə çox mülayim halda Heybətə üz tütdü:

– Get, briqadanı yığ. Hamını başa sal ki, Pirvəli heç kəslə də müqavilə bağlamaq fikrində deyil... – O yenə bir qurtum çay içib, mənə müraciət elədi. – Bilirsən niyə, yoldaş rəis? Ona görə ki, mənim müqaviləm yetmişinci ilnəndir... Hayıf ki, texnikamız mən deyən kimi işləmir, yoxsa lap səksəninci ilnən yarışaram... – Bayaqkı ağır söhbəti tamam unutmuş kimi, qəribə və səmimi bir təbəssümlə usta Heybəti dürtmələdi. – İndi başa düşdün ya yox, ay adlı-sanlı qəhrəman?

Usta Heybət birdən ayağa qalxdı:

– Belə görünür ki, məndən çox yanıqlısanmış, – dedi. – Az qala qanımı içməyə hazırsanmış.

Bu sözləri deyə-deyə qapıya yaxınlaşanda, usta Pirvəli, yenə qaşqabağını töküb, sox dəyişmiş, bir qədər tutqunlaşmış səsi ilə onu çağırdı:

– Ay Heybət, başqasına mən bu sözləri deməzdim. Bir rəisimizə, bir də sənə deyirəm, daha bundan sonra bir daş altda, bir daş üstə... Gəl çayını iç. Getmə. Qayığın balacadır, tufan qalxar, bir xata çıxardar...

O geriyə baxmadan:

– Nə olar, olar... Hələlik!.. – deyib qapının ardında görünməz oldu.

Usta Pirvəli isə gözlərini yerdən qaldırmır, iştahı küsmüş kimi çayını könülsüz içir, təkdənbir burnunu çəkir, deyirdi:

– Sən də deynən, nahaq gedir. Mən bilirəm, bu dəniz neçə qudurğandır...

## III

Biz mədəni budkadan çıxanda, soyuq xəzri hər an şiddətlənir, dalğalar köpüklənməyə başlayırdı. Usta Heybətin qayığı isə buruqdan xeyli aralanmışdı. Pirvəli papağının qulaqlarını aşağı saldı, sırıqlı pencəyinin düymələrini bağlaya-bağlaya, qayığın dalınca baxdı:

– Lap nahaq getdi, – dedi. – Biz sahildən o qədər uzaqda deyilik. Amma yenə də tufan olanda burda qalmağa ehtiyat eləyirik, gör indi onun buruğunda nə qiyamət qopacaq. Ağlı olsa, gedib çatan kimi camaatını yığıb geri qayıdar.

– Nə bilmək olar, usta, – dedim. – Bir də görürsən külək xırp kəsdi, tez qayıtdığına da peşman oldun...

Usta Pirvəli başını buladı, deyəsən ürəyinə nə isə dammışdı. Buruğa tərəf gedə-gedə, gözlərini üfüqdə qaralan qayıqdan ayırmırdı.

Doğrudan da on dəqiqə belə keçməmiş xəzri tamam çılğınlaşdı. Sahildən cəmi-cümlətanı bircə kilometr uzaqda, yəni usta Pirvəlinin buruğunda işi dayandırmalı oldular. Uzaqdan bəriyə doğru şütüyəndə dağ kimi ucalan dalğalar buruğu kökündən qoparmaq dərəcəsinə gəlirdisə, deməli, 109-cu quyunun vəziyyətini yalnız təhlükəli saymaq azdı. Böyrümüzdən keçib sahilə tərəf üz qoyan digər qayıqların dalğaları necə çətin yararaq irəlilədiyini və az qala suyun tərkinə düşüb gözdən itdiyini görəndə bunu daha aydın başa düşürdüm.

Artıq mən də həyəcan içində idim. Dəniz buruqlarından fəhlələri sahilə daşıyan qayıqlara baxdıqca, usta Heybətin taleyini daha çox düşünürdüm. Adətən, beş baldan artıq külək əsəndə mexanizmləri dayandırmalı, fəhlələri dərhal sahilə daşımalı idilər. Keçən il baş vermiş təbii fəlakətdən sonra bu barədə xüsusi bir əmr də verilmişdi.

Mən usta Pirvəlidən ayrılıb, geriyə döndüm, mədəni budkaya getdim, radist ilə usta Heybətin buruğunu tutub radioqram verdim: "Adamları bu dəqiqə sahilə çıxardın!"

Lakin yenə də ürəyim sakit olmadı. Budkadan usta Pirvəlinin yanına gələnəcən, iki yerdə külək az qala məni vurub dənizə salmışdı. Ağac məhəccərdən ikiəlli yapışmasaydım, kos kimi suya düşməyim labüd idi.

Qoca usta işi dayandırmışdı. Tez-tez uzaqlara baxır, dodağının altında, pıçıltı ilə, bəlkə də ixtiyarsız olaraq "nahaq getdi, lap nahaq" deyib, astadan köksünü ötürürdü. O, birdən həyəcanını biruzə verdi:

– Camal, oğul, – deyib, mənə üz tutdu. – Mənim məsləhətimə qulaq as, əmr elə, qoy onun dalınca "Bakı fəhləsi" katerini yollasınlar.

Onun fikrini başa düşmək çətin deyildi. Demək istəyirdi ki, indi xırda-xuruş qayıqlara buruğa yan almaq olmaz. Fəhlələr ölüm-zülüm bu qayıqlara minə bilsələr də, sağ-salamat üzüb sahilə çıxa bilməzlər.

– Düz buyurursan, usta, – dedim. – Tez olun, yığışın, gedək, təcili tədbir görək.

Hamımız qayığa doluşduq və kapitanı tələsdirib, sahilə yola düşdük. Biz hələ mənzilə çatmamış, körpüdən yüz əlli, iki yüz metr bəridə "Bakı fəhləsi" ilə qarşılaşdıq. Görünür, qazma idarəsinin işçiləri bizdən cəld tərpənib, uzaqdakı buruqlara təcili kömək yollamışdılar...

Bu dəmdə mən istər-istəməz usta Pirvəliyə baxdım. Onun qaşqabağı daha yerlə getmirdi. Hətta arabir gülümsəyirdi.

– "Bakı fəhləsi" gedəndən sonra, daha qorxusu yoxdur... Xəzərin öhdəsindən bircə o gəlir!..

IV

Usta Pirvəlinin də, mənim də sevincim yersizmiş. Dəniz son iyirmi beş ildə görünməmiş bir fəlakət törədib, açıq dənizdəki buruqlardan bir neçəsini, o cümlədən də usta Heybətin 109 nömrəli kəşfiyyat buruğunu uçurmuşdu. Hava xidməti idarəmizdən alınan məlumatda deyilirdi ki, külək on üç bala çatır, "Bakı fəhləsi"ndən göndərilmiş radioqram daha dəhşətli idi: Usta Heybətin briqadasından iki nəfər ölümcül yaralanmış, özü isə həlak olmuşdu...

Bu xəbər tək məni yox, bütün qəsəbəni, çox keçməmiş bütün Bakını sarsıtdı.

Ustanın cənazəsini, yaralıları və o biri fəhlələri gətirən "Bakı fəhləsi" körpüyə yaxınlaşanda mən də sahildə idim. Dəniz qırağında iynə salmağa yer yox idi. Heybətli səslə uğuldayan Xəzərdə sanki yerlə göy birləşirdi, amma qəsəbə sakinləri ardı-arası kəsilməyən bir izdiham kimi sahilə axışırdılar. Qazma idarəsinin əməkdaşları, rayon rəhbərləri, evlər yıxan küləyə sinə gərərək gözlərini yavaş-yavaş körpüyə yan alan gəmiyə zilləmişdilər.

Bu səhnəyə ürək ağrısı duymadan tamaşa eləmək çətindi. Elə bil hamının qəddi bükülmüşdü. Ancaq hələ də çoxları usta Heybətin ölüm xəbərinə inana bilmirdilər. Əllərində xərək, bir-birinin ardınca gəmiyə

adlayan sanitarlar, əvvəlcə yaralıları, sonra, lap axırda üz-gözündə qan laxtalanmış və gözlərini əbədi yummuş usta Heybəti gətirməsəydilər, yəqin ki, sahildəki izdiham, qocanın ölüm xəbərini adi bir şayiə sayacaqdı.

– Ə, bir yol verin!.. – deyə camaatı aralayıb, axırıncı xərəyə doğru yönələn adamı tək mən yox, sağımda, solumda dayanmış o biri yoldaşlar da gördülər. Nəfəs-nəfəsə kütləşmiş yüzlərcə insanı asanlıqla yarıb irəliləyən, burdakıların hamısından iki daban uca, bahadır cüssəli kişini qəsəbə sakinləri usta Heybətdən az tanımırdılar. O məndən də qabağa keçdi və xərəyin önünü kəsdi:

– Dayanın! – dedi.

Sanitarlar bu əmrdən çıxa bilməzdilər. İrəlidə dayanmış nazik, uzun sanitar, ehtiramla, yalvarış dolu bir nəzərlə onun üzünə baxdı və yalnız özünün eşidə biləcəyi pıçıltı ilə xahiş elədi:

– Pirvəli dayı, yol ver!

Lakin o, yol vermədi. Sanitarlar xərəyi yerə qoymağa məcbur oldular.

Hamının gözü Pirvəliyə zillənmişdi. Nə isə deyəcəyini gözləyirdilər. Lakin usta Pirvəli heç nə demədi, xərəyin yanında diziüstə qapandı, rəqibinin cənazəsini qucaqladı və tük ürpərdən bir səslə hönkürdü.

Bu vaxt bütün izdihamdan şivən qopdu.

Adətdir... pəhləvanlar ağlayanda, bütün el-oba ağlayır.

*1964*

# YERALTI ÇAYLAR DƏNİZƏ AXIR

## BİRİNCİ HİSSƏ

Səmirə Aydın bizim köhnə dostumuzdu. Mənim arvadım Gülnisa xanımla orta məktəbin birinci sinfindən ta axırıncı sinfinə qədər bir skamyada oturmuşdu. O vaxtdan bəri sirləri-söhbətləri də bir olmuşdu. Yaxşı yadımdadır: bizim toyumuza dostların hamısından əvvəl o gəlmişdi. İlk sevgilisi Müdhətlə də mən o axşam tanış olmuşdum. Səmirə orta məktəbi bitirəndə on yeddi yaşına yenicə girmişdi. Ona gözəl demək çətindi, amma çirkin də deyildi. Qara, yumru və bir az çıxıq gözləri vardı. Kiçik ağzının sağ tərəfi həmişə yuxarıya dartılmış kimi göründüyündən, nazik dodaqları elə bil gülümsəyirdi. Bu ifadə onun sifətinə nə isə xüsusi bir məlahət verirdi. Qalın və sıx qaşlarının tən ortasında qaralan xal qələm ucundan təsadüfi düşmüş mürəkkəb damcısını xatırladı. Deyib-gülməyi, çalıb-oynamağı yaman sevirdi. Bəstə boyuna görə ayaqları da göyçək idi. "Ceyranı" havasının lirik ahənginə uyaraq süzəndə dirsəyə qədər açıq qolları ilan kimi qıvrılır, bütün bədəninin sümükləri elə bil əriyib yox olurdu. Onun rəqsi tək məni və Gülnisa xanımı yox, çoxlarını heyran qoyurdu. Toy məclisimizə gəlmiş qızlar arasında özünün zahiri gözəlliyi ilə onu kölgədə buraxanlar vardısa da, onun kimi məharətlə piano çalan və onun qədər zərif oynayan yox idi. Bizim toyumuza hamıdan çox o rövnəq verirdi. Müdhət isə həm uca, həm də gözəldi. Onun ağıllı, iri gözləri, geniş alnı, gur və qıvrım saçları, enli kürəyi məclisdəki qızların ürəyində Səmirəyə qarşı həsəd oyatmaya bilməzdi. Onunla Səmirə yanaşı dayananda, gənclərdən bəziləri Hüseyn Cavidin gurultulu bir müvəffəqiyyətlə səhnədə göstərilən "Səyavuş" əsərindən məşhur, qanadlı misraları xatırlayırdılar:

Bir göyərçin əsir etdi qartalı
Gözəllik naminə, sevgi naminə!..

Bu sözün deyilişindən çox vaxt istehza sezilirdi. Mən bunu açıq-aydın hiss eləyirdim, bəzən hətta pıçıltı ilə deyilən ayrı-ayrı sözlər də mənim qulağıma çatırdı: "Gözünü dağlayım, bu cücənin nəyinə vurulmusan?" Belə bir sual yalnız Müdhətin ünvanına deyilə bilərdi. Səmirə onun yanında boy-buxundan çox kasıb görünürdü. Ancaq mən öz-özümə deyirdim ki: "Könül sevən doğrudan da gözəl olurmuş..."

Toy günümüzdən indi düz otuz il keçir. Artıq biz qocalığa qədəm qoyuruq, ancaq o qayğısız, o şən günlərimizi unutmuruq. Unuda bilmirik. Bizim hər birimiz həyat adlanan burulğanın dərinliklərinə batıb-çıxdıqca, ağır zərbələrə və sarsıntılara məruz qalaraq ara-sıra ümidsizliyə qapıldıqca, gənclik illərimizin əziz xatirələrindən qüvvət alıb, bir-birimizə təsəlli veririk: "Qəm yemə, bu da keçər" deyirik.

İndi biz Səmirəgillə ev qonşusuyuq. Hər gün olmasa da, həftədə bir-iki dəfə ya o bizə gəlir, ya da biz onlara gedirik, istirahət saatlarımızı bir yerdə keçiririk.

Mən Səmirənin həm müharibə illərində, həm də sonralar necə məhrumiyyətlərə qatlaşdığını yaxşı bilirdim. Hətta neçə yol demişdim ki, azacıq imkan tapan kimi özüm sənin sərgüzəştini yazacağam. Səmirə mənim bu arzumu adi zarafatlarımdan biri sayırdı, sözü də bu olurdu ki, sənin kitablarını oxumuşam, qadın ürəyinin sirlərini yaxşı duya bilmirsən, inanmıram yazdığından bir şey çıxsın. Mən də yarızarafat-yarıciddi cavab verirdim ki, günah məndə deyil, rəfiqən Gülnisa hədsiz dərəcədə qısqanc olduğundan, mən qadın tayfası ilə oturub-durmaqdan çəkinirəm, deyəsən elə bu səbəbdən də qadın mənəviyyatı mənim nəzərimdə vərəqləri kəsilmiş sirlər kitabına bənzəyir...

O bizə gələndə, adətən, məni yazı stolunun arxasında görsəydi, işləməyimə mane olmamaq üçün, səssizcə addımlarla yan otağa adlayar, divanın üstündə Gülnisa ilə yanaşı oturar, nə barədə isə xısın-xısın danışıb gülər, səssizcə də çıxıb gedərdi. Ancaq günlərin birində, nahar tənəffüsü vaxtı gəlib qapını tıqqıldadaraq, yazı otağıma girməyə izin istədi:

– Ay qağa, – dedi, – məni bağışla. Bilirəm, ədəbiyyat tarixinə ziyan vuracağam, günahımdan keç.

Mən güldüm.

– Əgər hamı mənim tarixi rolumu belə başa düşsəydi, daha nə dərdim vardı? – deyə mən də onun sözlərinə zarafatla cavab verdim.

– Baxma, gec-tez başa düşəcəklər! Xüsusilə məndən yazandan sonra... – O, qolundan sallanan qara, iri çantadan müşəmbə cildli qalın bir dəftər çıxartdı. – Al bunu, vaxtın olanda oxu... Əlbəttə, belə cızmaqaraları sən iki gündə yazarsan, ancaq mən bunun üstündə düz iki il tər tökmüşəm... Oxusan, hər halda xam material kimi sənin üçün faydasız olmaz...

O, dərin qırışıqlarla örtülmüş alnını ovuşdurdu, gümüşü saçlarını əli ilə geriyə sığalladı, nə isə qəmgin və tutğun bir ifadə ilə mənə zillənmiş yorğun gözlərini yerə dikib, qapıdan çıxdı. Bu son illər müd-

dətində nə qədər qocaldığını yalnız indicə duymuş kimi, mən bir xeyli hərəkətsiz dayanıb, xəyalımda onun ilk gənclik dövründəki portretini canlandırmaq istədim; deyəsən onun simasında dəyişilməyən yalnız qaşlarının tən ortasındakı qara xalı, bir də yuxarıya tərəf dartıldığı üçün həmişə gülümsər kimi görünən üst dodağı idi. Mən Səmirənin verdiyi dəftəri maraqla oxudum. Öz xatirələrini yazmışdı. Gördüm ki, bunları düzəltməyə başlasam və yaxud öz zövqümə uyğunlaşdırsam, istər-istəməz hekayətin baş qəhrəmanına, yəni burada təsvir olunmuş həqiqətə xələl gətirəcəyəm. Mən xatirələrə əl vurmadan eyni ilə çapa verməyi lazım gördüm. Yalnız dəftərin birinci səhifəsində "Səmirə Aydın. Yeraltı sular dənizə axır... (İnşaat mühəndisinin xatirələri)" sözlərini yazdım və hər fəslə bir ad verdim.

O günün sabahısı mən özüm onu çağırdım, fikrimi ona söylədim. Səmirə mənim xırda əlavələrimdən razı qalıb dedi:

– Ay qağa, məni tənqid eləsələr, köməyini əsirgəmə ha...

## AĞIR XƏBƏR

Mən o gün mətbəxdə idim. Xörək hazırlayırdım. Birdən qapının zəngi çalındı. Bu vaxt gələn kim ola bilərdi? Kamranın işdən, qızlarımın da məktəbdən qayıtmağına hələ çox qalmışdı. Düşündüm ki, indi olsa-olsa Gülnisa gələr. O, qan təzyiqinin çoxluğu nəticəsində parez olub yorğan-döşəyə düşəndən sonra, düz il yarım yatmışdı. Həkimlər yalnız indi qalxmağa və gəzməyə icazə vermişdilər. O, bəzən mənim, bəzən də qonşu arvadlardan birinin köməyi ilə dəniz qırağına çıxır, bir neçə saata açıq havada oturub, yorulanda evə qayıdırdı, mənim işə getmədiyimi biləndə, adətən bizə dəyirdi.

Mən qapıya yanaşdım.

– Gülü, sənsən?

Böyük qızım Kəmalənin səsini eşitdim.

– Mənəm, ana.. tez ol, aç..

Təəccüblü idi. Saatıma baxdım. Bu günkü dərslərinin qurtarmağına hələ iki saat vardı. Qapını açmağımla sualım bir ana düşdü:

– Nə olub? Səndən çıxmayan iş...

O pörtmüşdü. Pillələri sürətlə qalxdığı hiss olunurdu. Tövşüyə-tövşüyə böyrümdən sivişib içəri təpildi. Portfelini divanın üstünə tul-

layıb, paltosunu çıxartdı. Mən ondan gözümü çəkmirdim, o isə mənə baxmırdı.

– Dərs olmadı? – soruşdum.

Yalnız yüyürdüyü üçün deyil, nədənsə həyəcanlandığına görə pörtdüyünü başa düşüb mən də həyəcanlandım.

– Cavab verəcəksən, yox? Bəlkə müəllim danlayıb? Dərsini hazırlamamışdın?

O, yenə də mənə baxmaq istəmirdi. Səbir kasam daşdı.

Ay qız, gözümün içinə düz bax!..

– Baxdım, – dedi və dərhal məni qucaqlayıb o üzümdən, bu üzümdən marçıltı ilə öpməyə başladı. – Anacan, şərtim var: əvvəlcədən toxtamalısan. Yoxsa gətirdiyim xəbərdən şok ola bilərsən.

– Şok nədir, ay qız?

– Yəni özündən gedərsən. Bu dəqiqə Zelenin damcıları gətirim, iç...

– Şad xəbərdir, qəmgin?

Mənim üçün şad xəbərdir, səni bilmirəm.

– Axmaq-axmaq danışma! Sən sevinəndə mən ağlayacağam, məgər?

– Hər halda dərman içsən yaxşıdır.

Kəmalə mətbəxə yüyürdü. Armudu stəkan gətirdi. Zelenin damcılarından onacan saydı, qrafindən onun üstünə azacıq su tökdü.

– Ala, iç, – dedi, – düşər-düşməzi olar...

O, doğrudan sevinirdi. Fərəhindən elə bil bu dəqiqə qaqqıldayıb güləcəkdi. Burnunun pərələri və dolğun dodaqları həyəcandan tir-tir əsirdi.

Mən damcıları içdim.

– Hə, indi danış görüm...

Kəmaləni bu qədər səbirli bilmirdim.

– Ürəyin sakit oldumu? – dedi.

– Ay qız, qəsdin nədir, bağrımı çatlatmaq istəyirsən? Demirsən, demə, lazım deyil. – Mən dərmandan xeyir əvəzinə ziyan çəkdiyimi görüb, mətbəxə sarı getdim.

O, yenə daldan boynumu qucaqladı:

– Ana, ana, – dedi, – bilirəm, inanmayacaqsan, bu xəbər sənə yuxu kimi görünəcək...

– Sən danış, bəlkə görünmədi...

– Tənəffüs vaxtı həyətdə voleybol oynayırdıq. Gördüm ki, bir kişi kənarda dayanıb, bizə tamaşa eləyir, gözü də hey məndədir. Bir azdan sonra mənə yaxınlaşıb xəbər aldı: “Sən Kəmalə Aydın deyilsənmi,

qızım?”. Nə qədər diqqətlə ona baxdımsa, tanımadım, amma ürəyimə nə isə damdı. Öz-özümə dedim, yox, ola bilməz, yəqin məni kimə isə oxşadır...

Mənim də ürəyimə dammışdı. Az qala çığırdım:

– Bax, Kəmalə, yenə dəliliyin tutub, ha... Nağıl açma, görüm!..

– Nağıl deyil, ana... O özü idi!..

– Kim! – Mən az qala dəli olacaqdım. – Kim idi, axı?

– Atam!..

– Necə yəni atan?

– Bunun necəsi yoxdur ki? Atam – Müdhət Aydın!..

– Sən sayıqlayırsan!..

– Yox, ana, yox, atam gəlib!.. Sağ-salamat!..

Mən Müdhətin ölüm xəbərini eşitsəydim, bu qədər təəccüb eləməzdim. Kəmalə boynumu qolları arasından buraxıb qabağıma keçdi:

– İnanmırsan? – dedi, – mama canı gəlib!.. Elə bu saat məni evimizəcən ötürdü, sənin ərə getdiyini eşidəndə gözləri doldu. Dedi ki, get, amma anana mənim gəldiyimi söyləmə. Mən də söz verdim... Saçları dümağ ağarıb... Lap qar kimi. Ancaq o, əvvəlkindən də gözəldir... Saçların rəngi...

Sonra Kəmalənin nə dediyini xatırlamıram. Gözlərimi açanda, özümü çarpayıda gördüm. Həkimin, tibb bacısının, qızlarımın... Kamranın gözləri məndə idi. Hərəsi bir tərəfdə əyləşmişdi. Heç biri dinib-danışmırdı. Elə bil yas yerinə toplaşmışdılar. Amma ağlayan yox idi. Başım üzərində kim isə dayanmışdı. Baxmasam da hiss eləyirdim: əlbəttə Gülnisa idi!

– Mənə nə olub, Gülü?

– Sən özün deyinən. Ha illah elədik, Kəmalədən söz qopara bilmədik. Nə oldu sənə birdən?

Mən də Kəmalə kimi, nə üçün şüurumu itirib yıxıldığımı gizlətməyə məcburdum: Kamran onsuz da ayaq üstündə diri gözlü ölüb getmişdi. Bu hadisənin əsil səbəbini öyrənsəydi, bağrı çatlardı. İlk məhəbbətimin tarixini yaxşı bilirdi. Müdhətin qayıtmağı, onun ölümünə bərabərdi. Mən Kamranın ölümünü istəmirdim, çünki onunla birgə ailə və həyat yolunu deyil, ölüm-itim yolunu keçib gəlmişdim...

Başım üzərində Gülnisa hıçqırdı: xəstələnəndən bəri yaman kövrək olmuşdu. Mən quyu dibindən gələn ölgün səsimlə vəfalı rəfiqəmdən soruşdum:

– Gülü, həkim bir söz deməyib ki? Yoxsa deyib? Sağalmağıma ümid yoxdur, hə? Mənə bir şey olsa, uşaqlar əmanəti...

Hıçqırıq səsi kəsildi. Gözüm Kamrana dikildi. Bu anda onun sifətində yalnız mənim oxuya biləcəyim məzəmmət dolu sərt və qəmgin bir sual çırpınırdı"Doğrudanmı bizi bu fəlakət gözləyir?

– Gülü, – dedim, – uşaqları nahaq qorxuduram. Mənim canım it canıdır. Ölən – bu cür ölməz...

Gülnisa, görünür, daha ağlamadığını mənə göstərmək istəməyib, böyrümdə, çarpayının üstündə oturdu və ağlamaqdan şişib qızarmış gözlərindən gülə-gülə dedi:

– Guya arvadların xasiyyətinə bələd deyilsən. Biz ki, soğan doğrayanda da ağlayırıq...

Mən də gülümsədim. Həkimlə tibb bacısı bir-birinə göz eləyib getməyə hazırlaşanda, mən onlara təsəlli verdim:

– Qorxmayın, öyrəncək olmuşam. Daha iynə vurmaq lazım deyil... Sizi yəqin Kəmalə çağırıb. Şüurum özümdə olsaydı, sizə nahaq zəhmət verməzdim.

Həkim şəhadət barmağını havada silkələyib, məni hədələdi:

– Yox, zarafatı buraxın. Gündə iki yol iynə vurulacaq. Minimum!..

O getdi. Kamran ayağa qalxıb, Kəmaləni o biri otağa apardı. Xəstələnməyimin səbəbini öyrənmək üçün onu sorğu-suala tutacağını bilirdim. Çox keçməmiş, ikisi də mənim yanıma qayıtdı. Üz-gözlərində elə bir dəyişiklik sezmədim. Kəmalə sirri yenə də açmamışdı. "Ağıllı qızım, düz eləyirsən, Kamranın əsəbləri mənimkindən də beşbətərdir", – deyə xəyalımdan keçirdim. Ana-qız gözləşdik. Kəmalə məndən utanırmış kimi kirpiklərini aşağı endirdi. Mən onu sözsüz də başa düşürdüm...

– Gedin, naharınızı yeyin, – dedim. – Mən də yaman acmışdım. Doktorun sözünə fikir verməyin, məndə heç nə yoxdur.

Görünür, bu təsəllimdən hamı ruhlandı. Gülnisa Kamrana və qızlara nahar verdi... Mən də qalxıb onların yanına adlamaq istədim, amma bacarmadım... O yatan düz on beş gün yatdım...

Kamranla uşaqlar evdə olmayanda, dərdimi açıb Gülnisaya danışdım. Yenə gənclik xatirələri canlandı. Dedim ki, Müdhətlə bir şəhərdə yaşayıb-görüşməməməyimiz ağlasığan iş deyil, bəlkə bu, taleyin gərdişidir, bizi təkrar bir-birimizə qovuşdurmaq istəyir?

Gülnisa, dediyim kimi, son zamanlarda çox kövrək olmuşdu. İki dəqiqədən bir gözünün qorasını sıxırdı. Amma bu dəfə nə ağladı, nə də

bir söz dedi. Yalnız fikirli-fikirli dodaqlarını bir-birinə qısdı, səssizcə köksünü ötürdü.

– Ərin mənim hekayətimi yazmaq istəyir, – dedim. – Ancaq mənim özümdə də yazmaq həvəsi oyanıb... Bu dərdi danışmaq yazmaqdan çətindir...

Xəstəlikdən qalxan günün sabahısı Gülnisanın köməyi ilə dəniz qırağına gəzməyə çıxdım.

Bulvarda ən çox saç-saqqalı ağarmış və gücdən düşmüş qoca təqaüdçülər, ürəyi və əsəbləri mənim kimi xəstə qadınlar və kişilər gəzişirdilər. Gülnisa vaxtının çoxunu dəniz sahilində keçirdiyindən, bu adamların bir neçəsi ilə yaxından tanış olub ünsiyyət bağlamışdı. Onlar hər addımda bir – birilə salamlaşır, hal-əhval bilirdilər. Ən çox da havada radioaktivliyin artmağından, dəniz qırağında, xüsusən səhər tezdən və axşamüstü ultrabənövşəyi şüaların xeyrindən danışırdılar. Mən onları dinləyə-dinləyə öz-özümə düşünürdüm: "qocaların təqaüdə çıxmağı və dərdsiz-qayğısız halda saatlarla burada gəzinməyi təəccüblü deyil, ancaq Gülnisa da, mən də hələ cavanıq, əgər indidən rəfiqələrimizin və yaşıdlarımızın sırasından ayrılsaq bizim üçün ağır olmazmı? Biz hələ bundan sonra çalışıb insanlara xeyir verə bilərik. Əgər bu qocalar və əlillər kimi yalnız öz səhhətimizi qorusaq, buna dözə bilərikmi?". – Mən bu suallara mənfi cavab verirdim: "Yox, çətin dözərik", Doğrudan da, səkkiz il Bakıdan, sevimli sənətindən ayrılmış, nə isə yeni bir şey ixtira eləyib yaratmaq həvəsi ilə çırpınan mənim kimi bir qadın əlil adı ilə təqaüdə çıxmağa necə razı ola bilərdi? İki bir-üç bir gəzişən qocalar içərisində, Gülnisanın dediyinə görə, həyatının otuz-qırx ilini mühüm sahələrdə çalışmış, vaxtı ilə adlı-sanlı işçilər kimi tanınmış adamlar az deyildi, amma Gülnisa da, mən də gördüyümüz işlərlə öyünə bilməzdik. Biz çalışsaq da əsil mənada bundan sonra çalışıb, "biz də filan işi gördük" deməyə özümüzü haqlı bilməli idik.

Bulvardan qayıdanda, mən özümü çox yorğun və əzgin hiss eləyirdim. Qonşuluqdakı dükana buruldum. Qalın dəftər aldım. O gündən sonra, işsizlikdən darıxdığım saatlarda, uşaqları və Kamranı yuxuya verib, xatirələrimi yazmağa başladım...

Yalnız bircə şeyə ümidim vardı: mən ancaq olanları yazdığım üçün xatirələrimin səmimiyyəti heç kəsdə şübhə oyatmayacaq.

## İLK ZƏRBƏ

Mən ali məktəbi bitirəndən sonra, inşaat materialları institutunda kiçik elmi işçi idim. Mövzu götürüb namizədlik dissertasiyası yazmaq istəyirdim. Hələ inşaat mühəndisi olmaq xəyalına düşdüyüm gündən, məni çox sadə və lazımlı bir problem düşündürürdü. Bilirsiniz ki, Bakının bir çox məhəlləsində, xüsusən çökək yerlərində yeraltı sular var. Bu suların haradan axıb gəldiyinə dair hərə bir fikir söyləyir. Mən bu təxminlərin çoxusu ilə tanışam, bəziləri deyir ki, şəhərin altından nə vaxt isə kanal çəkilmiş və guya burdan torpağa sızan sular gölməçələr bağlayır sonra da tədricən yeri ova-ova ətrafa yayılır. Bəziləri də bu fikirdədir ki, şəhər dənizin sahilində olduğundan, həmin sular ən çox dənizə yaxın yerlərə nüfuz eləyir... Mən bu mülahizələrdən hələ müfəssəl danışmıram, çünki bu xüsusda hələ özümün də aydın təsəvvürüm yoxdur. Əsərim üzərində yenicə çalışmağa başladığım zaman mənə bircə şey məlum idi: yeraltı sular bir çox hündür binanın zirzəmisinə dolub, yalnız burda yaşayan ailələrə əziyyət verməklə qalmır, evlərin özülünü də ovub korlayır. Mən qarşıma məqsəd qoymuşdum; həmin suların yaşayış binalarına təsirini ziyansız hala salmaq üçün bir vasitə axtarıb tapmaq! Tədqiqat institutumuzun görkəmli alimləri mövzumu bəyənmişdilər. Elmi rəhbərim isə dönə-dönə deyirdi: "Əgər təcrübən müvəffəqiyyətlə nəticələnsə, bunun gözəl praktik əhəmiyyəti olacaq".

Mən işə çox böyük həvəslə girişmişdim, amma ailə vəziyyətim səmərəli çalışmağa yaman mane olurdu. Qızlarımı oxudub tərbiyə eləməli, onların xörəyini bişirməli, paltarını yumalı, ev-eşiyin təmizliyinə və səliqə-sahmanına fikir verməliydim. Bütün bunlarla yanaşı, elmi işdə çalışmaq və mövzunun öhdəsindən gəlmək üçün yuxuma haram qatmalıydım. Mən hər bir əziyyətə və məhrumiyyətə dözürdüm. Ancaq yalqızlığımı hər an hiss edirdim. Ərim Müdhət qırx ikinci ilin sonlarında cəbhəyə getmişdi. İki ildi ki, ondan heç bir xəbər-ətər yox idi. Mən istər-istəməz onun hardasa, nə vaxtsa həlak olduğunu düşünürdüm. Yazdığım məktubların birinə də cavab almamışdım. Qohum-əqrəba da ondan tamam əl üzmüşdü. Amma biz dərdimizi ürəyimizə salır, onun sağ-salamat qayıdacağına ümid eləyib, səbirlə gözləyirdik. Əslinə baxsan, başqa bir çarəmiz də qalmamışdı. O biri tərəfdən də maddi ehtiyac içində boğulurduq. Şirin çayın dadı çoxdan yadımızdan çıxmışdı. Ət və düyü xörəyinə də həsrət qalmışdıq. Qoşunlarımız

irəliləyib, Almaniya sərhədlərinə yaxınlaşırdılar. Amma tək biz yox, bütün əhali qıtlıqdan əziyyət çəkirdi. Buna baxmayaraq, mən küncdə-bucaqda narazılıq səsləri eşidəndə, buna çox qəzəblənirdim. Axı, biz nəyin bahasına olur-olsun bütün ölkəyə müdhiş bir fəlakət gətirən düşməni nəhayət məğlub edib azad nəfəs almalı idik. Bunun xətrinə mən də, ailə üzvlərim də daha ağır məhrumiyyətə dözməyə hazırdıq.

Günlərin birində məni hərbi komissarlığa çağırdılar.

– Müdhət Aydının attestatı kəsilir, – dedilər.

Səbəbini soruşdum.

– İtkin düşüb, – dedilər.

Dünya başıma hərləndi. Evə qayıdanda, uşaqlar da, qayınanam da az qala məni tanımadılar. Hər tərəfdən üstümə suallar yağdırdılar. Mən xəstələndiyimi bəhanə gətirib üzüqoylu çarpayıma sərildim, iki gün-iki gecə yerimdən qalxmadım. İşə getdim. Məyusluq və kədər həyulası bir an belə üzərimdən əskik olmurdu. Nə uşaqların, nə də qayınanamın üzünə şax baxa bilmirdim. Sanki hamısının qarşısında rüsvay olmuşdum.

Mənim maaşım yalnız çörəyimizi almağa çatırdı. Əgər qaynım Faiq təkdənbir bizə pul verməsəydi, acından batardıq. Dediyim kimi, müharibənin ağırlığından beli bükülən tək biz deyildik. Biz bundan da ağır ehtiyaca qatlaşa bilərdik, təki Müdhət... təki Müdhət...

Hər gün səhər tezdən qalxıb, uşaqlarımı məktəbə yola salır, səssiz-səmirsiz köksünü ötürən və bununla da guya dərdini bizdən gizlədən qayınanama təsəlli verirdim:

Qəm yemə, Bədirnisa xala, Hitlernən də bizim aramızda çox qalmayıb... Bu gün-sabah onun vayını verəcəyik, – deyib işə gedirdim. Bəzən acından başım hərlənib ürəyim qısılsa da, çalışmaq və yaratmaq həvəsim azalmırdı. Bu sizə parodoks kimi görünməsin. O vaxt insanların sakit həyatını pozub adi məcrasından çıxaran hadisələr məni ruhdan sala bilmirdi. Əlbəttə, mən bu barədə heç də istisna təşkil eləmirdim. Belə görünürdü ki, başqaları kimi mən də böyük ümidlə yaşaya bildiyim üçün xudpəsənd və kiçik duyğuları boğub-öldürməyi bacarırdım. Bu yeni həyat tərzi məndə artıq vərdiş halına gəlməyə başlayırdı.

Qırx dördüncü ilin sonunda Müdhətdən məktub aldım. Deyirlər ki, insan sevincdən ölə bilməz. Bu doğrudur, ancaq mən Müdhətin yolladığı zərfə baxanda ölüb o dünyadan qayıtdım. Bir an sonra, məktubu

oxuyanda isə dünya gözlərimdə qaraldı. Müdhət şagird dəftərindən qoparılmış dama-dama kağızda əyri-üyrü xətlə tələm-tələsik yazmışdı:

"Əziz dost! Mən sağam. Amma buna təəssüf eləyirəm. Ölsəydim, bu mənə də, sizə də şərəf gətirərdi. Görünür taleyim belə imiş. Aylarca qatlaşdığım əzab-əziyyətdən sonra alnıma vurulan "xain" damğası, mənim həyatımı məhv elədi. Ancaq mən heç bir zaman xain olmamışam. Son dəqiqəyə kimi namusla vuruşmuşam... Bizi yatapla sürgünə yollayırlar. Əlvida!..."

Məktubun sonunda adres də yoxdu, imza da. Lakin onu yazan Müdhət idi. Xəttindən tanıyırdım. "Əziz dost" sözünü yalnız o mənə yazardı...

Bir neçə gündən sonra başqa bir məktub gəldi:

"Əziz dost! Uzaq Şimala yaxınlaşırıq. Bu sözləri yazdığım vaxt necə iztirab çəkdiyimi təsəvvürünə gətirə bilməzsən. Məni bir daha gözləmə. Çox ağırdır, əziz dost... Əgər özünə layiq başqa birisiylə... yox, ağırdır... Hər hansı bir ərin öz həyat yoldaşından onun yolunda ömrünü çürütməyi tələb etməyə mənəvi haqqı varmı? Məncə yoxdur. Bəlkə sən başqa birisi ili xoşbəxt olacaqsan? Əgər sən özünə layiq gördüyün bir insanla yenidən həyat qursan, inan ki, bu mənim qüruruma və heysiyyətimə zərrəcən də toxunmaz. Mən ki köhnə müsəlman deyiləm..."

Bu dəfə məktubu imzalamışdı: "Müdhət Aydın".

İlk günlərdə mənə bunlar yuxu kimi görünürdü. Qarışıq, iztirablı və mənasız bir yuxu kimi. Bəzən mənə elə gəlirdi ki, o, hardansa, kimdənsə mənim yanlış bir hərəkətimə dair söz eşidib, mənə qarşı yalnız məhəbbətini deyil, bütün etimadını belə itirmişdi. Yoxsa "yeni həyat", "başqa birisi" kimi sözləri necə yaza bilərdi? Mənə dəyən bu müdhiş zərbənin ağrısından canım qurtaranda və az-çox özümə gələndə çox düşünüb – daşındım, gördüm ki, o, mənim ər evində ömürlük qalmağımı tələb yox, xahiş belə eləsəydi, öz təbiətinə zidd getmiş olardı. Orta məktəbdə odlu məhəbbətlə, az qala Leyli və Məcnun kimi sevişdiyimiz ilk gənclik illərindən bəri Müdhət nəinki məndən soyumamış, hətta əksinə, mənə daha möhkəm, daha qırılmaz tellərlə bağlanmışdı və mənim mənəvi azadlığıma bir nöqtə qədər də xələl gətirməmişdi. Heç birimiz on iki illik ailə həyatının ləzzətindən doymamışdıq. "Ərarvadın savaşı – yaz gününün yağışı" məsəlinin mənası hələ də mənə aydın deyildi. Biz hər ikimiz sözdə bir-birini sevən, amma əsil həqiqətdə adi bir riyakarlıq eləyən və məhəbbətdə çirkin haqq-hesab güdən adamları bu günün yox, uzaq keçmişin eybəcər məxluqları sayır-

dıq. Bizim məhəbbətimiz – təbii bir ehtiyac idi. Ailə həyatının çətinliklərini belə sevincə çevirməyənlər bizim nəzərimizdə yoxsul və bədbəxt insanlardı.

Müdhətin məktubunu alan günü işdən çıxıb dəniz qırağına getdim. Xəlvət bir bucağa çəkilib, bir neçə saat tək-tənha oturdum. Ağlamaqdan güclə özümü saxlayaraq, qəhərdən boğula-boğula, tərəddüd içində fikirləşdim, bu vəziyyətdən çıxmaq üçün bir yol tapmaq istədim. Şırıltı ilə sahili döyəcləyən ləpələr elə bil qulağıma bu sözləri pıçıldayırdı: "Çalış, yenə çalış... İnsan başına iş gələr... Çalış, çalış, bu məşum fikirlərdən tez canını qurtar..." – İçəridən başqa bir səs də eşidirdim: "Qalx ayağa, hündür bir yer tap, özünü at dənizə, qurtar canını!" Şüurumu topladım: "Yox, buna mənim haqqım yoxdur. Uşaqlarımı yetim qoyub getmək, analıq borcuna xəyanət olar!..." Dənizin şırıltısı yenə o məşum sözləri pıçıldamağa başlayanda, sürətlə skamyadan qalxdım. Bu anda başım hərləndi. Gözlərim alacalandı. Əlbəttə, bu aclıqdandı (səhər tezdən qəndsiz çayla yediyim bir parça çörəyin üstündə idim). Dərhal da qızlarım yadıma düşdü. Yəqin onlar da heç nə yeməmişdilər.

Şər qarışmışdı. Pəncərəmizdən işıq gəlirdi. İndi məni ən çox həyəcanlandıran başqa bir məsələ idi: necə eləyim ki, qızlarım da, qayınanam da hədsiz dərəcədə qəmgin olduğumu başa düşməsinlər?

Qapını Bədirnisa xala açdı. Mən tez-tələsik gecikməyimin səbəbini uydurdum:

– İclasımız vardı. Bərk yorulmuşam

Yalan söz demək, riyakarlıqdan da bədtərdir. Bərk qızardığımı hiss eləyib, qoltuğumdakı dəftər-kitabı cəld stolun üstünə atdım və dərhal mətbəxə adladım. Hələ yuyulmamış qab-qacağı görəndə sevindim. Deməli Bədirnisa xala nə isə bişirib qızlarıma yedirtmişdi (Bizim qoca arvadların ehtiyatı heç bir zaman əskik olmur!). Bu halda tərs kimi o, mənim ardımca gəldi:

– Qızım, – dedi, – adam da özünə bu cür zülm elər? Sən ki bu gün alatorandan acsan... Bir ovuc düyü saxlamışdım Bişirdim, qızlar yedi. Faiq anası ölmüş gəldi, onun qabağına heç nə qoya bilmədim. Səni çox gözlədi, axırda kor-peşman qayıtdı. Bircə günlüyə izin alıbmış... O balaca torbada beş-on kartof, üç-dörd yumurta gətirmişdi... Yazıq uşaq gedəndən sonra bunu bilmişəm... Götür ondan, bir-ikisini qızart, sən də ye!

Sevinməyə bəhanə tapmış kimi gülümsədim:

– Çox sağ ol, xala, – dedim. – Faiq həmişə bizim dadımıza çatır. Bu saat kartof qızardıb yeyərəm, doğrudan da yaman acmışam...

Qarı mən sarıdan arxayın olub, öz otağına keçdi. Mən kartof soydum. Bişirdim, ancaq yeyə bilmədim. Tikə boğazımdan ötmürdü. Vanna otağına keçdim, uşaqların çirkli paltarını yudum. Əslinə baxsan, mən özüm də kədərimin səbəbini onlardan gizlətmək fikrində deyildim. Ancaq əhvalatı birdən-birə açıb söyləməyə dilim gəlmirdi. Doğrudur, qızlarım hələ balaca idilər, bütün ailəmiz üçün necə bir fəlakət baş verdiyini o qədər də yaxşı anlaya bilməzdilər, ancaq Bədirnisa xala son dərəcə həssas bir qadındı və həqiqəti ondan gizlətməyin mənası yoxdu...

Bütün gecəni yata bilmədim. Saat onacan dərslərini hazırlayıb yerlərinə girmiş və yuxulamış qızlar, bunun fərqinə varmadılar, ancaq Bədirnisa xala, oğlu cəbhəyə gedəndən bəri adətən səksəkəli yatırdı, yerinə uzansa da, çox vaxt gözünə yuxu getmirdi. O, mənim stol dalında bu qədər çox oturduğumu görməyə bilməzdi. Doğrudan belə oldu. Mən onun sakit addımlarla dəhlizə çıxdığını, mənim qapımın ağzından keçəndə ayaq saxladığını və oğrun-oğrun mənə sarı boylandığını, sonra da yanıma gəlmək istədiyini duyub, yerimdən cəld qalxdım və özüm onu qarşıladım:

– Niyə yatmırsan, Bədirnisa xala?

Onun sual dolu baxışları bir xeyli üzümə dikilib qaldı. Aydındı ki, nə isə ürəyinə dammışdı.

– Canına yazığın gəlsin, qızım,-dedi. – Olan-olub, keçən-keçib...

Bu dərdə mübtəla tək biz deyilik... Hər şey tanrının əlindədir.

Mən daha ona təsəlli vermədim: yalan demək üçün rola girməyi bacarmadım, yaxşı ki, o da mənə çox bənd olmayıb, yenə də səssizcə addımlarla öz otağına qayıtdı... Mən təkrar stolumun dalına keçdim. Evdə necə səssizlik idisə, öz otağında ah çəkirmiş kimi yavaşcadan köksünü ötürən qayınanamın səsi açıq-aydın gəlib qulağıma çatırdı. Mənim qarşımda kitab vardı, ancaq oxuduğum beynimə girmirdi. Mən yenə də düşünür və qəti bir fikrə gələ bilmirdim. Hər halda Müdhətdən aldığım məktubun məzmununu həm direktorumuza, həm də partiya bürosuna yazmalıydım. Kimdən və nədənsə qorxduğum üçün yox, yalnız öz vicdanım qarşısında təmiz olmaq üçün, yoldaşlarımın və dostlarımın üzünə şax baxa bilmək üçün. İndi hətta mənə elə gəlirdi ki, bu barədə bir az gecikmişəm, bilmədiyim və ya tanımadığım hansı bir bədxah isə məndən əvvəl artıq bu xəbəri təcili olaraq, canına yel dəyməmiş, lazımı yerlərə çatdırmışdır.

Tamam gücdən düşmüş halda, yuxum gözümdən tökülə-tökülə ərizə yazdım və paltarımı soyunmağa belə ərinib üzüqoylu çarpayıma sərildim...

Nə qədər yatdığımı bilmirəm. Mən uşaqları məktəbə yola salan qayınanamın səsinə oyandım. Tezcə qalxıb əl-üzümü yudum. Belə hallarda hesabla gərək səliqə-sahmanımı unudaydım. Ancaq qadınların zəif damarından məndə də vardı. Başımı darayıb, saçlarımı təzədən hörməyi və güzgüyə baxıb sir-sifətimi nəzərdən keçirməyi unutmadım. Dünəndən bəri məndə rəng-ruh qalmamışdı. Elə bil qaşlarımın arasındakı qara xalın da rəngi solmuşdu. Soyumuş çaydan yarım stəkan içib, əl boyda çörək payımı yeyə-yeyə tramvay duracağına yüyürdüm...

Bizim iş otağımız uzun və geniş dəhlizin sağ tərəfində idi. Qapımız pilləkənə açılırdı. Pilləkən isə birinci mərtəbəyə, laboratoriyamıza enirdi. İyirmi kvadratmetrlik işıqlı otağımızda dörd stul qoyulmuşdu. Mən Kirov prospektinə baxan hündür pəncərənin qabağında oturdum. O biri rəfiqələrim isə bir-birilə yanaşı divar boyu otururdular. Vaxtımızın çoxunu laboratoriyada keçirirdik. Təcrübələrimizin yekununu yazmaq üçün buraya gələndə, adətən, elmi mövzulardan yox, dərd-sərimizdən, Sovet Məlumat Bürosunun verdiyi son xəbərlərdən, yeni paltar modalarından, ən çox da ərzaq qıtlığından danışırdıq. Yaşca fərqimiz çox deyildi. Heç kim sirrini bir-birindən gizlətmirdi. Üçümüz evli idik. Yalnız yəhudi qızı Rima hələ ərə getməmişdi. Ona oğlan bəyəndirmək olmurdu. Kimin adını çəkirdiksə, üz-gözünü əyib, əlini tovlayır, "eh, siz də adam tapdınız!" deyib bizə arxa çevirirdi. Deyəsən ömürlük qız qalmaq fikrində idi. O, keçən ilin baharında namizədlik dərəcəsi almışdı, indi isə doktorluğa hazırlaşırdı. Bəzən ərə getməkdən söz düşəndə, qalın qaşlarını çataraq, pamada ilə rənglənmiş nazik dodaqlarını büzərək, kəsik saçlarını ikiəlli sığallayıb deyinirdi:

– Mən əyyaşlar üçün araq pulu qazanmaq fikrində deyiləm!.. Həyatda mənim idealımı tapmaq çətindir, oğlanların hamısı yağlı yer axtarır, mənimsə zəhləm alfonslardan gedir!..

Mənim sağ tərəfimdə oturan Tura isə ərini tərifləyir, Səməd Vurğundan sitat gətirirdi:

– "Əli bəy quş kimi yemləyir məni!.."

Sənin bəxtin gətirib, Tura, – deyə Rima təqdirdən çox təkdir eləyirmiş kimi, üz-gözünü daha da turşudub, əl güzgüsündə özünə baxa-

baxa damağını nırçıldadırdı. – Amma mən buna da yoxam, o səni quş kimi yemləyir, sən də ona naz satırsan. Süniliyə düşmənəm!

Doğrusu onun indiyəcən ailə həyatı qurmamağı məni həmişə təəccübləndirirdi. Axı, Rima heç birimizdən çirkin deyildi. Əksinə, boy-buxunu və qaş-gözü (hələ mən onun necə ağıllı və çalışqan olduğunu demirəm) ən surətpərəst oğlanları da cəzb eləyə bilərdi. Mümkün deyildi ki, ona tez-tez elçi gəlməsin. Bəs nə üçün o, indiyə kimi ərə getməmişdi? Özü bu barədə bir söz deməsə də, biz bilirdik: vaxtını ötürmüşdü. Məlumdur ki, adətən qız gənc yaşlarında öz tayını tapmasa, sonralar, yəni kamala çatanda oğlanlara daha tənqidi yanaşır, onların xasiyyətlərində başqalarının görə bilmədiyi qüsurlar tapır və elçiləri də bir-birinin ardınca məyus yola salır. Rima təzə modalı geyimləri o qədər də xoşlamırdı. Ancaq həmişə təmiz və səliqəli geyinirdi. Mən onun əynində çox vaxt açıq mavi rəngdə yun jaket, tünd yaşıl yun parçadan tarım tikilmiş tuman, qırçınlı yaxalığı qar kimi ağaran və həmişə də ütülənmiş üst köynəyi görərdim. Bəzən jaket əvəzinə pencək geyər, qalstuk taxardı. Əgər dodaqlarını boyamasaydı, onu bu geyimdə daha çox oğlana bənzədərdilər. Hər saatı nədir, hər dəqiqəni faydalı bir işə sərf eləmək onun müqəddəs devizi idi. Azacıq boş vaxt tapan kimi, köhnə xurmayı portfelindən ingilis dili dərsliyini çıxardıb, dodaqlarını səssiz-səmirsiz tərpədərək yeni-yeni kəlmələr əzbərləyirdi. "Hər gün beş söz-normamdır", – deyirdi. Bəzən isə altı-yeddi kəlmə öyrənirdi və belə hallarda özündən razı qalıb, portfelinin balaca gözündə saxladığı pamada ilə dodağının boyasını təzələyirdi, sonra da Sergey Yesenini qəribə bir məftunluqla oxuyurdu...

Mənim kədərli olduğumu hamıdan əvvəl o sezdi. Ərizələrimi kitabın arasından götürüb partiya bürosuna getmək istəyəndə, o, qapıda mənimlə üz-üzə gəldi. Biz, az qaldı, toqquşaq. Rima təəccüb ifadəsi ilə parıldayan gözlərini mənə dirəyib soruşdu:

– Nə yaman tez gəlmisən, Sema? Hələ işin başlanmağına iyirmi dəqiqə var ki. Sənə nə olub belə, rəngin-ruhun özündə deyil?

Mən onun böyründən sivişib keçmək istədim, o buraxmadı.

– Laboratoriya hələ bağlıdır, – dedi. – Nə əcəb belə tezdən?

O, gözlərini məndən çəkmirdi. Görünür, sir-sifətim doğrudan da çox dəyişmişdi. Rima qolumdan tutub içəriyə dartdı, qapını örtdü. Yenə israrla soruşdu:

– Yoxsa Müdhətdən bir xəbər var? Dünəndən gözümə birtəhər deyirsən...

Mən etiraf elədim:

– Düz deyirsən, Rima, qanım bərk qaradır. Müdhətdən məktub gəlib...

– Qara xəbər? – O, elə bil son dərəcə adi və əhəmiyyətsiz bir hadisədən danışırdı. Çoxlarının cəbhədə həlak olmağına dair alınan xəbərlər, ölüm hadisəsinə soyuqqanlı baxmağa camaatı alışdırmışdı. – Sən özün həmişə deyirsən ki, su qabı suda sınar... Deyilmi?

– Elədir, deyirəm... Səni inandırıram ki, ölüm xəbəri məni bu qədər sarsıtmazdı. Ondan da müdhiş xəbərdir.

Rima səksənmiş kimi başını bir az dikəltdi.

– Müdhəti sürgünə yollayıblar, – dedim.

– Nə üçün?

– Guya düşmənə könüllü əsir düşüb...

– Özü yazır?

– Özü. – Mən əlimdəki ərizəni ona uzatdım. – Burada hamısını yazmışam.

Rima stolunun dalına keçib oturdu. Kağızı açıb qabağına sərdi. Əllərini gicgahlarına söykəyib, oxumağa başladı. İndi də mən ondan gözümü çəkmirdim. Açıq havada gəzməyə çıxmadığından, onun kül rənginə çalan bənizi daha da solğunlaşdı.

– Bax, Sema, – dedi və oxumağına ara verdi. – Ərin də belə dərdləri var... Ancaq bu ərizəni nahaq verirsən. Axı sən nə üçün Müdhətin hərəkətinə cavabdeh olmalısan?

– Mən ərizəmdə cavabdehlik barədə heç nə yazmamışam. Mən yalnız faktı qeyd eləmişəm. Müdhətin yazdığını yazmışam. Hər şeyi olduğu kimi qoy bilsinlər. Bu daha yaxşı deyilmi?

– Hm... Bilsinlər... Axı, bunun sonrası var. Sən bu barədə heç fikirləşmisənmi? Mən adamları yaxşı tanıyıram... Xüsusilə bizim partkom katibini... Sən ondan qəhrəmanlıq umma!

– Nə mənada?

– O mənada ki, kölgəsindən qorxanın biridir. Onun fikrincə şəxsi rəydən məhrum olmaq ən böyük səadətdir!

– Yox, Rima, sən nahaq yerə adamlara bu cür nihilistcəsinə yanaşırsan. Bizim katib bəzən direktorla döş-döşə gələndə, heç də başqalarından az cəsarətli olmur...

– Direktorla, hə... Çünki onun yerinə göz dikib... Yox, bacım, sən yaşca məndən böyük olsan da, hələ də gimnazistlər kimi sadəlövhsən... İndi görəcəksən ki, sənin məsələnə baxılanda o, necə qorxaqlıq eləyəcək...

– Nə olsun? O qorxsa da, mən qorxmayacağam.

– Mən də bilirəm, qorxmayacaqsan... Ancaq unutma ki, sənin uşaqların var. Əgər işdən çıxartsalar, tək özünün yox, onların da vəziyyəti ağırlaşacaq...

– Bilirəm, mən bunu da gözümün altına almışam.

– Məncə, ərizə verməsən yaxşıdır.

– Hər şeyi gizlədim? – Mənim səsimdə artıq əsəbi nidalar çırpınmağa başlayırdı. Rimanın mənə ikiüzlülük eləməyi məsləhət gördüyünü düşünürdüm. – Bu sözlərlə sən məni təhqir eləyirəsn...

Mən belə deyəndə, onun üzünə necə baxdığımı bilmirdim, ancaq Rimanın yanaqlarına çökən xəfif qızartıdan hiss eləyirdim ki, mənim etirazım onun könlünə toxunmuşdur. O, bir qədər tutulub, sükuta gedəndən sonra, azca xırıltılı səsi ilə, dediklərimə məni peşman eləyən qəribə bir səmimiyyətlə, yerdən gözlərini qaldırmayaraq, dırnaqlarını qurdalaya-qurdalaya (onun əlləri xəfif-xəfif titrəyirdi) dilləndi:

– Elə düşünmə ki, mən sənin ikiüzlü olmağını istəyirəm. Ancaq onu da bilməmiş deyilsən ki, insan mələk deyil. O, bəzən iradəsindən asılı olmayaraq, həyatın tələbinə uyğunlaşmağa məcburdur. Sən doğruluğunu sübut üçün ərizə verirsən, bilirsən ki, ərin Müdhət sürgündədir. Sonra?.. Doğrudur, sən bunu özün deməsən də, gec-tez biləcəklər. Onsuz da bizdə "xəbərçilər" pis işləmir... Bunu sabah da bilə bilərlər, iki aydan sonra da... Mən onu deyirəm ki, çağırıb səndən xəbər alsalar, o başqa məsələ... Əsil həqiqəti onda açıb söylərsən.

– Yox, – dedim. – Bilirəm ki, sonra etiraf eləsəm, məndən şübhələnib ədalətsiz ittiham verərlər: "Əgər sən doğru adamsan, nə üçün indiyəcən bizdən gizlətmisən?"

Bu dəfə Rima mənimlə razılaşdı, ancaq ərizəmi ondan alıb otaqdan çıxmaq istəyəndə, yenə tərəddüd göstərdi:

– Bəlkə dil cavabı deyəsən, hə? Ərizə yazmağı tələb eləsələr, onda heç... Yazmısan, verərsən. – O, mənə acıyırdı, tez-tez köksünü ötürməyindən və təəssüflə başını bulamağından duyurdum ki, mənim əvəzimə o qorxur, doğrusu, bu, mənə toxundu. – Hə, niyə mənə birtəhər baxırsan?

– Çünki, – dedim. – mənə nahaq acıyırsan!..

– Bəs neyləyim, qəzəblənim?

– Ölmək ölməkdir, xırıldamaq nə deməkdir?

Mən birbaş direktorun qəbul otağına yönəldim və ərizəmi katibəyə verib, tezcə də çıxdım. Partkom katibini isə yerində tapmadım. O, hələ işə gəlməmişdi. Qapısı bağlı idi.

Rimanın yanına qayıtdım. O birisi rəfiqələrim də gəlmişdilər. Kitab-dəftərlərini stolun üstünə qoyub, laboratoriyaya enməyə hazırlaşırdılar. Mənimlə adi qayda ilə görüşüb, xalatlarını geydilər. Hiss elədim ki, Rima mənim haqqımda onlara heç nə deməmişdir. Tura o biri rəfiqəm Məlikədən daha həssasmış. Məni görən kimi nədənsə həyəcanlı və məyus olduğumu sezib, əvvəlcə göz-qaşını oynadaraq, sonra da sağ əlini çiynimə qoyub soruşdu:

– Niyə tutqunsan?

Onun sualı Məlikəni də maraqlandırdı. Hər üç rəfiqəm gözlərini mənə dikib, cavab gözləyirdi. Rimanın baxışlarından isə ayrı sual oxuyurdum: ərizəni verib-vermədiyimi bilmək istəyirdi. Mən başımı tərpədib “hə” cavabı verdim. O, Tura ilə Məlikəyə əhvalatı qısaca danışdı. Otağımıza qüssəli bir sükut çökdü. Onlardan hansının daha çox kədərləndiyini söyləmək çətindi.

– Nə olar, olar, – deyə mən də xalatımı geydim. – Yəqin bu gün axırıncı dəfə işləyirəm...

Tura deyəsən o qədər də bədbin deyildi:

– Bu nə sözdür, Sema? Kimin ağzıdır sənə güldən ağır bir söz desin?

Rima ilə Məlikə isə dinməyib, ağır və könülsüz addımlarla qapıya sarı getdilər.

Hamımız laboratoriyaya endik. Rima qapı ağzında məni saxlayıb, pıçıltı ilə dedi:

– Nahaq tələsdin, Sema. Bu adamlardan qəhrəmanlıq gözləmə...

Əlbəttə, o, rəfiqələrimi deyil, institut rəhbərlərini nəzərdə tuturdu. Mən bu barədə ona heç nə demədim. Tələsməyə nə ehtiyac vardı ki? Gec-tez onun nə dərəcədə haqlı olub-olmadığını biləcəkdim.

Srağagünkü təcrübənin nəticəsini yoxlamağa başlamamış, direktorun findfüruş geyimli, tünd iyli ətirlə laboratoriyanın havasını dərhal dəyişən katibəsi gəldi. Bizdən o yanda yanaşı oturub xosunlaşan oğlanlara naz-qəmzə satıb, mənə üz tutdu:

– Yoldaş Səmədov sizi çağırır, yoldaş Aydın, – dedi.

Rima da, Məlikə ilə Tura də məndən çox həyəcan keçirirdilər. Mənim gözüm Rimaya dikilib qaldı. O, başını bulayır və katibənin nə üçün gəldiyini bildiyindən, yəqin ki, oğlanlardan mənim əhvalatımı gizlətmək məqsədi ilə heç bir söz demirdi. Elə bil gözlərində eyni ifadə çırpınırdı: "Nahaq tələsdin, Sema, çox nahaq".

Mən katibənin ardınca ikinci mərtəbəyə qalxdım və partkom otağının yanından keçəndə, yarımaçıq qapıdan büro katibimizi görüncə, xalatımın cibindən ərizəmi çıxardaraq, izin istəmədən içəri girdim, salam verib, kağızı ona uzatdım:

– Alın, oxuyun. Direktorun yanına gedirəm, lazım olsa, məni çağırtdırarsınız, – deyib, dübarə çıxdım.

Direktor xalılarla döşənmiş geniş kabinetində var-gəl eləyir, radioda Sovet Məlumat Bürosunun verdiyi son xəbərləri dinləyirdi. Mənim salamımı ağız-ucu alıb, pəncərə yanındakı divardan asılmış böyük xəritəyə yanaşdı, cəbhə xətti boyu düzülmüş xırdaca bayraqlardan birini çıxardıb, yerini dəyişdi və yalnız bundan sonra üzünü mənə çevirdi. Ürəkdən gələn bir sevinclə yox, nə isə rəsmi bir vəzifəni yerinə yetirməyə məcbur olan məmur kimi, boğazdan yuxarı və qaş-qabaqlı halda dilləndi:

– Sərhəddi keçdik. Bizim də küçəmizdə toy-bayram başlandı!.. Necə görürsən bizi, hə? – Mənim cavab vermədiyimə sevinmiş kimi, tutqun bir təbəssümlə gülümsəyərək, qaşlarını qaldırıb saldı və təkrar xəritəyə yanaşdı. – Bütün cəbhə boyu irəliləyirik!.. Daha bizim qabağımızı saxlaya bilməyəcəklər!.. Amma bircə şeyə təəssüf eləyirəm. Niyə mən də vuruşanların cərgəsində deyiləm? Lap sıravi əsgər olmaq istərdim. Qoy boz şinel, ağır soldat çəkməsi geyim, amma vuruşum... Bu elm məni dostlarımın yanında xəcil elədi. – O, təəssüflə köksünü ötürdü. Mən nə üçünsə bunun da səmimi olduğuna inanmadım. O, xəritədən aralanıb, stolunun arxasına keçdi və yumşaq kreslosunda oturdu. – İnan ki, lap elmdən də əl çəkməyə hazıram, təki sıravi əsgər olum...

Bu anda mənim fikrimdən bir sual keçdi: "Sizə kim mane olur...?" – Ancaq bu sualı verməkdən çəkindim. Axı, insanın üzü ətdəndir. "Sizə kim mane olur?" deyə soruşsaydım, yəqin ki, pərt olacaqdım. Mən hiss eləyirdim ki, o, məndən tamamilə başqa bir söz gözləyir. İstəyirdi ki, deyim: "Yox, siz yalnız elm üçün yaranmısınız, yoldaş Səmədov. Heç Stalin özü də institutu buraxıb cəbhəyə getməyinizə razı olmaz". O, ərizəmi əlinə alıb bir neçə an sükuta qərq oldu. Mənə elə gəldi ki,

deyəcəyi sözlər artıq hazırdı, ancaq məni öz səmimiyyətinə inandıra biləcəyinə şübhə elədiyi üçün tərəddüd göstərirdi. Nəhayət gözlərini aşağı dikib, çiyinlərini çəkdi:

– Oxudum, – dedi. – Ancaq çox kədərləndim. Ola bilsin ki, ərinin günahı var. Amma oğul ataya cavabdeh deyil. Əlbəttə, müəyyən orqanlarla məsləhətləşmək lazımdır. Ərizənin üstündə bir kəlmə dərkənar yazmaq çətin deyil. Ancaq mən bunu yazmıram, çünki canlı insanın taleyini bu cür asanlıqla həll eləmək olmaz. Axı, insan-ən qiymətli kapitaldır. Bilirsənmi bu, nə deyən sözdür? Mən sosioloq olsaydım, bircə bu formulanın əsasında iki cilddən ibarət bir traktat yazardım!.. – O duruxdu. Görünür, məni bu sözləri dinləmək üçün çağırmadığını xatırladı. – Bu saat mən sənə nə deyə bilərəm? Bu əhvalat məni çox məyus elədi.

Mən fikirləşdim: “Gözünün içinəcən yalan deyirsən”.

– Ancaq hər şeyi olduğu kimi yazmaqda doğru iş görmüsən!.. – deyə o, yerində yayxındı. – Partiya bürosuna necə, məlumat vermisənmi?

– Bəli, – dedim. – Ərizəmin surəti onlardadır.

– Elə bunu da yaxşı eləmisən. Məsələ belə olanda, iş bir qədər asanlaşır. Yəqin ki, məni də müzakirəyə çağıracaqlar. Bu daha gözəl!.. Birgə baxarıq... Şəxsən mənim fikrimi soruşsalar, kollektivin rəyi ilə razılaşacağam... – Direktor yenə yerindən qalxıb, reproduktoru bağladı və bir daha gözlərini yuxarı qaldırmadan dedi: – Hələlik get, işinlə məşğul ol. Müəyyən orqanlarla məsləhətləşərik. Görək onlar nə deyir... Hər halda çox kədərləndim...

Artıq onun nə üçün məni çağırtdığını anlaya bilmirdim. Mənim ərizəmi oxuyandan sonra kədərləndiyini dönə-dönə təkrar elədikcə, məndə get-gedə daha qüvvətli daxili bir etiraz baş qaldırdı: “Axı, səndə mərdlik yoxdursa, heç olmasa danışma. Səni yalan deməyə kim məcbur eləyir?

Mən ona hörmətsiz bir söz deməkdən özümü saxlamaq üçün dönüb otaqdan çıxdım. Hər şey mənə aydın idi... Bu gündən sonra o, məni institutda saxlamağa cəsarət eləməyəcəkdi.

Laboratoriyaya enmədim. Otağımıza qayıtdım. Partkom katibindən cavab gözləməyi qərara aldım. Bizim otaqda onun kabineti arasında yalnız bir qapı vardı. Adi vaxtlarda katib özü gələr, bizimlə söhbət elər və iclasın vaxtını kommunistlərə xəbər verərdi. Bu dəfə isə direktorun katibəsini yollayıb, işdən sonra büroya çağırıldığını bildirdi. Mən artıq özümü köməksiz və yalqız hiss eləyirdim. Bu dərd aclıq və susuzluq dərdindən yüz qat ağırdı...

Partkom otağında büronun yeddi üzvündən yalnız dördü oturmuşdu. Mən içəri girəndə heç biri başını qaldırıb üzümə baxmadı. Elə bil hamısı bir-birindən küsülü idi. Bir xeyli sükutdan sonra katib qapıya baxa-baxa dedi:

– Nizam-intizam barədə danışmaqdan yorulmuşuq. Hələ bunlar büro üzvləridir... On beş dəqiqə gözlədik... Bəsdir. Kvorum var, biz başlaya bilərik!..

O, ərizəmi oxudu. Üzvlərin rəyini soruşdu. Əvvəlcə heç kimdən səs çıxmadı. Katib direktora müraciət elədi:

– Bəlkə siz deyəsiniz?

– Mən nə deyə bilərəm? Şəxsən mənim rəyimi soruşsanız, kollektivin qərarı mənim üçün qanundur! – deyə direktor yerində dikəldi, sarı təsbehini çıqqıldadaraq, gözlərini hara isə zilləyib susdu.

Rima ona baxa-baxa istehza ilə gülümsündü:

– Hər halda siz idarə rəhbərisiniz, – dedi. – Şəxsi rəyiniz olsa yaxşıdır!

Direktor onun atmacasından o qədər də incimədi, pencəyinin döş cibindən darağını çıxardıb, uzun saçlarını daramağa başladı:

– Şəxsi rəyimi hamınızdan sonra deyəcəyəm!

– Elə isə siz buyurun, yoldaş Kabus!.. – Katib, Rimanın böyründə oturmuş və ağ əllərini dizlərinin üstündə daraqlamış baş elmi işçi, dosent Mirzəliyevə müraciət elədi: – Onsuz da hamınızı danışdıracağam... Nəzərdə tutun ki, söhbət istedadlı və cavan kommunistdən gedir... Səmirə Aydın yoldaş partiya sıralarına müharibənin ən ağır günlərində, faşistlər Qafqazın qapılarını döydüyü zaman ərizə vermişdi.

– Doğrudur! – deyə Mirzəliyev sevinmiş kimi yerində doğruldu və pencəyinin döş cibindən çıxardığı kağıza bükülü iki-üç papirosdan birini götürüb damağına qoydu. – Mən Səmirə Aydını tələbə olduğu vaxtdan tanıyıram. Gərək ki, bir il də onların sinfində dərs demişəm. İki uşaq anası ola-ola bütün predmetlərdən əla qiymət alırdı. Elə deyilmi, Səmirə xanım?

Mən yalnız başımı tərpətməklə onun sözlərini təsdiqlədim.

– Büro üzvlərindən üçünün gəlməməyi, əslinə baxsan, onların cəsarətsizliyinə dəlalət eləyir...

Direktor Mirzəliyevin sözünü kəsdi:

– Biz büro üzvlərinin yox, Səmirə Aydının məsələsinə baxırıq. Olmazmı yoldaşların barəsində qeybət eləməyək?

– Bu qeybət deyil, yoldaş Səmədov... Mənim yanımda hamısına xəbər verdilər. İşin nə yerdə olduğunu bilən kimi portfellərini götürüb, birbaş evlərinə əkildilər. Məncə bu doğru hərəkət deyil. Əgər Səmirə xanımı özlərindən incitmək istəmirlərsə...

– Əksinə, onların heç biri Səmirənin əleyhinə danışmazdı... – deyə Rima sözə qarışdı. – Üzr istəyirəm, yoldaş Mirzəliyev... onlar məhz Səmirə Aydının əleyhinə danışmamaq üçün gəlməyiblər...

Mirzəliyev əli titrəyə-titrəyə ( o, papiros çəkdiyi üçün arada üzr də istədi) çaxmaqla papirosunu yandırdı və fikrini tamamladı:

– Əgər onlarda cəsarət olsaydı, iclasa gələrdilər. Səmirəni müdafiədən də çəkinməzdilər. Mənim təklifim belədir ki, Səmirənin səmimi ərizəsi nəzərə alınsın.

– Vəssalam? – deyə direktor gözlərini bərəldərək, təəccüblə onun üzünə baxdı.

Mirzəliyev eyni təmkinlə papirosunu sümürüb, bir az da qəti dedi:

– Bəli, vəssalam!..

Direktor, ürəkdən inandığı müqəddəs bir ehkamın uçurulmağından qəzəblənmiş kimi, artıq müvazinətini saxlaya bilməyib onu acıladı:

– Siz, yoldaş Mirzəliyev, siyasi sayıqlığınızı nə üçün belə tez və asan itirdiniz?

– Siz buna nə ad verirsiniz, verin, ancaq mən başqa cür bir qərarı təsəvvürümə gətirmirəm!

Bu sözləri demək üçün gərək partiya vicdanını itirəsən

Partkom katibi mübahisənin söyüş və təhqirə çevrildiyini görüncə, karandaşını stola vura-vura yoldaşları sakitliyə çağırdı:

– Bəs sizin təklifiniz nədir, yoldaş direktor? – deyə soruşdu. – Nə şəxsi fikrinizi deyirsiniz, nə də başqalarının danışığına imkan verirsiniz...

Katibi üstələmək üçün elə bil direktorun əlinə gözəl bir fürsət düşdü. Mən onun bayaq dediyi bəzi orqanlarla artıq danışıb gəldiyini və müəyyən bir göstəriş aldığını açıq-aydın hiss eləyirdim. Ancaq o, heç bir adamın və idarənin adını çəkmədən, böyük bir auditoriya qarşısında nitq söyləyirmiş kimi dedi:

– Mən şəxsi rəy məfhumunun həm lüğəti, həm də fəlsəfi mənasını anlaya bilmirəm. Nədir şəxsi rəy? Mütəşəkkil bir kollektivin iradəsi ilə çalışan bir dövlətdə şəxsi rəyə malik olmaq xudpəsəndlik deyilmi? Burda söhbət Vətən müharibəsi cəbhəsində andını ayaqlamış, dövlətə xəyanət eləmiş bir adamın əyalından gedir. Bu cür hallarda hamımız

üçün məcburi bir qayda var: yalnız müqəssir özü yox, onun ailə üzvləri də cəzasız qalmasın gərək! Sovet orqanları Müdhət Aydının günahını təsdiq elədiyi halda biz buna hansı əsasa görə şübhə ilə baxa bilərik? Əgər mən buna şübhə eləsəm, tək özümün deyil, böyük bir institutun da adı ləkələnə bilər... Təklifim budur ki, Səmirə Aydın partiya sırasından çıxarılsın!..

Bu, təklifdən çox əmrə bənzəyirdi. Rima, Səmədovun dediklərindən qəzəblənib, söz istədi:

– Mən bilmirəm ki, direktor yoldaş hamımız üçün məcburi qayda deyəndə məhz nəyi nəzərdə tutur?

– Necə nəyi? Hər bir soldatın, hər bir zabitin andını! O şeyi ki, vuruşma cəbhəsində bir balaca ayağını əyri atsan, gərək səni divara söykəyib güllələyələr!.. – Direktor otağı başına götürdü: – Danışanda, hər sözünüzün məsuliyyətini hiss eləyin, canım... Bəlkə hərbi andın mənasını hələ də bilmirsiniz?

Rima onun təhdidlərindən qorxub geri çəkilmədi:

– Ola bilər, – dedi, – çünki nə mən özüm and içmişəm, nə də and içmiş ərim var. Bir dəqiqəliyə belə fərz eləyək ki, Müdhət Aydın günahkardır və ona verilən ağır cəza da ədalətlidir. Bu barədə mən mübahisə eləmək fikrində deyiləm. Mən Səmirə Aydından danışıram. Onun günahı nədir? Heç nə! O, ərinin hərəkətlərinə cavabdehdirmi? Yox? Müdhət Aydın neçə ildir cəbhədədir. Çox mümkündür ki, bu müddətdə onun xarakterində müəyyən dəyişiklik əmələ gəlib. Dünən müsbət bir insan kimi tanıdığım şəxs müəyyən hadisələrin təsirilə dəyişə bilərmi? Əlbəttə, dəyişə bilər. Sən onun xasiyyətində, vərdiş və adətlərində yaranan yeni cəhətləri görə bilmirsən, sən ona təsir göstərmək imkanından məhrumsan, çünki o, səndən uzaqdadır. Ərlə arvad bir damın altında yaşasaydı, hər gün bir-birilə görüşsəydi, burda qarşılıqlı məsuliyyətdən danışmaq olardı. Onlar bir birinin əhvali-ruhiyyəsində əmələ gələn mənfi halları görə bilərdilər və biri digərini pis yoldan qaytarardı. Mən inanıram ki, Səmirə Aydın möhkəm iradəli bir qadındır. Müdhəti yanlış hərəkətlərdən saqındırmağa qadirdir. Amma indiki halda o, belə bir imkandan məhrumdur. Deməli, biz ərin günahını arvadın boynuna yıxmağa haqlı deyilik. Mən Kabus Mirzəliyev yoldaşın fikrinə şərikəm: Səmirə Aydının səmimi ərizəsi nəzərə alınsın!..

Büro katibi çox danışmadı. Yalnız mənim lehimə səs verən yoldaşların rəyi ilə razılaşdığını bildirdi.

– Deməli, siz Səmirə Aydının partiyadan çıxarılmağıma tərəfdar deyilsiniz? – deyə direktor katibdən soruşdu və ondan "bəli" cavabını almağa bəndmiş kimi qəribə bir məmnunluqla gülümsündü. – Mən vaxtında xəbərdarlıq elədim. Bundan hamının qarşısında vicdanım təmizdir. Daha, deməyin ki, Səmədov şəxsi-qərəzlik elədi, bizi pis vəziyyətdə qoydu. Ancaq mən sözümün üstündə möhkəm dururam. Səmirə Aydın nəinki partiyada qala bilməz, hətta o, günü bu gün vəzifədən də azad olunmalıdır!

– Mən təklifləri səsə qoymuram. Görünür bunun üçün büro üzvlərinin hamısını çağırmaq lazım gələcək. Mən sabah onlardan bircə-bircə nə səbəbə iclasdan qaçmaqlarını öyrənərəm. Etiraz yoxdur ki?

Rima bu təkliflə razılaşmadı:

– Onlar sabah da gəlməyə bilərlər. Yaxşı olmazmı ki, ümumi iclasa keçirək, hamının rəyini öyrənək?

Direktor yenə adəti üzrə saçlarını daraya-daraya ayağa qaxdı, heç kəsə müraciət eləmədən dedi:

– Camaata nahaq zəhmət verirsiniz. Bu elə məsələdir ki, ümumi iclas Səmirə Aydını partiyada saxlamaq barədə bir səslə qərar çıxartsa da, raykom bu qərarı ləğv eləyəcək!

– Siz bunu hardan bilirsiniz, yoldaş Səmədov, yoxsa raykomla əvvəlcədən şərt kəsmisiniz? – Rimanın səsində həqiqəti öyrənmək istəyən adamdan çox, müarizinə açıqdan-açığa istehza eləyən bir adamın üstünlüyü duyulurdu.

Kabus Mirzəliyev hirsindən boğulurmuş kimi köynəyinin yaxalığını dartışdırdı, tutqunlaşmış səsi ilə direktorun üzünə bozardı:

– Əgər belədirsə, bəs nə üçün biz havayı-havayı danışdıq, yoldaş Səmədov? Birdəfəlik ərizəni raykoma yollayaq, qoy məsələ orda müzakirə olunsun də...

Direktor ikiəlli şişmiş qarnını sığalladı:

– Siz nahaq əsəbiləşirsiniz, yoldaş Mirzəliyev... Mən əsil həqiqəti deyirəm. Tələsmək də lazım deyil. İndi görərsiniz kim haqlıdır, mən, ya siz...

Katib də hirsini boğa bilməyib, səsini qaldırdı:

– Hər halda raykom da böyük bir kollektivin rəyi ilə hesablaşmaya bilməz!..

Mən direktordan gözümü çəkib, Rimaya dikdim. Baxışlarımla ona dedim ki: "Hə, indi gördünmü, katibimiz barədə sən nə qədər yanılmısan!"

– Demokratik mərkəziyyət prinsipini unutmayın!.. – deyə Səmədov şəhadət barmağını təkləyib, havada saxladı və katibə qorxu təlqin etmək istəyərək, durğun gözlərinə rəsmi və qəzəbli bir ifadə verdi.

– Belə hallarda yoldaşlar raykomda da tələsmirlər, məsləhətləşirlər, bəzən hətta şəxsən yoldaş Mollayevin öz fikrini soruşurlar.

Direktor Mollayevin adını çəkən kimi hamı başını aşağı salıb susdu. Mən yenə Rimaya baxdım. O da başını aşağı salmışdı. O da susurdu. Bu nə deməkdi? Nə olmuşdu? Mən hələ bir şey başa düşə bilmirdim. Sonralar hər şey aydın oldu. Demə, bizim direktorun özünün dediyi kimi, onun "şəxsən Mollayevlə haqq-salamı varmış" və heç vaxt, heç yerdə Mollayevin adını boş-boşuna dilinə gətirmirmiş. Bütün bunları büro iclasından bir həftə sonra, mən partiya biletimi təhvil verib qayıdanda, yolda Rimadan eşitdim.

## İMTAHAN GÜNLƏRİ BAŞLANIR...

Partbiletimi aldıqları zaman necə hönkürüb ağladığımı gizlətmək istəmirəm. Partiya sıralarından kənarda qaldığım on il müddətində bir dəqiqə, bəlkə də bir an mən özümü ondan ayrı təsəvvür eləməmişəm. Mən özüm istəsəm də, bunu bacarmazdım. Məni ona bağlayan mənəvi telləri qırmağa heç bir qərarın gücü çatmazdı...

Direktorumuz bu günün işini sabaha qoyan adamlardan deyildi. O, məni işdən çıxarmaqla qalmadı, mənzilimizi də boşaltmağa əmr elədi. Biz, vaxtı ilə, hələ Müdhətlə evlənməmişdən qayınanamın, Müdhətin və qaynım Faiqin yaşadığı zirzəmiyə köçdük. Bu rütubətli zirzəmidə yeraltı suların qarşısını almaq üçün vasitə arayıb-tapmaq arzusu məndə daha çox güclənməyə başladı...

Rima demək olar ki, hər gün bu zirzəmiyə gəlirdi; o, mənim üçün iş axtarırdı. Mən özüm isə heç kəsin üstünə getməyi lazım bilirdim. "Xalq düşməninin arvadına kim iş verər? – deyə fikirləşirdim.

Lakin iş verən tapıldı...

Məktəb yoldaşım Zəfər cəbhədən şikəst qayıtmışdı. Kimdənsə işsiz olduğumu öyrənən kimi, məni yanına çağırtdırdı. Rəis göndərildiyi idarəyə arxiv müdiri təyin elədi. Mən əvvəlcə "Çox sağ ol" deyib onun təklifindən boyun qaçırdım, qorxurdum ki, bundan ona ziyan dəyər.

Sözümə baxmadı. “Cəhənnəmə ki!” – dedi. Üç-dörd gün işə gəlmədim. Zəfər buna ayrı məna verdi:

– Bilirəm, arxiv müdirliyi sənə layiq vəzifə deyil, yer açılan kimi başqa bir işə keçirəcəyəm. Bir az səbir elə.

– Mən süpürgəçilik də eləyə bilərəm, – dedim, – ancaq istəmirəm sənə ziyan dəysin. Sən məndən bir yaş böyük olsan da, təcrübən məndən azdır. Bərkə-boşa düşməmisən. Adamlar yaman korlanıblar...

O, özü evimizə gəldi, israr elədi:

– Bunlar hamısı müvəqqəti şeylərdir. Müharibə dövrünün törətdiyi sərtlik gec-tez aradan qalxacaq. Sən mütləq bir yerdə çalışmalısan. Uşaqları acından öldürə bilməzsən ki?.. Mənim üçün nahaq bu qədər həyəcan keçirirsən...

Mən o günün sabahısı işə getdim. Arxiv, doğrudan da mənə layiq yer deyildi. Gündə bir-iki dənə köhnə sənədi arayıb-tapmaq və ya kağızları qayda ilə bir-birinin üstünə yığıb cildə vermək üçün böyük məharət tələb olunmurdu. Əlbəttə, mənə belə gəlirdi, çünki mən birdənbirə elmi işdən ayrılıb, yatanda yuxuma da girməyən təzə bir ixtisasla məşğul olacağımı ağlıma gətirməzdim. Lakin mən istəsəm də, istəməsəm də başımı aşağı salıb, bu can sıxan yarımqaranlıq otaqda saatlarımı saya-saya çörək pulu qazanmalıydım.

Bir gün Zəfər özü arxivə gəldi. Mənə ağzı bağlı bir zərf verdi: “Evdə açarsan” deyib getdi. Düşündüm ki, məni arxivdə saxlamaq mümkün olmadığını söyləməyə üzü gəlmir, bunu mənə məktub vasitəsilə bildirir. Doğrusu, konverti açmaqdan qorxurdum. Qorxurdum ki, ağlıma gələn başıma gəlsin...

Mən evə gələndə qayınanamla uşaqlar köməkləşib, zirzəmiyə dolmuş suyu vedrə ilə daşıyıb bayıra tökürdülər. Mən də onlara qoşuldum, gecə yarıya kimi əlləşdik. Su bir tərəfdən boşaldısa, o biri tərəfdən yenə sızılıb gəlir, döşəməni basırdı. Əskidən, cındadan nə vardısa, hamısını isladıb, nəhayət döşəməni qurutduq. Yorğan-döşəyimizi saldıq. Yorğun düşmüş qızlarım yerlərinə girən kimi gözlərini yumdular. Mən onları yatmış bilib, Zəfərin konvertini açdım. Qaranlıq bucağa çəkildim. Zərfdən bir parça kağız və iki min manat pul çıxdı. Zəfər, görünür məni utandırmamaq üçün, mənə deyiləsi sözlərini kağıza yazmışdı. “Əziz bacım! Qüruruna toxunmasın. Çətin günlərdə bir-birimizə əl tutmaq borcumuzdur”

Sən demə, böyük qızım yorğanın altından oğrun-oğrun baxırmış.

– Atam göndərib? – deyə o, məndən xəbər alanda mən səksəndim, kağızı da, pulları da gizlətmək istədim. Lakin artıq gec idi. Gözlərim doldu. Qızım yerindən sıçrayıb, məni qucaqladı:

– Atam nə yazır? – deyə israrla soruşdu və gözlərimin içinə baxdı.

Qayınanam da eyni sualı verdi. Mən uşaqlarıma heç vaxt yalan demirdim. Mışıltı ilə yatan Rəhiləni oyatmamaq üçün, əhvalatı açıb pıçıltı ilə onlara söylədim. Hər üçümüz susduq. Ağır ehtiyac içində olduğumuza baxmayaraq, heç birimiz sevinmirdik. Qayınanamla Kəmalənin nələr düşündüyünü bilmirəm, ancaq mən öz-özümə deyirdim ki, bu gündən sonra gözümüzü başqalarının əlinə dikəcəyik, ölmək bundan min pay yaxşıdır.

Kəmaləyə üz tutdum:

– Yat, qızım. – Səhər tezdən qalxacaqsan.

– Bəs sən? – deyə qızım qüssəli gözlərini mənə dikdi və hönkürüb ağlamamaq üçün məndən nə isə ürəkaçan bir söz eşitmək istədi. Ona nə deyə bilərdim? Mən də paltarımı soyundum. İstər-istəməz, açıq sinəmə və qollarıma baxdım: bir dəri, bir sümük qalmışdı. Qızımla yanaşı yerimə girdim, böyrümdə, stol üstündə yanan yaşıl abajurlu lampanı söndürdüm. İçəriyə zülmət kimi bir qaranlıq çökdü. Nə qədər yuxuya getmək istədimsə də, mümkün olmadı. Ürəyim daş kimi ağırlaşmışdı. Zəfərin pulunu geri qaytarmaq fikrində idim. Yaxşı tanıdığım məktəb yoldaşımın sədaqətinə də, səmimiyyətinə də zərrə qədər şübhəm yox idi. Amma o da böyük bir ailə sahibi idi. Səhərəcən gözüaçıq qaldım, yalnız bu barədə fikirləşdim... Qızlarımı məktəbə yola salıb, vaxtımdan yarım saat da əvvəl idarəyə gəldim. Süpürgəçidən başqa heç kim yox idi. Dəhlizdəki reproduktordan son xəbərləri oxuyan diktorun gümrah və şad səsi eşidilirdi. Cəbhə boyu genişlənən hücum, elə bil mənə aid deyildi. İndiyəcən bu qədər biganə olduğum heç yadıma gəlmirdi. Arxivin qapısını açdım. Burda eşələnmək mənim üçün çox ağırdı. Ancaq mən buna dözməliydim. Başqalarının əlinə göz dikməmək üçün bəlkə o süpürgəçi qadın kimi mən də vedrə götürüb, əski ilə döşəməni yumalı, pəncərənin şüşəsini təmizlənməli idim.

Zəfəri çox gözlədim. O da, tərs kimi, harasa iclasa çağırılmışdı. Günün ikinci yarısında qayıtdı. Mən onun kabinetinə girəndə, şöbə müdirlərini toplayıb, nə barədə isə danışırdı. Sözlərini ucdan-qulaqdan eşidirdim: “ müharibə qurtarır... Vaxtı ilə quyuları daşla doldurmuşduq

ki... cəbhə bizdən uzaqlaşır... İndi daha çox neft lazım olacaq...”. – O məni görəndə əli ilə oturmaq üçün yer göstərdi:

– Buyurun, mən bu saat iclası qurtarıram, – dedi.

Doğrudan çox danışmadılar. Şöbə müdirləri idarə rəisinin qısa və aydın sözlərindən razılıq eləyə-eləyə dağılışdılar. Onların hamısı çıxıb gedəndən sonra mən zərfi çantamdan çıxarıb özünə qaytardım:

– Çox sağ ol, Zəfər, – dedim. – Axı mən bilirəm, sənin də ailən ehtiyac içindədir...

Onun rəngi qaraldı. Əvvəlcə hətta bir qədər özünü itirən kimi oldu. Deyəsən məndən bu cür bir hərəkəti gözləmirdi. Zərfin o üzünə-bu üzünə baxıb, yenə mənə tərəf uzatdı:

– Götür, Səmirə, – dedi. – Nə üçün mənim xətrimə dəyirsən? Mən pulu bütün ailəmin qərarı ilə... götür-götür... Əslinə baxsan, bizim Tövsiyə xanım israr elədi. Dedi mən də anayam, yaxşı bilirəm iki uşağı yedirib-geyindirmək nə deyən sözdür. İstəyirsən, telefon elə, soruş. Al, bu da nömrəmiz... – O, kalendarın vərəqlərindən birini qopardıb, ev telefonunun nömrəsini yazdı. – Al, özün Tövsiyədən soruş. Mən ondan gizlin iş görmürəm. – Zəfər uşaq sadəliyi ilə gülümsədi, alt çənəsindəki qızıl dişi göründü. – Arvaddan qorxmayan kafirdir...

Tövsiyə ilə yaxından tanış deyildim, amma tərifini çox eşitmişdim: “Zəfərə layiq qadındır. Gül kimi uşaqları var. Hamısını da gözəl tərbiyə eləyib...”

Mən zərfi götürmədən çıxıb getmək fikri ilə qapıya sarı yönələndə, arxadan Zəfərin incik və azca tutqunlaşmış səsini eşitdim:

– Borc verirəm, Səmirə... Axı, mən Müdhətə inanıram!..

Ayaq saxlamağa məcbur oldum. Dönüb Zəfərə baxdım. O, inamla başını qaldırıb-saldı.

– Bəli, bəli, inanıram!.. – deyə bir az da ucadan təkrar elədi. – Ola bilsin ki, inanmayanların sayı çoxdur, ancaq mən inanıram. Özü də lap möhkəm!..

Bu sözlər mənim nəzərimdə ən böyük mükafatdı. Qəribə idi ki, o, elə bil kiminsə acığına, qəsdən ucadan danışırdı. Sanki hər bir kəlməsini, qapı dalında durub onu pusan və hara isə, kimə isə xəbər aparmağa hazır dayanmış bir bədxaha eşitdirmək istəyirdi.

– Zəfər, – dedim,-mən Müdhətə özümdən də çox inanıram. Bilirəm ki, o, əsil həqiqəti məndən gizlətməz. Məktubunda yazıb ki, müqəs-

sir deyiləm, uşaqlarımın üzünə şax baxa bilərəm, ancaq daha məni gözləməyin...

Bu dəfə Zəfər stolunun dalından çıxıb, əlində zərf, mənə tərəf gəldi. Mənim dediklərimdən necə xoşhal olduğunu hiss eləyirdim. Rəngi birdən-birə açıldı. Baxışları duruldu.

– Deməli hər ikimiz inanırıq, – dedi. – Çünki ikimizin də vicdanımız təmizdir. – O, elə bil məni hipnoz elədi. Birdən zərfi əlimdə gördüm. Qaytarmağa iradəm çatmadı. Zəfər, fikrimdən dönə biləcəyimi görüb, qəribə bir çevikliklə məndən aralandı. – Bilirsənmi, nə üçün Müdhətə inanıram? Mən deyim, sən qulaq as. Onların hissəsi mühasirəyə düşənə qədər biz eyni cəbhədə, eyni diviziyada idik. Mənim köhnə tanışlarımdan, hətta inandığım adamlardan dönüklük eləyib könüllü əsir düşənlər də oldu. Sən demə bu xəbislər üzdə bir, içəridə tamam başqa adamlarmış. Elələri də vardı ki, faşistlərin tərəfinə keçəndən sonra radio ilə çıxış eləyib bizi də xəyanət yoluna çağırırdılar. Əgər onlardan birini “dil” kimi oğurlayıb gətirdə bilsəydim, soldatların gözü qabağında tərəddüdsüz güllələrdim. Lap öz əlimlə... Ancaq Müdhət... Yox, Səmirə, o, necə dara düşür-düşsün, xəyanət eləyə bilməzdi. Mən onun özünün də, batalyonunun da necə vuruşduğunu az görməmişdim. Hitlerçilər radio ilə tez-tez onu da, komissarını da hədələyib deyirdilər ki, əgər diri-diri əlimizə düşsəniz, boğazınızdan yox, ayağınızdan asacayıq, çünki bizim təslim olmaq təklifimizə hər dəfə yaylım atəşi ilə cavab verirsiniz...

Mən Zəfəri dilindən daha çox tərif eşitmək üçün onun mühakimələrində guya ziddiyyət olduğunu söylədim:

– Bəlkə o da sənin inandığın adamlar kimi sonralar dönüklük eləyib?

– Yox, Səmirə!.. – deyə Zəfər az qala qışqırdı. – Əgər belə olsaydı, ən geci bir gündən sonra Müdhəti də radio ilə danışdırardılar, mütləq danışdırardılar. Xainlərin çoxusu öz canını bu yolla qurtarırdı.

Daxili bir qürur hissinin təsiri ilə məndə həm Zəfərin, həm də bütün idarə əməkdaşlarının üzünə dik baxmaq arzusu oyanırdı. Uşaqlarımın da, özümün də vəziyyətimi unudub, Zəfərin hədiyyəsini təkrar geri qaytarmaq istəyəndə o, sir-sifətini necə turşutdusa, mən istər-istəməz fikrimdən daşındım.

– Axı, bilirəm, – dedi, – evində hər şeyi satmısan, hətta paltar-palazını da... Heç olmasa, müvəqqəti bir mənzil tutarsan. O gün evinizi gördüm. Hamınız yel azarına tutulacaqsınız. Uşaqları bu yaşından şikəst eləmək istəyirsən?

Mən heç bir söz deməyib çıxdım. Zəfərin necə qorxulu bir addım atdığını görmək üçün o qədər də böyük fərasət lazım deyildi. Mən düşünən kimi də oldu. Bu hadisədən iki həftə belə keçməmiş, Zəfərin yaxın dostlarından, şöbə müdiri İldırım, arxivdən köhnə bir sənədi almaq üçün mənim yanıma gələndə, heç kəsə bildirməmək şərtilə mənə xəbər verdi ki, "Hardansa, Zəfərə telefon eləmişdilər. Sizin barənizdə danışırdılar. Söhbət çox uzun çəkdi. Zəfər yaman əsəbiləşib özündən çıxmışdı. Deyirdi ki, "Siz Səmirə Aydını şübhəli adam sayırsınız, amma mən saymıram. Müdhət Aydın öz hərəkətlərinə özü cavabdehdir, arvadı yox. Əslinə baxsanız, hələ Müdhətin özünün də günahkar olduğuna inanmıram. Cəbhədə də sizin kimi hər şeyə hərbi nizamnamənin mahiyyətinə görə yox, hərflərinə görə yanaşan küt adamlar az deyil. Onların fikrincə əsgər və ya zabit əsir düşdüsə, deməli xaindir. Amma müharibədə min cür təsadüf ola bilər. Əsir düşənlər içərisində səndən də, məndən də sadiq oğlanlar var. Xahiş eləyirəm, qışqırmayın. Kommunist yalnız siz deyilsiniz və bu adı heç kim sizin inhisarınıza verməyib..." Səmirə xanım, doğrusu, bu günəcən mən Zəfəri belə bilmirdim. Ona həm yazığım gəldi, həm də acığım tutdu. Axı, belə ağır bir zəmanədə böyüklərlə bu cür höcətləşmək ancaq ziyan gətirə bilər...

İldırım tez-tez qapıya sarı boylanır, az qala pıçıltı ilə danışırdı. O, arxivdən çıxan kimi, mən ərizə yazıb apardım və Zəfərdən cavab almamış işdən yarımçıq çıxıb evə getdim.

Axşamüstü Zəfər Tövsiyə ilə bizə gəldi. Məktəb yoldaşımın arvadı özündən iki daban hündür idi. Dolğun, qarabuğdayı və gülərüz bir qadındı. Məzəli bir söz deyəndə hamıdan əvvəl özü gülürdü və güldükcə də yoğun bədəni ləngər vururdu. Biz çox tez dostlaşdıq. Mənimlə çox ərklə danışırdı və onun bu səmimiyyəti mənim ürəyimdəndi:

– Zəfərdən tərifinizi çox eşitmişəm, – deyirdi. – İnanın ki, mən sizi ondan da çox bəyəndim.

Zəfərlə onun mehribanlığı ilk dəqiqələrdən məndə qibtə hissi oyatdı. Zəfər danışır, Tövsiyə gülür, Tövsiyə deyir, Zəfər gülürdü. Əgər Zəfəri yaxşı tanımasaydım, ərlə-arvadın bu hərəkəti mənə toxuna bilərdi. Orta məktəbdə oxuduğumuz vaxtdan Zəfəri hamımız zarafatcıl bir oğlan kimi tanıyırdıq. Onun bir o qədər də məzəli olmayan sözlərinə belə şaqqanaq çəkib gülməyə adət eləmişdik. Amma, görünür, ərlə-arvad əvvəlcədən aralarında şərt bağlamışdılar: vəziyyətimizin ağırlığını bizə mütləq unutdurmalıydılar. Yaxşı ki, qayınanam dəhlizdə

çay dəmləyir, onları dinləməyə imkan tapmırdı. Yoxsa özünü saxlaya bilməz, Zəfərə acı bir söz deyərdi. Müdhətdən az istəmədiyi və həmişə bu daxmaya gəlib-gedəndə tikəsini bölüşdüyü Zəfərin bu cür aramsız danışıb-gülməyi və uşaqlıq dostu Müdhətin acı taleyindən kədərlənməməyi, qayınanama çox yer eləyə bilərdi. Hər bir dəqiqə Bədirnisa xalanın içəri girəcəyindən qorxurdum. Müdhətin ömürlük sürgünə göndərildiyini biləndən sonra arvad şam kimi əriyirdi. Yemək-içmək nə olduğunu bilmir, yatanda çox vaxt altına döşək də salmırdı. Yavaşcadan, dodağının altında eyni sözləri hey təkrar eləyirdi: “Anan ölsün, ay oğul...”

Mən ondan beləcə quru yerdə yatmağının səbəbini soruşmurdum. Onsuz da aydındı ki, hardasa bu cür quru torpaqda soyuqdan tir-tir əsə-əsə uzanıb yatan ilk beşiyinin taleyini düşünür, özü də onun kimi əziyyət çəkmək istəyirdi. Mən bunu Zəfərlə Tövsiyəyə deyəndə, onlar susub qapıya sarı boylandılar.

Oturmağa boş stulumuz olmadığından, qızlarım ayaq üstündə durub, yeganə pəncərəmizə söykənmişdilər. Bu vaxt onlar, adətən yemək stolunun dalında qabaq-qabağa oturub səssizcə dərslərini hazırladılar. İndi mən yaxşı bilirdim ki, qızlarımın heç biri qonaqların gəlişinə sevinmirdi. Xüsusən ilk beşiyim Kəmalə birinci sinifdən əlaçı oxuduğu üçün, müəllimlərinə zəif cavab verməyi şəninə sığışdırmırdı. Bir dəfə də beləcə, qonaqların təqsiri üzündən dərsini hazırlaya bilməmişdi. Ana dili müəlliminin “Kəmalə, qızım, sənə nə olub, şeri niyə əzbərləməmisən?” sözlərini eşidən kimi əlləri ilə üzünü qapayıb hönkürtü ilə ağlamışdı. Mən bu əhvalatı Kəmalənin özündən yox, həmin məktəbdə dərs deyən müəllim dostumdan eşidib Kəmaləyə deyəndə, qız əvvəlcə boynuna almamışdı, ancaq sonralar durub-oturub gileylənirdi: “Yəqin qonaqlarımızın məktəbdə oxuyan uşağı yoxdur”. İndi hiss eləyirdim ki, o, dəqiqələri sayır və əsəbiləşir.

Hələ şər qarışmadığı halda, biz içəridə bir-birimizi yaxşı görə bilmirdik. Mən qalxıb işığı yandırdım. Tövsiyə elə bil məni sevindirmək üçün şad bir xəbər söyləməyə ehtiyac duydu. Gicgahlarına tökülmüş qara və dalğalı saçlarını ikiəlli geriyə sığallayıb gülümsəyə-gülümsəyə dedi:

– Zəfər haqlı imiş, burda uşaqlar dərs oxuya bilməzlər. Yaxşı eləyib ki, sizə ayrı mənzil axtarıb tapıb!

Bu sözlərdən Kəmalə diksinmiş kimi mənim üzümə baxdı. Gözlərindən “sevinim, sevinməyim?” sualı oxunurdu. Mənim sevinmədiyimi,

əksinə bir qədər də tutulduğumu görəndə, eynən mənim qaşlarıma bənzəyən qalın və sıx qaşları çatıldı. O, kövrəldi, ağladığını qonaqlar bilməsin deyə otaqdan çıxdı. O biri qızım Rəhilə isə əlini əlinə vurub üstümə atıldı:

– Ay ana!.. – deyib məni qucaqladı.

Mən onu məyus eləməmək üçün dinmədim. Tövsiyə isə mənim ürəyimdən axan qara qanları görmürdü. Amma Zəfər uzun illərin tanışlığı sayəsində, mənim necə ağır bir hal keçirdiyimi duymaya bilməzdi. O dedi:

– Biz sənə firavan həyat vəd eləmirik. Səmirə... Uşaqların gələcəyi naminə... Bəs dost-dosta nə gündə lazım olacaq? Axı, uşaqların...

Mən onun sözünü kəsdim:

– Çox sağ olun... Ancaq bunun sonrasından qorxuram.

Tövsiyə, görünür, mənim sözlərimin mənasını anlaya bilmirdi. Gözlərini gah zəfərə, gah də mənə dikib çiyinlərini çəkir, bununla da demək istəyirdi ki, burda qorxulu nə ola bilər? Düşündüm ki, yəqin ev və ailə məsələlərinə başı qarışdığı üçün dünyadan xəbərsizdir, bilmir ki, dünən gözləri üstündə saxladıqları, “orda oturma, burda otur” deyə ehtiram göstərdikləri bir adamı gözdən salmaq üçün o qədər də ciddi bir səbəb lazım deyil.

Mən onu başa salman istədim:

– İndi vəziyyət başqadır. Əlbəttə, heç bir kəsi qınamaq olmaz. Sən, mən Müdhəti tanıyırıq, amma tanımayanlar da var axı... Bəlkə zəfər sənin qanını qaraltmamaq üçün heç nə deməyim.?.. Arxiv nədir ki, məni orda işə düzəltdiyinə görə, böyüklərdən hansısa ona dişinin dibindən gələni deyib... Axı, mən də gərək onu zərbə altında qoymayam... Bizim üçün ev düzəltdiyindən xəbər tutsalar, o saat çək-çevirə salacaqlar.

Ancaq Zəfər o qədər də ümidsiz deyildi.

– Nahaq ümumiləşdirirsən, Səmirə, sənin sözündən belə çıxır ki, bu boyda şəhərdə hamı bizim bədxahımızdır. Elə deyil axı, Səmirə xanım, – deyib mənim sözlərimdən məyus olmaq əvəzinə, qayğısız bir təbəssümlə başını buladı, yalnız məsul işçilərin çəkdiyi uzun müştüklü papirosunu damağına qoyub tapança çaxmaqla yandırdı, birinci qullabdan sonra qalxıb dəhlizə çıxdı; otağın havasını korlamaq istəmirdi.

Tövsiyə yəqin ki, ərinin fikrini söyləyərək, intim bir əda ilə yalnız ürək dostlarına məxsus səmimi bir etimadla dedi:

Səmirə bacı, nahaq ərizə vermisiniz. Zəfərin heç nədən qorxusu yoxdur. Dünən lap yuxarıdan biri telefon eləyibmiş, lap respublikanın sahibi Mollayevin adından danışırmış. Zəfəri də istəməyənlər var. O saat əllərinə bəhanə düşüb. Ancaq Zəfərin dostları da var. Zəfər nədən qorxacaq ki? Cəbhədən yeni qayıdıb... Güllədən bədəni deşik-deşik olub. Özün ki, yaxşı bilirsən, allaha şükür, indi dövran bunlarındır...

Arabir uşaqlar qapını açıb-örtdükcə, qaranlıq dəhlizdə Zəfərin papirosu işıldayıb sönürdü: Tövsiyə mənə dediklərini ondan gizlətmək istəmirdi:

– Təzə evə köçərsiniz, – deyirdi, – Zəfər adresi yazıb verdi, özüm də gedib baxdım. Əlbəttə, sizə layiq mənzil deyil, yaxşı mətbəxi, vanna otağı yoxdur, ancaq heç olmasa genişdir, bura nisbətən işıqlıdır. Burda qalsanız, çox əziyyət çəkəcəksiniz. Görürəm ki, uşaqların dərs hazırlamağı üçün şərait yoxdur.

Tövsiyə ayağa qalxdı:

– Yavaş-yavaş gedək, biz olmayanda uşaqlar yatmırlar, əllərinə bəhanə düşür, qulluqçunun sözünə baxmırlar. – O, qapıya sarı yönəldi. Zəfər papirosunun köyünü harasa tullayıb içəri girmək istəyirdi ki, arvadı ilə üz-üzə gəldi.

Tövsiyə dedi:

– A kişi, qızların dərsinə mane olmayaq...

Mən onların nahaq tələsdiklərini söyləməyə imkan tapmadım. Bu halda qayınanam göründü:

– Hara, ay oğul? Çay-çörək düzəltmişəm, – dedi və ərklə Zəfərin qolundan tutub, dalınca içəriyə gətirdi. – Deyirsən yəni o qədər kasıb olduq ki, bir stəkan çayımız da olmadı? Baxma, Bədirnisanın evində hələ heç kim acından ölməyib...

Zəfər müti bir uşaq kimi, ona müqavimət göstərmədən, yemək stoluna qədər gəldi və bayaq oturduğu stula əyləşdi:

– Bax, Tövsiyə, – dedi, – anamın sözündən çıxa billəm, amma Bədirnisə xalanın hər əmri mənim üçün qanundur. Otur, otur, əgər onun çayını içməsək, haqlı olaraq deyəcək ki, "ac günlərin nə tez yadından çıxdı?".

Qızım Rəhilə gah mənə, gah da Zəfərlə Tövsiyəyə baxır, onların tutduğu mənzildən imtina elədiyimə təəssüfləndiyini gizlətmir və məndən ayrı bir söz gözləyirdi. Gözləyirdi ki, "Yaxşı" deyib razılığımı bildirim.

Qayınanam çay-çörək gətirəndən sonra mənzil söhbəti təzədən başlandı. Zəfər dedi:

– Salaməleykümü kəsərəm, ha... Zarafatsız. Günü sabah köçəcəksiniz... Yox, yox, etiraz qəbul olunmur...

Rəhilənin gözlərində sevinc yaşları parıldayırdı. Deyəsən artıq mənim razılıq verməkdən başqa çarəm qalmadığını hiss eləmişdi.

Zəfər çaydan bir qurtum içib, qayqanaqdan bir çəngəl götürdü. İştahası olmaya-olmaya yediyini, yalnız Bədirnisa xalanın könlünü sındırmamaq üçün ağız tərpətdiyini duyurdum. Bu halda Kəmalə də içəri girdi. Üz-gözünü yumuşdu. Amma harasa qısılıb ağladığından yanaqları, dodaqları şişmişdi. Rəhilə onu dümsükləyib qulağına nə isə pıçıldayanda, o, narazı halda bacısını yavaşcadan kənara itələdi.

Zəfər isə sözünə ara vermədən deyirdi:

– Hər ağızdan bir avaz gəlir. Əgər onların hamısına qulaq assan, gərək onda hər gün yox, hər saat fikrini dəyişəsən... Bu da ki, özün bilirsən, mənim qanun kitabıma düz gəlməz. Ən uzağı o olacaq ki, tutub işdən çıxaracaqlar.

– Elə sən uşaqlıqdan köntöyün biri idin, – deyə Bədirnisa xala aradan bir söz atdı və köksünü ötürdü... – Anası ölmüş də sənin kimi bildiyini heç kəsə verən deyil...

– Hə, işdən çıxartdılar, üstündən də kök bir töhmət verdilər, sonra? – deyə Zəfər daha da ucadan soruşdu. Mən ona bir söz demədim, yalnız bunu düşündüm ki, "sonra çox şey ola bilər. Mollayevə çatdırarlar, o da ki, siyasi sayıqlığını itirdiyinə görə, xalq düşməninin ailəsini müdafiə elədiyinə görə səni partiyadan çıxartdılar".

– Sonra? – Zəfər inadla gözlərimin içinə baxdı, bir qurtum da çay içdi. Kirpiklərini qırpmadan təkrar elədi: – Hə, niyə dinmirsən? Sonra?

Nəhayət mən dözmədim:

– Axı, sən uşaq deyilsən, Zəfər. Bu saat adamların enməyi qalxmağından çox-çox asandır!

Bu dəfə Zəfər hiddətini də gizlətmədi:

– Deyək ki, məni hər yerdən çıxartdılar. Lap Müdhət kimi sürgünə yolladılar. Sonra? Sözün açığı mən səni yaxşı başa düşə bilmirəm, Səmirə, axı bu fikir sənin başına hardan gəlib? Kim ki, sənə rəğbət bəsləyir, demək mütləq cəzalanmalıdır?

– Bizim institutda partkom vardı, Əkbərov, – deyə mən cavab verdim, – o da mənə rəğbət bəsləyirdi, Zəfər.

– Nə olsun ki, işdən qovdular?

– Yox, qovmadılar, ancaq möhkəmcə qulaqburması veriblər. Üç-dörd gün bundan qabaq Rima yanıma gəlmişdi, mənim rəfiqəm. O dedi ki, Mollayev özü telefonu götürüb zəng vurub, Əkbərova möhkəm təpinib. Açığı, qorxuram, Zəfər, qorxuram. Çatdıralar.

– Nahaq yerə mübaliğə eləyirsən, Səmirə. Mollayevin dərdi mən deyiləm ki!

Daha heç birimiz dinmədik. Zəfər stəkanını götürüb, soyumuş çayını dibə qədər başına çəkdi. Qayğanağı özündən aralayıb, yaylıqla dodağını silib ayağa qalxdı:

– Arvad, dur gedək. Bir az da otursaq, Səmirə, axırda məni vətən xaini kim dar ağacından asdıracaq...

O, özünə xas olmayan çılğın bir səslə qəhqəhə çəkdi. Mən hiss elədim ki, o bizim söhbətimizdən şad olduğu üçün yox, mənim həyəcanımdan əsəbiləşdiyi üçün gülür...

Onlar getdilər. Nə isə çox kədərli, ağır və üzücü bir sükut dar otağımızı buz kimi soyutdu. Canımdan üşütmə keçdi. Mənim ürəyimi üzən əndişə bəlkə qadın təbiətinin zəifliyindən doğan bir haldı? Bəlkə bu, həm özümün, həm də Zəfərin vəziyyətini olduğundan qat-qat ağır təsəvvür eləməyimin nəticəsi idi?

Kəmalə bizim söhbətimizin əvvəlini dinləməsə də, hər şeyi başa düşmüşdü. Gözlərini yuxarı qaldırıb, üzümə baxmaqdan belə çəkinirdi. Kitabını, qələm-kağızını götürüb, küncə çəkildi. Vərəqləri səssizcə aralayıb, başını aşağı dikdi, amma açıq-aydın hiss eləyirdim ki, qulağı məndədir, pisdən-yaxşıdan bir söz eşitmək istəyir. Mən dinməyəndə özünü saxlaya bilməyib soruşdu:

– Ana, razı oldun, olmadın? – Cavab almamış, ürəyindən keçənləri açıb söylədi: – Ana, Zəfər dayı atamın əsil dostudur, elə deyilmi?

Mən başımı tərpədir, onunla razılaşdım. Qız köksünü ötürdü:

– Dünyada mənim bircə arzum var: beləcə bir dostum olaydı!..

Qayınanam Kəmaləni çox istədiyindən, onun ən adi sözlərindən də xoşhal olurdu, amma bu dəfə o qədər sevinmədi. Mənə elə gəldi ki, hətta Zəfər kimi bir dostumuzun kölgəsində firavan dolanmağımızı özümüzün bu qaranlıq və rütubətli zirzəmimizdə sıxıntı ilə yaşamağımızdan üstün tutmurdu. Əlbəttə o, Zəfərin də, Tövsiyənin də bizə bu cür qayğı göstərib canıyananlıq eləməyindən narazı deyildi, bəlkə hətta ürəyinin dərinliklərində onun sədaqətini təqdir eləyirdi, belə çətin

günlərdə bizə kömək əli uzatmağını və ən çox da Müdhətin günahsız olduğuna inanmağını bəyənirdi, ancaq mən yaxşı anlayırdım ki, qarının fikrincə, Müdhət, hardasa, evindən, eşiyindən, arvad-uşağından uzaqda min cür əzab-əziyyətə qatlaşdığı üçün, biz də onun yolunu məhz belə ağır vəziyyətə dözə-dözə gözləməliyik.

Qarı mənə və nəvələrinə bu barədə bir söz deməsə də aramsız olaraq düşünürdü, xüsusən gecələr tez-tez ah-uf eləməyindən bunu bilmək çətin deyildi. İndi mən neyləməliydim? Başqa mənzilə köçməliydim, yoxsa Zəfərə rədd cavabı verməliydim? Bunu fikirləşirdim ki, Rəhilə dilləndi:

– Görəsən, təzə evimizin həyəti varmı?

Kəmalə bacısının üzünə istehza ilə baxdı, bu sualdan "Həyətdə uşaqlar da varmı? – deyə soruşacağını tək o yox, mən də gözləyirdim. Rəhilə dərsdən çox yaşıdları ilə oynamağı xoşlayırdı.

Kəmalə dedi:

– Biz nə haydayıq, bu nə haydadır...

Bədirnisa xala Rəhilənin yerini saldı, soyuq qayğanaqdan bir parça qopardıb, çörəyin arasında ona verdi. Rəhilə şam yeməyini həris bir iştahla gəvələyə-gəvələyə soruşdu:

– Ana, köçürük, köçmürük?

– Qoymaz ki, dərsimizi oxuyaq! – deyə Kəmalə dəftər-kitabını zərblə dizinə çırparaq, bacısına acıqlandı. Ortalığa yenə sükut çökdü...

O günün sabahısı Zəfərin göndərdiyi böyük yük maşını gəldi. Uşaqları məktəbə yenicə yola salmışdım. Qayınanamla qabaq-qabağa oturub, yavan çörəklə acı çay içirdim. Pendirimiz dünəndən qurtarmışdı. Qənd üzünə də həsrət idik. Ancaq bu, nə məni, nə də qayınanamı kədərləndirirdi. "Elnən gələn qara gün toy-bayramdır" məsəlini təkcə Bədirnisa xala yox, mən də təkrar eləyirdim, özümə də, uşaqlara da təsəlli verirdim. Hər gün, hər saat, bəlkə hər dəqiqə bizi düşündürən yalnız Müdhətin taleyi idi. Bədirnisa xala hamımızdan dözümlü idi. Təkdənbir Müdhət barəsindi nə isə deməyə məcbur olsaydım, o dərhal araya söz qatırdı: "Eh, qızım, igidin başı qalda gərək!". Belə deyirdi və dərdini ürəyində gizlədirdi. Köksünü səssizcə ötürməyə adət eləmişdi. Ancaq, görünür, onu bilmirdi ki, indi mən əvvəlki Səmirə deyildim, üzdən nə qədər biganə görünməyi bacarsam da, onun ən cüzi hərəkətlərini belə gözümdən qaçırmırdım. Müdhətlə birgə keçən qayğısız həyat yalnız uzaq bir xatirə kimi yadıma düşürdü.

Yük maşınının şoferi bir nəfərlə içəri girdi. Ehtiramla salam verdi:

– Bacı, nəyi aparacaqsınızsa, göstərin, daşıyaq, – deyib məndən cavab gözlədi.

Qayınanam tutuldu. Tikəsi boğazında ilişib qalda. Demək mən dünənki təxminimdə yanılmamışdım: bizim köçməyimiz ürəyindən deyildi. O, indi mənim üzümə baxmırdı. İncikliyini büruzə verməkdən də çəkinmirdi. Axı mən də onun razılığı olmadan təzə mənzilə köçmək istəmirdim.

– Xala, – dedim, – elə zənn eləmə ki, mən də, uşaqlar da çox sevinirik. Əgər məsləhət görmürsənsə, yerimizdən tərpənməyək... İndiyə kimi necə, bundan sonra da elə... Qəhərdən səsim qırıldı. (Son günlərdə bu, tez-tez təkrar olunduğu üçün özümdən çox narazı idim!). O dinmədi. Yemək stolunun üstündəki qabı-qaşığı, stəkan-nəlbəkini yığıb mətbəxə apardı.

Mən odla su arasında qalmışdım. Məni şofer tərəddüddən qurtardı:

– Nəyi aparacaqsınızsa, göstərin, bacı!..

– Bir az səbir eləyin, qayınanamın xətrinə dəymək olmaz, – deyib, Bədirnisa xalanı səslədim, ondan cavab çıxmadığını görüb dəhlizə yönəldim. Doğrusu, onu bu cür qəmgin görəcəyimi ağlıma belə gətirməzdim. Bildiyiniz kimi o, qadın olsa da, təbiətcə zəif adam deyildi. İndi onun səssizcə ağlamağı məni sarsıtdı. Ona ürək-dirək vermək üçün tutarlı söz tapmadım. “Əgər köçməyimizə razı deyilsənsə, dünən açığını deyəydin, Zəfər özü də eşidəydi. Hələ indi də gec deyil. Hər şey bizdən asılıdır. Zəfərə xəbər yollayıb köçmək fikrindən daşındığımızı bildirmək nə çətin işdir ki?”. – Mən bunu fikirləşə-fikirləşə arxadan qayınanamın arıq çiyinlərini iki əlli qucaqladım:

– Xala, – dedim, – inan ki, mən özüm üçün yox, nəvələrinin xətrinə razı oldum. Əgər sən razılıq verməsən, bu saat şoferi geri yollaram...

Arvad önlüyünün ətəyi ilə gözünün yaşını sildi, üzünü mənə çevirdi:

– Yox, qızım, siz köçün, – dedi. – Mən cəhənnəm, qoy uşaqlar əziyyət çəkməsin, dərsdən qalıb bədbəxt olmasınlar.

– Bu nə sözdür, xala, – dedim. – Bizi özündən niyə ayırırsan? Köçürüksə, hamımız köçək, bir-birimizə hayan olaq...

Bədirnisa xala başını buladı:

– Yox, qızım, – dedi. – Uşaqlarnan sən köç. Doğru sözümdür. İşdir, qəzadır, indi ki, biznən belə başlayıblar, qorxuram axırdı Əli aşından da olaq, Vəli aşından da...

Mən onun bu sözlərini başa düşə bilmirdim. Əgər o, get-gedə vəziyyətimizin daha da ağırlaşacağını nəzərdə tuturdusa da, daha bundan artıq bizə neyliyə bilərdilər?

– Xala, – dedim, – qaradan pis rəng yoxdur! Hər şeyi gözümün altına almışam. Nə olar, olar!..

Mən doğrudan da hər növ məhrumiyyətə dözməyə hazırdım. Ancaq buna baxmayaraq, hələ də ümüdimi itirməmişdim. Bədirnisa xalanın necə haqlı olduğunu yalnız sonralar başa düşdüm. Kim bilir, bəlkə də o, bizim başımıza nə bəlalar gələcəyini o vaxt hələ təsəvvürünə gətirmirdi. Müdhət kimi sədaqət timsalını "vətən xaini" adı ilə damğalayan adamların etibarına inanmamağa onun haqqı vardı...

Mənim dinib-danışmadan cavab gözlədiyimi yalnız indicə duymuş kimi qayınanam ağlamaqdan qıpqırmızı olmuş gözlərini qaldırıb qəti dedi:

– Köçün, qızım!.. Fikirləşib görürəm ki, Zəfər barədə zənnim yanılmayıb... Deyir: "İgid odur, atdan düşə – atlana, igid odur, hər cəfaya qatlanı". Dünən bazara göyərti almağa getmişdim. Müdhətin yoldaşı Mikayıla rast gəldim. Məni görən kimi yoxa çəkildi... Allahın salamını da verməkdən qorxdu... Zəfər hara, belələri hara? Bir halda ki, yaman gündə sənə kömək əli uzadıb, ev tutub, köçməsən xətrinə dəyər... Siz köçün, əgər sonra bir şey olsa, mən burda, otaq burda, qayıdıb gələrsiniz!..

Mən şoferlə bərabər gəlmiş adamın qapı ağzında, üzü bəriyə dayandığını və tez-tez mənə sarı baxdığını duyurdum. O, arabir şoferə nə isə deyirdi. Bizim köçüb-köçməmək barədə əvvəlcədən fikirləşməməyimizdən narazılıq elədiyi hiss olunurdu. Mən onu ilk dəfə görürdüm. Qaraşın sifəti, iri durğun, şüşə kimi soyuq gözləri vardı. Kim və nəçi olduğunu bilmirdim, hərəkət və davranışında nə isə bir təkəbbür vardı. O, qızıl saat bağlanmış yoğun qolu ilə birdən havanı yarıb, geniş addımlarla küçə qapısına doğru yönəldi və gedə-gedə şoferi də çağırdı:

– Bəri gəl, adə, bəri gəl!.. İşdən-gücdən avara oluruq. Görünür adam ələ salıblar. Qoy əvvəlcə fikirləşsinlər. İstəməsələr, nə çoxdur müştəri, göydə götürəcəklər!

Qayınanam da onun sözlərini eşidirdi. Mənim böyrümdən adlayıb ona dayanmaq işarəsi verdi və küsüb gedən bir tanışını sülhə çağırırmış kimi səsləndi:

– Ay oğul, bir ayaq saxla! Acığın niyə tutur daha? Sənə güldən ağır bir söz deyən ki, yoxdur. Bir azca səbrini bas, bu dəqiqə şey-şüyü yığışdıraq, aparın!

Şofer onun qolundan tutub geriyə çəkdi:

– Mən sabah burda olmayacağam, – dedi. – Rayondan ORS üçün Mədrəsə çaxırı gətirməyə gedəcəyəm...

Qayınanamla mən köməkləşib yorğan-döşəyimizi, qab-qacağımızı, uşaqların pal-paltarını yığdığımız köhnə çamadanları tez-tələsik gətirib, şoferə və onunla gələn oğlana verdik, onlar da aparıb maşına doldurdular.

Vaxtı ilə, xoşbəxt günlərimizdə alınan mebellərimiz, paltar dolabımız, servant və servizlərimiz çoxdan satılmışdı. Mən şoferlə kabinədə yanaşı oturub təzə mənzilə yola düşəndə qədim atalar sözünü xatırladım: "Dərziyə köç dedilər, iynəsini yaxasına sancdı".

Şoferlə gələn qaraşın oğlan yeni köçdüyümüz mənzilin sahibi imiş. Evi şəhərin yuxarı məhəlləsində, birmərtəbəli qədim binaların yerləşdiyi basırıq, bürkülü döngədə idi. Bizə verdiyi otaqlara zirzəmi demək olmazdı, ancaq zirzəmidən o qədər fərqlənmirdi. Alçaq qapıları və pəncərələri həyətə baxırdı. Yalnız axşamlar yox, gündüzlər də lampa yandırmaq lazım idi, amma otaqlar geniş idi. Qızlarım bir-birinə mane olmadan dərslərini hazırlaya bilərdilər. Mən təzə mənzilimizin qüsurlarını yox, məziyyətlərini daha çox görürdüm. Ev sahibi indi əvvəlki kimi qaşqabaqlı və təkəbbürlü deyildi. Su, qaz və işıq sarıdan heç vaxt korluq çəkməyəcəyimizi dönə-dönə vəd eləyir, gah lampaları (onlar çoxdan bəri silinmədikləri üçün çil-çil olmuşdu) yandırır, gah həyətdəki su kranını, gah da qaz pilətəsini göstərir, ümumiyyətlə mənzilin səliqə və sahmanını tərifləyirdi. Vanna və duş barədə bir söz demirdi, mən də bunların yoxluğunu üzə vurmaq fikrində deyildim. Ev sahibi özü məni qabaqlayıb dedi:

– Hamam yaxındadır. Hamımız orda çimirik. Köhnə evlərin hamısı belədir. Əslinə baxsan, dədə-babalarımız canlarının qədrini yaxşı bilirləşmiş. Hamam olan yerdə nə vannaya ehtiyac var, nə də duşa. Hayıf deyil hamam? Hər dəfə çimləndə belinə kisə çəkdirmədin nə ləzzəti? Müsəlman hamamının bədənə bilirsiniz nə faydası var? Adamı lap anadangəlmə eləyir!

Mən bu xüsusda fikirləşmirdim. Ev sahibinin qəribə bir ilhamla dediyi sözlər də mənə yersiz görünürdü. Mən bu saat ən çox mənzil kirayəsi barədə həyəcan keçirirdim. Zəfər mənim nə qədər az maaş

aldığımı bilirdi. “Yəqin danışıb, razılığa gəliblər” deyə, düşünürdüm. Ancaq ev sahibi, deyəsən, xırmanda yabalaşmamaq üçün şərti şumda kəsmək istəyib, əvvəlcədən xəbərdarlıq elədi:

– Sizdən cəmi-cümlətanı beşcə yüz manat alacağam. Bir qəpik də artıq istəməyəcəyəm. O da sizin, Zəfər qədəşin xətrinə...

– Ayda, ildə? – deyə mən qeyri-ixtiyari soruşdum.

Ev sahibi güldü. Alt çənəsinin bir cərgə qızıl dişini göstərdi.

Ayda, ayda, Səmirə bacı, – dedi. – Yarım litr arağın pulu... Lap müftəcə... Beş yüz manata indi nə verirlər ki? Vallah, tamahkar adamlardan mənim zəhləm gedir. Əgər köhnə dostum Zəfər qədəş təvəqqe eləməsəydi, bax, bu canım ölsün, – ev sahibi əlini zərblə döşünə çırpdı, – dünyasında otaqları kirayəyə verən deyildim. Əgər istəsəm, gündə azı beşcə min qazana bilərəm. Görürsünüz də, müharibədir, camaat yeməyə bir şey tapmır. Bir yol gedib rayondan üç-dörd kisə kartof gətirsəm, azı bir kisə pul başımın altındadır. Doğrusu, mən aza qənaət eləyirəm, başqaları kimi camaatı soymuram.

Mən onun sözlərində zərrəcən də səmimiyyət görmürdüm. Qızıl zəncirli qol saatı, bahalı kaverkotdan geniş balaqlı şalvarı, uzun ətəkli pencəyi, qəlibdən təzəcə çıxmış açıq qəhvəyi çəkmələri, müharibə dövrünün ortada yeyib-qıraqda gəzən cayıllarından birini tanımaq üçün kifayət idi. Belələrinin min fırıldaqla hərbi qulluqdan boyun qaçırdıqlarını bilirdim və hər dəfə onları görəndə qəzəbimdən az qala sinəm çatlayırdı. Müdhət kimiləri gözəl ixtisaslarına görə əsgərlikdən azad olunmağa haqlı ikən, cəbhəyə hamıdan əvvəl könüllü getdikləri halda, belələri alverlə məşğul olur, pulla xəzələ fərq qoymur və heç şübhə eləmirdim ki, müharibənin tez qurtarmağını da istəmirdilər...

Ev sahibi Zəfərin adını çəkəndə və onu “köhnə dostum” adlandıranda, nə vaxtdan və nə münasibətlə dost olduqlarını soruşdum.

Ev sahibi, onun sözlərinə açıqdan-açığa şübhə elədiyimi duyub, səksənmiş kimi kəskin bir hərəkətlə çiyninin üzərindən mənə baxdı. Yenə təkəbbürlü bir görkəm aldı:

– Dost yox, qardaş kimi yaxın olmuşuq, Səmirə bacı. Siz bu oğlanı yaxşı tanımamısınız... Bir vaxt, atam sağlığında bax, bu dib otaqda kirayənişin idi. Elə o zamandan qaranoyuq. İndi də ki, şükür allaha, gedib davadan döşü ordenli qayıdıb, yaxşı qulluq sahibi olub, aramızdan su keçmir. Üç-dörd gün bundan qabaq sifariş yollamışdı ki, yaxın dostum Müdhətin uşaqları küçədə qalıb, mümkünsə otağın ikisini onlara verim.

Mən dostluqda möhkəm oğlanam. Vəfalı dostun yolunda can əsirgəyəni heç kişi hesab eləmirəm...

Mən ev sahibinin adını, familiyasını soruşdum. O yalnız adını dedi:

– Balaqədeş!

Amma necə də qürurla dedi. Sanki bu vaxtacan hansı təsadüfi səbəbdənsə bu məhşur adı eşitmədiyimə həm təəccüb eləyir, həm də kinayə ilə qımışıb, mənim avamlığıma gülürdü. Mən, hesabla gərək o dəqiqə səhvimi anlayıb etiraf eləyəydim ki: "Aha, Balaqədeş... O sənsənmiş? Bəs necə, mən sənin barəndə çox şey eşitmişəm!..". – Lakin mən də gülümsəməyə məcbur oldum və dərhal da sual verdim:

– Nə əcəb səni əsgərliyə aparmayıblar?

– Necə, bəyəm? – O, sualımın ahəngini nə isə müəmmalı bir nida duymuş kimi sir-sifətinə durğun bir ifadə verdi, artıq çiyni üzərindən yox, dabanı üstündə fırlanaraq, mənimlə üzbəüz dayanaraq, gözlərimin içinə baxdı.

– Yəni deyirəm ki, bəlkə bir naxoşluğunuz və ya şikəst yeriniz var? – Mən qəsdən onu təpədən-dırnağa kimi süzdüm, bu cür sağlam bir gəncin əsgərliyə şübhəli bir haqq-hesab nəticəsində getmədiyinə açıqdan-açığa işarə elədim. O da, yəqin ki, mənim fikrimi dürüst anladı, amma cavab verməyə tənəzzül buyurmaq istəmədi və ev əşyamızı içəri daşıyan şoferə kömək bəhanəsi ilə gedə-gedə dodağının altında deyindi:

– Belə lazım gördülər. Elə buranın özündə də hökumətə xeyrim dəyir. Hamının soldat olmağı məcburi deyil ki?

O, mənim sualımın cavabını deyəsən sonradan-sonraya başa düşüb, əlində stul, şoferin dalınca içəri girəndə, gülə-gülə yenə alt çənəsinin bir cərgə qızıl dişini parıldadaraq, elə bil mənə yanıq vermək istəyib dedi:

– Hökumətimizdən yerdən-göyəcən razıyam, Səmirə bacı. Mənim kimi yetimlərin də qədrini bilir.

– Axı, sən hökumət üçün necə faydalı bir iş görürsən ki? Öz vətəndaşlıq borcunu verməkdən boyun qaçırmağınla hələ bir fəxr də eləyirsən? – Mən özüm də fərqinə varmadan, müvazinətimi itirib əməlli-başlı istintaqa girişdim. – Bir yerdə işləyirsənmi, barı?

– Xeyr, xeyr, rəsmi qulluğum yoxdur. – O, damağındakı uzun müştüklü papirosun kötüyünü döşəməyə tüpürdü. – Mənə nə qulluq? Amma hökumətimizə qulluq sahiblərinin çoxundan yaxçı xeyir verirəm.

– Məsələn, nə kimi? – Mən imkan tapsaydım, dalını-qabağını fikirləşmədən onun ətli yanağına kök bir sillə də vurardım. – Bəlkə kirayənişinlərdən aldığın pulu hökumətə verirsən?

– Xeyr, bu ev mənim dədə-babamın xüsusi mülküdür. Sizin kimi dostlara verib, xətirlərini xoş eləyirəm!

– Balaqədeş, axı beş yüz manat çoxdur! – deyə şofer yandan söz atdı.

– Çoox? – Balaqədeş az qala şoferin üstünə əl qaldırmaq istədi. O, dişlərini qıcayıb, gözlərini bərəltdi. – Necə yəni çox? Sənin dünyadan xəbərin var? Əgər varsa, de görüm beş yüzün bahasına nə verirlər? Əşi, pir olmuş, istəyirsən heç Səmirə xanımdan bir köpük də almayım. Beş yüz manat yarım-litr arağın qiymətidir, onu da güc-bəla tapırıq... Dünən bir müştəri gəlmişdi, ayda iki min beş yüz verirdi. Bu sən öləsən! – O, sağ əlini yanağına çırpdı. – İnanmırsan?

Doğrusu, indi mən Zəfərin hərəkətinə təəccüb eləyirdim. O, mənzil sahibi ilə danışanda bizim maddi imkanımızı niyə yadından çıxarmışdı? Balaqədeş üçün beş yüz manat yox, beş min də cüzi bir məbləğ idi. Ancaq mən təsadüfən qazanclı bir vəzifəyə təyin olunsaydım da, bu pulu böyük çətinliklə verəcəkdim. Mən nə etməliydim? Ev əşyasını təkrar maşına doldurub qayınanamın yanına qayıtsaydım, daha yaxşı olmazdımı? Zəfər mənzil kirayəsini də öz öhdəsinə götürsəydi, mən bunu heç vəchlə qüruruma sığışdıra bilməzdim. Onun dostluq hissləri nə qədər nəcib və saf olsa da, mən bundan sui-istifadə eləməyə özümü haqlı bilmirdim.

Birdən qızlarımı xatırladım (Yəni, əslinə baxsanız, onları bir an belə yadımdan çıxarmırdım). Onlara yeni mənzilimizin ünvanını verməyi unutmuşdum. Otaqları səliqə və sahmana salmamış, əvvəlcə Kəmalənin, sonra da Rəhilənin məktəbinə getdim. Sinif otağının qapısında gözləməkdən yorulub, uzun və işıqlı dəhlizdə divarlardan asılmış plakatları, şagirdlərin əl işlərini, divar qəzetlərini gözdən keçirməyə başladım. Hər şeydən kədərlənib məyus olan bir ana üçün doğma balasının məktəbdə ən yaxşı, əlaçı şagirdlərdən biri kimi tanınmağı yeganə təsəlli idi. Kəmalənin ədəbiyyatdan, rəsmdən, əl işindən sərgidə üç-dörd nümunə işi vardı. Onun yaxşı oxumağında, çalışqanlığında və əxlaq cəhətindən başqalarına nümunə göstərilməyində mənim payım yox idimi? Mən sevinirdim, kirayə məsələsini tamam unutmuşdum. İndi mənim qəlbimdə daha böyük bir dərd baş qaldırmışdı. “Qızlarımı necə saxlayacağam? Oxudub boya-başa çatdıra biləcəyəmmi? Tutaq ki,

Zəfərin pulu ilə bir-iki ay ölüm-zülümlə girləndik. Bəs sonra?" – Mən sevincimin birdən-birə necə kədərə çevrildiyini duyan kimi, sinəmdən sancı qalxdı. İndiyə qədər öz səhhətindən şikayətlənən dostlarıma az rast gəlməmişdim, amma həmişə də onları vasvasılıqda təqsirləndirib gülmüşdüm. Fikir eləyirdim ki, sinəmin ağrısı tezliklə keçib gedəcək, amma əksinə oldu. Sinəmdəki sancı get-gedə daha da şiddətləndi. Elə bil sinəmə iki yerdən bıçaq saplayıb oyan-buyana burur, köks qəfəsimi partlatmayınca məndən əl çəkməyəcəkdilər. Nə vaxt və necə şüurumu itirdiyim yadıma gəlmir. Gözümü açanda, özümü xəstəxana çarpayısında gördüm. Kəmalə ilə Rəhilə başımın üstünü kəsib, səssizcə ağlayırdılar...

Kamrana da burda rast gəldim. Xəstəxanada boş çarpayı olmadığından, əlacsız qalıb mənim çarpayımı kişilərin palatasının bir küncünə qoymuşdular və and-amanla vəd eləmişdilər ki, imkan olan kimi yerimi dəyişdirəcəklər. Kamranın çarpayısı mənimki ilə yanaşı idi. Hiss eləyirdim ki, ona yerindən qımıldanmağı belə qadağan eləyiblər. Mən özüm də onun günündə idim. Əgər təcili yardım maşınında tez gətirib dava-dərman verməsəymişlər, uşaqlarım yetim qalacaqmış. Qəzavü-qədərə inansaydım, deyərdim ki, allah üzümə baxıb və atalarından məhrum olmuş uşaqlara yazığı gəlib. Həkimimiz Səidə xanım isə sağ qalmağımı çox sadə bir səbəblə izah eləyirdi: "Ürəyinizdə üzvi dəyişiklik əmələ gəlməyib".

Səidə xanım əvvəlcə qızlarımı mənim yanıma buraxmaq istəmirmiş, deyirmiş ki, "xəstəni həyəcanlandırmaq olmaz". Kəmalə israr eləyir, onu inandırır ki, "Anam bizi görən kimi sevinəcək, sevincindən isə ona xeyir dəyə bilər. Səidə xanım sonralar mənə dedi ki, "Mən özüm də anayam, qızlarınızı görəndə həkimliyimi unudub, istər-istəməz razı oldum".

İlk günlərdə öz xəstəliyimdən çox, palatada uzanmış yoldaşlarımın vəziyyəti ilə maraqlanırdım. Bunun da səbəbi yəqin o idi ki, mənim kökümə düşmüş xəstələrin tezmi, ya gecmi sağalacağını bilmək istəyirdim. Əlbəttə, tezliklə qalxıb uşaqlarımın yanına qayıtmağa tələsirdim. Axı, hər şeyi alt-altda, üst-üstdə qoymuşdum. Qızlarım nənələrinin yanında qalırdılar. Mən harda qulluğa girəcəyimi bilmirdim. Ancaq onu da deyim ki, mən heç bir zaman ölümdən qorxmamışam. Şüurumu itirdiyim anlarda yalnız uşaqlarımın taleyini düşündüyüm yaxşı yadımdadır.

Səidə xanım hər dəfə palataya gələndə, tək mənə yox, hamıya ürək-dirək verir, elə qorxulu bir şey olmadığını dönə-dönə söyləyirdi. Hər kəlməsinə inansınlar deyə çox vaxt uca səslə gülür, bəzən hətta vəziyyətinin ağırlığından şikayətlənən xəstələrin sözünə cavab olaraq, onları ələ salırdı: "Mən indiyəcən bu fikirdəydim ki, qorxaqlıq yalnız qadınlara məxsus bir keyfiyyətdir, görünür yanılmışam. Bir deyin görüm buranın həkimi mənəm, yoxsa siz? Əgər tibb elmindən bu cür dərin məlumatınız varsa, bəs nə üçün mühəndislik eləyirsiniz?

Kamran bu barədə bizim hamımızdan seçilirdi. Öz barəsində həkimdən heç nə soruşmur, bəlkə də onun dediklərini dinləmir, cınqırını belə çəkmədən, gözlərini geniş açıb tavana zilləyir, hey bir nöqtəyə baxırdı. Mən buraya düşəli Səidə xanım ondan bir kəlmə də qoparda bilməmişdi. Kamran nə vəziyyətindən şikayətlənir, nə də tezmi, gecmi sağalacağı ilə maraqlanırdı. Üzünü cod tük basmışdı. Seyrək saçları pırpızlanmışdı. Yeməyini tibb bacısının köməyi ilə, başını azacıq yuxarı qaldıraraq, arxası üstdə yeyirdi. Əslinə baxsan, elə bir yeməyi də yox idi. Şorbadan bir-iki qaşıq hortdayır, kiselinin də yarısını içib, başını səssizcə tərpədərək, tibb bacısına təşəkkürünü bildirib, yenə eyni nöqtəyə baxmaqda davam edirdi...

Mən insanların tək-tənha, başqalarının dərd-səri ilə maraqlanmadan, ünsiyyətsiz yaşaya biləcəklərinə elə əvvəlcədən inanmırdım. Heç kəsin üzünə baxmayan, yanındakı adamların söhbətini dinləməyən, həmişə də palatadakı xəstələrin danışığını mümkün qədər eşitməmək üçün gözlərini yumub yorğanla üzünü örtən və yuxulamağa çalışan Kamran az qalmışdı mənim bu inamımı qırsın. Neçə gün, neçə gecə idi ki, o, səssiz-səmirsiz uzanmış, bir dəfə də olsun ufuldamamışdı. Lakin mənim xəstəxanaya gətirildiyim o uğursuz gündən düz bir həftə sonra Kamran, yəqin ki, bunu mənə hiss etdirmək istəmədən, yenə də cınqırını çəkməyib bəriyə sarı çevrildi və artıq tavana yox, yalnız mənə baxmağa başladı. Onun gözlərində elə bil heç bir ifadə yox idi. Yenə də sanki nəfəs almadan, lal-dinməz uzanmışdı. İçəri girib-çıxan şəfqət bacılarının, Səidə xanımın və palatadakı xəstələrin varlığına tamam biganə idi. O, mənə tərəf çevrilib, kirpiklərini bir dəfə belə qırpmadan, gözlərini inadla mənə zillədiyi dəqiqədən ta üç gün keçənə qədər mənim yerimdə kim olsaydı düşünə bilərdi ki, bu adam beş hissinin beşini də itirib, gördüyü şeylərin rəngini, yediyi xörəklərin dadını, danışan xəstələrin səsini, hər gün bədəninə vurulan

iynələrin ağrısını duya bilmir, sakit dəlilər kimi hər şeyə soyuq bir şüursuzluqla baxır. Mən artıq səbir edə bilməyib, nəhayət Səidə xanımdan soruşdum:

– Bu yoldaşın xəstəliyi nədir?

Kamranın mənim sualımı eşidib-eşitmədiyini deməkdə çətinlik çəkirəm. Üz-gözünün durğun ifadəsindən bunu duymaq mümkün deyildi, ancaq təxmin eləmək olardı ki, o, mənim qadın həkimlə yalnız ikimizə aid intim bir məsələ haqqında danışdığımı düşünə bilərdi (Mən bu cümləyə nöqtə qoyub səhər tezdən işə getmişdim. Kamran stolun üstündə qalmış xatirələrimi oxuyub, bloknotundan qopardığı bir vərəqə bu sözləri yazmışdı:

"Mən sizin söhbətinizi eşitmək istədiyim üçün bərk diqqət kəsilmişdim. Səidə xanıma məhz mənim barəmdə sual verdiyini başa düşürdüm, ancaq doğrusu, o qədər yavaşdan danışırdınız ki, heç bir sözünüzü aydın eşitmirdim. Bəlkə, öz təxminini yox, əsil həqiqəti yazasan, hə?).

Səidə xanım da mənim kimi dodaqlarını qulağıma söykəyib, pıçıltı ilə cavab verdi:

– Mikroinfarkt olub. Hamınızdan tez qurtaracaq.

Mən nə üçünsə Kamrana baxmırdım, ancaq onun inadlı baxışlarını öz üzümdə açıq-aydın hiss eləyirdim. Mən Səidə xanımdan ayrı bir söz soruşmadım. Soruşmadım ki, "belə də xəstə olar? Dili nə üçün kilidlənib? Bəlkə danışmağı siz ona yasaq eləmisiniz?".

İlk dəfə burda gördüyüm, məndə bu qədər təəccüb və heyrət doğuran bu adamın dilindən heç olmasa bir kəlmə eşitmək yalnız mənim üçün yox, palatamızdakı başqa xəstələr üçün də maraqlı idi.

Kamran, üzünü bəriyə sarı çevirəndən üç gün sonra, səhər yeməyini yeyib, əvvəlki vəziyyətindən fərqli olaraq, sağ əlini başının altına dayaq elədi və mənim səbirsizliklə gözlədiyim sözləri nəhayət dedi:

– İnsan nə qədər zəif məxluqmuş...

Bu dəmdə, dib tərəfdə, ayaqlarını çarpayıdan sallayıb üzünü qırxan arıq və cılız xəstənin sualını eşitdim:

– Necə məgər, yoldaş Kamran? Siz kimi nəzərdə tutursunuz?

Kamran, xəstələrin nə isə başqa bir söz də gözlədiklərini hiss eləyib dedi:

– Hamıdan çox özümü!

İndiyəcən yalnız öz aralarında astadan, kəsik-kəsik danışan yoldaşlarımız, hamı üçün maraqlı bir mövzu tapılmış kimi, hər tərəfdən söh-

bətə qarışdılar. Elə bil hamısı Kamranın dillənməyini gözləyirmiş. Çoxları bir ağızdan danışmağa başladı. Kimin nə fikrində olduğunu anlamaq çətin idi. Mən sözlərin yalnız bəzilərini aydın eşidirdim:

– Əcəb zəifsən! Əgər sən deyən doğrudursa, gərək odun-alovun içindən sağ-salamat çıxmayaydın...

– O vurhavura dözmək hər oğulun hünəridir, məgər?

– İnsan zəif məxluq deyil, xəbis məxluqdur. Bilmirəm hansı ağzıgöyçək deyib ki, "insan-əşrəf məxluqatdır"? Əgər əşrəf məxluqat olsaydı, bir-birini canavar kimi boğub parçalamazdı!.. Qədim zamanlarda qoşunlar qabaq-qabağa durub vuruşardı, amma indi iş o dərəcəyə çatıb ki, körpə uşaqları da süngüyə taxıb divara çırparlar...

– Canım, mən insandan danışıram, faşistdən yox!

Mən heç bir söz demədim. Belə görünürdü ki, palatadakı xəstələrdən yalnız mən Kamranın başına gəlmiş macəradan xəbərsizdim. Sağımda uzanmış kürən oğlan nə isə bir söz deməyə fürsət axtarır, amma hər dəfə ağzını açanda dilavərlərdən birinin danışmağa başladığını görüb, susmağa və gözləməyə məcbur olurdu. Axırda Kamran yerində dirsəklənib yoldaşları sakitliyə çağırdı:

– Əgər mümkünnsə, müəllim yoldaşı dinləyək, görək o, nə buyurur...

– Elə bir buyurmağım yoxdur, – deyə kürən oğlan üzünə dikilmiş gözlərin ağır və tələbkar ifadəsindən səksənmiş kimi azca tutuldu, sarımtıl kirpiklərini döydü. Enli və uzunsov yanaqlarına xəfif bir qızartı çökdü. – Təkcə onu deyə bilərəm ki, insan məfhumu barədə ümumiyyətlə danışmaq dürüst deyil. Hər bir adamın ayrı-ayrılıqda bioqrafiyasını diqqətlə öyrənsəniz və anadan olduğu gündən ta öldüyü günə qədər necə bir inkişaf yolu keçdiyinə nəzər saldınız, görərsiniz ki, onun qüvvətli və zəif olmağı tərbiyənin nəticəsidir. Bu dəqiqə mən sizə bir misal da çəkim. Mən onuncu sinifdə otuz iki uşağa dərs deyirdim. Hamıdan zəif oxuyan bir şagird vardı. Mən də, başqa müəllimlər də onu "maymaq" adlandırırdıq. Hansı müəllimdən soruşsaydın, hamısı onu pislərdi: "Zəif oxuyur, istedadsız, kütbaşdır, olsa-olsa yaxşı hamballıq bacarar". Doğrusu, mən də bu fikirdəydim. Bir gün xəbər tutduq ki, cəbhəyə könüllü gedib... Heç iki ay keçməmiş qəhrəman adı aldı. Bunu eşidəndə hamımız təəccüb elədik. Ancaq mən fikirləşib gördüm ki, onun "zəifliyi" öz təbiətindən yox, bizim tərbiyə üsulumuzun naqisliyindən irəli gəlirmiş. Deməli, biz həmin tələbənin

potensial imkanını görməkdən, istiqamətləndirməkdən aciz olmuşuq. Müharibə şəraiti isə əksinə, bu imkanı üzə çıxardıb parladıb.

Bu başqa məsələdir, yoldaş müəllim, – deyə Kamran yenə söhbətə qarışdı. – Əgər siz deyənə şərik olsaq, gərək biz bu kökə düşməyəydik, bizə dəyən zərbələrdən daha da möhkəmlənəydik, sarsılıb sınıq çıxmayaydıq, gərək müharibə şəraiti bizi daha da bərkidəydi... "İnsan zəif məxluqmuş" deyəndə, mən həm özümü, həm sizi nəzərdə tuturam. Burda yatan xəstələrin hamısı həyatda məğlub olmuş adamlardır. Mən bu palataya düşəndən bəri bir kəlmə də danışmayıb ancaq sizin söhbətinizi dinləmişəm. İndi hər birinizin nə üçün xəstələndiyini bilirəm. Hamınız, mən qarışıq, niyə xəstələnmişik? Çox sadə və adi bir səbəbdən. Çünki, ümumiyyətlə insan – zəif bir məxluqdur. Əgər güclü olsaydı, həyatın bircə zərbəsindən ürək xəstəliyinə tutulub yorğan-döşəyə düşməzdi. Tərbiyə neyləsin? Bizim şansımız pis tərbiyə olunmuşuq?.. Əgər insan güclü məxluq olsaydı, ən ağır zərbələrə də dözərdi...

Doğrusu, Kamranın dediklərini öz sərgüzəştimlə tutuşdurub, ona müəyyən dərəcədə haqq verirdim. Amma belə görünürdü ki, o, müasir ziyalıların bir qismi haqqında düşünür, müşahidələrini isə bütün insanlara şamil eləyirdi. Onun mülahizəsindəki dolaşıqlıq isə, yəqin ki, burdan irəli gəlirdi...

– Yoldaş Kamran, – dedim, – insan zəif yox, zərif məxluqdur. Bunlar isə ayrı-ayrı şeydir. Ola bilsin ki, birini ağır zərbə də yıxmaz, ancaq çox adi bir söz və ya adi bir təhqir diri gözlü öldürər...

Kamran gülümsündü, lakin onun təbəssümündə yalnız qadınlara məxsus bir sövq-təbii ilə duya bildiyim xəfif bir qüssə vardı, bəlkə də o, bununla demək istəyirdi ki, sən qadınsan, ona görə də biz kişilərdən qat-qat zəifsən, özünə bəraət qazandırmaq üçün "zərif" sözünü uydurursan...

(Bu sözlərin yanında yenə Kamranın ayrıca vərəqədə yazdığı etirazı gördüm:

"Səmirə! Məncə burda yanılmısan. Mən tamamilə başqa, daha mühüm bir səbəbdən gülümsəyirdim; bu, doğrudan da qüssəli bir təbəssüm idi. Mən demək istəyirdim ki, indiki zamanədə zəriflik özü zəiflik nişanəsidir. Bizi yorğan-döşəyə salan da elə bu deyilmi? Bəlkə sən yox, mən yanılıram? Biz həm maraqlı, həm də tragik bir dövrün insanlarıyıq. Biz xəstələnən zaman taleyin zərbələrinə dözmək üçün

hazır deyildik! Bu isə bizim şəxsi faciəmiz olmaqdan daha çox, mənsub olduğumuz nəslin faciəsi idi. Bizi zərbələrin ağırlığı yox, ədalətsizliyi yıxmışdı. Axı, bunu inkar eləyə bilməzsən ki, heç birimiz bu cür zərbələri gözləmirdik!...)

Bu sözləri oxuyandan sonra palatadakı söhbətlərin təfsilatını xatırlamağa çalışdım. O vaxt kim isə müəllimə dedi ki:

Müharibə başqa, məktəb başqa... Cəbhədə sıravi əsgər belə nə vaxt və kimdən zərbə alacağını bilir, ona nisbət də mənəvi cəhətdən özünü hazırlayır. Burda, cəbhə arxasında isə vəziyyət başqadır. Bizim çoxumuz kimdən nə vaxt zərbə alacağımızı əvvəlcədən bilmirik, elə buna görə də burda yıxılmaq cəbhədə yıxılmaqdan daha müdhiş olur...

O, haqlı idi. Mən bu fikrin doğruluğuna sonralar da çox inanmağa başladım.

Xəstəxanadakı mübahisələr Səidə xanımın gəlişi ilə kəsildi. O, qapı ağzından Kamranın artıq dil açıb danışdığını görəndə, adəti üzrə sakit və səssiz addımlarla yox, sürətlə içəri girdi və elə bil hamımızı unudub, yalnız Kamranı salamladı:

– Təbrik eləyirəm! – dedi. – Belə rəvan danışmaq özü sizin ürəyinizin sağaldığını göstərən ən fərəhli bir əlamətdir!.. Amma bir şərtim var: qan qaraldan söhbət olmasın. Yaxşı?

Kamran gözlərini Səidə xanıma zillədi, nə isə çox məftun baxışlarla onu süzməyə başladı. Hətta bir neçə an mənə elə gəldi ki, diqqətli müalicə üçün ona təşəkkürünü bildirmək əvəzinə, onun gözəlliyindən və məlahətli təbəssümündən xüsusi bir zövq aldığını ona hiss etdirmək istəyirdi. Səidə xanım bu gün nədənsə, adəti xilafına, saçlarını pırpızlandırıb başının ortasında toplamış, brilyant sırğalarını taxmışdı. Həmişəkinə nisbətən daha məmnun görünürdü. Üzünə gün düşdükdə, sırğaları parıldayıb bərq vururdu. İndi elə bil ki, bir az da cavanlaşmışdı. Neçə vaxtdan bəri gecəli-gündüzlü xəstəxanadan çıxmadığı halda, hərəkətlərində və danışıq tərzində təzə gəlinlərə məxsus bir şuxluq vardı. Deyəsən mənim baxışlarımdan bu cür bəzənib-düzənməyindən heç də xoşlanmadığımı duyub, o saat özünə bəraət qazandırmaq fikri ilə mənə müraciət elədi:

– Böyük qızım səhər-səhər məni bərk danladı. "Ay ana, – dedi, – sən indidən qocalmısan, nədir? Üzünə baxan sənə əlli yaş verər". Nə qədər çalışdımsa, qızın əlindən yaxamı qurtara bilmədim. Saçımı bu kökə saldı, sırğalarımı tapıb gətirdi...

– Yox, doktor, – deyə Kamran onun sözlərinə inanmadığını dərhal büruzə verdi. – Bu da sizin müalicə üsullarınızdan biridir: xəstələrə psixoloji təsir göstərmək istəyirsiniz!

Yox, Kamran haqlı deyildi. Səidə xanım süni yollarla özünə sığal verib nə olduğundan cavan görünməyə çalışırdı, nə də xəstələrin əhvali-ruhiyyəsini yüksəltmək üçün bu vasitəyə əl atırdı. Mən onu kişilərdən daha tez tanıdığıma görə, bunun səbəbini də anlamaqda çətinlik çəkmirdim: o, bəzənib, düzənməklə, tavuz quşu kimi cilvələnməklə yalnız kişilərin deyil, qadınların da xoşuna gəlməyi sevirdi.

Kamran isə gözlərini ondan ayırmırdı. Baxışlarındakı həyat və eşq ifadəsi o qədər qüvvətli idi ki, elə bil bu günəcən hər şeydən əl üzmüş, nə isə tamam başqa, xəyali bir aləmdə yaşayan soyuq və ehtirassız xəstə deyildi. Mən artıq dünənki, srağagünkü Kamranla bu günkü Kamranın eyni adam olduğuna bir növ inanmırdım. İnana bilmirdim. O, birdən-birə nə üçün belə dəyişmişdi? Bəlkə səhhəti yaxşılaşdıqca, insanlardakı gözəl keyfiyyətləri də görməyə başlayır və yaxud onda məhəbbətə bənzəyən bir hiss oyanırdı? Bu cür düşünməyə mənim haqqım vardı: Səidə xanım bir qadın kimi hər bir kişidə həvəs və iştaha oyada bilərdi.

(Mən xatirələrimin bu yerinə çatanda dəftəri qəsdən açıq qoyub işə getdim. Dedim ki, görüm Kamran mənimlə razılaşacaq, ya yox. Axşam evə gələn kimi, portfelimi hələ stolun üstünə atmamış dəftərə baxdım. Kamran heç nə yazmamışdı: "Bəlkə hələ oxumayıb?" deyə düşündüm. O, məni görəndə müəmmalı bir təbəssümlə gülümsəyib başını buladı. Səbəbini soruşdum. Cavabında dedi ki, "qadınlar qorxulu tayfadır").

Ancaq mən hələ sualımın heç birinə qəti cavab tapmamışdım. Bilirdim ki, ilk təəssürat nə qədər güclü olsa da, çox vaxt insanı birtərəfli, yanlış nəticələrə aparıb çıxardır. Mən öz-özümə söz verirdim ki, tələsməyim, Kamran haqqında nələr düşündüyümü onun özünə də, Səidə xanıma da hiss etdirməyim. Mən o vaxt yalnız soyuqqanlı bir tamaşaçı olmağa çalışırdım, sanki teatr səhnəsində böyük məharətlə yaradılmış bir tamaşaya baxırdım və öz münasibətimi heç nə ilə büruzə vermirdim. Bəzən hətta əksinə, o qədər dalğın və diqqətsiz görünürdüm ki, elə bil dünənki Kamranı əvəz eləyirdim. Bunun səbəbini özüm də başa düşmürdüm. Tək mən yox, yəqin başqa xəstələr də Kamranın qəfildən Səidə xanıma çılğıncasına vurulduğuna şübhə eləmir-

dilər. Cavan, şux və gözəl həkimin təzə və modalı paltar geyinməyinin, brilyant sırğa taxmağının, saçlarını on yeddi-on səkkiz yaşlı qızlar kimi daramağının səbəbini bunda görməyim də təbii deyildimi?

Səidə xanım gülə-gülə mənə yanaşıb halımı xəbər alanda, stul çəkib çarpayımın yanında mənimlə nəfəs-nəfəsə dayananda və qan təzyiqimi ölçəndə onun mənə necə şəfqətli bir qayğı ilə yanaşdığını ağıl və şüurumla dərk eləyib anlayırdımsa da, ürəyimin hansı dərin bir guşəsində isə ona qarşı qısqanclığa bənzər bir hissin qeyri-ixtiyari, həm də anlaşılmaz bir inadla oyanıb gücləndiyini duyurdum. Mən bu hissi elə içərimdəcə boğub öldürməyə nə qədər çalışırdımsa da, o, tərs kimi yerini daha da möhkəmlədib bütün ürəyimə hakim kəsilməyə can atırdı. Bu hissin pəncəsində əsir olmaq təhlükəsi artıq məni qorxutmağa başlayırdı. Kim bilir, bəlkə də bu, qısqanclıq deyil, məndən qat-qat gözəl bir qadının mənəvi qələbəsinə qarşı oyanan adi bir həsəd idi və mən bunu, sadəcə olaraq, etiraf eləməyi öz qüruruma sığışdırmırdım? Axı, Kamran mənim üçün kim idi? Hansı qeyri-adi bir duyğu Müdhətin məhəbbətini mənim ürəyimdən qopara bilərdi? Bəlkə mən onun bir daha geri qayıtmayacağını bildiyim üçün, özümdən asılı olmayaraq, mənim ilk məhəbbətim, sevimli balalarımın atası öz yerini bir başqasının məhəbbətinə tərk edirdi? İlk günlərdə bu xüsusda bir an, yalnız bir an xəyalımdan keçən fikir məni dəhşətə gətirirdi. Müdhətin son məktubundan bu sözləri xatırlayırdım: "Öz sevimli ərlərinin ölümündən sonra onların yolunda həyatını çürüdən gəlinlərə mənim hörmətim var, çünki bu cür fədakarlıq yalnız uca təbiətli insanlara xas bir nişanədir. Lakin heç bir ərin öz arvadından belə məhrumiyyətə qatlaşmağı tələb eləməyə mənəvi haqqı yoxdur. Əks təqdirdə bu ən adi xudpəsəndlik olardı. Mən bu sözlərimin səmimiliyinə səni inandırmaq üçün and içmirəm. Bilirəm ki, məni yaxşı tanıdığına görə belə şeylər haqqında yalnız düşündüyüm və inandığım kimi yazdığıma zərrəcən də şübhən olmayacaq. Məni bu saat ən çox həyəcanlandıran başqa bir şeydir: müvazinətini itirib, intixabında yanılmayasan. Sən məndən qat-qat uca və daha ləyaqətli bir həyat yoldaşı axtarmağa haqlısan..."
– Yox. Heç kəsi axtarmırdım və əslinə baxsan bu sözlərdə acı bir təhqir və töhmətdən başqa heç nə görmürdüm. Bəs necə olmuşdu ki, bu günəcən xoşbəxt insanların həyatını görəndə hədsiz dərəcədə sevinməyi bacaran mən, indi Kamranın Səidə xanıma vurulduğunu güman eləyib, onlara həsəd aparmağa başlayırdım? Bu çirkin hiss hardan və

necə mənim ürəyimə yol tapmışdı? Bəlkə mən ifrata varır və özümü nahaq yerə günahlandırırdım? Bəlkə bunun səbəbi Müdhətin başına gələn müsibət, ailəmizin həyəcanları və mənim xəstəliyim idi?

Mən o günlərdə nə Kamrana sarı üz çevirirdim, nədə Səidə xanıma baxırdım. Mən istəyirdim ki, yenə əvvəlki Səmirə olum, onların həyatını nurlandıran məhəbbət macərasından fərəh duymağa başlayım və yalnız bundan sonra açıq alın, saf ürəklə hər ikisini təbrik eləyim.

Elə bu vaxt Səidə xanım qadınlar palatasında çarpayı boşaldığını bildirib, məni qonşu otağa köçürdü. Dostlaşdığım və ünsiyyət bağladığım xəstələrlə xudahafizləşmədim. Görünür, bu tezliklə hələ bir-birimizdən ayrılmayacağdıq. Hamıdan əvvəl Kamran sağalıb duracaqdı. Amma o da ən azı on-on iki gün burda qalmalı idi. Məni xərəkdə götürüb aparanda, Kamran əlini yuxarı qaldırıb məni uzaq səfərə gedən bir tanış kimi ötürdü və dalımca "görüşənə qədər" deyib ucadan səsləndi. O biri xəstələrin sözlərini aydın eşitmədim. Yəqin ki, onlar da mənə tezliklə sağalmağı arzulayırdılar. Səidə xanım böyrümcə gedə-gedə, yalnız sonralar mənasını başa düşdüyüm bir eyham da vurdu:

– Sizin köçməyiniz kamran yoldaşın ürəyindən olmadı.

Qızlarım tez-tez məni görməyə gəlirdilər, hər dəfə də Zəfərin onlara baş çəkib, hal-əhval bildiyini söyləyirdilər. Birinci dəfə qadınlar palatasına gələndə, bu barədə mənə heç nə demədilər, mən özüm onlara sual verdim. Kəmalə də, Rəhilə də susub gözlərini yerə dikdilər. Onların tutulduğunu görüncə, nə isə xoşagəlməz bir hadisə baş verdiyini hiss elədim. İsrarla soruşdum. Kəmalə dedi:

– Zəfər dayı bir həftədən çoxdur bizə gəlmir.

– Nə üçün? – soruşdum.

– Yəqin başı qarışıq olur... – Kəmalənin əsil həqiqəti söyləyib məni həyəcanlandırmaq istəmədiyini anlamaq çətin deyildi. Rəhilənin üzünə baxdım. Onun gözləri dolmuşdu. Kirpiklərində iri yaş damcıları titrəyirdi. Hönkürüb ağlamaq üçün balaca bir himə bənddi.

– Əgər mənim tez sağalmağımı istəyirsinizsə, – dedim, – məndən heç nəyi gizlətməyin. Düzünü bilməsəm, daha çox fikir eliyəcəyəm, bu da ki, mənə ziyandır.

Onlar oğrun-oğrun bir an gözləşdilər və mənim hər şeyi hiss elədiyimi görüb, o acı xəbəri gizlətməyin tamam faydasız olduğunu yəqin elədilər. Rəhilə qulağıma sarı əyildi. Heç kəs onun sözlərini eşitməsin deyə pıçıldadı:

– Zəfər dayını sragün tutublar...

Onun pıçıltısı gətirdiyi xəbərin dəhşətini azaltmadı. Mən sarsıldım. Rəhilənin hıçqırtısını eşidən xəstə qadınların gözləri bizə zilləndi. Mən qızımın başını qolumun arasına aldım:

– Bax, Raya, unutma ki, daha yekə qızsan... – dedim. – Sən indi on yaşına girmisən!

Görünür o, altı-yeddi nəfər xəstənin də həyəcanlanmağında özünün təqsirini başa düşüb, hıçqırtısına ara verdi, yaylığı ilə gözlərini örtüb palatadan çıxdı.

Mən artıq insanların taleyini oyun-oyuncaq sayanlara bələddim, ancaq dünən cəbhədə vururmuş, bədənində sağ yer qalmamış və bəlkə də xoşbəxt bir təsadüf nəticəsində çovutma bir gülləyə hədəf olmamış Zəfərin həbsə alınacağını xəyalıma belə gətirməzdim. Axı, burda adi bir məntiq axtarmaq özü də əbəs idi!

Rəhiləyə nisbətən təmkinli və həssas Kəmalə, mənim nə isə bir təsəlliyə ehtiyac hiss elədiyimi duyub, böyüklərə məxsus bir əda ilə dedi:

– Can ana, hələ bilmək olmaz, bəlkə bu gündə, sabahda buraxdılar. Axı, onun heç bir günahı yoxdur... Tez qalx, bizim ürəyimiz sənin yanındadır. Dünən əmim kəşfiyyatdan gəldi. Təzə buruğu bolluca neft verib... Çoxlu mükafat alıb... Bu gün səhər getdik, Balaqədeşdən şeylərimizi alıb gətirdik.

O, məni öpüb ayrıldı, bir azdan sonra Səidə xanım gəldi. O, həmişəki kimi məmnun təbəssümlə xəstələri salamladı. Qadınlara eyni nəzakət və əda ilə yanaşır, qonur, badamı gözlərini süzdürür, naz-qəmzə ilə danışırdı.

Hamının yanında qızlarımı təriflədi:

– Ağıllı uşaqlardır. Xoşbəxt olsunlar!

Bütün analar kimi mən də bu cür tərifdən qəribə bir zövq aldığımı gizlətmədim. Səidə xanım ana qürurumu bir az da artırmaq istəyərək təkrar elədi:

– Gözəl uşaqlardır! Ancaq təəssüf ki... – O, nırçıldayıb susdu.

– Doktor, nəyə təəssüf eləyirsiniz? – deyə mən özümü saxlaya bilməyib, tez-tələsik soruşdum. O, süzgün gözlərini dolandırıb, xəstələri göstərdi: yəni bunlar bilməsələr yaxşıdır, yalnız sizə deyəcəyəm.

Tibb bacıları məni yenə xərəyə qoyub rentgen otağına apardılar. Səidə xanım qaranlıqda məni müayinədən keçirən həkimin azərbaycanca bilmədiyini nəzərə alıb, bayaq mənə demək istədiyi sözləri indi dedi:

– Amma təəssüf ki, atalarının başına o cür müsibət gəlib... Sizin xəstəliyinizin səbəbi indi mənə aydındır. Amma dözmək lazımdır, Səmirə xanım, təkcə dava-dərmana ümid bağlamaq azdır. İradənizi ələ alın, dərdinizi unutmağa çalışın. Həyatın ağırlığından sarsılan tək siz deyilsiniz... – Onun səsində qəmgin bir titrəyiş vardı. – Mən sizdən az iztirab çəkmirəm Mənim də ərim Müdhətin günündədir. Bəlkə də daha pis. Yenicə hərbi orden almışdı. Əsgərlərindən bir neçəsi almanların tərəfinə keçəndə, onu günahlandırıb, az qala güllələyirmişlər. Ştabda bir allah bəndəsi işə qarışıb, ölüm cəzasını həbslə əvəz elətdirib...

Mən eşitdiklərimə əvvəlcə inanmadım. Səidə xanımın gülüşlərini, naz-qəmzəsini, bəzənib-düzənməsini gördükcə, onu təzə eşq bəlasına mübtəla olmuş cavan bir qız bilmişdim... Əlbəttə, günah məndə deyildi. O vaxt insanlara üzdən, səthi yanaşmağa adət eləmişdik. Həqiqi mənada heç kimin dərdini öyrənməyə ehtiyac duymurduq. Bizə elə gəlirdi ki, belə zəmanədə dərddən, kədərdən söhbət açmaq hansı müqəddəs ehkamı isə uçurmaq deməkdir...

Bir həftədən sonra mənə ayağa qalxıb gəzinməyə icazə verdilər. Xəstəxananın həyətindəki bağçada təmiz hava udduqca, hər iki tərəfində güllər və çiçəklər əkilmiş asfaltlı cığırla yavaş-yavaş addımladıqca, məndə yenidən həyata qayıtmaq həvəsi artmağa başlayırdı. Məni ağır və üzüntülü məhrumiyyətlər gözlədiyini yaxşı bildiyim halda, könlümdə güclənən bu həvəsi öldürmək çətin idi. Burda Kamrana da, kişilərin palatasından tanıdığım o biri xəstələrə də tez-tez rast gəlirdim. Bir-birimizi salamlayır, kef-əhval soruşur, azacıq ayaq saxlayıb, yalnız üç-dörd qısa cümlədən ibarət söhbətlər eləyirdik.

Bir dəfə Kamran xiyabandakı yaşıl skamyada mənimlə yanaşı oturmağa izin istədi. Belə hallarda insan ürəyini açıb, dərdini söyləməyə nə isə bir ehtiyac duyur. Amma söhbətə ilkin mən başlamadım. Necə oldusa, Kamran birdən köksünü ötürdü:

– Səmirə xanım, – dedi, – Zəfər barədə bir söz eşitdim. Bilmirəm əsası var, ya yox? Təəccüb eləməyin. Mən onu çoxdan tanıyırdım. Cəbhədə də bir diviziyada idik. Tez-tez görüşürdük. Elə bir gündə də yaralandıq. Eyni qospitalda yatıb, eyni gündə də tərxis olunduq. Görürsünüz, daha mən hərbi qulluğa yaramıram. – O sağ qolunun sağalmış uzun yarığını və dibdən kəsilmiş barmaqlarını göstərib, səmimi bir təəssüflə başını buladı. – Zəfəri də azad elədilər... Nə mən, nə o, şan-şöhrət axtarmırıq. Borcumuzu verib qayıtmışıq... Doğrusu, o cür igid

bir adamın həbsə alındığını eşidəndə, matım-qutum qurudu, əl-ayağım yerdən üzüldü. Mən bunu ədalətsizlik sayıram. Çox böyük ədalətsizlik! Kimin üçün vuruşursan, kim səni cəzalandırır? Az qalır fikirdən beynim partlasın... – O, yenə dərindən köksünü ötürüb, susdu. Harasa, uzaqlara baxdı və mənə elə gəldi ki, cəbhədə, vuruşma meydanında odlar, alovlar ayaqladığı günləri təsəvvürünə gətirdi. – Belə şeyləri görmək adama bərk yer eləyir... Çox bərk! Elə bil sənin gözünün içinə deyirlər ki, canın çıxsın, həm vuruşacaqsan, şikəst olub adamlıqdan çıxacaqsan, həm də düşmən kimi, həbsdə, sürgündə çürüyəcəksən. – O, qəhərlənmişdi, səsinin titrəyişini gizlədə bilmədiyindən utanır kimi, təkrar susdu, gözlərimin içinə baxdı və sonra, deyəsən kövrəldiyini mən duymayım deyə, başını o tərəfə çevirdi. Bir xeyli danışa bilmədi. Nəhayət, iradəsini topladı və dedi: – Zəfər əriniz Müdhətin yaxın dostu idi. Neft institutunda onları həmişə bir yerdə görərdim... Bəlkə Zəfərin tutulmağı şayiədir, hə?

Nə deyəcəyimi bilmədim. Tərəddüdlə sükut eləyib, Kamranın üzünə baxa-baxa qaldım.

– Çəkinməyin, düzünü deyin!.. – O, görünür, mənim sifətimdə əmələ gələn dəyişiklikdən, eşitdiyi bəd xəbərin doğru olduğunu yəqin eləyib, israrla soruşdu. – Demək tutublar? Hayıf ona!.. Axı o cür namuslu adamın ayağına nə günah yaza bilərlər?

Bu sualı da cavabsız qoydum. Sözlərinin çox səmimi və qəti ahəngindən hiss elədim ki, Zəfərin büllur kimi saf olduğuna əmindir. Özözümə düşündüm: "Deyəsən Zəfər hardasa Müdhətin tərəfini gözləyib... Əgər belə isə həddindən artıq cəsarətli tərpənib, kəfənini boğazına dolayıb. Nahaq, nahaq, faydasız işdir..."

Kamran artıq mənə üz tutmadan, daha inamla cəbhə dostunu təriflədi:

– Əgər mən onun barəsində yanılmamışamsa, əgər o, mən tanıyan Zəfərdisə, burada nə isə bir dolaşıqlıq olub, kimin isə böhtanına düşüb... Biz faşistləri belə igidlərin sayəsində biçib-tökürdük. Yox, onun barəsində çox böyük ədalətsizlik eləyiblər!

Mən çiyinlərimi çəkdim:

– Nə deyim, vallah? Mən də Zəfəri əsil insan, əsil vətəndaş kimi tanıyıram, ancaq belə görünür ki, bu, kiminsə o qədər də xoşuna gəlmir. Belələrinin fikrincə, hər bir vətəndaş gərək onların əmrini tutu quşu kimi təkrar eləməyi bacarsın, "bəli, bəli" dən qeyri bir söz deməsin. Ancaq mən yaxşı bilirəm ki, Zəfərin devizi bam-başqadır: "İnsan – kölə deyil. İnsana baş müstəqil düşünmək üçün verilib!.."

Kamran yaralı əlini zərblə dizinə çırpdı:

– Yox, mən nəyin hesabına olursa-olsun düz Moskvayacan getməyə hazıram. Lap Stalinin yanına!.. Qoy o, bu ədalətsizlikdən xəbər tutsun. Qoy bilsin ki, Zəfər kimi sadiq əsgərlərin tutulmağını görən cavanlar, cəbhəyə həvəslə gedib vuruşmayacaqlar!

– Eh, yoldaş Kamran, bizim respublikanın sahibini Stalinin nəzərindən salmaq asandır?

– Necə? – Kamran məyus halda, səsinin əhəngini birdən yumşaldaraq üzümə baxdı. – Yəni Zəfərin tutulmağından Mollayevin xəbəri var! Ola bilməz!

– Böyük bir idarənin rəisini ondan icazəsiz tutmayacaqlar ki?

– Əgər belədirsə, bu daha pis. – Kamran yenə səsini ucaltdı. – Deməli onu aldadıblar!

– Orasını bilitrəm, – dedim. – Bəlkə də. Məni bura gətirdikləri gündən Zəfəri görməmişəm. Çox mümkündür ki, o özü Mollayev yoldaşla üz-üzə gəlib, aralarında söz-söhbət olub. Bəlkə Zəfər bir az ötkəm danışıb, Mollayevin də bundan xoşu gəlməyib... Hər şey ola bilər...

– Bir adi kapriz üçün adamı cəzalandırmaq?!

Kamran əsəbiləşirdi. Əlləri əsir, gözlərinin nazik damarlarına qan sağılırdı. Mən ona Səidə xanımın məsləhətlərini xatırlatdım:

– Sakit olun. İradənizi ələ alın. Yeni-yeni dirçəlirsiniz. Belə getsə, müalicənin də faydası olmaz. – Mən bu əsəbi söhbətlərin sonrakı ziyanından qorxub, ayağa qalxdım. Kamran mənə yenə nə isə demək istəyirdi. Mən onu qabaqladım:

– Söhbətimiz sonraya qalsın, – dedim və cəld addımlarla uzaqlaşdım.

Mən o gündən sonra, özüm də fərqinə varmadan, Kamranın vəziyyəti ilə maraqlanmağa başladım. İkinci mərtəbədən yavaşca addımlarla, mərmər pilləkənin ağac sürahısından tuta-tuta aşağı enəndə və xiyabanda tək-tənha gəzinəndə, gözlərimlə qeyri-ixtiyari daim onu axtarırdım. O isə daha görünmürdü. Mən əvvəlcə onun tamam sağaldığını və xəstəxanadan çıxıb getdiyini güman elədim. Nə üçünsə kişilərin palatasına girib, onu soruşmağa və hətta Səidə xanıma bu barədə sual verməyə də utanırdım. Dərhal fikrinə gələ bilərdi ki, nə səbəbə onun taleyi mənim üçün bu qədər əhəmiyyətlidir? Belə bir sualın cavabını tək ona yox, özümə də verə bilməzdim. Doğrudan da mən nə üçün o biri xəstələri yox, məhz Kamranı soruşmalıydım?

Gəzinməkdən qayıdanda, kişilərin palatasının qapısını tıqqıldatdım. Kim isə içəridən "buyurun!" deyə səsləndi. Mən içəri girəndə, elə bil çətin bir imtahan verəcəkdim. Necə olur-olsun bir neçə dəqiqə Kamrana tərəf baxmamalıydım, burda yatan bütün xəstələrə baş çəkməyə gəldiyimi göstərməliydim. Ax, bu aktyorluq!.. Səhnədə göstərilən məharət bizim hamımız üçün nə qədər sevinc gətirirsə, həyatda işlədilən oyun bir o qədər süni və iyrəncdir. Doğrusu, bir an özüm-özümdən iyrəndim. Bu cür riyakarlıq mənim təbiətimə tamam ziddi. Yalnız palataya daxil olanda düşündüm ki, heç kəs mənim gəlişimə pis məna verməsə də, Kamranın fikrinə ayrı şey gələ bilər. Lakin artıq gec idi. Mən geri dönə bilməzdim. Mümkün qədər şad görünməyə çalışıb, hamıya salam verdim:

– Köhnə dostlar, necəsiniz? – deyə xəstələrə bəridən o yana bir-bir (amma orasını da deyim ki, təbii görünməyə nə qədər müvəffəq olduğumu söyləməkdə çətinlik çəkirəm) göz gəzdirdim, ən axırda Kamrana üz tutdum. – Siz ki, əməlli-başlı sağalmışdınız, nə oldu, birdən-birə?

O, hava azlıq edirmiş kimi, dərindən nəfəsini dərdi və qeyri-müəyyən bir ifadə ilə qaşlarını dartıb, kirpiklərini qıpdı, amma heç bir söz demədi. Onun əvəzinə müəllim cavab verdi:

– Qorxusu yoxdur. Pillələri qalxanda nə isə ehtiyatsızlıq eləyib... Unudub ki, bu halda ürəyə əziyyət vermək olmaz. Səidə xanım dedi ki, uzanmağı məsləhətdir.

Müəllim yanılırdı. Bizim aramızdakı əsəbi söhbətdən xəbərsizdi...

Mən ayrı-ayrılıqda hamının kefini soruşdum. Xəstələrin içərisində ən çox nikbin danışan yenə də müəllim idi.

– Nə cür naxoşluq olur-olsun, hətta zəif insanlarda da daxili müqavimət qüvvəsi yaradır. Elmi terminologiya ilə desək immunitet. Ölüm. – buradakıların heç birindən qüvvətli deyil. Mən indi də bu fikirdəyəm ki, insan xarakterinin zəifliyi naqis tərbiyənin acı səmərəsidir. Bizim potensial imkanlarımız...

– Ay müəllim, ay əzizim, adamda bu potensial imkan nə qədər olar, axı? – deyə vaxtı ilə mənim yatdığım çarpayıdan solda uzanmış arıq, dik və sivri hülqümlü, az-az söhbətə qarışan və həmişə də iki-üç kəlmədən artıq danışmayan xəstə (sonra bildim ki, o, Balaqədeşin əmisi oğludur) bu dəfə uzun bir hekayət başladı: – Bir yol dözürsən, iki yol dözürsən, ay canım-cigərim, bu ürək yazıq neyləsin ki, hər gün ona iyirmi yol cəhənnəm əzabı verirlər? Əşi, niyə uzağa gedirsiniz?

Bax, elə mənim doğmaca əmim oğlu camaata göz verib, işıq vermir. Vücudu iki qara köpüyə dəyməz, amma gül təki oğlanları dalbadal ləkələyib, bir-bir gedər-gəlməzə yolladır. Başqaları bir yana dursun, elə mənim özümü neçə yol dəniz qırağına apartdırıb? ("Dəniz qırağı" deyəndə, o, Dövlət Təhlükəsizlik Nazirliyini nəzərdə tuturdu). Nə var, nə var, içki məclisində kefim durulanda ehtiyatsızlıq eləyib demişəm ki, tutulanların içində günahsızlar da olub... Yaxşı, bir qələtdir qarışdırmışam, daha bundan ötrü adamı yüz yol öldürüb-diriltməyin nə mənası? Əgər orqan əksinqilabçılara qulaqburması vermək üçündürsə, daha mənim kimisindən nə istəyirlər? Heç mənim əksinqilabçıya oxşarım var?

Bu söhbət bizim üçün maraqlı deyildi, amma xəstənin sözünü də kəsən yox idi. Belə görünürdü ki, nikbinlikdə müəllim, bədbinlikdə isə o, palatadakıların bir-birinə zidd iki qütbünü təşkil edirdilər.

– Əgər burdan sağ-salamat çıxmaq istəyirəmsə, məndən xəbis adam yoxdur! – deyə bədbin xəstə üzünü divara sarı çevirib, birdən uşaq kimi hönkürdü.

Mən daha xəstələrin üzünə baxmayıb, qapının arasından necə sivişdiyimi bilmədim: insanların iztirabına dözmək üçün mənim ürəyim həddindən artıq zəif idi. Əgər bir azacıq da burda qalsaydım, yəqin ki, mən də ona qoşulub ağlayacaqdım...

O günün sabahısı qızlarımı gözləyirdim, amma qaynım Faiq gəldi. Bir dəstə ağ qərənfil gətirmişdi. Mən onun məqsədini başa düşürdüm. Xoşbəxt günlərimi yadıma salmaq istəyirdi. Müharibədən əvvəl sahil küçəsindəki evimizin balkonunda özüm gül-çiçək əkərdim. O vaxt Faiq mənim becərdiyim ağ qərənfillərdən dəstə düzəldib, sevgilisinə aparardı. İndi fikri, deyəsən, borcunu qaytarmaq idi. O, məni gülərüzlə salamladı.

– Səmirə, yallah, – dedi, – bu gün qızlar növbələrini mənə verdi: Əgər Səidə xanım razı olsa, bu saat onlar da gələcək. Aşağıda oturub gözləyirlər.

– Çox sağ ol, – dedim və qalxıb xəstəxana xalatında Faiqin köməyi ilə həyətə endim.

Qızlar məni görən kimi sevinə-sevinə üstümə atıldılar.

– Can ana! – deyə bir ağızdan qışqırdılar.

Mən sevinirdim. Hər ikisinin təzə tufli geyindiyini görmək mənim üçün xoş idi. Faiq də məndən az sevinmirdi. Skamyada dördümüz də yanaşı oturduq. Qayınanamın kefini-əhvalını soruşdum və o dəqiqə də

peşman oldum: qızlarımın da, qaynımın da üz-gözünə qəm kölgəsi endi. Bunun səbəbini mənə izah eləmək lazım deyildi: hamısı Müdhəti xatırlamışdı: Bədirnisa xalanı Müdhədsiz təsəvvürə gətirmək çətindi. Onların kədərini dağıtmaq üçün söhbəti dəyişdim:

– Hə, Faiq, sən özün necəsən? Çoxdandır görüşmürük. Sən gələndə mən evdə olmuram, mən evdə olanda sən kəşfiyyata gedirsən.

– Elədir, – deyə qaynım hələ də kədərlə çulğalanmış gözlərini yuxarı qaldırmadan cavab verdi.

– Eşitdim, təzə buruğunuz qiyamət eləyir, – dedim.

– Düz eşitmisən, – dedi. – Biz öz borcumuzu ödədik. Sübut elədik ki, Şirvan düzündə böyük neft xəzinəsi var. Yoldaş Xəlilov, yəni "Azərneft" birliyinin rəisi, bizi yaman hədələyirdi, həmişə də Mollayevin adından hey deyirdi ki, avantüristsiniz... Guya biz qəsdən milyonları çölə tökən, dövlətin malına qəsd eliyən xalq düşməni imişik. Amma fantan vaxtı özü gəldi, içindən qırıla-qırıla hamımızı təbrik elədi, kəşfiyyat dəstəsinə mükafat verdi. Arada bir qonaqlıq də düzəltdi... – Faiq danışdıqca, qəzəbini gizlətmirdi. Xəlilovun ikiüzlülüyündən soyuqqanlı danışa bilmədiyini açıq-aydın görürdüm. – Onun sözlərindən belə başa düşdüm ki, mənim də, geoloqumuzun da həbsinə qərar verilibmiş... Kəşfiyyat quyusundan elə neft çıxır ki, onun yanında Suraxanı nefti yalandır. Zavodda işlənməmiş götür doldur baka, aviamotorun canına yağ kimi yayılsın. Yalan olmasın, benzin yerin altından lap hazır çıxır. Bu saat qırıcı təyyarələrimiz üçün bundan yaxşı hədiyyə olmaz. Bilirsən də, dünən qoşunlarımız Almaniyanın sərhədlərini keçdi! Qələbə günümüz yaxınlaşır. Nemeslərin vayını veririk!..

Adətən palataya qəzet gətirmirdilər, amma cəbhədə baş verən hadisələrdən hamımızın xəbərimiz vardı. Həkimlərdən, tibb bacılarından öyrəndiyimiz son məlumat ildırım sürəti ilə xəstəxanaya yayılırdı. Faiqin sözləri mənə bütün qəm-qüssəmi unutdururdu. Deməli, artıq qələbə günündən və müharibənin tezliklə qurtaracağından söhbət gedirdi. Müdhətin də, mənim də, uşaqlarımın da taleyi gülümsəyə bilərdi. Ümid nə gözəl şeydir!.. Müharibənin ağır günlərində zəruri sayılan sərt qayda-qanunlar yavaş-yavaş aradan qalxacaq, səhv buraxanların günahı bağışlanacaq, günahkarların cəzası yüngülləşəcəkdi. Mən belə düşünürdüm və inanırdım ki, çoxları da belə düşünməkdə haqlıdır!

Qızlarımın dərsindən söz saldım. Son rübdə ikisi də əla və yaxşı qiymət almışdı. Faiq də evdə olduğu günlərdə onları tez-tez yoxlayırmış. Mənim yanımdan qayıdan kimi yenə uzaq kəşfiyyata gedəcəkdi.

– Bütün dərs ilini də müvəffəqiyyətlə başa vuracaqlar. Buna heç şübhən olmasın, – deyə Faiq böyründə oturmuş Rəhilənin saçlarını sığalladı. Bu vaxt Faiq qardaşına necə də oxşayırdı. Mehriban, nəvaziş dolu baxışlarını Müdhətinkindən fərqləndirə bilməzdin. Qızlar da onun xətrini çox istəyirdilər. Müharibə qurtaran kimi evlənsəydi, mən bilirdim ki, qızlar onun toyunda nə qiyamət qoparacaqdılar. Xüsusən Kəmalə! (Böyük qızım oynamaqda məndən geri qalmır!)

Faiq cibindən bir dəstə pul çıxartdı:

– Uşaqlar üçün yox, burda xərcləmək üçün, – dedi, – Çölün düzündə mənə o qədər lazım olmur, Bilirsən də, ovçuyam, qırqovuldan, turacdan vurub gətirirəm, bəzən də Kürdən balıq tuturam... O dəfə ceyran ovuna getmişdik...

– Bəs qadağan deyil?-deyə soruşdum.

– Qadağandır, – dedi, – ancaq buna tək mən yox, heç kəs baxmır. Pilotlarımız ki, heç... Belə getsə, ceyranların nəsli kəsilər.

– Necə məgər? – soruşdum.

– Bir də görürsən təyyarəni aşağıdan sürüb, on-on beşini birdən biçib tökürlər. O dəfə özüm şahid oldum.

Mən Faiqin pulunu götürmədim. Bədirnisa xalaya verməyini məsləhət gördüm. O, həm qənaətlə, həm də ən zəruri şeylərə xərcləməyi bacarırdı. İndiki vəziyyətimizdə hər manatın yerini məndən də, Faiqdən də o yaxşı bilirdi.

Qaynım həmişəki kimi indi də Müdhətin yoxluğunu mənə hiss etdirməməyə çalışırdı. Getməyə hazırlaşanda yenə hamımıza ürəkdirək verdi:

– Nə olaydı, bircə tez qurtaraydı bu müharibə, birbaş Şuşaya gedəydik. – dedi, – çoxdandır, ürəyimiz açılmayıb. İsa bulağında mahnı eşitmək üçün burnumun ucu göynəyir. – O, sözünün axırında təkcə mənə üz tutdu:

– Heç fikir eləmə, Səmirə. Yaman günün ömrü az olar. Məsəl var: "Yetim yaza çıxacaq, qışın pisliyi özünə qalacaq". Bax, bu qızlar da böyüyəcək, Müdhət də qayıdacaq, bədxah adamların yamanlığını özünə qalacaq...

Qızlar iki yandan onun qoluna girib, xiyabanla böyük darvazaya doğru getdilər. Qırx-əlli addımlıqdan dönüb mənə əl elədilər...

Bu dəfə pillələri ölüvay yox, çox gümrah qalxdım. Səidə xanım otağının açıq pəncərəsindən bizi müşahidə eləyirmiş. Dəhlizdə qabağıma çıxıb, adəti üzrə, gülə-gülə məni salamladı:

– Daha kefiniz kökdür, Səmirə xanım, – dedi. Şad xəbər eşitmiş adama oxşayırsınız. Qızların bəzənməyindən bildim ki, daha o günkü kimi qaşqabaqlı deyillər. Ən gözəl dərman elə budur!.. Şükür allaha, indi səhhətiniz lap düzəlib.

Sanki mən də bunu gözləyirdim:

– Madam ki, düzəlib, daha məni niyə saxlayırsınız? – dedim. – Bu gündən məni buraxın gedim evimizə... Sabahdan o uşaqlar qarının ümidinə qalacaq, dərslərinə baxan olmayacaq.

Səidə xanımın təbəssümü dodaqlarında dondu. Deyəsən mənim xahişim onun xətrinə dəydi. "Səni nə vaxt buraxmalı olduğumu özüm çox yaxşı bilirəm" demək istədiyini baxışlarının zəhmli ifadəsindən açıq-aydın oxuyurdum. Ancaq nə isə fikirləşib, mənə cavab vermədi, qoluma girib kabinetinə apardı:

– Əyləşin, – deyə üstünə təmiz döşəkağı salınmış taxta divanı göstərdi. Qan təzyiqimi ölçdu, fonendoskopunun nikelli uclarını qulaqlarına taxıb, ürəyimin döyüntüsünü dinlədi. – Bilirsinizmi, Səmirə xanım, mən özünə möhkəm inanan həkimlərdənəm. Çox nadir hallarda diaqnozum yanlış olur (bunu təvazösizlik hesab eləməyin!) amma ağıl ağıldan üstündür deyirlər. Çıxardığım nəticədə yanılıb-yanılmadığımı yoxlamaq üçün professorla məsləhətləşməliyəm. Əgər o da fikrimi təsdiqləsə...

Xəstəxanadan məhz bu gün çıxıb getmək arzum birdən-birə o qədər gücləndi ki, mən Səidə xanıma yalvarmağa da hazırdım. Onun sözünün axırını dinləməyə də səbrim çatmadı:

– Mən də sizə inanıram, – dedim, – hamı sizi tərifləyir, lap professor özü də... Dərman yazarsınız, neçə gün desəniz içərəm.

– Əgər mənə inanırsınızsa, hələ bir az səbir eləməlisiniz, – dedi. – Mən də, siz də tamam arxayın olsaq yaxşıdır... Hə, o qızların yanındakı oğlan kim idi?

– Qaynım. Faiq. Necə məgər? Xoşunuza gəlmədi?

– Əksinə. Uşaqlarınızla çox mehribandır. Mənim də qaynım var, amma sizdən nə gizlədim, ayda-ildə bir dəfə də qapımızı açmaz. – Onun mənə qibtəmi elədiyini, yoxsa öz qaynından gileyləndiyinimi bilmək çətindi. – Evlidirmi?

– Sizi tanımasaydım, düşünə bilərdim ki, Faiqə vurulmusunuz, – deyə mən zarafat tərzində ona sataşdım.

– Mənim qaynım evlidir, belə görünür ki, arvadı bizim dostluğumuza mane olur... Eh, biz qadınların da canında az yoxdur.

Mən yenə zarafatla dedim:

– Yəni sizin də canınızda var?

– Birində az, birində çox, axtarsan hər qadının canında var... Əvvəlcə bir mənzildə olurduq. Gəlin gələndən on gün keçməmiş aramızda ixtilaf başlandı. Bir-birinə can deyib can eşidən qardaşlar yarım il küsülü qaldılar... Eh, bilmirəm, bu nə söhbətdi, biz başladıq?.. Deməli professorla məsləhətləşəcəyik. Etirazınız yoxdur ki?

Mən kabinetdən pərt çıxdım. "Açığını deməkdən çəkindi, görünür, vəziyyətim o qədər də yaxşı deyil" deyə düşündüm. Əgər belə olmasaydı, Səidə xanım o cür tərəddüdlə danışmazdı. Xəstə insan, bəzən özünü tamam gümrah hiss eləsə də, nəinki doktorun, hətta sadə və sıravi bir adamın ən kiçik təlqinindən də şübhəyə düşür. İndi mən də belə bir hal keçirirdim. Fikrim-zikrim içərimdə cəmlənmişdi. Mənə elə gəlirdi ki, hər dəqiqə yox, hər an zəifləyirəm, yenə çarpayıya uzanmaqdan başqa çarəm qalmamışdır.

Palataya girəndə yoldaşlarımdan biri mənim şübhəmi daha da artırdı:

– Rəngin-ruhun niyə qaçıb, Səmirə bacı?

Mən yerimə uzandım və heç bir söz deməyib yatmağa çalışdım. Əlbəttə, məndə ciddi bir dəyişiklik yox idi. Bunların hamısı yorğunluğun və ən çox da həyəcanlanmağın nəticəsi idi...

Ertəsi gün professor gəldi. Konsilium düzəltdilər. Səidə xanımdan başqa, indiyəcən xəstəxanada görmədiyim bir həkim də var idi. Ucaboy, qaraşın, beli azca donqar, başını ülgüclə tərtəmiz qırxdırmış, uzunsov üzlü bir kişi idi. Səidə xanımdan fərqli olaraq, qaş-qabağını sallamışdı. Onun tutqun sir-sifətinə baxan hər bir xəstə dərhal bədbinləşir və istər-istəməz deyərdi: "Görünür, sağalmağıma heç ümid yoxdur". Ancaq mən yanılmışdım. O, dərin çuxurlarda yaş zeytun dənələri kimi işıldayan gözlərinin bulanıq ifadəsini dəyişmədən soyuq bir inamla dedi:

– Mənim fikrimcə, daha burda saxlamağın mənası yoxdur. Buraxın getsin, Abşeron sanatorilərindən birində təmiz hava alsın. Ən gözəl müalicə Zuğulba tərəfin dəniz havasıdır. Bizim verdiyimiz dərmanların bəzən xeyirdən çox ziyanı var... Royenin normadan yuxarı olmağı, beyin damarlarının sıxılmağı ilə o qədər də əlaqədar deyil. Bədəninin başqa bir yerində iltihab da ola bilər.

– Səmirə xanımın beyin damarları yox, ürək damarları sıxılır... Stenokardiyadan xəstələnib,-deyə Səidə xanım yaşca özündən xeyli böyük olan bu həkimin sözlərinə etiraz eləyəndə, doğrusu, mən istər-istəməz ondan narazı qaldım. Axı, məni burada saxlamaqda məqsədi nədir? Nə üçün mənim azad olunmağıma hər vasitə ilə mane olur?" deyə fikirləşdim. Səidə xanım mənim o qədər də yaxşı anlamadığım bir neçə istilah da işlədib, həkimlə nə səbəbə razılaşmadığını izah eləyir, amma səsini ucaltmırdı. Onları diqqətlə dinləyən professor hələ öz rəyini söyləməyə tələsmirdi. Mənimlə diz-dizə, məhrəm oturmuşdu. Ağır-ağır nəfəs alırdı. Paltarından nə isə çox qiymətli bir ətir iyi gəlirdi. Ortası ağ zolaqlı, uzun və dalğalı saçlarını arxaya daramış, qartal burnunu aşağı sallayıb, əllərini qoynunda çarpazlamışdı. Təkdənbir həkimlərə və mənə qısaca suallar verirdi.

O, nəhayət doğruldu. Böyründəki stuldan tonometrini götürdü. Qalın şüşəli, qızıl çərçivəli pensnesini burnunun ucuna taxıb qan təzyiqimi özü yoxladı. Ürəyimi dinlədi. Mənə elə gəlirdi ki, o, cavabını nə qədər səbirsiz gözləməyimlə heç zərrəcən də maraqlanmırdı. "Bunu niyə hamı tərifləyir? Daş ürəkli adamdan da kardioloq olar?

Elə bu vaxt həkimlərə üz tutdu:

– Ürəyi bir qədər küt döyünür, amma orqanik təbəddülat yoxdur. – Yenə məndən soruşdu: Nədən əsəbiləşmişdiniz?

Mən, bilmirəm neçənci dəfə, xəstəliyimin tarixini danışdım.

– Deməli, iclasda olmayıb? – Onun sualının ahəngindən əsil həqiqəti öyrənmək arzusundan daha çox, incə bir kinayə duyurdum. – Kobud tənqidlərdən əsəbiləşmək halları tez-tez baş verir. Xüsusən axır zamanlarda...

Qadınlardan kim isə qırıq-qırıq güldü, böyrümdəki xəstəyə yavaşcadan dediyi sözləri mən də eşitdim:

– Lap düz deyir. Gör heç demaqoqlardan xəstələnən var?

Konsiliumdan yeni bir şey öyrənmədim. Həkimlərin indi söylədiyi fikirləri, ayrı-ayrı vaxtlarda, ola bilsin başqa sözlərlə, Səidə xanım mənə demişdi. Məni daha çox nəticə maraqlandırırdı.

Professor dazbaş həkimlə razılaşdı:

– Bəlkə siz deyən kimi doğrudan da sanatoriyaya getsin... Ancaq indi sanatoriyalar...

Səidə xanım başını tərpədib, onun fikrini tamamladı:

– Hamısı hərbi xəstəxanadır.

Mən özümü saxlaya bilmədim:

– Səidə xanım, professor da mənim arzuma zidd deyil. Siz nə üçün israr eləyirsiniz? Sanatoriyada yer olsa, bu saat məni ora göndərən kimdir? Siz bu haqda da fikirləşməlisiniz. Göndərsələr də razı olmaram. Yaralı əsgərləri qoyub niyə gərək məni müalicə eləsinlər?

Səidə xanımın gözlərində əsəbi bir qığılcım yanıb-söndü. Mən onun ürəyindən keçəni özümə görə yozdum. "Deyəsən dazbaş həkimlə razılaşdığım üçün əsəbiləşir".

Professor və həkim bizimlə xudahafizləşib getdi. Səidə xanım onları ötürüb, yenə palataya gəldi.

– Siz mən deyənə baxın, Səmirə xanım, inanın ki, ancaq sizin xeyrinizi fikirləşirəm... Sonra peşman olarsınız. Axı, mən neylədiyimi bilirəm... – O, məndən tamam inciyibmiş kimi, üzünü o tərəfə çevirib, xəstələri müayinəyə başladı...

Mən üç gündən sonra yenə dirçəlib həyətə enəndə Kamrana rast gəldim. Köhnə dostlar kimi görüşdük, bir-birimizə əl verdik. Hal-əhval bildik.

– Əliniz nə yaman soyuqdur, – dedim.

Doğrudan da onun əli buz kimi idi. O, mənim sözlərimə şablon bir ifadə ilə cavab verdi:

– Amma ürəyim istidir.

Mən gülümsündüm. O da gülümsündü.

– Səmirə xanım, – dedi, – əlbəttə, mənim sizdən inciməyə haqqım yoxdur. Ancaq sözün düzü yaxşıdır. Lap uşaqlıqdan düzünəqulu danışmağı sevirəm. Diplomatiya işlədənlərdən xoşum gəlmir...

Bu müqəddimədən sonra mən ondan nə isə çox mühüm və ciddi bir söz eşidəcəyimi güman eləyirdim. Amma təxminən düz çıxmadı... Kamran əllərini xalatının cibinə saldı, çoxdan bəri üzünə həsrət qaldığı Quba almasından bir dənə çıxardıb mənə verdi (bu almanı ilin bu vaxtında hardan aldığını soruşmaq istədimsə də, elə bil nitqim tutuldu, dinmədim) və dinləməyə hazırlaşdığım sözlərin əvəzində, tamam başqa bir söz eşitdim:

– Amma xahişim budur ki, Qubanın ağ almasını çox sevdiyinizi hardan və kimdən öyrəndiyimi xəbər almayasınız. Yaxşı?

Qəribə idi. Mən yalnız almanın özünü deyil, bu alma haqqındakı xalq mahnısını da sevirdim, pianoda çalıb-oxumağı da bacarırdım. Bunu Kamran kimdən öyrənmişdi? Ha fikirləşdimsə də, tapa bilmədim. Mən ona təşəkkür elədim.

– Buyurun, nə isə demək istəyirdiniz, – dedim və almanı xalatımın cibinə qoydum.

– O dəfə bizim palataya gələndə, mənim kefimi hamıdan sonra xəbər aldınız. Elə bilirəm ki, bunu mən eləsəydim, sizə toxunardı... Doğru deyirəm, yox?

– Yox, nə üçün toxunsun? Burada mən ehtiyatsız bir şey görmürəm, – dedimsə də, ürəyimdə ona haqq verdim. Palataya məhz onu görmək məqsədi ilə gəldiyimi, amma riyakarlıq eləməyə məcbur olub, əvvəlcə o biri xəstələrin halını soruşduğumu açıb-söyləməyə cəsarətim çatmadı.

Kamran ağır-ağır nəfəs alıb dayandı və əlini sinəsinə qoydu. Bir xeyli dinmədi. Sonra addım-addım irəlilədi və məndən üzr istəyib skamyada oturdu:

– Bir ay bundan əvvəl desəydilər ki, mənim ürəyim xəstələnə bilər, mən qəh-qəh çəkib gülərdim. İndiyəcən ürəyimin hansı tərəfdə olduğunu da bilmirdim dəmir kimi möhkəm idi. “İnsan – zəif məxluqmuş” deyəndə, yadınızdadırmı, müəllim də, o biriləri də mənimlə razılaşmadılar. Bax, bir balaca gəzindim, o saat sinəmdən sancı qalxdı.

– Əyləşin, əyləşin, – dedim və əl yaylığımın ucunda düyünlədiyim nitroqlitserin şüşəsini dərhal çıxarıb ona uzatdım – Buyurun!..

O, dərmandan birini götürüb, dilinin altına qoydu:

– Nahaq yerimdən qalxdım, – dedi və yenə susdu.

Sinəsinin ağrıları azalandan sonra, bizim aramızda uzun bir mükaliмə başlandı:

– Bəzən mənə elə gəlir ki, heç sağalmaq da lazım deyil.

– Bu nə sözdür, yoldaş Kamran?

– Tutaq ki, sağaldım. Hara, kimin yanına gedəcəyəm?

– Evinizə, arvad-uşağınızın yanına!

– Hmm... arvad-uşaq... Mən çox ağır yaralanmışdım. Sağ qolumu dibindən kəsmək qorxusu vardı. Qanqrenadan güclə xilas elədilər. Kaş ki, sağalmayaydım. Ancaq o vaxt həyata qayıtmaq üçün hər şeyə razı idim... Axı, mən onu sevirdim. Ölmək istəmirdim, çünki sevirdim. Məhəbbətin gücünə dair yazılmış dastanlara da inanırdım. Gözüm görə-görə bədənimi doğrayıb tikdikləri zaman da onu yadımdan çıxarmırdım... Vətən məfhumunu öz sevgisindən ayrı təsəvvür eləyənlər də var, amma mən vətən üçün vuruşanda onu yadımdan çıxara bilmirdim. Cərrahın bıçağı altında ağrıdan dişim bağırsağımı kəsəndə, xəyalımda təkcə onun sürəti idi!..

– Axı siz kimi deyirsiniz?

– Necə yəni kimi? Bəs demədim?

– Yox, demədiniz, yoldaş Kamran.

– Arvadımı, həyat yoldaşımı... Bir zamanlar həyatımdan artıq sevdiyim o afəti...

Orta məktəbdə oxuyarkən bizim hamımızın işlətdiyi bu dəbdəbəli ifadələr indi mənə parodiya təsiri buraxırdı. Ancaq mən gülmürdüm, çünki Kamran danışdıqca elə bil içindən od-alov püskürürdü.

– Axı, ona nə olub ki?

– Ölüb... Yəni mənim üçün ölüb... – O, yuxudan yenicə ayılmış kimi gözlərini ovuşdurdu. – Göyümtül dodaqları titrədi. Yox, o ağlamırdı. Göynəyirdi. Birdən qəddini düzəltdi. Əllərini döşündə çarpazladı. – Ancaq mən indi ölmək istəmirəm. – Öz-özünün zəifliyini təkdir edir kimi başını bulayıb susdu, yalnız sonradan-sonraya fikrini tamamladı: – Mən onu çox sevirdim, amma tək onu yox!

– Vətəni?

– Qəribə sual verirsiniz, Səmirə xanım... Vətən üçün iztirab çəkəndə, ona insanın məhəbbəti azalır məgər?

– Yox Kamran yoldaş, – dedim. – Siz mənim sözümü düz başa düşmədiniz... Vətəndən söhbət gedəndə, həqiqi insan öz şəxsi taleyini həmişə unudur. Əgər unutmağı bacarmayanlar varsa, demək onlar mənəvi yoxsul və xudpəsənd adamlardır. Mən sizin barənizdə nə əsasa görə bu cür düşünə bilərəm? Əksinə, mən bu fikirdəyəm ki, siz vətən üçün çəkdiyiniz iztirabların qüdsiyyəti ilə fəxr eləməyə haqlısınız!

– Əlbəttə, fəxr eləyirəm! – deyə Kamran tamam dəyişmiş səslə, dəruni bir həyəcanla cavab verdi və mənə elə gəldi ki, bu sözləri məndən eşitdiyi üçün daha çox sevinir, ağrılarını unudub özünü nə isə daha böyük və daha yüksək bir aləmdə hiss eləyir, elə bir aləm ki, onun qarşısında insanın şəxsi iztirabları son dərəcə kiçik və əhəmiyyətsiz bir şey kimi görünür.

Kamran yerindən qalxdı. Dərindən nəfəs alıb irəlilədi. Deyəsən ağrıları kəsilmişdi. Daha mən ona baxmırdım, amma nə isə deməyə hazırlaşdığını hiss eləyib, onunla yanaşı addımlayırdım.

Cənub küləyi əsirdi. Bağçanın yaşıllaşmış körpə çinarları azacıq əyilib, sanki yerə baş əyir, yenə düzəlir, yarpaqlarının xəfif pıçıltısı eşidilirdi. Bizim yaxınlaşdığımızı görən boz sərçələr budaqlardan pırıltı ilə qalxaraq, bir az o yanda yenə ağaclara qonur, daha böyük

həvəslə yenidən civildəməyə başlayırdılar. Kamran gözlərini onların ardınca zilləmişdisə də, fikri tamam başqa yerdə idi. O, azacıq sonra mənim bu təxminimi təsdiqləyən bir sual da verdi:

– Siz necə bilirsiniz, Səmirə xanım. Müdhət sağ-salamat qayıtsa, çox dəyişəcək, eləmi?

Mən tutuldum. Əvvəlcə deməyə söz tapmadım. Həm sualının mənasını, həm də mənim cavabımdan sonra nə deyəcəyini fikirləşdim: "Bu məsələ sizi nə üçün maraqlandırır?" – deyə soruşmaq istədim. Kamran mənə inadla baxırdı. Yəni kirpiklərini qırpmadan, sualına cavab almamış məndən gözlərini çəkməyəcəyini bildirən bir ifadə ilə baxırdı. Elə bil mənim sözlərimdən məyus olmaq qorxusu onu bərk narahat eləyirdi.

– Fikriniz mənə aydın deyil. Necə məgər? – dedim. – Əgər Müdhətin bu qədər sarsıntıdan sonra qocalmağını, saç-saqqalının ağarmağını nəzərdə tutursunuzsa...

Kamran başını buladı:

– Yox, yox, demək istəyirəm ki, yəni onu haqsız cəzalandırıblarsa, küskün qayıdar, necə bilirsiniz?

Başqa təbirlə, əgər Kamran Müdhətin məhz narazı qayıdacağını güman eləyirdisə də, deməli, onu özündən qat-qat zəif bir adam sayırdı. Belə çıxırdı ki, o, vətən yolunda çəkdiyi iztirabların bihudə olduğunu görüb, inkisar xəyala uğrayacaq, min cür məhrumiyyətə nahaq dözdüyünü başa düşüb, ideallarından əl çəkəcək, daha əvvəlki kimi ürəkdən çalışmayacaqdır. Əlbəttə, mən bunu təsəvvürümə gətirə bilmirdim. Kamran, sanki, hansı bir məqsəd üçünsə, mənim ümid və arzularımı alt-üst eləmək üçün belə deyirdi. Mən ona sərt və kobud bir söz qaytarmaqdan güclə özümü saxladım, bacardığım qədər mülayim dedim:

– Yox, siz Müdhəti yaxşı tanısaydınız, onun barəsində heç vaxt belə düşünməzdiniz. Olsa-olsa, Müdhət onu cəzalandıran adamlardan narazılıq eləyə bilər. Bu da çox təbiidir. Axı, məsələ burasındadır ki, siz də, mən də onun işinin təfsilatından xəbərsizik. Mən onun qəsdən ziyanlı bir addım atdığına inanmıram. Ola bilər, qeyri-ixtiyari elə bir səhv buraxıb ki, bunun ziyanlı nəticəsi üçün ağır cəzaya məruz qalsın. Siz daha yaxşı bilərsiniz. Cəbhədə belə şeylər olur, ya yox?

Kamran, yəqin ki, mənim səsimdə, özüm istəməyə-istəməyə büruzə verdiyim əsəbi nidaları duyurdu və Müdhətin sədaqətinə şübhə ilə yanaşdığını mənə söylədiyinə müəyyən dərəcədə peşman da

olmuşdu. Amma artıq gec idi. Oxu atıb, yayını gizlədə bilməzdi. Mən sualımı ucadan, israrla təkrar elədim:

– Düzünü deyin görüm, o cür şeylər olur, olmur?

– Əlbəttə, olur, – dedi. Bəzən kiçik bir səhvin nəticəsi bizə ən böyük xəyanətdən də çox ziyan verir. Bu cür hallarda hərbi tribunal tərəddüd köstərmir, ağır cəza tədbirlərinə əl atır. Müharibənin özü kimi, qanunları da sərtdir.

Mən daha heç nə demədim. Aramızda xeyli sükut oldu. Kamran mənim üzümə artıq məyus və xəfif bir təbəssümlə baxırdı. Bilmirəm, bəlkə də o, mənə başqa bir söz deməyə hazırlaşırdı, amma zahirən mülayim, əslində isə qəzəblə verdiyim cavabdan pərt olub susurdu. Sonralar, o, mənə ürəyini açıb-söyləyəndə mən xəstəxana həyətində gəzinə-gəzinə elədiyimiz bu xoşagəlməz söhbəti bütün təfsilatı ilə xatırladım və belə düşünərkən o qədər də yanılmadığımı gördüm.

– Xəstəxanadan nə vaxt çıxırsınız? – deyə Kamran aramızda heç nə olmamış kimi təzədən sözə başladı.

– Bir-iki gündən sonra.

– Bəlkə dediklərim qəlbinizə toxundu?

– Yox, yox, qətiyyən!

Kamranın üzündəki dalğın kədər birdən-birə silinib yox oldu. Ancaq çox keçməmiş yenə tutqunlaşdı.

– Görürəm, Müdhət barədə sualımdan çox narazı qaldınız... Ancaq mən bu sualı pis məqsədlə vermədim.

– Yaxşı ya pis, hər halda sözünüzdən belə çıxdı ki, Müdhət dönüklük də eləyə bilər, hətta xəyanət yoluna da düşə bilər. Deməli onu haqlı olaraq sürgünə yolladıqlarına da şübhəniz yoxdur.

– Siz nə danışırsınız, Səmirə xanım? Bu cür düşünməyə mənim nə haqqım var?.. İndi mənə bircə şey aydın oldu ki, siz sarıdan o çox xoşbəxtdir.

– Onu deyə bilmərəm.

– Siz demirsiniz, amma mən deyirəm. Müdhətin yerinə mən olsaydım, belə vəfalı sevgilim olduğunu görüb, heç nəyi vecimə almazdım!..

Kamran belə dedikcə, onun sözlərinin ahəngindən oxuduğum kədərli qibtədən sevinməyə başlayırdım. Hesabla gərək mənim onu görən gözüm olmayaydı, çünki, o, dünyalar qədər sevdiyim, günahsız olduğuna bir an da şübhə eləmədiyim, vətəninə və ideallarına fanatikcəsinə sadiq bildiyim Müdhətə toxunmuşdu, ancaq o, bir neçə kəlmə

ilə məni tərifləyəndən sonra elə bil nə o bundan əvvəlki ağır sözləri demişdi, nə də mən ondan incimişdim. Biz qadınların qəlbində hələ də kəşf olunmamış sirlər az deyil. Kim bilir, bəlkə bu da bizdəki xudpəsəndliyin təzahürlərindən biri idi? Axı, hansı qadında, rüşeym halında olsa da, buna bənzər qüsurlar yoxdur? Onlardan bəzilərini mənəvi və cismani məziyyətlərinə görə mələk adlandıranlar, burda həqiqətdən çox nə isə gələcək bir ideal və arzunun təcəssümünü görmək istəmirlərmi?

Mən bu görüşümüzdən sonra, demək olar, hər gün Səidə xanımdan soruşurdum:

– Məni nə vaxt buraxırsınız?

Soruşurdum, amma heç vaxt ondan cavab ala bilmirdim. O, özünü həmişə tibbi müayinə ilə məşğul göstərirdi. Mənim sözlərimi qəsdən eşitməməzliyə vurduğu gün kimi aydın idi. Bəzən mənə elə gəlirdi ki, o, xəstəliyimin ağırlığını qəsdən gizlətmək istəyir və bunu mənə söyləməyin çətin məcburiyyətindən yaxasını kənara çəkirdi. Nəhayət, mən dözmədim, onu dəhlizdə yaxalayıb təklədim, nə üçün suallarımı cavabsız qoyduğunu israrla xəbər aldım.

– Doktor, – dedim, – bəlkə də bu, mənim tərəfimdən bir növ nəzakətsizlikdir. Deyə bilərsiniz ki, sizin işinizə qarışıram, sizə bir növ təzyiq göstərirəm. Ancaq siz də gərək mənim vəziyyətimi başa düşəsiniz. Neçə vaxtdır uşaqlarım başsız qalıb, onların yeməyinə, içməyinə, dərslərinə nəzarət eləyən yoxdur. Hələ mən onu demirəm ki, bir böyrü üstə çarpayıda yatmaqdan, hər gün xəstəliyə dair eyni adamların söhbətini dinləməkdən, eyni dərmanları içməkdən təngə gəlmişəm. Axı, mən bu könüllü həbsxanadan mümkün qədər tez qurtulmaq istəyirəm. Bəs siz nə vaxt məni buraxacaqsınız?

– Necə, necə? – deyə Səidə xanım, indiyə kimi onda görmədiyim sərt və acıqlı bir hal aldı. Gözlərimin içinə baxmaqdan çəkinib, ayaq saxladı. – Könüllü həbsxana? Oh, sizdən qorxmaq lazımdır. Necə də zəhərli sözlər tapırsınız!

– Əgər bu sözdən inciyirsinizsə, başqasını deyə bilərəm, yaxşı, qızıl qəfəs olsun, baği-cənnət olsun, istirahət evi olsun... Necə istəyirsiniz elə deyim... Əgər mənim vəziyyətim ağırdısa, onu da məndən gizlətməyin. Axı, düzünü bilsəm, bundan mənə xeyir gələr ki, ziyan gəlməz. Bilməsəm, qorxuram, təzədən yıxılam, bir də qalxmayam.

O, sanki artıq şux təbəssümü, üzgün və məmnun baxışları ilə xəstələrə fərəh təlqin eləyən o gözəl Səidə xanım deyil, insanlara qətl hökmü verəndə kirpikləri də titrəməyən qəzəbli bir firon idi!

O, mənim əlimdən sivişib çıxdı, dəhlizlə irəlilədi və arxaya baxmadan cavab verdi:

– Düzünü bilmək istəyirsiniz? – deyə birdən dabanı üstə geriyə fırlanaraq sözləri pulemyot gülləbləri kimi yağdırdı: – Düzü budur ki, indiki halda mən sizi heç yana buraxan deyiləm. Səbr eləməlisiniz. Səbr!.. Bəlkə tərcümə eləyim?.. Yəni dözməlisiniz. Tamam yaxşı olun, sonra... – O, təkrar yoluna düzəldi və yenə mənə üz tutdu: – uşaqlarınızın taleyini düşünürsünüzsə, ilk növbədə öz taleyinizi düşünməlisiniz!

Yox, o, məndən nəyi isə gizlədirdi. Hərəkətindən, danışıq tərzindən və mənimlə öz arasındakı məsafəni bu cür uzadıb, hər vasitə ilə baxışlarını məndən gizlətməyindən bilinirdi ki, məni xəstəxanadan buraxmaq istəməməyinin səbəbi yalnız naxoşluğum deyil. Mən özümü doğrudan da yaxşı hiss eləyirdim. Neçə gündən bəri ürəyim ağrımırdı. Professorun "orqanik təbəddülat yoxdur" sözlərini eşidəndən sonra tamam inanmışdım ki, əgər hər xırda şeydən ötrü əsəbiləşməsəm, özümü tox tutmağı bacarsam, əlbəttə müalicə sayəsində elə qorxulu bir şey qalmadığını öz-özümə təlqin eləsəm, uşaqlarımın yanına qayıdıb, işləyə də bilərəm.

Bunu demək üçün Səidə xanımın ardınca kabinetə girdim:

– Doktor, bu saat çıxıb getməyim məsləhətdir.

Onu inadından döndərmək nə qədər çətindi.

– Dedim, qurtardı! Məsləhət görmürəm, vəssalam! Sonra peşman olacaqsınız! Heç kəsin də sizə köməyi dəyməyəcək!

– Necə peşman olacağam?

– Xəstəxanadan çıxdığınıza! "Könüllü həbsxanadan" azad olmağınıza!.. Aydındırmı?

– Yox, aydın deyil. Mən bunun səbəbini bilmək istəyirəm. Nə üçün bunu hərbi sirr kimi məndən gizlədirsiniz?

O, nəfəsi daralmış kimi dərindən köksünü ötürdü:

– Səmirə xanım, – dedi, – nahaq yerə özünüzə də, mənə də əzab verirsiniz. Bəli, əzab. Axı, nəzərə almalısınız ki, mənim ürəyim daşdan deyil, mən də insanam, həm də o qədər də pis insan deyiləm... Məndən

asılı olmayan bir şeyi niyə məndən tələb eləyirsiniz? Sizi buraxmağa mənim nə ixtiyarım var?

Onun gözləri dolmuşdu. Bir az da belə getsəydi, ağlayacağına şübhəm yox idi. “Gizlidir, nəyi isə məndən gizlədir” deyə xəyalımdan keçirdim və sürətlə otaqdan çıxıb, baş həkimin yanına getdim. O da eyni sözləri dedi:

– İsrar eləməyin, Səmirə xanım. Əgər mən sizin yaxşılığınızı istəmirəmsə, dünyada məndən pis adam yoxdur. Axı, siz niyə elə düşünürsünüz ki, xəstələri vaxtından artıq saxlamağa bizim həvəsimiz var? Əksinə, bu qətiyyən bizim xeyrimizə deyil, cəbhədən gələn yaralıları müalicə üçün çarpayılarımız hər yerdə çatışmır...

Yalnız sonralar, evimizə qayıdanda bildim ki, bu adamlar doğrudan da məni gözləyən fəlakəti bilirmişlər və məqsədləri də tək məni yox, həm də uşaqlarımı həmin fəlakətdən yayındırmaq imiş...

Mən xəstəxanadan çıxanda Səidə xanım palatanın qapısı ağzında dayanmışdı. Əgər ondan olsaydı, yenə də bir xeyli məni palatasında saxlardı, ancaq indi dediklərinə görə tamam sağalmışdım, konsilium da bir səslə bu fikrə gəlmişdi. Səidə xanımın incə, qansız dodaqları tir-tir əsirdi. Ən yaxın dostlarından biri edama aparılan və onun xilası üçün hər vasitəyə əl atıb, ən axırda əlacsız qalan insan kimi qəddi bükülmüş halda baxırdı, gözləri dolsa da, nə isə qüvvətli daxili bir müqavimətin gücünə özünü ağlamaqdan saxlayırdı, lakin sonsuz kədərini gizlədə bilmirdi. Mən artıq hiss eləyirdim ki, burda mənimlə tanış olmuş həkimlərin hamısı Səidə xanımın bildiyi o müdhiş fəlakətdən xəbərdardır, hamısı da mənə rəğbətlə yanaşır.

Çox ola bilər ki, mən bunu sonralar başıma gələn hadisələrin təsirilə indi uydururam, ancaq bir həqiqət var ki, Səidə xanımın əllərini sıxanda ondan eşitdiyim “mən də, yoldaşlarım da çox əlləşdik, mümkün olmadı” sözlərini yaxşı xatırlayıram. Deməli onlar məni xəstəxanadan çıxarmağa məcbur edilmişdilər. (İndi bunu qəti deyirəm, çünki Səidə xanım, əhvalatı mənə müfəssəl danışmışdır. Yeri gələndə, mən də sizə danışacağam!).

Mən evə çatanda və məktəbdən qayıdan uşaqlarımı görəndə ürəyimə nə isə çox ağır və gözlənilməz bir kədər qondu. Qayınanam evdə yoxdu. Qapının açarını qonşuya verib, özü harasa getmişdi. Qızlarım da mənim evə qayıtmağımdan məmnun deyildilər. Doğrusu, ilk dəqiqələrdə bərk tutuldum. Gözləyirdim ki, hər ikisi üstümə atılıb məni

bərk-bərk qucaqlayacaq, bəlkə də sevinclərindən ağlayacaq. Mənim düşündüyüm və gözlədiyim kimi olmadı. Onlar tutqun və kədərli idilər. Hətta üzümə baxmaqdan belə qorxurdular. Nə qədər sual-cavaba tutmaq istədimsə də "heç...elə bir şey yoxdur" deyib durdular. Sanki aralarında şərt bağlamışdılar.

– Bəlkə atanızdan bir xəbər var?

– Yox.

– Məktub göndərməyib?

– Yox.

– Zəfər dayınızdan necə, hələ buraxılmayıb?

– Yox.

– Bəs Tövsiyə xalanı necə, görməmisiniz?

– Yox.

– Ay qız, – deyə Rəhilədən soruşdum: – Yalan danışmağa da öyrəşmisiniz?

– Ana canı, yox, – deyə hər ikisi birdən cavab verdi.

– Yaxşı, əgər bir səbəb yoxdursa, niyə qaşqabağınız yer süpürür?

– Heç... Elə bir şey yoxdur, – Kəmalə otağın bucağında kitablarını çantadan çıxarıb, stolun üstünə düzdü. – Nənəm gələr, ondan soruşarsan.

Bədirnisa xalanı gözləməkdən gözümün kökü saraldı. Dəqiqələri saymaqdan yorulmuşdum. Qızlar məndən yaxalarını qurtarmaq üçün, tez-tez həyətə cumurdular. Qəhər məni boğurdu.

Axşamüstü Bədirnisa xala gəlib çıxdı. O da məni görəndə qaşqabağını salladı. Evimdə bu cür qarşılanmağımın səbəbini fikirləşəndə, Müdhətin başına nə isə daha ağır bir bəla gəldiyini yəqin elədim. Az qala qayınanamın üstünə qışqırdım:

– Yoxsa oğlundan təzə bir xəbər var, nə üçün məndən gizlədirsiniz?

– Qızım, Səmirə, – dedi, – səni niyə buraxdılar? Axı mən srağagün Səidə xanımın yanına getdim, yalvarıb-yaxardım, dedim ki, çalış, gəlin bir neçə gün də yatsın, bəlkə ara soyuya, yaddan çıxa.

– Nə yaddan çıxa, arvad?

Mən hər dəfə əsəbi və həyəcanlı sualımı verdikcə, qayınanam da, qızlar da, elə bil xəcalətdən utanıb yerə keçir, hər dəfə bir bəhanə ilə gözlərini ora-bura dikirdilər. Hiss olunurdu ki, əsil həqiqəti açıb-söyləmək üçün əzab-əziyyət çəkirdilər. Nəhayət mənim çılğınlaşdığımı görən arvad, deyəsən təkrar xəstələnə biləcəyimdən qorxub, tutula-tutula, hər sözündən sonra udqunaraq dedi:

– Səmirə, qızım, allahdan gizli deyil, səndən niyə gizlin olsun? O gün iki adam dəniz qırağından gəlib səni soruşdu, – qarı dil-dodağı əsə-əsə, gözlərini yenə yerə zillədi. – Xəstəxanada yatdığını biləndə, "yaxşı, sonra gələrik" dedilər, "ancaq onu xəbərdar elə, Bakıdan kənara çıxmasın". Tez də getdilər. İstədim soruşam "Hara aparacaqsınız, niyə aparırsınız?". Ancaq özümü elə itirdim ki, sualım da yadımdan çıxdı. Gülnisanın yanına getdim, əhvalatı ərinə danışdım. Yazıqların qanı bərk qaraldı. Gülnisa ağlayıb-sıtqadı. Gülnisanın əri kiməsə telefon eləyib getdi, iki saatdan sonra qayıtdı. Dedi ki, "Xala, söz aramızda, böyüklərdən birinin yanındaydım. İnsafən məni hörmətlə qarşıladı, gömək eləməyə söz verdi, ancaq çox ümidsiz danışırdı. Mən belə başa düşdüm ki, yuxarıdan göstəriş var, yəqin Mollayevdən..." İndi də onun yanındaydım, dedi ki, "söz verən adam heç bir şey eləyə bilmədi, Mollayevdə əmr var, tək Səmirə deyil, çox adam onun günündədir". Yazıq uşaq kimi kövrəldi... Gülnisa məni ötürəndə dedi ki, Səmirənin əhvalatını eşidəndən bəri kişinin yuxusu göyə çəkilib, gecələr ürəyinin ağrısından şikayət eləyir. Müdhətin də, sənin də canına and olsun ki, dəniz qırağından gələn o kişiləri görəli, allahın yuxusu nədir ki, onun da üzünə həsrət qalmışam. Hər dəfə qapı döyüləndə, elə bilirəm ki, yenə onlar gəlib... – Qarı gözünün qorasını sıxdı. – Heç belə də hərəkət olar? Uşaqların atasını tutublar. Yaxşı, buna ölüm-zülüm dözürük. Bəs anadan nə istəyirlər? Lemsiyə yesir düşəni sürgün eləmisən, buna sözümüz yox. Günahkar bilmisən, cəza vermisən, yaxşı, olsun. Axı, bəs arvadının günahı nədir?

O, nə isə deyəcəkdi ki, sözü ağzında qaldı. Döyülən qapının səsini eşidib, səksəndi. Qeyri-ixtiyari gözünü sol tərəfə zillədi. Mən yalnız sonradan-sonraya dilləndim:

– Kimdir? Buyurun!..

Tanımadığım bir nəfər içəri girdi. Onun arıq, uzun yanaqlarının əzələləri elə bil gipsdən tökülmüş, gözləri şüşədən qayrılmışdı. Əgər dodaqlarını tərpətməsəydi, canlı bir insan olduğuna inanmaq çətindi. O, qapı ağzında göründüyü ilk anlardan, məni tanıdı. Əvvəlcə mənə elə gəldi ki, bu cür sir-sifətin sahibi o dəqiqə kobud bir söz deyəcək, mənim ləyaqətimi qəsdən təhqir edəcək, qaba əllərilə evin altını üstünə çevirəcək, əgər dinib-danışsam üzümə tərs bir sillə də vuracaq və bu hərəkətlərindən necə mənəvi bir zövq aldığını nə məndən, nə də ailə üzvlərindən gizlədəcək. Onun qəzəblə düyünlənmiş seyrək

tüklü qaşlarından, soyuq və rəhmsiz baxışlarından, ən çox da şalban kimi dümdüz duruşundan aldığım ilk təəssürat, məni tanıdığı dəqiqədən tamam dəyişdi, elə bil nə zamansa, nə üçünsə onun üzünə taxılmış maskanı, gö zəgörünməyən məchul bir əl qeyri-adi sürətlə, bacarıqlı hoqqabaz məharəti ilə götürüb kənara atdı. Mən qarşımda tamam başqa bir adam gördüm və dərhal anladım ki, onun baxışlarındakı soyuq rəhmsizlik, əsil təbiətindən doğmur, mövqeyinin, vəzifəsinin tələbindən doğur, ona əmr verib mənim dalımca göndərən adamın iradəsinə qeydsiz-şərtsiz itaət göstərmək məcburiyyətindən doğur. Onun hər an mehribanlaşan, nə isə daxili bir işıqla durulan gözlərində elə bil bu sözlər oxundu: " bax, mən də sizin kimiyəm, qorxmayın". Mən onu da hiss elədim ki, bu saat mənə deməyə hazırlaşdığı sözlər ürəyindən gəlməyəcək; əgər azca imkan tapa bilsəydi, elə qapının ağzındaca üzr istəyib geri dönərdi və gedib rəisinə deyərdi: "Səmirə Aydını tutub gətirməyə vicdanım yol vermədi". Lakin o, içini gəmirən əzab və işgəncəni zor-güc boğub, tutqun və azca titrək səslə məndən soruşdu:

– Səmirə Aydın sizsiniz?

Bu sualı verəndə də hiss olundu ki, o, məni tanıdığı halda yalnız rəsmiyyət xətrinə bunu da xəbər almağa və mənim cavabımdan sonra əsil mətləbi açıb-deməyə məcburdur.

– Bəli, mənəm, – dedim.

– Elə isə yığışın, mənimlə gedəcəksiniz!

– Hara?

O, kitelinin döş cibindən dörd qatlanmış bir kağız çıxartdı. Oxumamış da bilirdim ki, orda yazılmış sözlər mənim barəmdədir.

O dedi:

– Buyurun, əmr əmrdir, vətəndaş Aydın. Yalnız siz gedəcəksiniz. Uşaqlarınızı qohum-əqrəbanızın yanında qoya bilərsiniz...

– Onları da özümlə aparmaq istəsəm necə?

– Onlar haqqında orderdə heç nə yazılmayıb.

– Birdən aparmaq istədim? – Mən bu sözləri nə üçün dediyimi özüm də bilmirdim. – Məsləhət tərzində deyirsiniz, yoxsa əmr belədir?

– Uşaqların barəsində nə orderdə yazılıb, nə də şifahi deyilib. Bu, həm sizin, həm də onların xeyrinədir. – O, mülayim danışmağının birdən fərqinə varmış kimi geriyə sarı boylandı və heç kəsin onu eşitmədiyini yəqin eləyib, üzünü yenə bəriyə çevirdi. Bu vaxt kədərdən dodaqları

əyildi: – Bunu deməyə ixtiyarım yoxdur, amma deyəcəyəm, Səmirə xanım. Axı, hər halda mən insanam. Mən də oğul-uşaq atasıyam. Sizə də, qızlarınıza da əziyyət olar...

Məndən başqa hamının gözü dolmuşdu. Rəhilə isə artıq hönkürməyə başlamışdı.

Kəmalə boynuma sarıldı. Onun da çiyinləri qalxıb-endi. Mən onlara təsəlli vermədim. Nə deyə bilərdim ki? Qayınanam ağlamırdı. Əgər ağlasaydı, daha yaxşı olardı. Qəhərdən boğulduğunu açıq-aydın duyurdum. Rəhilə də boynuma sarıldı. Mən onların qolları arasından çıxmağa məcburdum: kişi məni gözləyirdi, onun şəfqətindən sui-istifadə eləməyə özümü haqlı bilmirdim.

– Yaxşı, – dedim, – bəsdir, qızlar. Bilirəm ki, əziyyət çəkəcəksiniz. Ancaq yadınızda saxlayın. Atanız da günahsızdır, mən də. Nənənizə hörmət eləyin, dərsinizə yaxşı fikir verin. Biz hamımız hökumətimizə çox borcluyuq. Gərək ömrümüz boyu bu borcumuzu ödəyək. Ac da qalsanız, susuz da, bu bizim ucbatımızdan deyil.

Kişi üzünü o tərəfə tutmuşdu. Mən ona müraciət elədim:

– Özümlə nə götürə bilərəm?

– Pal-paltar. Yəni don, jaket, palto, hər halda isti olsun. Bir az yemək götürün. Pulunuz varsa, pul da götürün.

Qayınanam küncdə qurdalanmağa başladı. Bağlama düzəldib çarpayının üstünə qoydu. Axırıncı pullarını yaylığa büküb mənə verdi. Mən bağlamanı götürdüm. Köhnə paltomu qolumdan asdım. Nə isə bir söz deməli idim. Dedim:

– İndiyəcən bəlkə də bir az ümidim vardı, fikirləşirdim ki, gec-tez Müdhəti buraxarlar... Əlbəttə, yanılmışam. Salamat qalın.

Qayınanam məni öpdü. Xeyir-dua verdi:

– Heç naümid olma, qızım, – dedi, – bu Süleyman dünyasıdır.

– Gedək, – deyib qapını açdım və sürətlə çıxdım.

Dəhlizdə qonşular məni gözləyirmiş. Hamısı qoca arvadlardı. Hərəsinin əlində bir şey vardı. Kimisi pul, kimisi yemək şeyi, kimisi də isti paltar təklif eləyirdi:

– Al, Səmirə!

– Götür, qızım!

– Kasıbın olanından!

– Gümanım bircə bu üzüyə gəlir, apar, qürbət yerə gedirsən...

– Sağ olun, çox razıyam! – deyib, boğazıma tıxanan qəhəri udaraq, arxama baxmadan uzaqlaşdım. Qayınanam, qızlarım, qonşularım səssizcə ağlayırdılar. Mən dözməli idim. Dözürdüm. Mən günahsız olduğumu bilirdim, bu səbəbdən də başımı dik və məğrur tutub gedirdim. Mən indi üzüağ, alnıaçıq bu sözləri deməkdə haqlı idim: "Əvvəllər düşündüyüm qədər də zəif deyiləmmiş!.."

Məni dəniz sahilinə, sərnişin gəmilərinin dayandığı körpüyə gətirdilər. Burda iynə salmağa yer yox idi. Məni gətirən adama üz tutdum:

– Evə xəbər verib, hara göndərildiyimi deyə bilməzsinizmi?

– Deyərəm, vətəndaş Aydın!

– Çox təvəqqe eləyirəm, uşaqlarım da, qayınanam da zəhmət çəkib məni axtarmasınlar.

– Deyərəm, vətəndaş Aydın!

Körpüyə təpilmiş adamlardan bəzisi əlində bağlama, bəzisi də balaca çamadan və ya sakvoyaj tutmuşdu. Ötürməyə gələnlərdən heç kəsi gəmiyə buraxmırdılar. Bir-birini çağıranların səs-küyündən ağız deyəni qulaq eşitmirdi.

Məni gətirən kişidən soruşdum:

– Bizi hara aparırlar?

O, mənə cavab vermək istəyəndə göyərtədən bir qadının mahnı səsi ucaldı. Çox keçməmiş hay-küy azaldı və nəhayət bütün sahilə qərib bir sükut çökdü. Hamı gözünü dolandırıb, onu axtarmağa başladı. Mən ayaq saxladım. Arxamca gələn kişi də dayandı. Qadın, görünür qəsdən, kiminsə ürəyini yumşaltmaq üçün həm zilə çəkir, həm də son dərəcə qəmgin sözlər oxuyurdu. Çoxumuz onun konsertlərdə məharətlə ifa elədiyi muğam və şikəstəni az dinləməmişdik...

Məni gətirən adamla bərabər irəli keçdim. O, mənim yanımca göyərtəyə qalxdı. Nə isə bir söz demək istədiyini hiss elədim, amma yenə mən soruşdum:

– Bizi hara aparırlar?

O, gözlərini yerə dikdi:

– Orta Asiyaya, – deyə pıçıldadı. Necə çətin danışdığını gizlədə bilmirdi. O, bizim evə gəldiyi anda üzünə taxdığı maskanı yenidən nə qədər bərpa eləməyə çalışırdısa da, bacarmırdı. Heç şübhəsiz müğənni qadının Qarabağ şikəstəsi onu da qəhərləndirmişdi. Mən çox istərdim ki, bu dəqiqə bir belə adamın hansı uğursuz səbəbdənsə yurdundan, yuvasından ayrı düşməyində özünün şəxsən günahı olmayan bu kişi-

nin mərhəmətindən istifadə elədim, onun məsləhəti ilə fürsət tapıb uşaqlarımı, qayınanamı görüm, məni hara göndərdiklərini onlara söyləyim. Ancaq buna daha imkan yox idi. O, razılıq versəydi də mənim ürəyim gəlməzdi. Öz xeyrim üçün onu bədbəxt eləyə bilməzdim. Mən yalnız bunu dedim ki:

– Sizə bir zəhmət də verəcəyəm.

O, kiminsə bizim aramızdakı söhbəti eşidəcəyindən ehtiyat edir kimi ağır və durğun baxışlarla ətrafını yoxladı və dodaqlarını səssizcə tərpətdi. Mən başa düşdüm ki, bununla mənə "buyurun" deyir.

Müğənninin yanıqlı nidaları məni də qəhərləndirmişdi. Hönkürmək üçün ən cüzi bir işarə də kifayət idi. Ancaq mən nə isə mənəvi bir istinad nöqtəsi tapıb kədərimə güc gəldim və son xahişimi də söylədim:

– Əgər mümkünsə, hara göndərildiyimi evimizə xəbər verin. Bütün ömrüm uzunu sizə minnətdar olaram.

Bu vaxt tanımadığım bir adam ana salam verib keçdi. Məni gətirən kişi üz-gözünə bayaqkı mehribanlığı ilə heç uyuşmayan qəddar bir ifadə verib, əlinin sərt hərəkəti ilə havanı yardı, boğunuq bir səs çıxartdı:

– Siz məni nə bilmisiniz, vətəndaş Aydın? – O, məndən aralandı və axırıncı sözünü yenə səssizcə pıçıldadı: – Yaxşı...

Gəmi uzun bir fit verdi. Dəmir dirəyə bağlanmış yoğun kəndiri açdılar. Məni gətirən kişi, saymazyana (amma diqqətlə) yan-yörəsinə baxa-baxa, kirpiklərini qırparaq, yalnız mənim hiss elədiyim nazik bir işarə ilə mənə "Uğurlu yol" arzuladığını bildirib, körpüyə endi və arxaya baxmadan izdihamın arasında gözdən itdi...

## AYRILIQ

Xəfif və bürkülü bir dumana bürünmüş Bakı da, sakit-sakit ləpələnən mavi Xəzər də heç vaxt mənim üçün bu qədər əziz olmamışdı. Gəmi sahildən uzaqlaşdıqca, mən doğma şəhərimi necə sonsuz bir məhəbbətlə sevdiyimi həqiqi mənada elə bil yalnız indi dərk eləməyə başlayırdım. Ondan ayrılıb getdiyimə bir növ inanmırdım. Mən bir daha buraya qayıdıb-qayıtmayacağımı bilmirdim. Qalın kül altında qalmış gözləri qəfildən əsən külək necə üzə çıxarırsa, gözlənilməz ayrılıq da insanın ürəyinin hansı guşəsində isə gizlənmiş məhəbbəti o cür üzə çıxardır.

Mən gəminin göyərtəsində sıxlaşmış adamların arasında dəmir məhəccərə söykənib şəhərə baxırdım. Yarımdairə halında boyunbağı kimi sahili çevrələmiş və göz işlədikcə uzanıb gedən Bakının əzəmətini sanki yalnız indi duyurdum. Mən bu şəhərdə doğulmuşdum. Atam-anam da buralı idi. Mən onların yeganə övladı idim. Gəmi sürətini artırıb sahildən uzaqlaşdıqca, həyatımın səhifələri gözlərim qarşısında ağır-ağır vərəqlənirdi. Atam bütün ömrü boyu neft mədənlərində işləmişdi. Adicə fəhlə idi. Özü savadsız olsa da, məni oxudub boya-başa çatdırmaq üçün hər əziyyətə qatlaşmışdı. Gözlərimi dünyaya açandan sonra özümü də, ata-anamı da şəhərin dağlı məhəlləsindəki birmərtəbəli, alçaq və təkpəncərəli daxmada görmüşdüm. İndi mən istər-istəməz o məhəlləni, o daxmanı axtarırdım. Otuz üçüncü ilə kimi yaşadığımız bu qaranlıq daxma, əlbəttə, çoxdan sökülmüşdü. Əgər ona toxunmamış olsaydılar da, buradan, dörd-beş kilometrlik məsafədən onu görmək mümkün deyildi. Yeni, uca binalar içərisində təkəm-seyrək daxmalar, indi şəhərin gözəlliyinə xələl gətirən bozumtul-qara ləkələr kimi əriyib gedirdi. Ancaq mən öz daxmamızı elə bil indi də görürdüm, onu mən həyatımın son dəqiqələrində belə unuda bilməyəcəkdim, çünki mən divarlarımın dibi həmişə rütubətçəkən, taxta-şalbanlarını qurd yeyib deşik-deşik eləmiş bu qədim daxmada bütün ömrümün ən dərdsiz-qəmsiz illərini yaşamışdım. Bax, elə bu dəqiqə də, işdən yorğun-arğın qayıdıb döşəmədəki həsir üstündə uzanan atamı, onun cadar-cadar olmuş ayaqlarını yumaq üçün aftafa-ləyən gətirən anamı görürdüm. Özü də elə bil onların ölümündən on bir il keçməmişdi... Ah, ey mənim əziz qocalarım, yaxşı ki, siz Çəmbərəkəndin sarımtıl torpağı altında rahat yatırsınız, qızınızın bu acı sərgüzəştindən xəbər tutmursunuz... Əgər siz bu günəcən sağ qalsaydınız, hər vaxt xoşbəxtliyini arzuladığınız Səmirənin dərdi ikinizi də vərəmlədib öldürdü...

Gəmi dövrə vurub açıq dənizə istiqamət aldığı zaman şəhər görünməz oldu. Daha mən sol tərəfə keçmədim. Bu qüssəli düşüncələrdən ayrılmaq üçün yalnız irəliyə, üfüqlə dənizin qovuşduğu səmtə baxdım... Göyərtənin baş tərəfində müğənni qadın dayanmışdı. Onun əlində yaylıq vardı. Tez-tez gözünün yaşını silir, içini çəkirdi. Qabardin makintoşunu qolunun üstündən asmış pəhləvan cüssəli bir kişi ona nə isə deyir, təkdənbir də əlini onun çiyninə qoyur, başını tərpədə-tərpədə sözünə qüvvət verirdi. Gəminin altından köpüklənərək çıxan suların şarıltısı kişinin dediklərini eşitməyə mane olurdu.

Bu halda göyərtədən hay-küy qalxdı. Mən də böyrümdəki sərnişinlər kimi dönüb səs gələn tərəfə baxdım. Üzünü görə bilmədiyim bir qadın çılğın səslə ucadan qışqırır, adamları köməyə çağırırdı:

– Ay aman, qoymayın, sumkanı apardılar, var-yoxum getdi!..

Sərnişinlər o dəqiqə bir yerə kütləşdilər. Qadını dövrəyə aldılar. Mən də, yanımdakı adamlar da izdihama yaxınlaşıb onu görmək istədiksə də, divar kimi qabağımızı tutmuş kütləni yarıb keçə bilmədik. Qadın hey qışqırır, aləmi başına götürürdü. Göyərtəni çulğamış uğultudan az qala qulaq tutulurdu.

Bir azca sonra gəminin kapitanı gəlib çıxdı:

– Vətəndaşlar, yol verin, bir yerə kütləşməyin!.. – deyə o, qüvvətli əllərilə özünə yol açıb, irəlilədi və çox keçməmiş, yenə izdihamı yararaq, bizim qabağımıza çıxdı. – Ay camaat, hər kəs öz yerinə qayıtsın, bu saat axtarış olacaq!

O ketdi. Bayaq məni dəniz qırağına gətirən kişiyə salam verib böyrümüzdən keçərkən gördüyüm kişi ilə bərabər qayıtdı. Onu görən kimi izdiham yavaş-yavaş seyrəlməyə başladı.

Şabalıd rəngində balaca çamadanın yanında durub hönkürə-hönkürə ağlayan qadın ortalıqda tək qaldı. Kapitan gətirdiyi kişi ilə bərabər qadına yanaşdı:

– Ağlamayın, bacı, ağlamayın, – dedi. – Siz yəqin bilirsiniz ki, sumkanızı burda oğurlayıblar? Bəlkə sahildə oğurlatmısınız?

Qadın ağlamağına ara verdi:

– Bax, bax elə bu saat oğurladılar. Bir göz qırpımında! – dedi və yaylığı ilə burnunu və göz yaşını sildi.

– Bəs görə bilmədiniz oğrunu? – deyə kapitanın yanındakı kişi soruşdu.

– Yox, görə bilmədim, – dedi. – Sumka əlimdə idi. Fikirləşdim ki, bu camaatın arasında oğru, cibgir nə gəzir. Sumkanı çamadanın üstünə qoydum. Bir də onu gördüm ki, yoxa çəkilib. Oyan-buyana ha baxdımsa, tapmadım ki, tapmadım. – O yenə yaylıqla üzünü örtüb, hönkürməyə başladı: – Öhö, öhö...

Kapitan əlini onun arıq çiyninə qoyub, sakit eləməyə çalışdı:

– Ağlamayın, bacı, əgər gəmi körpüdən aralanandan sonra oğurlayıblarsa, heç bir qorxusu yoxdur. Tapılacaq, mütləq tapılacaq!

Qadın yenə ağlamağına ara verib, çantasından danışdı:

– Pulum, boyunbağım, üzüklərim hamısı onun içində idi. Tərs kimi hamısını çamadandan götürüb, bir yerə yığdım... Qürbətdə mənə kim əl tutacaq?

Kapitan bizdən üç-dörd metr aralı kayutalardan birinin qapısı ağzında dayanmış bəhriyəlini çağırdı:

– Səlimov! Uşaqlara de ki, nə aşağıdan bura, nə də burdan aşağıya heç kimi buraxmasınlar. Özün gəl, bu tərəfi kəs!...

Bəhriyyəli yoldaşlarını səsləyib tez gəldi və ikinci klasa enən pilləkənin ağzında dayandı.

Kapitan sərnişinlərə müraciət elədi:

– Vətəndaşlar, yerinizdən tərpənməyin, bu xanımın sumkası itib, hamının şeyləri axtarılacaq.

Heç kimdən səs çıxmadı. Kapitan yanındakı adamla bərabər sərnişinlərin çamadanlarını, bağlamalarını, ciblərini, üstlərini yoxlamağa başladı. Göyərtədə toplaşmış qadınlar və kişilər cınqırını çəkmədən, təhqirdən məyus olmuş halda sakit bir vahimə içində yoxlamaya tamaşa eləyir, öz növbələrini gözləyirdilər. Çantası oğurlanmış qadın ağlamaqdan qızarmış xırdaca göy gözlərilə kənardan diqqətlə baxır, nə isə çox ümidsiz, gah əllərini tovlayır, gah da köksünü ötürərək nırçıltı ilə başını bulayırdı. İlk dəqiqələrdə yoxlamanın heç bir nəticə verməyini görən o biri sərnişinlərin gərgin həyəcanı yavaş-yavaş azalır, onların üz-gözündə sevinc və razılıq ifadələri canlanırdı. İndi artıq sərnişinlər kapitanın təklifini gözləmədən çamadanlarını və bağlamalarını məmnuniyyətlə açıb göstərir, “buyurun, buyurun” deyib, bəzən gülümsəyərək, bəzən də tamam etinasızlıqla, döşəməyə dağılan tuman-köynəklərini, dəftər-kitablarını yığışdırır, əvvəlki səliqə ilə yerinə qoyur, üstlərindən ağır bir yük götürülmüş kimi dərindən və rahat nəfəs alırdılar.

Mən öz bağlamamı açdım. Bədirnisa xalanın yol üçün mənə nə qoyduğunu bilmirdim. Hələ ərindən yadigar qalmış tirmə şalın arasından iki dəst alt paltarı, Müdhətin vaxtı ilə Moskvadan alıb gətirdiyi isti köynəyi, özümün yaşıl yun jaketim, Kəmalənin toxuduğu krujeva ilə haşiyələnmiş əl yaylıqları, Bədirnisa xalanın gəlinlik üzüyü, (doğrusu, bunu görəndə qadın mənim nəzərimdə bütün mənəvi gözəlliyi ilə birə-on yüksəldi), mənim heç vaxt geyinmədiyim yun corablar çıxdı.

Kapitanın yanındakı kimi mənə üz tutdu:

– Yığışdırın, yoxdur, amma üzüyü barmağınıza taxın, itirərsiniz. Paltonuzu göstərin!

Mən göstərdim. Ciblərini çevirdim.

– Yoldaş kapitan, – dedim, – bu saat hər kəs öz hayındadır...

O, mənə zənnlə baxdı, amma bir söz deməyib, o tərəfə addımladı. Məndən sonra iki nəfərin də çamadanını yoxladılar. Qarşıdan gələn sərnişin gəmisi salyut verib keçdi. Kim isə qüssə ilə köksünü ötürüb dedi:

– Hey gidi dünya, bir vaxt bu gəmi ilə Volqa səyahətinə getmişdim... Görünür daha qismət olmayacaq.

Müğənni qadının növbəsi çatdı. Onun böyründə dayanmış pəhləvan cüssəli kişi, nazik vurulmuş göyçək qara bığını tumarladı. Gülü-gülə dedi:

– Ceyran xanım, birdən sən oğurlamış olarsan, ha!

– Bu istehza nahaqdır, vətəndaş. Heç kəs onu oğru hesab eləmir. Mən çox gözəl bilirəm ki, Ceyran xanımın özgə malına ehtiyacı yoxdur. Biz hamının şeylərini axtarmalıyıq. Xətrinizə dəyməsin. Ceyran xanım...

– Qətiyyən, qətiyyən! – deyə Ceyran xanım çamadanını açdı.

Çox ürəkdən və məlahətli bir təbəssümlə, asan və təbii oxuduğu nəğmələrindən sonsuz bir zövq aldığım Ceyran xanımı ömrümdə ilk dəfə belə yaxından görürdüm. Onun yalnız səsi deyil, özü də gözəldi, açıq və hündür alnı, uzun, seyrək kirpiklərilə çevrələnmiş süzgün qara gözləri, dolğun, iştahalı dodaqları vardı. Uzun və gur hörüklərini arxadan sallamışdı. O, əllərini bir-birinə geydirib, ağ ipəkdən boynu krujevalı tarım koftasının dolğun və qabarıq göstərdiyi döşləri üstündə tutmuşdu. Balaca ayaqları vardı, dizinəcən enən mavi donundan aşağı mərmər kimi ağ çılpaq qıçları görünürdü. Onu, yaxşı tanıyanların hamısı tipik bir Azərbaycan gözəli sayırdı. Ancaq mənə elə gəlirdi ki, Ceyran xanımın düzgün, cazibəli sifətində və boy-buxununda, onu kişilərə daha çox sevdirə biləcək kiçik bir qüsur çatmırdı.

Kapitan onun pal-paltarını o biri sərnişinlərinkinə nisbətən daha qayğılı və ehtiyatlı götürür, yenə də eyni səliqə ilə yerinə qoyur, heç birinin qatını açmırdı. Ceyran xanım özü, əli qoynunda hərəkətsiz dayanaraq baxırdı. Birdən kapitan, ilan vurmuş adamlar kimi geriyə sıçradı. Ceyran xanım təəccübdən böyümüş gözlərini çamadana zilləyərək müdhiş bir səslə qışqırdı:

– Yox, yox, bu ola bilməz, bu böhtandır!

Çantası oğurlanmış qadın elə bil yerin altından peyda olub çamadanın böyrünü kəsdi:

– Şükür allaha, tapıldı! – deyə çantanı qapıb, sevincdən parıldayan göy gözlərini Ceyran xanıma dikdi: – Ayıb olsun sizə! – dedi. – Yaxşı geyinmək üçün oğurluq eləməyi də bacarırsınız?

Ceyran xanımın yanındakı pəhləvan cüssəli kişinin (adını bir azdan sonra Ceyran xanımdan eşitdim: Elman idi) nitqi də tutulmuşdu. Hamı kimi o da donub qalmışdı, gah çantaya, gah da açıq çamadana baxır, deməyə söz tapmırdı.

Ceyran xanımın sifəti isə ölü rənginə çalırdı. Kapitanla birgə yoxlama aparan kişi (onun adını heç kəs demədiyi üçün mən də öyrənə bilmədim) çanta sahibindən çox sevinirdi.

– Üstü bəzək, altı təzək buna deyiblər ha... Adına-sanına bax, əməlinə bax, – deyə o, istehza ilə gülür, Ceyran xanımı hamının gözündə alçaltmaq istəyirdi. Onun bu hərəkəti məndə nə isə bir şübhə oyatmağa başladı: “Bəlkə bu oyunu qəsdən düzəldiblər?”.

Bu anda heç kəsin, hətta mənim də gözləmədiyim bir hadisə oldu. Ceyran xanım kapitanın böyründən irəli şığıyıb, çanta sahibinin hülqumundan ikiəlli yapışdı, boğmağa başladı. Nəfəsi kəsilən və xırıldayan qadın nə qədər dartındısa da, maqqaş kimi iki tərəfdən boğazına ilişmiş nazik barmaqların arasından hülqumunu qurtara bilmədi. Ceyran xanım dişlərini qıcıldadaraq yenə eyni çılğın ehtirasla qışqırdı:

– Fitnəkar! Bu fitnəni sən düzəltmisən. Qoy nə olur-olsun, səni öldürməmiş ürəyim soyumuyacaq!

Kapitan və onunla birgə yoxlama aparan kişi nə qədər onları aralamaq istədilərsə də bacarmadılar. Çarəsiz qalıb geri çəkildilər. Bir də irəli atıldılar, yenə gücləri çatmadı.

Bu vaxt Elman özünü yetirdi. Bir göz qırpımındı adamları sağa-sola itələyib ildırım sürəti ilə qadınlara yanaşdı, yoğun əzələli qollarını irəli uzadıb, iki yüngülcə kuklanı bir-birindən ayırırmış kimi onları araladı. Onun bu hərəkətinə pıqqıltı ilə gülənlər də oldu.

– Ceyran xanım, lazım deyil, siz neyləyirsiniz? – deyib müğənni qadını çanta sahibindən uzaqlaşdıran Elman indi hamının diqqət mərkəzində idi. Sərnişinlər içərisində onu tanıyanlar da vardı: bir zamanlar sirk meydanında ən görkəmli pəhləvanları dizə gətirən bu adam görünür, hələ də o qədər gücdən düşməmişdi.

Çantası oğurlanmış qadının ətsiz buxağı qana boyanmışdı. O, nazik boğazındakı qırmızı zolaqları əlilə sığallaya-sığallaya deyinirdi:

– Hələ bir utanmaz-utanmaz danışır da!.. Fahişə!.. Beləsini gərək divara söykəyib camaatın gözü qabağında güllələyəsən, başqalarına ibrət olsun!

Qəribə idi ki, çox adam Ceyran xanımı müdafiə eləyir, çanta sahibinin ünvanına pis-pis sözlər deyirdi. Görünür, onlar da mənim kimi bu oyunun nə məqsədlə isə əvvəlcədən uydurulduğunu düşünürdülər.

Ceyran xanım Elmanın qolları arasında balıq kimi çapalayır, yenə irəli atılmağa çalışır, amma bunu bacara bilmədiyi üçün müarizini cavabsız qoymayıb, uzaqdan-uzağa tutqun səslə qışqırırdı:

– Hələ dayan bir... Mənə də Ceyran deyərlər! Bu hayıfı səndə qoysam, onda doğrudan da fahişəyəm.

Çanta sahibi də ona borclu qalmır, hamı eşitsin deyə bayaqkı kimi adi səsi ilə yox, ucadan, əl-qolunu ölçərək deyirdi:

– Sənin fahişə olduğunu bütün sənət aləmi bilir! Aktrisalar arasında əxlaqsızlığı sən yaymısan. Elə ona görə də cəzandır, çəkəcəksən!

Ceyran xanım nə hiylə işlətdisə, Elmanın əlindən qopdu, qızmış pələngtək qadının üzərinə sıçradı. Şəhadət barmağında brilyant üzük parıldayan sağ əli ilə onun yanağına bomba kimi partlayan bir sillə çəkdi. İkinci silləni vurmağa imkan tapmadı, çünki bu vaxt Elman yenə özünü yetirdi və Ceyran xanımın nazik gərdənini ikiəlli qamarlayıb, onu hop götürdü, izdihamdan uzaqlaşdırdı. Mən yalnız Ceyran xanımın gedə-gedə dediyi sözləri eşidirdim:

– Elə bil öz dərdim mənə bəs deyil, hələ bir üstümə oğurluq da yıxmaq istəyiblər. Hoqqabazlığı görmürsən? Gör çamadanı necə açıblar ki, heç xəbər tutmamışam. Mən oğruyam, Elman? Bircə bu üzüknən eləsinin beşini satın allam... İndi qoy neyləyirlər, eləsinlər. Yaxşıca vayını verdim!

Onun səmimi və yanıqlı dediyi bu sözlərdən sonra artıq bir şey mənə aydın oldu: “Kələkdir, nə üçünsə böhtana salmaq istəyirlər!” deyə düşündüm və bir azca əvvəl fikrimdən keçən təxminin doğruluğuna şübhəm qalmadı. Deyəsən sərnişinlərin çoxu da çanta sahibinin düz adam olmadığını hiss eləyib, bayaqkı kimi öz aralarında xosunlaşmaqla kifayətlənmir, heç kəsdən çəkinməyərək, narazılıqlarını bildirirdilər.

– Zalım qızı lap əcinnəyə oxşayır...

– Balam, mahir adammış,gör çamadanı necə açıb ki, Ceyran xanımın da, pəhləvanın da xəbəri olmayıb.

– Kişinin qızı haqqında özündən çıxıb.

– Yox, gərək vurmayaydı, qanuna salsalar, bunun da cəzası var.

– Fırıldaqdır...

Bu söhbəti kapitan da, onun yanındakı kişi də dinləyir, cavab verməkdən çəkinirdilər. Özlərini elə göstərirdilər ki, guya bu əhvalat onlar üçün gözlənilməz və fövqəladə bir şeydir. Kapitan yanındakı kişinin qolundan tutub gəminin baş tərəfindəki kayutaya tərəf apardı.

Doğrusu, mən öz dərdimi unudub, Ceyran xanımın taleyini düşünürdüm. "Deməli heç bir günahı yoxdur. Əgər o arvadın sözləri doğru da olsa, bunun üçün o cür gözəl müğənnini Bakıdan uzaqlaşdırmağa haqları varmı? Doğrudur, çox adam onun adını Don Juanın qadın variantа qoyub... Axı, ara sözü hələ sübut deyil..."

Bizim göyərtəmizdə bu hadisənin şahidi olmuş adamlar, o qadından mümkün qədər aralı durmağa çalışırdılar. Elə bil sirayətedici bir xəstəliyə tutulacaqlarından qorxurdular.

Ceyran xanımın başına gələn qəziyyədən o biri klaslarda sonradan xəbər tutmuş sərnişinlər iki bir-üç bir bizim göyərtəyə qalxır, gözlərilə çanta sahibini axtarır və onu görən kimi, bir-birini dümsükləyərək qaş-göz işarəsilə onu nişan verir, dərhal da ondan aralanır, uzaqdan-uzağa, oğrun-oğrun onu müşahidə eləyir, yenə öz klaslarına enirdilər. Çanta sahibi də heç şübhəsiz, bunu hiss eləyir, gah başını sinəsinə əyir, gah da üzünü başqa səmtə çevirib, tamaşaçıların nəzərindən yayınırdı. Ancaq onunla maraqlananların ardı-arası kəsilmədiyi üçün qadın axırda təngə gəldi və çamadanını götürüb hara isə getdi. Mən onu bir daha görmədim.

Mənim sağımda dayanmış, əlində brezent çanta tutmuş gödək və yoğun kişi:

– Allah sənə şükür, daha böhtana düşmək qorxusundan canımız qurtardı, – deyə dua oxuyan adamlar kimi əlini göyə qaldıranda, sərnişinlər gülüşdülər.

Ancaq mən gülə bilmədim. Ceyran xanımın əhvalatında gülməli bir şey yox idi. Mən yenə qəmgin-qəmgin fikirləşirdim: "Onun barəsində şayiə buraxmışdılar ki, guya ehtirasının dəhşətindən adi kişilərlə kifayətlənməyib, pəhləvana ərə gedib. Tutaq ki, gedib, nə olsun? Pəhləvan da ailə qurmalıdır ya yox?.. Hə, bəlkə Elman onun əridir?

Axtarışın nə qədər uzun çəkdiyini yalnız indi başa düşdüm: dəniz üzərinə axşam enirdi. Demək biz hamımız vaxtın necə gəlib-keçdiyini bilməmişik. Bakıdan buraya dörd saata gəlmişdik.

Sərin şimal küləyi əsirdi. Hava yavaş-yavaş soyumağa başlayırdı. Mavidən də mavi göy üzünün rəngi dənizin rəngindən seçilmirdi. Hər tərəfə elə bil əbədi bir sükut çökmüşdü. Dəniz üzərində qaralan suitiləri gəminin yaxınlaşdığını duyan kimi suya baş vurub görünməz olurdular. Uzaq üfüqdə günəş batırdı. Onun yanğını xatırladan şüaları gəminin arxasında qaynayıb-köpüklənən sulara əks eləmişdi. Mən belə bir qürubu ömrümdə ilk dəfə görürdüm.

Bütün bədənim gizildəyirdi. Bu, yəqin ki, yorğunluqdandı. Oturub azacıq dincəlməyə yer axtarmaq üçün gözümü dolandıranda Ceyran xanımla Elmanı gördüm. Onlar yenə də eyni yerdə durub, tən yarıyacan suya qərq olmuş günəşə baxırdılar. Ceyran xanım günün ziyasını əks edib daha da böyük görünən tünd qara gözlərini elə bil qəsdən qıymayıb daha da geniş açmışdı. O, Elmanın yanında boylu-buxunlu bir atanın miniatür qızına daha çox bənzəyirdi. Bu anda onların nələr düşündüyünü təyin eləmək çox çətindi. Onlar kədərli deyildilər. Lakin sevindiklərini də söyləmək olmazdı. Kim bilir, bəlkə də qürubun seyrinə dalıb hər şeyi, o cümlədən də bayaqkı çirkin səhnəni unutmuş bu adamlar öz talelərindən razı idilər, bax, beləcə bir yerdə olmaqdan başqa heç nə arzulamırdılar?

Birdən məndə nə üçünsə hər ikisi ilə tanış olmaq arzusu oyandı. Əlbəttə, onların heç birinin təsəlliyə ehtiyacı yox idi. “Yaxşı, tutaq ki, mən onlara yanaşdım, dedim ki, izin verin, sizinlə tanış olum. Sonra? Bəs sonra onlara nə deyəcəyəm? Nə Ceyran xanımın, nə də Elmanın təsəlliyə ehtiyacı var. Bəlkə onlar mənə ürəkaçan bir söz dedilər, elə isə gedim, tanış olum. Deyirlər ki, aktrisalar öz pərəstişkarlarının tərifindən yaman xoşlanırlar. Ceyran xanıma deyəcəyəm ki, bu vaxtacan o gözəl nəğmələrinizlə mənə verdiyiniz böyük zövq üçün sağ olun. Sonra? Sonra deyəcəyəm ki, sizi hara göndərsələr, hər yerdə pərəstişkarlarınız olacaq. O ifritə qadının alçaq fitnəsini hamımız başa düşdük. Ona sillə vurmaqda düz iş gördünüz. Bəs sonra nə deyəcəyəm?”. – Mən bu suala cavab tapmamış, qeyri-ixtiyari onlara tərəf addımladım: “Gərək o çantanı açıb baxaydınız. Mən indi tamam arxayınam ki, onun içərisində qiymətli bir şey yoxdur. O ifritə əvvəlcə elə ağla-

yırdı ki, mənim ona yazığım gəldi. Fikirləşdim ki, bəlkə adama bir az pul yığıb verək. Ancaq indi lap yəqinimdir ki, çantada beş-on manat puldan qeyri heç nə yoxdur. Qəsdən düzəlmiş fitnədir”.

Bayaqkı gödək və yoğun kişinin səsini eşitdim:

– Bacı, ay bacı, bağlamanızı götürün, düşər-düşməzi olar.

Mən əlimi tovladım: “Cəhənnəmə ki, nə olacaq, olsun!”.

Ceyran xanıma yanaşıb salam verdim.

– Məni tanımazsınız, – dedim, – ancaq mən sizi tanıyıram.

O, məmnuniyyətlə əlini irəli uzatdı. Brilyant üzüyü əlimi xəfifcə daladı. Hər ikisi mənim hərəkətimdən məmnun olub gülümsədi. Elman Ceyran xanımdan o qədər də böyük deyilmiş. Saç-saqqalında bir dənə də ağ tük yox idi.

Mən söhbətə nədən başlayacağımı bilmədim. Bayaq fikirləşdiyim sözlərin heç biri yadıma düşmədi. Yaxşı ki, Elman köməyə gəlib, məni çətinlikdən qurtardı:

– Sizi niyə?

Bu sualın mənasını soruşmaq lazım deyildi: “Sizi nə səbəbə sürgün eləyirlər?” demək istədiyi mənə aydın idi. Mən çiyinlərimi çəkdim. Ancaq bir söz deməliydim. Dedim də:

– Ərimə görə.

Ceyran xanım da söhbətə qarışdı:

– Ərinizə nə olub ki?

– Sürgündədir.

Elmanın da, Ceyran xanımın da dodaqlarındakı qüssəli təbəssüm əriyib yox oldu. Mən Ceyran xanıma müraciət elədim.

– Bəs sizi niyə?

O da mənim kimi çiyinlərini çəkdi:

– Hələlik bir söz deməyiblər. Məni gətirən adamdan xəbər aldım. “Sonra bilərsiniz”, dedi... Yəqin ki, ona deyiblər. – Ceyran xanımın azacıq qabarıq dodaqları açıq bir istehzadan əyildi. – Bilmirəm harda, hansı aktrisanı əxlaqsızlığa sürükləmişəm. O qədər ağılsız arvad deyilmiş, hərçənd ki, onun qurduğu kələk heç bir əxlaqsız aktrisanın ağlına gəlməz.

– Bəs nəyi ağıllıdır? – mən soruşdum.

– Ağıllı olmasaydı, gəmi körpüdən aralanmamış hay-küy qopardı. O yaxşı bilir ki, burda şahid və ya sübut istəməyə imkanım olmayacaq... Dənizin ortasında kim mənim harayıma çatacaq?.. – Ceyran

yanıqlı-yanıqlı köksünü ötürdü və gözlərinin yaşardığını mənə göstərməmək üçün, üzünü o tərəfə çevirdi. – Mən əxlaqsız olsaydım, heç vaxt başıma bu müsibəti gətirməzdilər...

Elman boy-buxununa uyğun gəlməyən incə bir nəvazişlə müğənni qadının açıq qolunu sığalladı:

– Ceyran xanım, – dedi. – Sən bu gün çox əsəbiləşdin. Görmürsən axırda necə çirkin böhtana əl atdılar? Özünə yazığın gəlsin, fikir vermə. Cəhənnəm. Olan olub...

Mən bayaq düşündüyüm sözləri xatırlayıb Ceyran xanıma təsəlli verməyə başladım:

– Bu fitnəni qəsdən düzəltdikləri hamımıza aydın oldu. Siz deyirsiniz, ağıllı qadındır, amma məncə yox, səfehdən də səfehdir... Özünü rüsvay elədi. Hamı ona lənət yağdırırdı. Nahaq yerə qanınızı qaraltmayın... Onu da deyim ki, əgər camaatdan qorxmasaydılar, oğru adı ilə sizə cəza verərdilər...

– Elə bilirsiniz verməyəcəklər? – deyə Ceyran xanım gözlərini silə-silə üzünü yenə mənə sarı çevirdi. – Ancaq mənim heç nədən qorxum yoxdur... Baxma belə nərmə-nazik olmağıma, cinim tutanda ağına-bozuna baxmıram... – O, necə daxili bir mətinliklə danışırdısa da, məndə onun yalnız dildə deyil, əməldə də cəsur bir qadın olduğuna inam yaranırdı. – Ax, neyləyim, qoymadılar onun vayını verim.

Elman artıq heç bir söz deməsə də, onun bığaltı gülümsəməyindən görürdüm ki, Ceyran xanımın öz heysiyyətini qoruyarkən bu cür əlli-ayaqlı tərpənməyi tamam ürəyindəndir.

Hava qaranlıqlaşırdı. Göyərtədəki sərnişinlər paltodan, plaşdan, yun odeyaldan yerə sərib, yatmaq üçün özlərinə yer düzəldirdilər. Deyəsən yorulan tək mən deyildim. Elman bunları görəndə, söhbəti dəyişmək üçün əlinə bəhanə düşmüş kimi dedi:

– Bağışlayın, bacı, adınızı bilmək olarmı?

– Olar, niyə olmaz? – dedim. – Adım Səmirədir. Səmirə Aydın.

– Bağlamanızı gətirin, burda birtəhər yer düzəldim. Görürəm, yorğunsunuz. İstəsələr də, bu qədər adama kayutalarda yer çatmaz.

Mən təşəkkür elədim:

– Nə üçün zəhmət çəkirsiniz? Hamı necə, mən də elə. Birtəhər büzüşüb yataram.

– Yox, yox, görürəm təksiniz. Azərbaycanlı qızı, uzun yol. Başa düşürəm. Çətindir... Hə, Ceyran?

– Əlbəttə, əlbəttə, – deyə müğənni qadın onunla razılaşdı. – Səhərəcən ayaq üstə, yuxusuz qala bilməzsiniz... Düzəlt, Elman... Yaxşı ki, palto götürmüsünüz. Nə qədər hap-gop eləsək də, hər halda qadınıq...

Onlarla bu cür tez dostlaşdığıma elə sevinirdim ki, Elman öz bağlamasını açdı. Möhkəm ehtiyat görmüşdü. Üstü qayışlı bağlanmış yekə brezent çantasından yun odeyal, başlıqlı yapıncı və hava ilə doldurulan yastıq çıxardıb, səliqə ilə döşəməyə sərdi:

– Mən heç... – dedi, – mən kəndçi babayam. Belə şeylərə öyrəşmişəm. Ömrümün çoxu çöldə, yamacda keçib... Yuxusuz da qalsam dözəcəyəm... – O, məni gözləmədən bağlamamı gətirməyə getdi.

– Ceyran xanım, yoldaşınızdır, hə? – deyə soruşdum.

– Bəli, ərimdir... Mənimlə gedir. Əvvəlcə onu gəmiyə buraxmaq istəmirdilər. Təsadüfən rəislərdən köhnə bir tanışına rast gəldi. Xeyli minnət-sünnətdən sonra razılıq aldı.

Elman bağlamamı gətirdi:

– Bu yastıq əvəzinə... Hava tamam soyusa, paltonuzu üstünüzə salarsınız...

– Çox sağ olun, – dedim. – Mən istəsəm də yata bilməyəcəyəm

Yenə söhbətə girişdik. İndi də onlar mənə sual verirdilər:

– Kimlərdənsiniz? Harda işləyirsiniz? Yoldaşınız nəçidir?

Mən hamısını danışdım. Qızlarımdan söz düşəndə, Ceyran xanım qəmli-qəmli köksünü ötürüb dedi:

– Mənimkilər çox balacadırlar. Anamın ümidinə qoyub gəlmişəm. Axı, bilmirik hara gedəcəyik, necə yaşayacayıq... Aktrisa olmağıma baxmayın, mən uşaqlarımı o biri analardan az sevmirəm...

– Bu nə sözdür, Ceyran xanım, – dedim-aktrisaların ürəyi daha nazik deyilmi?

– Görmədiniz o ifritə nə deyirdi?.. Ancaq mən yaxşı bir məsəl bilirəm: “Çaqqal var gödən dağıdır, qurdun adı bədnamdır”. Elə pozğun tiplər var ki, artistlər onların yanında toya-bayrama getməlidir...

Mən yorulmuşdum. Oturub dincimi almaq istəyirdim. Amma buna baxmayacaq, Ceyran xanımla Elmandan əvvəl uzanmağa utanırdım.

Qaranlıq üfüqdən on beş günlük ay doğdu, dənizin sakit suları üzərinə işıq zolaqları töküldü. Hər tərəfə sükut çökəndə gəmi mexanizmlərinin uğultusu eşidildi...

Mən çox bərk yorulmuşdum. Ceyran xanımın uzandığını görüncə, mən də Elmandan üzr istəyib, odeyalın üstündə oturdum. Bir az sonra

isə büzüşüb uzandım. Elman üzünü aya sarı çevirib, papirosunu sümürürdü. Gözümə necə yuxu getdiyini xatırlamıram. Oyanıb ətrafa boylananda, irəlidə sarımtıl, çılpaq təpələri gördüm. Bura artıq sahil idi. Biz, Krasnovodska çatırdıq...

Gəmimiz limana yaxınlaşdıqca, sərnişinlərin bəzisi dəmir məhəccərə söykənib sahilə baxır, bəzisi gərnəşir, bəzisi axşamdan yerə sərdikləri paltar-palazı yığıb bağlayır, kimisi köhnə adəti üzrə səhər gimnastikası ilə məşğul olur, kimisi yüngülvarı qəlyanaltı eləyirdi. Məndən əvvəl oyanmış Elman Ceyran xanımın böyründə bardaş qurub, nə isə çox fikirli halda papirosunu tüstülədirdi. Çox keçməmiş, Ceyran xanım da oyanıb, ətrafına göz gəzdirdi, harda olduğunu xatırlayan kimi qaşqabağını salladı, dərhal çantasını açıb əl boyda güzgü çıxartdı, yan tərəflərdən azacıq pırtlaşmış saçlarına sığal verdi və birdən məni görüb, qəşəng sifətinə çox yaraşan səmimi bir təbəssümlə gülümsündü:

– Harda, hansı şəraitdə olsaq, gərək bizim səliqəmiz pozulmaya, hə, Səmirə xanım?

Mən də istər-istəməz gülümsündüm və onun sözlərini təsdiqlədim:

– Əlbəttə, elədir. Amma bu şərtlə ki, ürəyində bu qədər niskilin olmaya...

– Yox, – dedi, – heç nəyi vecimə alan deyiləm. İnsan dünyaya bir dəfə gəlir. Bəlkə elə bu günü də görmək lazımmış.

– Başa düşürəm, – deyə mən onun ürəkdən gələn bu sözlərindən xoşlandığımı gizlətmədim. – Sizin həyata fəlsəfi baxmağınız heç də pis deyil.

– Fəlsəfi ya qeyri-fəlsəfi, mənim prinsipim belədir. Ürəyim nə təhər istəsə elə də eləyəcəyəm. Heç bilirik sabah başımıza nə gələcək? Dünən Elmana deyirdim. Əgər bundan sonra məni güllələməyə aparsalar da öz prinsipimi pozmayacağam, dodağımda pomada, əynimdə ən çox sevdiyim libas, ayağımda da təzə modalı tufli. Mahnı oxumaq da öz qaydasında.

– Məni bağışlayın, Ceyran xanım, – dedim. – Dünən körpüdə bu prinsipinizi pozdunuz, şikəstə oxuyub hamını kədərləndirdiniz. Mən belə hiss elədim ki, o mahnınızla hər şeydən əvvəl öz dərdinizi açıb söyləyirdiniz.

– Qətiyyən yox! Mən körpüdən camaata demək istəyirdim ki, bundan sonra daha da eşqlə oxuyacağam. Qoy məni elimdən, obamdan ayıranlar yanıb yaxılsın!.. – O, kimisə hədələyirmiş kimi uzaqlara baxdı. – Səsimi əlimdən almayacaqlar ki?

Bu vaxt Elman bəriyə döndü və papirosunun kötüyünə baxa-baxa üz-gözünü əydi:

– Bu zəhrimar lap məni cana doydurub... İlla da ac qarına çəkəndə. Sinəmdən o saat ağrı qalxır... Sabahınız xeyir, Səmirə xanım...

– Sabahınız xeyir.

– Ceyran xanım, qayınanam yola nə isə qoymuşdu. Gəlsənə, bir az ondan çıxardasan, yeyək.

Mən Bədirnisa xalanın bağlamasındakı pendir-çörəyi xatırladım. Çıxartmağa utandığım üçün, Elmanın sözünü eşitməməzliyə vurub, onlardan aralandım.

Gəminin sürəti azalırdı. Adamlar düşməyə hazırlaşırdılar. Birdən radio səsləndi:

– Vətəndaşlar, körpüdə cərgəyə düzülün, vağzaldan birbaş qatara minəcəksiniz!

Böyrümdə Elmanın nəfəsini duydum. O dedi:

– Siz də gəlin, Səmirə xanım. Hələ düşməyimizə çox var. Gəlin, bir az çörək yeyin.

Dönüb Ceyran xanıma baxdım. O da əl eləyib məni çağırırdı. Ər-arvadın təklifindən boyun qaçırmadım. Gəlib, çamadanın üstünə sərilmiş qəzetin arasından mən də Ceyran xanım kimi bir parça toyuq əti götürdüm.

– Vətəndaşlar, hələ tələsməyin. Bir yerə kütləşməyin. Gəmidən düşüb, qatara minəcəksiniz!

– Bildik, bildik!.. – deyə Elman dodağının altında deyindi. – Restorana aparmayacaqsınız ki?

Biz, doğrudan da, yalnız səhər yeməyini qurtarandan sonra körpüyə yan aldıq. Dünən kapitanla birgə yoxlama aparan kişi hamıdan əvvəl gəmidən düşdü.

Biz üçümüz də növbəyə düzülmüş adamların cərgəsində dayandıq. Ceyran xanım dedi:

Bizi yəqin Krasnovodskda çox saxlamazlar. Türkmənistana konsert verməyə gələndə buranı bir neçə yol görmüşəm, elə-belə ötəri... Yaxşı ki, hələ səhər tezdəndir, cırcırama başlamayıb, yoxsa cəhənnəm istisinə dözə bilməzdik.

Körpüyə endik. İki nəfər Ceyran xanımın böyrünü kəsdi.

– Xanım, – deyə onlardan biri – ağ köynəyinin yaxasına noxud boyda qara xalları olan sumax rəngli qalstuk taxmış, ağ çesuça kostyumlu

arıq, uzun kişi əli ilə müğənni qadına gedəcəyi istiqaməti göstərdi: – Siz bu tərəfə!

– Gedək, Elman! – deyə Ceyran xanım vəziyyətini zərrə qədər dəyişmədən geriyə dönüb ərini çağırdı.

– O yox, siz gedəcəksiniz! – deyə qara kostyumlu, liliputa bənzəyən balaca kişi xırıltılı və əsəbi bir nida ilə əmr verdi. – Ardımca gəlin!

Elman cərgədən kənara çıxmaq üçün özünə yol açmaq istəyəndə, uzun kişi vəsiqəsini göstərdi:

– Siz çəkilin, vətəndaş! – dedi.

Elman hirsini boğub, Ceyran xanımın dalınca baxdı.

– Ay canım, belə də zülm olar? – deyə nırçıldayaraq çiyinlərini çəkdi və çamadanını götürüb, cərgədən aralandı. – Mən sürgünə getmirəm, mən arvadımın dalınca gəlmişəm. O hara. Mən də ora!

Ceyran xanımı dəniz vağzalının otaqlarından birinə apardılar.

Mən onlardan ayrılanda elə bil son ümidim alt-üst oldu...

## İKİNCİ HİSSƏ

### ÇÖLÜN DÜZÜNDƏ

Nağıllarda deyildiyi kimi, az getdik. Üz getdik, dərə-təpə düz getdik, ən axırda heç vaxt görmədiyimiz və bilmədiyimiz bir çölə gəlib çıxdıq. Adi səyahət olsaydı, xəritə götürərdim, hansı şəhərləri, hansı yaşayış məntəqələrini, hansı yollardan keçib getdiyimizi öyrənərdim, ancaq indi nə xəritəm vardı, nə də bizi ötürən adamlardan bunu soruşa bilirdim.

Bizi Krasnovodskdan yük qatarına doldurmuşdular. Az qala sərnişinlər qarın-qarına oturmuşdular. Görünür, bizim bəxtimizdən havalar hələ o qədər də isti deyildi, buna baxmayaraq, bəzən bürküdən nəfəsi darıxanlar və ürəyi gedənlər də olurdu. Vaqonun qapısı ağzını kəsmiş gözətçi heç vaxt bizim yanımıza gəlmir, nəyə ehtiyacımız olduğunu soruşmurdu. İçəridə, ayaq tərəfdə qoyulmuş alümin bakı gündə bir dəfə su ilə dolduran bələdçidən başqa biz heç kəsi görmürdük. Yemək ehtiyatı çoxdan qurtarmış mənim kimi adamlar ona pul verib bir parça çörək, pendir, ya başqa bir şey aldırmaq istədikləri vaxt, o, boynumuza bir xeyli minnət qoyur, ancaq insafən həmişə mütləq bir şey tapıb gətirir, pulumuzun da xırdasını düppədüz özümüzə qaytarır, təklif elədiyimiz bəxşişi götürmürdü.

Səfərimizin birinci günündə qatar yalnız bəzi stansiyalarda dayanırdı, amma sonralar təkdənbir göz işlədikcə uzanan düzün ortasında, bəzən də stansiyaların axırında, o da gecələr (yəqin ki, su götürmək üçün), dayanmağa başladı. Əgər mən vağzalların adını oxumasaydım, bəzən günlərlə qət elədiyimiz yolların hansı respublikadan keçdiyini də öyrənə bilməyəcəkdik. Türkmənistanı və Özbəkistanı adlayıb, nəhayət Tacikistana çatdıq.

Gecənin bir aləmində bizi vaqonlardan düşürüb, yük maşınlarına doldurdular, səhər yenicə açılhaaçılda, kənddən-kəsəkdən uzaq, hansı arx üçünsə qazılmış torpağa yaxın bir yerdə düşürdülər. Yalnız gün doğub üfüqdən baş qaldırdığı zaman, uzaqlarda, bizdən ən azı on-on iki kilometr aralı, havadan güclə seçilən bir tüstü gördüm və orda yaşayış məntəqəsi yerləşdiyini yəqin elədim.

İlk dəfə burada gördüyüm bir nəfər, camaatın iki-üç addımlığında dayanmış yük maşınının üstünə sıçradı. Kim isə "rəisimiz!" – dedi və bu səs uzun bir pıçıltı ilə izdihama sürətlə yayıldı. (Onun adını, atasının

adını və familiyasını sonralar öyrəndim: Həsən Babacanoviç Niyazov idi). O, xaki rəngli parçadan qoşacibli üst köynəyi və qəlifeyi şalvar, dizindən xeyli aşağıda boğazı qarmon kimi büzüşmüş çəkmə geyinmişdi. Sağ böyründən tünd qırmızı qoburlu tapança sallanırdı. Paltarı rəngdə şapkasını geriyə itələmişdi. Batıq alnının hər iki tərəfindən bərk seyrəlmiş saçlarının ucları görünündü. Kirpiklərini tez-tez qırpırdı. Boyu orta idi. Qıyıq gözləri çox zəhmli baxırdı. O, sifətinə nisbətən çox ağ görünən əlini yuxarı qaldırıb, camaatı sakitliyə çağırdı və çox gözləməyib ucadan, tənqidli səslə dedi:

– Vətəndaşlar!..

Belə hallarda ən cüzi bir şey də insanın qəlbinə toxunur. Mən indiyəcən hər yerdə "yoldaşlar" sözünü eşitməyə adət eləmişdim, amma bu sözün qüvvəsini həqiqi mənada yalnız indi qiymətləndirirdim. Deməli, bundan sonra məni də, mənim günümə düşmüş başqa adamları da "vətəndaş" deyə cağıracaqlar. Doğrusu, son ay içərisində keçirdiyim rühi sıxıntıların hamısından çox bu mənə yer elədi: "Nə üçün yoldaş yox, vətəndaş? Məsələn, şəxsən məni niyə yoldaşlıqdan çıxardırlar?" deyə düşündüm və mənə elə gəldi ki, az-çox heysiyyəti olan hər kəs də ürəyində özünə bu sualı verir.

– Vətəndaşlar! – deyə Niyazov elə bil qəsdən mənə yanıq vermək üçün təkrar elədi. – Siz məhbus deyilsiniz, heç bir hüququnuz da əlinizdən alınmayıb, ölkəmizin daxili vəziyyətini, yəni müharibənin əmələ gətirdiyi şəraiti nəzərə alaraq, bəzi mülahizələrə görə sizin yalnız yerinizi dəyişməliyik. Sizin üçün bax, burada, – o əli ilə düzənliyi göstərdi – kənd salınacaq... Yəni bu kəndi siz özünün salacaqsınız, yaşayış evləri tikənə qədər, yəni müvəqqəti olaraq, çadırlarda yaşayacaqsınız, yəni müəyyən əziyyətə qatlaşacaqsınız...

Mənim arxamda dayanmış bir nəfər zarafat eləməyə də imkan tapıb söz atdı:

– Aşnam "yəni" sözünü yaman xoşlayır, ha.

– Görürsünüz ki, vətəndaşlar, hələ baharın oğlan çağıdır, yəni bahar yeni başlanır, yəni işləmək üçün ən müsaid vaxtdır, hər şey sizin özünüzdən asılıdır...

– Yəni... – deyə yenə arxadan eşitdiyim səs sahibi bir az da ucadan söz atdı.

Arada hətta pıqqıldayıb gülənlər də oldu. Niyazov nitqinə ara vermədən deyirdi:

– Sizin içərinizdə mühəndislər, aqronomlar, müəllimlər, bənnalar, həkimlər var. Bunu biz yaxşı bilirik. Hər biriniz namuslu zəhmət sayəsində hörmət və rəğbət qazana bilərsiniz, əlbəttə, bu cür işləsəniz, taleyinizə də bunun müsbət təsiri ola bilər...

Niyazov yerə düşdü və mənim yanımdan ötüb maşınlardan bir az bəridə toplanmış gözətçiləri səslədi: yəqin hamımıza eşitdirmək üçün qəsdən ucadan dedi:

– Bir-ikiniz burada qalın, o biri yoldaşlar maşın götürüb çadırları gətirməyə getsinlər. Bilirsiniz, haradan alacaqsınız? Bilmirsiniz? Onda mən bu saat adres verərəm...– O, döş cibindən əl boyda bloknot çıxarıb tez-tələsik yazdı, vərəqi qopardıb gözətçilərdən birinə uzatdı: – Amma bu gün nə tövr olsa qayıdın, yağış-filan yağsa, camaatı naxoşladarıq...

Göy üzü duru və təmizdi. Belə getsə, bu gün də, sabah da yağış qorxusu ola bilməzdi. Bəs o, nə üçün bu sözləri deyirdi? Yəqin buradakılara özünü qayğıkeş və insanpərvər bir adam kimi qələmə vermək istəyirdi. Ancaq, əksinə, məndə onun səmimiyyətinə dərhal şübhə oyandı. Fikirləşdim ki, əgər insan qədrini biləndinsə, nə üçün əvvəlcədən hazırlıq görməmisən?

O, təcili bir işə gedirmiş kimi, əlini gicgahına yaxınlaşdıraraq, gözətçilərlə salamatlaşdı və çevik addımlarla maşına yanaşıb, sürücünün yanında oturdu, əli ilə bayaq mənim gördüyüm yaşayış məntəqəsini nişan verdi. Maşın uzaqlaşdı...

Arxa tərəfdən yenə o tanış səsi eşitdim:

– Hə, deməli gəldik çıxdıq mərəndə!.. Dəmir məftil çəkib qarovul da qoysaydılar, bir dəfəlik işimizi bilərdik.

Kim isə onunla şərik olmadı:

– Kişinin oğlu dedi ki, sizin yalnız yerinizi dəyişdiriblər, kənd salacağıq, təsərrüfatla məşğul olacağıq...

Tanış səs farsca misal çəkdi:

– Xər həmən xər əst-çuli digərəst.

– Baxma, təfavütü çoxdur.

Mən də elə düşünürdüm ki, burda kənd salmaq və həyat qurmaq fikri hər halda bizim xeyrimizədir. Bir halda ki, bizi bura gətirmişdilər, deməli hərə bir iş görəcək, azad vətəndaşlar kimi dövlətə fayda da verəcək. Axı, bunsuz bizim həyatımız çox cansıxıcı və mənasız keçə bilərdi! İndiyəcən bizim sovet adamlarımızın burdan qat-qat çətin yerlərdə, qırx, əlli dərəcəli şaxtada sadəcə kənd deyil, böyük sənaye şəhərləri

saldıqlarını mən çox gözəl bilirdim. Bunu kitablarda oxumuş, sənədli filmlərdə görmüşdüm. Mən sıravi, sadə insanların nəhəng qüdrətinə inanırdım, bilirdim ki, hələ texnikamız ibtidai halda ikən belə işlər görməyi bacaran bu insanlar, elmə, biliyə və texnikaya yiyələnəndən sonra dünyanı heyrətə gətirəcəklər!

Əlbəttə, mən o azad vətəndaşlarla bizim fərqimizi yaxşı anlayırdım: onlar yeni torpaqlara könüllü gedirdilər, yarıac, yarıtox, bəzən cırıq-cındır paltarda olduqlarını unudurdular. Çünki onlar bütün ölkənin köməyinə arxalanırdılar. Amma, bizi etibarsız və ictimai cəhətdən qorxulu adamlar kimi şəhərimizdən ayırıb buraya gətirmişdilər. Niyazovun dediyi kimi, başqa hüquqlarımız əlimizdən alınmasa da, biz "yoldaş" məfhumuna zidd ünsürlər sayılırdıq. Bu müqəddəs adı daşımaq hüququndan məhrum edilmişdik. Əlbəttə, buna nisbət də bizə xalqdan, cəmiyyətdən demonsayağı uzaqlaşdırılmış günahkarlar kimi baxacaqdılar. Bunu fikirləşəndə, vəziyyətimizin necə həqarətli olduğunu bir daha hiss eləyib, qəhərdən boğulmaq dərəcəsinə gəlirdim...

Uzun yolun yorğunluğunu tək mənim kimi bərkə-boşa düşməmiş, neçə gündən bəri yavan çörəkdən başqa şeç nə yeməmiş cılız bədənli qadınlar deyil, hələ heç nədə özünə korluq verməmiş, güclü və sağlam kişilər də hiss eləyirdilər. Niyazovu dinlədikdən sonra adamlar birdən süst düşüb orda-burda oturdular, bağlamalarını açıb özlərinə yer düzəltdilər.

Mən də yorğunluqdan az qala ayaq üstündə yuxulayır, bəzən hətta gördüklərimin də həqiqət deyil, yuxu olduğunu düşünürdüm. Şüurum dumanlanmağa başlayırdı.

Mən fəlakətə uğramış insanın özünü xilas üçün bəzən öz həmcinsini ayaqladığına, onun tikəsini əlindən qoparmaq üçün onu hətta öldürdüyünə dair qəribə əfsanələr eşitmişdim, amma bunların doğruluğuna inanmamışdım, indi isə heç inanmırdım. Əksinə, mənim ürəyimdə insanlara bəslədiyim rəğbət və etimad hissi daha da qüvvətlənirdi. Mən bu barədə yuxulu-yuxulu fikirləşəndə yenə o tanış səsi eşitdim:

– Ay bacı, adını da bilmirəm, gəl, sən də ye, kasıbın olanından... Səni deyirəm, ay bacı!

Dönüb baxdım. O, mənim arxa tərəfimdə, göy otun üstündə bardaş qurub, iki nəfər özündən yaşlı kişi ilə üzbəüz oturmuşdu. Əli ilə məni göstərdi:

– Buyur, bacı, sən də ye, görürəm, acsan.

Süfrə əvəzinə ortalığa salınmış qəzetin üstündə xırda-xırda doğranmış qara çörək, göy soğan, bir-iki dəstə tərxun və keşniş vardı. Mən, əlbəttə, onun təklifindən boyun qaçıra bilməzdim, çünki acından gözlərim qaralırdı. Ancaq mənim tərəddüd elədiyimi başa düşüb, o, yenə çağırdı:

– Gəl, bacı, utanma. Daha utanmaqdan keçib... Gərək bir-birimizə həyan olaq... Mənim dayım tolstoyçu imiş. Qraf həzrətlərinə tez-tez məktub yazırmış. Günlərin birində Yasnaya Polyanaya gedib çıxır. Tolstoy onu içəri aparır. Parket döşəmə çox sürüşkən imiş. Dayım onunla yanaşı yeriyənlə, birdən sürüşür, az qalır yıxılsın. Lev Nikolayeviç o dəqiqə dayımın qolundan yapışır, yıxılmağa qoymur. Deyir ki, bax, insanlar gərək həmişə beləcə bir-birinə kömək eləsin... Gəl, gəl, otur, bacı...

Yox. Mən daha utanmırdım. Dinməz-söyləməz, süfrənin bir qırağında dizlərimi yerə qoyub oturdum.

– Bu gün birtəhər keçinək, sabah da allah yetirər, – deyə o, sözünə ara vermədən, göy soğanı bükmələyib çörək və pendirlə bərabər iştaha ilə yeməyə başladı.

Bu adamın sifəti mənə hardansa tanış gəlirdi, ancaq onu məhz harda gördüyümü xatırlamağa çalışdımsa da, yadıma sala bilmədim. Mən də onun kimi bir parça pendir, çörək götürdüm.

– Ay qardaş, – dedim, – olan-qalanınızı da biz yesək, sonra özünüz ac qalacaqsınız.

– Yox, – dedi, – ac qoymazlar. Mən bu yolu bir dəfə də gedib gəlmişəm. Qayda-qanuna möhkəm əməl eləyirlər. Doğrudur, o vaxt demirdilər "yalnız yerimizi dəyişdirmişik". Tutmuşdular, özü də bundan xeyli uzağa yollamışdılar, ancaq görürsünüz də, ölməmişəm, sağam...

– Niyə, nə üçün sizi tutmuşdular, axı? – soruşdum.

– Günahkardım, onda haqları vardı tutmağa, hətta güllələməyə...

Görünür, mənim ondan daha müfəssəl cavab gözlədiyimi başa düşüb dedi:

– Gizli millətçilər təşkiatının üzvü idim. Mətbəədə korrektor işlədiyimdən istifadə eləyib, Sovet hökumətinin əleyhinə intibahnamə buraxmışdım, heç nə... ağılsızlıq. Onca il Salovkada ayaq döydüm. Cəza müddətim qurtaran kimi buraxdılar. Ancaq onu da deyim ki, orda da qəzet buraxırdım, klub düzəldib, özfəaliyyət dərnəyi təşkil eləmişdim, həftədə bir tamaşadan, konsertdən verirdim. Beş-altı dəfə təşəkkür almışdım.

– Millətçilər təşkilatının məqsədi nə idi? – deyə soruşdum.

– Məqsədi? – O, üz-gözünü əydi və zəhlətökən bir milçəyi qovurmuş kimi əlini kəskin hərəkətlə qaldırıb-saldı. – Məqsəd böyük sözdür, bacı. Onlarınkı məqsəd deyildi, fitnə-fəsaddı. Böyük Turan dövləti... hımm... gör nə gurultulu adı var!.. Amma axırda fıs çıxdı. Ümumiyyətlə, millətçilərin lideri də, təşkilatı da dil ustası, ağıl xəstəsi idi. Hamısı fıs çıxdı. Avantüranın axırı bəs necə ola bilərdi ki? Əlbəttə, bunu mən gec başa düşdüm. Lap gec. Otuz yaşından sonra. Müharibə başlanan günü hərbi komissarlığa getdim, könüllü yazılmaq istədim, yazmadılar. Deməli, fikirləri buraya yollamaqmış... Nə olar, canları sağ olsun. İslanmışın yağışdan nə pakı?.. Burda da özümüzə məşğulat taparıq...

O, yenə iribaşlı bir soğanı dəstələyib, çörəyin arasına qoydu və daha həris bir iştaha ilə yeməyə başladı. Böyründə oturmuş kişilər onun söhbəti ilə maraqlanmırdılar. Deyəsən, tərcümeyi-halını ilk dəfə dinləmirdilər. Mən yenə sual verdim:

– Yaxşı, sovet hökumətinin əleyhinə çıxmağa sizi nə məcbur eləmişdi?

– Heç nə, sarsaqlıq. Mən özüm fəhlə balasıyam. Atam mədəndə dartayçı idi. Oxutdu, savadlandırdı. O vaxt da savadlıları günün günorta çağı əldə çıraq axtarırdılar. Məni korrektor qoydular. Qəzetdə elə odlu-odlu yazırdılar ki, hər oxuduqca öz-özümə deyirdim: dünyanı düzəltsələr yalnız bunlar düzəldəcəklər... Mən nə bilim ki, millət deyib bağıranlar millətin elə əsil düşmənləriymiş?.. Axırı nə oldu? Hamıdan qabaq milləti qoyub xaricə qaçan da onlar oldular.

Mən pendir-çörəkdən yedikcə, elə bil gözümə işıq gəlir və ətrafı daha aydın görməyə başlayırdım. Bizim bu son mənzilimiz vaxtı ilə uşaqlıqdan gördüyüm qaraçı köçünü xatırladırdı. Yalnız bir fərqlə ki, bizim düşərqəmizdən tüstü qalxmırdı. Atımız-arabamız yox idi. Biz kəndlərdə-kəsəklərdə satmaq üçün ələk, xəlbir toxumurduq. Uşaqlarımız dəstə düzəldib çiling-ağac, ya top-top oynamırdılar. Biz də qaraçılar kimi bir yerə toplaşıb rəqs eləyənlərə və ya kamança çalıb mahnı oxuyanlara qulaq asmırdıq... Təxminən iki hektar yeri tutmuş düşərgəmizdə adamların bəzisi bizim kimi iki-bir, üç-bir oturub çörək yeyir, bəzisi çanta və bağlamasını başının altına qoyub mürgüləyir, yorğunluğunu alırdı. Amma buranın baharı da bizim çöllərin baharı kimi cavan və gözəldi. Bir az o tərəflərdə iki qarış hündürlüyündə qalxmış göy otlarda şeh parıldayırdı. Rəng verib – rəng alan körpə çiçəklər, qızıl lalələr Mil və Muğan düzlərini mənim yadıma salırdı. Axı, bura

da mənim vətənim idi, yəni mənim bacılarımın, qardaşlarımın vətəni idi. Axı, mənə və mənim kimilərinə qarşı yönəldilmiş bu ədalətsiz hökm o qədər güclü deyildi ki, illərdən bəri ürəyimdə ucsuz-bucaqsız, bölünməz, vahid Sovet Vətəninə bəslədiyim böyük məhəbbəti öldürə bilsin? Mənim üçün əsil imtahan indi başlanırdı. Mən öz-özümə deyirdim: “Yox, Səmirə, sən yalnız şəxsi səadətin naminə qayəndən, məsləkindən, idealından üz döndərməyə haqlı deyilsən!..” – Mən düşərgəmizdəki adamlara baxırdım və onların da mənim kimi düşünməyini arzulayırdım. Mən artıq buradakıların sayı ilə maraqlanırdım.

– Bağışlayın, adınızı da bilmirəm, – deyə məni yeməyə dəvət eləyən kişinin üzünə baxdım.

– Əsil adım Sədəddin Gülməmmədovdur, ancaq mətbuatda işləyəndən özüm üçün təxəllüs götürmüşəm, indi çoxları məni bu təxəllüslə çağırır: “Sədi Kamal!..”

– Yoldaş Sədi Kamal...

– Yoldaş yox bacı, biz burda vətəndaşıq...

– Yaxşı, olsun vətəndaş Sədi Kamal, görəsən burda neçə adam var?

– Gəmi ilə gələnlərin yarısını başqa yerə apardılar. Deməli, biz iki yüz nəfərə yaxınıq... Necə məgər, niyə soruşursunuz?

– Bəs bu qədər adamın xərci-xərəcatı kimin boynuna düşəcək?

– Sən onun dərdini çəkmə, bacı. Əvvəl vaxtlar biz hökumətdən yeyəcəyik, sonra da hökumət bizdən... Borclu borclunun sağlığını istər...

– Yəni deyirəm ki, müharibənin bu vaxtında camaatı yığıb bura tökmək xeyirdən çox ziyan deyil?

– Əlbəttə, ziyandır. Ancaq bunun siyasi mənası var! – onun bu sözləri ciddi, ya zarafatla dediyini ayırd eləmək çətindi. – Hökumət ölkəni beşinci kalonnadan təmizləyir ki, əmin-amanlıq olsun.

Mənim sağımda oturmuş keçisaqqal kişi soruşdu:

– Bu nə sözdür, ay Kamal?

– Beşinci kalonna – yəni xarici kəşfiyyatın agentləri... Başa düşmədin?

– Düşdüm, düşdüm, amma inanmıram indi beləsi qalmış ola.

– Ay canım, siz də ayrı söz tapmırsınız danışmağa? – deyə o biri kişi ətrafına göz gəzdirdi. – Görəsən bu gün çadırları gətirəcəklər, ya yox?

Sədi Kamal axırıncı soğanı da bükmələyib ötürdü.

– Çadır oldu-olmadı, mənim halıma iəfavüt eləməz. Öyrəşmişəm, – deyib ayağa qalxdı. – Nə gözəl hava var!.. Amma bir azdan susuzluq bizə güc gələcək, ha...

– Bir azdan niyə? – deyə keçisaqqal kişi də ayağa qalxdı, – duzlu pendiri də yedik, elə indidən ürəyimi yandırır, hey baxıram, bu yanlarda bir işarantı görünmür, arxı qazıb hazırlayıblar, amma su buraxmağı yadlarından çıxardıblar.

Sədi Kamal bu dəfə də təsəlli verdi:

– Günlərin birində yəqin ki, buraxacaqlar. Bayaq bizi gətirən gözətçi deyirdi ki, hələ bənd hazır deyil. Müharibə başlanan kimi işi dayandırıblar.

Keçisaqqal kişi bağlamasını açdı, paltosunu çıxartdı:

– Qardaş, mənciyəz yatdım, – deyə yerə çökdü, paltosunu yumurlayıb başının altına qoydu, – allah eləsin, gözümü açanacan su özünü yetirsin...

– Allaha qaldısa, heç nə. Batdıq... – deyə Sədi Kamal parusin köynəyinin döş cibindən tütünqabını çıxartdı, yoğun bir papiros büküb damağına qoydu və təyyarə şüşəsindən qayrılmış iri çaxmaqla yandırdı. – Yat, yat, qardaş. Bütün Şərq aləmi yatıb.

Keçisaqqal kişi onun zarafatına zarafatla cavab verdi:

– Əslinə baxsan, yuxunun Şərqdə çox xeyri olub, çünki yuxu – böyük enerji mənbəyidir... Niyə gülürsən? Doğru deyirəm, vallah... Bilirsən çox yatan nə cavan qalır?

Sədi Kamal papirosunu qəribə bir ləzzətlə sümürüb müsahibini təpədən-dırnağa qədər süzdü və bu dəfə qəhqəhə ilə gülüb dedi:

– Əşi, mən səni belə filosof bilmirdim, sən bu cür məntiqlə tənbəlliyin fəlsəfəsini də yarada bilərsən ki... – O, birdən nəyi isə xatırlamış kimi üzünə ciddi bir ifadə verdi. – Çox yatmağa alışmasan yaxşıdır. Sən görməmisən, ancaq mən görmüşəm, iş başlananda, yuxu üçün o qədər də imkanın olmayacaq... Nəzərdə tut ki, istirahət evinə gəlməmisən.

– Bilirəm, bilirəm, amma buna baxmayaraq, mən yatdım, – deyə Sədi Kamalın müsahibi böyrü üstə uzanıb gözlərini yumdu və o dəqiqə də xoruldamağa başladı.

– Bəxtəvərə bax, gör nə ləzzətlə yatır! – deyə yan tərəfdən kim isə söz atdı.

On dəqiqə belə keçməmiş bütün düşərgə süst düşüb, sükuta qərq oldu. Mən də özümə yer düzəldib uzandım, bədənimdə nə isə bir gizilti vardı. Nə vaxt gözümə yuxu getdiyini bilmədim...

Yük maşınının səsinə oyandım. Şoferlə yanaşı oturmuş düşərgə rəisini gördüm. O, yerə düşüb bizə tərəf addımladı:

– Vətəndaşlar, – dedi, – hələ bura gələnlərin siyahısı hazır deyil, yoxsa sizi növbə ilə işlədərdim. Hələlik iyirmi nəfəriniz ayrılsın, çadırlar üçün yer qazıb düzəltsin, – o, əli ilə adamları göstərə-göstərə: – Siz, siz, siz... – deyib yalnız kişiləri çağırdı. – Maşından belləri, lapatkaları götürün, dalımca gəlin!

Bizdən ayrılan adamlar tez belləri, lapatkaları götürüb, düşərgədən on-on iki addım aralandılar və rəisin nişan verdiyi yeri qazmağa başladılar. Çadırlar üçün kvadrat şəklində yeri hamarlayıb düzəltmək, yağış sularının öz-özünə axını üçün xəndək qazmaq o qədər də ağır iş deyildi (hətta mən də bunu bacarardım. Bir zamanlar, Müdhətlə bərabər Göy gölün sahilində çadır quranda bunu kişilərdən heç də pis eləməmişdim!). Niyazov özü üst köynəyini çıxarıb bir tərəfə atdı və yanındakı adamların birindən beli alıb kişilərə nümunə göstərməyə başladı. Deyəsən onun bu hərəkəti yalnız mənim yox, çoxlarının xoşuna gəldi, onu hamıdan əvvəl tərifləyən Sədi Kamal oldu:

– Yox, balam, kişi öz vədinə xilaf çıxmadı. Deməli, çadırları gətirdəcək. Yoxsa özü bu cür həvəslə işləməzdi.

Keçisaqqal kişi yuxudan yalnız indicə oyandığı üçün bizim o tərəfə baxdığımızı da sonradan-sonraya gördü və bunun səbəbi ilə maraqlandı. Mən əhvalatı ona danışdım. O, yük maşınını göstərib soruşdu:

– Bəs su gətirmədi?

– Yox, – dedim. – Hələ gətirtməyib... Bir halda ki, sözünün ağasıdır, deməli, qanun-qaydaya əməl olunacaq.

– Ax, hayıf... – deyə o, köksünü ötürüb başını buladı. – Yaxşıca yuxu görürdüm. Bir dəstə dost-aşna İsa bulağına getmişdik. Uşaqlar tonqal qalayıb bax bu hündürlükdə köz salmışdılar. Biri qabırğa kababı üçün ət doğrayırdı, biri tikələri şişə taxıb duzlayırdı. Mən onlardan aralanıb bulağa yanaşdım, dalbadal iyirmi stəkan su içdim, amma yenə də ürəyimin yanğısı kəsmədi. Gördüm ki, stəkan kara gəlmir, dizi üstə qapanıb ağzımı bulağa söykədim. Ləzzətlə hey içirdim ki, sizin səsinizi eşidib oyandım... Dilim ağzımda lap quruyub.

– Siz qarabağlısınız? – deyə soruşdum.

– Necə məgər, oxşamıram?

– Yox, canım, elə-belə maraqlanıram. İsa bulağından danışanda, səsinizdə elə həyacanlı titrəyiş vardı ki, mən bunu ancaq qarabağlılarda, ən çox da şuşalılarda müşahidə eləmişəm.

– Mən qarabaqlı deyiləm, bacı, qazaxlıyam, – deyə keçisaqqal kişi birdən ləhcəsini dəyişib, doğrudan qazaxlıya oxşadı. – Ə, Sədi Kamal yoldaş, bə niyə o nəçənniyə demədilər ki, bizi susundan qırma?

Sədi Kamal onun sözlərini eşitmədi; yan tərəfdə uzanmış cavan bir oğlanla nə barədə isə söhbət eləyirdi.

– Hə, bacı, mən qazaxlıyam, amma Qarabağda düz iyirmi il külüng çalmışam, başımın tükü sanı dostum olub... Hansı qapıya getsəm, ən azı bir toğlu kəsəcəklər. Qarabağı mən qarabağlılardan az istəmirəm. Başa düşdün?..

– Düşdüm, qardaş, düşdüm, amma bircə bunu başa düşmədim ki, bu sözdən niyə acığın gəlir?

– Gələr da... Bə gəlməz? Elə bu cür məhləbazlıq bizim evimizi yıxmadı? Məni buraya sürgün elətdirən də həmən yerliçilik azarına tutulanlar olmadı? Nə var, nə var, analığımın əmisi nəvəsi it ilində Türkiyəyə qaçıb! Eh, ay bacı, görünür, hələ ağzının ləzzətini bilməmisən, İsa bulağının üstündə bir-iki yol kef çəkmiş adam vallah ölümünə də təəssüflənməz.

– Mən İsa bulağında olmuşam, – dedim, – çox da xoşuma gəlib.

– Hə, eləsə, mən deyəni başa düşürsən. Ey fani dünya, sənə heç etibar yoxmuş... – Kişinin səsi birdən qırıldı və gözləri uzaq, məchul bir nöqtəyə dikilib qaldı. Mən duyurdum ki, onun İsa bulağı ilə nə isə çox unudulmaz xatirələri bağlıdır. – Vaxt olar, yenə oralara qayıdarıq, o dostları, aşnaları yığıb, yenə o kabablardan yeyərik...

Doğrusu, kişinin səmimi və yanıqlı danışığı məndə istər-istəməz ona rəğbət oyadırdı. Bu qədər söhbətdən sonra onun adını hələ də öyrənə bilmədiyim üçün bərk sıxılırdım. Aralığa çökən qısa sükutdan istifadə eləyib ondan üzr istədim və soruşdum:

– Adınız nədir, dayı? Görürəm, siz də mənim kimi günahsızsınız.

O, mənim bu sözlərimdən xoşlanıb gülümsündü və bir azca əvvəl mənə "bacı" deyə müraciət elədiyini unudub cavab verdi:

– Eh, qızım, Yevlaxdan o yana ötən kimi qabağına çıxan hər kəsdən soruşsan, Ağdam neft bazasının müdiri Rəcəb kişini tanımayan olmaz. Lap uşaqlar da mənim idarəmi, evimi sənə nişan verər, əgər familiyam səni maraqlandırırsa, onu da deyə billəm. Rəcəb Səlimov... Qaldı mənim günahım...O, susdu və ah çəkir kimi dərindən köksünü ötürdü. – Əlbəttə, günahım var. Özü də lap böyük.

Mən təəccüb elədim:

– Var? O nə günahdır, elə?

– Günahım odur ki, neft bazasını nə özüm yeyib dağıtdım, nə də ona-buna yedirtdim. Axırda əllərinə bəhanə düşdü, əleyhimə material düzəltdilər, məndən yaxşıca hayıf aldılar.

– Kim aldı hayıfı?

– O adam ki, mənə sifariş yollayıb demişdi: “Bakıya gedirəm, on-on beş dəqiqəliyə mənim yanıma gəlsin”. Mən də getmədim, cavab yolladım ki, vaxtım yoxdur.

Mən Rəcəb dayının qarğa dilindən heç nə başa düşmədim:

– Gedəydin də... Nə itirirdin, axı? – Mən onun istehza ilə qımışdığını görəndə, nə isə çox adi bir şeyi bilmədiyimi başa düşüb, qızardım. – O səni niyə çağırırdı, sən niyə getmirdin?

– Eh, ay qızım, görürəm sən çox sadədil adamsan, dünyada heç nədən xəbərin yoxdur. Bu saat ərz eləyim, sən də mültəfit ol.

– Yaxşı, ərz elə, Rəcəb dayı.

– Bizim rayonun təhlükəsizlik orqanına təzə bir rəis yollamışdılar. Kolxozu, sovxozu, meşə idarəsini, yəni ən yağlı yerləri döndərmişdi öz dədəsinin baqqal dükanına. Hamıdan da pul, çervon qızıl istəyirdi. O mənə sifariş yollayanda ki, on-on beş dəqiqəliyə mənim yanıma gəlsin, gərək başa düşəydim ki, hərifə on-on beş qızıl aparmalıyam. Mən də belə şeylərə adət eləməmişdim. Aparmadım. Nə dədəm qızıl kəsəndi, nə də özüm. Hardan alaydım qızılı? Əgər olsaydı, özüm xərclərdim, daha ona niyə verirdim?.. O gündən başladı ayağımın altını qazmağa, babamın, ulu babamın nə dərddən öldüyünü yoxlamağa... Bədxahın biri onun qulağına pıçıldayır ki, bəs nə durmusan, ay dili qafil, Rəcəb Səlimov Türkiyəyə qaçmış filankəsin qohumudur. Hərifin əlinə girəvə düşür. Sədi Kamal demiş, məni də qatır beşinci kalonnaya... İndi də başa düşmədin, qızım?

– Düşdüm, Rəcəb dayı, düşdüm. Bu, doğrudan da lap ağ olub. Ancaq sən dedin ki, yerliçilik...

– Bəli, yerliçilik... Gözünə döndüyüm bir qarabağlı vardı. Hara göndərildilərsə, işin öhdəsindən gələ bilməyib üzüqara qayıdırdı. Savadsız, cahil, yekəbaş bir heyvərə. Oturub-durub hey mənə deyirdi ki, niyə gedib öz xaraban qazaxda işləmirsən ki, mən də sənin yerinə təyin olunam? Mənim də həmişə cavabım bu olurdu ki, elə bura da mənim xarabamdır, evim, eşiyim burda, arvad-uşağım burda, niyə gedim? Yerini dar eləyirəm? Bir yol lap qızıl-qırmızı üzümə dedi: “Bu qədər

sən yedin bəsdir, indi də qoy bir az mən yeyim...” Görünür təhlükəsizlik rəisinə beləsi lazımmış. İndi yəqin ikisi də xımır-xımır yeyir, can bəsləyir...

Mən qulaqlarıma inana bilmirdim. Deyəsən Rəcəb dayı mənim barəmdə tamam düz deyirdi. Vaxtı ilə mənim komsomol sıralarına ərizə verdiyim illərdə təhlükəsizlik idarələrinin haqq və ədalət timsalı olduğuna dair necə təsəvvürüm vardısa, indi də elə təsəvvürüm vardı.

Düşərgə rəisi Niyazov bizə yanaşdı, mənim ətrafımdakı kişiləri çağırdı:

– İndi də siz gəlin, o biri çadırın yerini düzəldin! – dedi və yenə bir dəstə ayırdı. Sədi Kamal da Rəcəb dayı da onlara qoşuldu.

Mən nə fikirləşdimsə, rəisə müraciət elədim:

– Bəs bizi nə üçün işlətmirsiniz?

Bu sual Niyazovu təəccübləndirdi. O, məni təpədən dırnağa qədər süzərək və bununla da görünür, cavab fikirləşməyə vaxt qazanmaq istəyərək, nəzakətlə dedi:

– Axı, biz hər halda şərqliyik, bacı. Ağır fiziki işlərdə qadınların əziyyət çəkməyinə necə razı olaq?

– Bağışlayın, üzr istəyirəm, – dedim, – siz bununla guya bizə xətir qoyursunuz, amma əslində müəyyən dərəcədə heysiyyətimizə toxunursunuz, təhqir eləyirsiniz.

Düşərgə rəisinin yanaqlarına qızartı çökdü:

– Təhqir niyə, bacı? – deyə o, şəxsən özünün nə isə ciddi bir səhv buraxdığını, ancaq bu səhvi hələ də dərk eləməkdən aciz qaldığını büruzə verdi. – Mən ki, sizə elə təhqirli bir söz demədim...

Mən indi çəkinə-çəkinə yox, cəsarətlə, kirpiyimi bir dəfə belə qırpmadan onun üzünə baxdım.

– Tək sizin yox, bir çoxlarının da qadınlar haqqında təsəvvürü köhnəlib. Belə görünür ki, şəhərdə, kənddə ən ağır işlərin öhdəsindən gələn qadınlardan xəbəriniz yoxdur. Lap sizin respublikanızda beləleri azdırmı?

– Aaa... – deyə o, indi artıq rəngdən-rəngə girməyə başlayıb kəkələdi. – Sizinlə ehtiyatlı davranmaq lazımdır, bacı... Əgər könlünüz varsa, buyurun, o biri qadınlara nümunə göstərin.

– Mən tək özümü nəzərdə tutmuram, – dedim, – mən də işləməyə hazıram, ancaq mən ümumiyyətlə burdakı qadınları nəzərdə tuturam.

Niyazov çətin vəziyyətdən belə asanlıqla çıxdığına sevinmiş kimi gülümsündü:

– Buyurun, buyursunlar, – deyə mənim töhmətli baxışlarımdan yaxa qurtarıb, o biri qadınlara üz tutdu. – Gəlin, vətəndaş qadınlar... Ancaq əliniz qabar olsa, şikayətinizi dinləyən deyiləm!

O, kişilərin dəstəsi ilə bərabər uzaqlaşdı və bayaqkı yerdən bir az bəridə, ikinci çadır üçün ayırdığı sahəni göstərdi.

Bu anda kim isə mənim qolumdan yapışdı. Dönüb baxdım: qadın idi. Ağır və yabançı gözləri ilə az qala məni yeyəcəkdi:

– Buyurun, – dedim,

– Buyurmağım yoxdur, – dedi, – qadınlar səni vəkil eləməyiblər. Elə biri mən!.. Nə vaxt demişəm ki, mənim də adımdan danış?

– Siz haqlısınız, – dedim, doğrudan da məni vəkil eləməmisiniz, ancaq mən belə düşünürəm ki, bundan sizə yalnız xeyir gələ bilər. – Qadın onun şişmanlığına işarə vurduğumu dərhal anlayıb, azca qızardı. – Adam hərəkətsiz qalanda yaman piylənir, bunun da ki, ürəyə çox ziyanı var. Bir də axı, kənarda oturub kişilərə tamaşa eləsək, işsizlikdən bağrımız çatlamaz?

– Yox, mənim bağrım çatlamaz. Ona görə də deyirəm ki, öz adından danış. Mən ömrümdə əlimə lapatka götürməmişəm. Bəlkə sən nökərçilikdə böyümüsən, onu bilmirəm. – O, hirsli-hirsli əlimi əlinə aldı və deyəsən təxmininin doğru çıxmadığını görüb tutulan kimi oldu. – Sən ki, nərmə-naziyin birisənmiş, bu əlnən yer qazmaq istəyirdin? – O, mənimlə artıq hər şeyi açıq danışa biləcəyini kəsdirib nə isə çox intim bir əda ilə dedi: – Ay qız, mən sənə də acıyıram, görünür, nəcib ailədənsən, naz-nemət içində böyümüsən. Evindən-eşiyindən didərgin saldıqları bəs deyil, hələ bir qara fəhlə kimi lapatka götürüb torpaq da qazıyasan? Sən bunların dədəsinin nökərisən?

Əlimi onun əlindən çəkdim:

– Mən də öz adımdan heç kəsi vəkil eləməmişəm, – dedim, – bəli, nəcib ailədənəm. Fəhlə ailəsindən!.. Siz çox nahaq yerə məni özünüzə tay bilirsiniz!

Qadın görünür, nə qədər cəsarətli olduğunu ətrafındakı adamlara da göstərmək üçün səsinə güc verdi:

Bunlar səni də, məni də özlərinin əlibağlı qulu kimi işlətmək istəyirlər, mən lap qəzəmətdə çürüməyə razı ollam, amma bu zülmə yox!.. Ay bədbəxt, mənim sənə də yazığım gəlir, çünki pis-yaxşı sən də bizdənsən...

Mən dözmədim:

– Axı, siz kimsiniz?

– Necə yəni kim? Hələ bizim kim olduğumuzu da bilmirsən?

– Yox, bilmirəm.

– Biz – yəni azərilər!..

– Mən azərbaycanlı olduğumu danmıram. Mən bununla həmişə fəxr eləmişəm, – dedim, – ancaq mən özümü sizdən saymıram. Çünki azərbaycanlılar mənim mənsub olduğum xalqdırsa, – o, heç vaxt sizin kimi zəhmətə bu cür nifrət gözü ilə baxmayıb!

– Mən zəhmətə zidd deyiləm, ancaq bu şərtlə ki, bu zəhmətdən mənim millətimə bir xeyir gəlsin. Başa düşdün? Millətimə...

Adamlar yavaş-yavaş ətrafımıza toplaşır və bizim mübahisəmizi dinləməyə başlayırdılar. Yanaqlarından az qala qan daman, enli gərdənli, danışdıqca bədəniləngər vuran bu qadın Sədi Kamalın bayaq dediyi millətçiləri mənim yadıma saldı.

– Bilirsən nə var, xanım? – deyə mən ona nə isə çox tutarlı bir cavab vermək istədim.

– Nə var?

– Məni yandıran odur ki, məni sənin kimilərinə yoldaş eləyiblər! Bu, doğrudan da böyük təhqirdir!.. – deyə onu yumruqlamaq arzusundan özümü güclə saxlayıb, Niyazovla bərabər bizdən aralanan dəstəyə sarı getdim.

Bu anda ovcuna tüpürüb günəşdə parıldayan lapatkanı torpağa düz bir qarış dərinlikdə batıran Sədi Kamal mənim nə məqsədlə gəldiyimi başa düşüb dedi:

– Ay bacı, rəis haqlıdır, sən bizə baxma, bərkə-boşa düşüb öyrənmişik. Bir də sən özünü pambıq becərən arvadlarla müqayisə eləmə. Sənin üçün çətin olar. Cılız, nərmə-nazik bir qadınsan...

– Çətin niyə olur? Müharibə başlanan günlərdə iki metr dərinliyində xəndək qazanlardan biri də mən deyildim? – deyə mən kişilərin neçəsindən lapatka istədimsə də heç biri vermədi.

Niyazov da mənə baxıb, boy-buxunumu istehza ilə süzdü:

– Görürsənmi, bacı, – dedi, – bax, bunlar da mənim sözümü təsdiq eləyir... Ancaq tələsməyin. Burda hamı üçün iş tapılacaq. Biz sizi başqa yerdə, kolxozda, sovxozda da yerləşdirə bilərdik. Ancaq görünür yuxarıda rəis yoldaşlardan hansısa belə məsləhət görüb. Demək istəyirəm ki, əzab-əziyyətiniz olacaq. Sizin sənətiniz nədir?

– Elmi işçiyəm, – dedim. – İnşaat mühəndisi.

Rəisin istehzalı təbəssümü bir an içində yox oldu, özündən böyük bir rəisin qarşısında rəsmi-təzim eləyirmiş kimi ehtiramla dartındı. – Bu daha gözəl.. Mənim belə bir sənətim olsaydı, dünyada özümü xoşbəxtlərin xoşbəxti sayardım! Deməli, sizi gərək gözümüzün üstündə saxlayaq.

Mən onun sözlərində kinayə axtardım, ancaq bu, əbəs idi: o, mənə heyrətlə baxır və tamam ciddi danışırdı.

– Sizin içərinizdə mühəndislər olduğunu mənə demişdilər, fikirləşirdim ki, bunlar yəqin neft mühəndisləridir.

– Yox, – dedim, – nahaq elə fikirləşmisiniz. Bakıda da həmişə tikinti işləri aparılır! Hələ mən gözəl memarlarımızı demirəm, yüzlərcə inşaat mühəndisimiz var.

– Ona görə də siz nahaq tələsirsiniz. Siz burda kənd salmağa yaxşıca kömək elərsiniz, – deyə Niyazov işləyənlərə baxdı və kimə isə xəndəyi o qədər də dərin qazmamağı tapşırıb, yenə mənə üz tutdu: – Görürəm ki, siz bura göndərilməyinizdən o qədər də qəzəblənməmisiniz...

– Yox, haqlısınız, qəzəblənmişəm, – dedim, – ancaq məsələ burasındadır ki, buralar da mənim nəzərimdə qürbət deyil.

Niyazov, deyəsən, mənimlə söhbət eləməkdən xoşhal olurdu. Nə isə deməyə hazırlaşırdı ki, birdən Rəcəb kişi lapatkasına söykənərək, şəhadət barmağı ilə alnının tərini siyirərək, düşərgə rəisini səslədi:

– A yoldaş nəçənnik, susuzluqdan bizi niyə qırırsınız?

Niyazov ona bir söz demədi, maşınlar gedən yola tərəf boylandı və dodağının altında kimi isə söyüb yamanladı.

Rəcəb kişidən sonra Sədi Kamal, onun da dalınca o biri kişilər deyinməyə başladılar: – Aclığa birtəhər dözmək olur, amma susuzluğa...

– Vətəndaş rəis, əgər mümkünsə özümüz gedək su gətirək. Nə olar, üstümüzə keşikçi də qoyun!

Birdən Niyazovun sifəti dəyişdi:

– Nə keşikçi?! Mən axı dedim ki, siz dustaq deyilsiniz. Neçə kərə demək olar, birdəfəlik başa düşün ki, bəzi mülahizələrə görə sizin ancaq yaşayış yeriniz dəyişdirilib. Aydındır? Qaldı su...

Rəcəb kişi ona qulaq asa-asa mızıldanırdı:

– Dəyişməyinə çox şey dəyişib, ay nəçənnik. İntaası sənnən çənəbazar eləməyə hövsələm yoxdur, lap ürəyim yanır. Heç qəzəmətə düşənlərə də bu əzabı vermirlər...

Bizim söhbətimizdən elə bil bütün düşərgə xəbər tutdu. Gün günorta yerinə qalxdıqca, hava istiləşdiyindən, susuzluq çox adamı əldən salırdı.

Düşərgədən böyük bir dəstə adam ayrılıb Niyazova sarı yönəldi. Onların içərisində bayaqkı qadın da gözümə dəydi. Ancaq o, özünü rəisə göstərməmək üçün ucaboylu kişilərin dalında gizlənirdi.

Niyazov bir az əvvəl söydüyü adamın adını, familiyasını çəkib ucadan deyindi: – Günah ondadır. Görürsən yaramazı? Hardasa veyllənir. Gərək indi çoxdan qayıtmış olaydı... – O, sağ əlini havaya qaldırdı: – Vətəndaşlar, bir az səbir eləyin!

– Nə vaxta qədər? – deyə qadının qabağını kəsmiş caydaq kişi zil səsi ilə qışqırdı. – Bizi dilsiz-ağızsız görmüsünüz?

– Vətəndaşlar, – deyə Niyazov izdihamı sakitliyə çağırdı. – Vallah, mən özüm də bərk susamışam. Su dalınca göndərdiyim adam nə üçünsə gecikib...

İzdiham sakitləşmək əvəzinə daha da zəhmli bir uğultu qopartdı:

– Su, su, su!..

Doğrusu Niyazovun sözlərinə mən ürəkdən inanırdım. O, tez-tez yaylığını çıxarıb alnının və boynunun tərini silir, nəfəsi daralmış halda az qala ləhləyirdi. O qadın bir də gözümə sataşdı. Mənə elə gəldi ki, o, yanındakı adamları tovlaşdırır, amma özü irəli yeriyib, bir söz deməkdən çəkinirdi. Mən də "su!" deyə fəryad eləyənlərə qoşulmaq istədiyim halda, bu narazılığa onun istiqamət verdiyini görüncə fikrimdən daşındım. Sədi Kamal rəisin köməyinə gəldi:

– Ay camaat, siz də qəribəsiniz, bu kişi suyu özü içib bizə verməsəydi, onda danışmağa haqqınız vardı, nə olub belə kəmhövsələlik eləyirsiniz?

Caydaq kişinin cin səsi bir də ucaldı:

– Yaltaqlıq sənə qalıb? Qoysana rəis cavab verə!

Qadın yanındakı adamlara dodağının altında yenə nə isə dedi və ləngər vura-vura, qaş-gözünü oynatdı. İzdihama qoşulanların sayı isə get-gedə artır və uğultu da güclənirdi. Yerindən qımıldanmayan Niyazov, yəqin ki, bu gözlənilməz etiraz səslərinin qalxmağında özünün də müəyyən dərəcədə günahkar olduğunu görüb, heç nə demirdi.

Birdən qadının böyründən, ordubatıq, üzünü tük basmış, yumru və gödək bir kişi izdihamı yarıb irəli çıxdı, hamının səsini ötərək qışqırdı:

– Ay camaat, siz bunların məqsədini nə üçün başa düşmürsünüz? Ayrı yolnan bizə cəza verə bilmirlər, acından, susuzdan qırmaq istəyirlər!

Əgər bu vaxt başqa bir nəfər də onun kimi açıqdan-açığa izdihamı qiyama çağırsaydı, gözü qızmış camaatın Niyazovu ayaq altına salıb tapdalayacağına heç bir şübhə ola bilməzdi. Görünür, bunu hamımızdan çox Sədi Kamal hiss eləyib, nahaq qana bais olmağın müdhiş nəticəsini fikirləşib, lapatkasını havaya qaldırdı, zəhmli bir görkəm alıb, adamların qabağına yeridi və həyəcandan tutqunlaşmış səsi ilə bağırdı:

– Geri çəkilin, ay yoldaşlar, siz neyləyirsiniz? Rəisin nə günahı var?

İzdiham sanki birdən soyuyub, tərəddüdlə ayaq saxladı. Hamıdan irəlidə dayanmış yumru kişi arxasında hücuma hazır dayanmış adamların dalı-dalı çəkildiyindən xəbər tuta bilmədiyi üçün yenə eyni ötkəmliklə düşərgə rəisinə tərəf yönəldi və yerdən daş götürüb, təkrar doğrulanda, Sədi Kamal sol əli ilə onun biləyini necə bərk sıxdısa, qara, uzunsov daşı yerə buraxmağa məcbur oldu.

– Sən nəçisən? – deyə yumru kişi Sədi Kamalın üstünə şeşələndi və arxasındakı adamları köməyə çağırmaq fikri ilə geriyə çevriləndə, özünü meydanda tək görüb, köpü yatmış halda kiridi və sanki suyu süzülə-süzülə dalı-dalı çəkildi.

– Ay camaat, belə sarsaqlara uyub, özünüzü rüsvay eləməyin! – deyə Sədi Kamal acı istehza dolu bir nəzərlə yumru kişiyə baxdı. – Mən bu cür qoçuların qeyrətinə çoxdan bələdəm!

İzdihamın hay-güyündən, düşərgəyə yan almış yük maşınının səsini heç birimiz eşitməmişdik. Şoferin yanından düşən DTK (Dövlət Təhlükəsizliyi Komissarlığı) leytenantının öz tapançasını qoburdan necə çıxartdığını və bizə necə yanaşdığını sezməmişdik.

Onu görən izdiham birdən susqun düşdü. Niyazov onun kimi isə vurmağa hazırlaşdığını anlayıb, bir göz qırpımında irəli atılaraq tapançanı vurub əlindən saldı və eyni çevikliklə əyilib yerdən götürdü.

– Bu nədir, dəlimi olmusan? – deyə bağırdı. – Adam güllələməyə vərdiş eləmisən, amma belələrini deməyiblər...

Leytenant üzdən çox cavan, amma saçları vaxtsız ağarmış, döşü qabarıq, boylu-buxunlu bir kişi idi. Niyazovun hərəkətini ən ağır təhqir saydığı qəzəbli və tutqun baxışlarından açıq-aydın oxunurdu. Rütbəcə özündən böyük adama söz qaytarmaq imkanından məhrum olduğu üçün, içindən qırıla-qırıla qaldığını yalnız mən deyil, yəqin ki, ona baxan adamların hamısı hiss eləyirdi, onun sifəti əvvəlcə xal-xal oldu, sonra isə kül kimi bozardı və nəhayət o, qürurunun tapdalanmağına dözməyib yalnız dodaqlarını tərpədərək dedi:

– Məncə xalq düşmənləri ilə bunların arasında elə bir fərq yoxdur. Əgər mən özümü vaxtında yetirməsəydim, siz indi o dünyada idiniz.

– Hanı su? – deyə Niyazov sərt bir ifadə ilə ondan soruşdu.

– Mən bu vəzifəni boynuma götürməmişəm və götürmək fikrində də deyiləm!

– Sizin nə fikirdə olmağınızla maraqlanmıram. Hanı su?.. Sizin kimilər müqəddəs çekist adını ləkələməkdən başqa heç nə bacarmırlar!

– Mən ləkələyirəm, yoxsa siz? Məncə siz və sizin kimilər!..

– Tərbiyə və ədəb hamıdan əvvəl çekistə lazımdır!.. – deyə Niyazov rütbəsindən çox yaşına və təcrübəsinə ehtiram göstərməyən bu kobud gəncə həddini bildirməyin çətinliyini görüb, səsini yavaşıtdı: – Mənə fəxri çekist nişanını Feliks Edmundoviç öz əli ilə verib! Anladınmı?

Niyazov leytenantın kimə və nəyə isə arxalandığı üçün saymazyana dayandığını görüb, istər-istəməz öz ixtiyarından istifadə eləməyə məcbur oldu.

– Bu dəqiqə gedin, baş leytenant Çeplakova deyin ki, mayor Niyazov sizi iki həftə müddətinə həbs eləyir! Əmrimi yerinə yetirin!

Leytenant həddini keçməyin heç bir fayda vermədiyini anladı, Niyazovun əlindəki tapançaya baxdı, rəisin onu geri qaytarmaq fikrində olmadığını yəqin eləyib, başını sinəsinə endirdi, istər-istəməz ayaqlarını cütləyib sağ əlini gicgahına yaxınlaşdırdı:

– Oldu! Baş leytenant Çeplakova deyim ki, mayor Niyazov məni iki həftə müddətinə həbs eləyir, – deyə dabanı üstə fırlanaraq maşına tərəf getməyə başladı.

– Dayanın! – deyə Niyazov öz aralarında nə isə danışan gözətçilərdən birini səsləyib yanına çağırdı. – Maşınla su gətirməyə gedəcəksiniz. Leytenantı rayon şöbəsinə aparın, qayıdanda kənddən boçka tapıb su ilə doldurun. Sizə yarım saat vaxt verirəm... Köməkçi lazımdırmı?

– Bir nəfər də versəniz pis olmaz.

Niyazov bizə müraciət elədi:

– Kim gedə bilər?

– Mən!.. – deyə Rəcəb kişi əlindəki beli yerə atdı. Niyazov başını tərpədərək razılığını bildirdi və təkrar yerqazıyan adamlara qoşuldu.

Gözətçi, Rəcəb kişi və leytenant maşına minib düşərgədən uzaqlaşdılar.

Bundan sonra Niyazovun xeyirxahlığına şübhə eləmək çətindi. Əlbəttə, o bizim nəzərimizdə qəsdən yaxşı görünməyə çalışmırdı. Axı,

buna onun ehtiyacı da yox idi. Bizim rəğbətimizi qazanmağın ona nə faydası ola bilərdi ki? Niyazov DTK leytenantının özbaşınalığına qarşı belə sərt bir tədbir görərkən də şəxsi xeyrini fikirləşmirdi. Mənə elə gəlirdi ki, düşərgə rəisi, adamları, heç bir səbəb olmadan, incitməyi lazım görmürdü. (Mən bu təxminin doğruluğuna sonralar daha çox inanmağa başladım. O, yeri düşdükcə, tabeliyində çalışan adamlara bəzən bizim yanımızdı tənbeh eləyib deyirdi: "Əgər müqəssirin günahı böyük olsaydı, ona daha ağır cəza verərdilər. Bizim vəzifəmiz müqəssiri daha çox sıxışdırmaq və ya alçaltmaq deyil, onu gələcəkdə faydalı bir vətəndaşa çevirməkdir. Bu məqsəd üçün də məhkuma nəcib təsir göstərməkdir. Yadınızda saxlayın ki, biz insanların yenidən tərbiyə olunmağına inanırıq!". Bir dəfə, nəzarətçilərdən biri, xəstələndiyi üçün işə çıxmayan Sədi Kamalı ədəbsiz sözlərlə təhqir eləyib söymüşdü. Niyazov Bu hadisədən xəbər tutanda, nəzarətçini yanına çağırtdırıb onu möhkəm danladı. Dedi ki: "Bizi burda hökumətin müvəkkili sayırlar, ona görə də hər hansımızın ədalətsiz hərəkətimiz tək özümüzü hörmətdən salmır, quruluşumuza ziyan verir, halbuki bizim borcumuz, həm də müqəddəs borcumuz – müqəssirdə hökumətimizə mənəvi etimad oyatmaqdır. Əgər müqəssir bizə qarşı ədavətini davam elətdirsə, o başqa məsələ. Bu vaxt güzəştə getmək özü cinayətdir!..)

Su gətirməyə gedən maşın qayıdanda, kuzovda əyləşmiş Rəcəb kişi uzaqdan bizə əl eləyib, hamımızı salamladı və maşın dayanar-dayanmaz yerə sıçrayıb, yenə çadırlar üçün yer düzənlərin yanında dayanmış Niyazova yanaşdı, sağ əlini hərbi qayda ilə gicgahına söykəyib – rəsmi-təzim ilə raport verdi:

– Yoldaş... bağışlayın, vətəndaş mayor, əmrimiz yerinə yetirildi! Amma yarım saat əvəzinə bir saata gəldik, kolxozda boçka tapılmadığı üçün suyu bidonlarda gətirdik. Mötərizədə onu da nəzərinizə çatdırım ki, Rudəki kolxozunun sədri əsil tacikdir, yəni çox alicənab, mədəni və qonaqcıl bir adamdır. Yenə də mötərizədə sizə ərz eləyim ki, bir az fars dilini bildiyim üçün, o dəqiqə dostlaşdıq. Mən Firdovsidən bir bənd oxudum, sədrin kefi duruldu. Fürsəti əldən verməyib, boçka istədim. Dedi boçka yoxdur, bidon verə bilərəm. Sədrin adı Tursun, atasının adı Tursun, famili Tursunbayevdir!.. Maşallah, yüz on kilo ağırlığı var. Görünür, özünün də, kolxozunun da kefi kökdür, yoxsa o, dünyasında bu cür kökələ bilməzdi. Sizdən icazəsiz ona bir vəd də verdim.

Niyazovu gülmək tutmuşdu, ancaq üzünü o tərəfə çevirib, dodaqlarında titrəyən təbəssümü bizdən gizlətməyə çalışırdı. “Vəd” sözünü eşidən kimi, qaşqabağını töküb soruşdu:

– Nə vəd?

– Dedim ki, dostum Tursun, mən də, yoldaşlarım da Azərbaycan qardaş Tacikistana qonaq gəlmişik. Borclu-borclunun sağlığını istər. Pambıq tarlanızda alaq vurulanda, dəstə düzəldib, özümüzü yetirəcəyik... Düz iş görmüşəm ya yox, vətəndaş rəis?

Niyazov gülməkdən yenə özünü güclə saxlayıb Rəcəb kişinin bir-birindən xeyli aralı duran əyri qıçlarına baxa-baxa dedi:

– Əgər hərbi qayda ilə raport verirsinizsə, ayaqlarınıza da bu qaydanı öyrədin. Bu bir. Əgər belə hallarda məndən icazə almağın lazım olduğunu başa düşürsünüzsə, doğru iş görürsünüz. Bu iki. Aydındır?

– Bəli, aydındır, – deyə Rəcəb kişi ayaqlarını cütləşdirdi və artıq məyus-məyus soruşdu: – Ancaq orasını demədiniz ki, düz iş görmüşəm, ya yox?

– Suyu camaat üçün gətirmisiniz. Bidonları yerə düşürün. Bu da üç!.. – Niyazov yalnız indi məmnun bir təbəssümlə güldü və adamların maşına sarı axışdığını görüncə, əlini yuxarı qaldırdı. – Vətəndaşlar, səbir eləyin, hamınıza su çatar. Nizam-intizamı pozmamaq üçün növbəyə düzülün!

Lakin adamlar nə bu sözü eşitdilər, nə də növbəyə düzüldülər. Bir dəqiqənin içində yük maşınını üzük qaşı kimi dövrəyə alıb, bidonları yerə düşürdülər. Stəkanlar, fincanlar, dəmir və alümin dolçalar əldən-ələ keçməyə başladı. Mən həqiqi mənada yalnız indi anladım ki, insanın müvazinətini pozmaq üçün ən güclü bir vasitə var: susuzluq!.. Əgər mən özüm susuzluğun bütün dəhşətini duymasaydım, bir-birini itələyib yıxan, tapdalayan, dartışdırıb sıradan çıxardan, bir-birinin əlindən fincan və dolça qapmaq üçün çılğınlaşan, hörmət və nəzakət məfhumlarını ayaqlar altına salan insanları görərkən tərəddüdsüz, uca səslə deyərdim: “Kamran haqsızdır. İnsan nə zəif məxluqdur, nə də mənim düşündüyüm kimi zərif məxluqdur, insan yırtıcı məxluqdur!.. “Lakin bu basabas, bu hay-haray on dəqiqə belə çəkmədi. Su, doğrudan da hamıya çatdı, hələ iki bidon da artıq qaldı. Düşərgə birdən süst düşdü. Qolu sərpənlər, yançağı əzilənlər, ayağının qabarı tapdalananlar, pencəyinin ətəyi, köynəyinin qolu cırılanlar belə, çox keçmədən, danışıb-gülür, zarafatlaşır, sanki bir azca əvvəl tutduqlarına

peşman olub, bir-birinə can deyib can eşidirdilər. Onlara baxdıqca mən istər-istəməz düşünürdüm: “Hər halda insan mehriban məxluqdur!”.

Düşərgə üzərinə qəribə bir axşam enirdi, çölün düzündən yavaş-yavaş bizə sarı addımlayıb gələn qüssəli və yorğun bir axşam. Bayaqkı ürək yanğımı unutdurmaq üçün havaya yüngül sərinlik gətirən, səhra otlarının və çiçəklərinin məstedici rahiyəsini bütün bədəninə hopdurmuş nəvazişkar, bakir cənub axşamı...

İlk çadır quruldu. Mən yorğundum. Yuxum gəlirdi. Yalnız bircə saat yata bilsəydim... O biri çadırı da qurdular. Ürəyimdən daş kimi ağır bir yük asılmışdı. Elə bil yer məni çəkib qoynuna almaq istəyirdi. Üçüncü çadırı da qurdular. Bəlkə mən bunları artıq röyada görürdüm?

Sədi Kamalın səsini eşitdim:

– Ay bacı, gedin, gedin, uzanın. Birinci çadırı qadınlara verirlər. Niyə dinmirsiniz? Yoxsa ayaq üstündə yatmısınız? Mənim də başıma gəlib... yuxu dünyanın ən böyük nemətdir. Bacı, ay bacı...

Sonra Sədi Kamalın nə səsini eşitdim, nə də özünü gördüm...

Yuxudan oyananda, artıq səhər idi. Aha, xatırladım, xatırladım. Məni Sədi Kamal qollarının üstündə üsulluca götürüb çadırın altında yerə uzatmışdı. Balaca uşaqları da bax beləcə üsulluca qucaqlayıb, yuxulu-yuxulu apardıqları zaman, onlar heç nədən xəbər tutmurlar, şirin yuxudan oyanmırlar. Ancaq mən onlardan bir az fərqlənirdim: hara isə aparıldığımı duyurdum. Ürəyimdə Sədi Kamala “sağ ol” deyib təşəkkür eləyirdim. Başımın altında bağlamamı gördüm. Yəqin bunu da Sədi Kamal gətirmişdi. “Kişidən yaman ayıb olub” deyə düşünürdüm.

Çadırda uzanmış qadınları aydın görürdüm. Hamısı on iki nəfərdi. Mən baş tərəfdə idim. Dünən savaşdığım qadını böyrümdə gördüm, doğrudan da nə yaman şişmandı. İkiqat buxarı vardı. Ağ-çəhrayı yanaqları işıldayırdı, nəfəs aldıqca yoğun, piyli qarnı enib-qalxırdı. Kök arvadın xoruldamağı nə dəhşət olurmuş...

Səhərdi, amma hələ gün doğmamışdı. Çadırın balaca qapısından görünən bir parça səma tərtəmizdi. Qadın isə xoruldayırdı. Bundan sonra istəsəm də, yata bilməzdim. Xorultu beynimə işləyirdi...

Cəld qalxıb eşiyə çıxdım, çadırdan xeyli aralandım. Ancaq yenə də qadının xorultusunu eşidirdim. Elə bil kim isə onu boğurdu... Bir az da uzaqlaşdım. Yox, onun xorultusu sanki mənim acığıma daha da bərkiyirdi. Çadırlara baxdım. Hamısı on iki dənə idi. Planla tikilmiş evlər kimi nizamla cərgəyə düzülmüşdü. Düşərgəmiz hərbi qəsəbəyə bənzəyirdi...

Saata baxdım. Əqrəb beşi göstərirdi, ancaq hələ də gün doğmamışdı. Üfüqdəki qızartılar nəhəng bir yanğını xatırladırdı. Bizim gəldiyimiz torpaq yoldan burula-burula qalxan toz dumanı, düşərgəmizə sürətlə yaxınlaşırdı. Əlbəttə, maşın gəlirdi. Bərk acmışdım. "Yəqin çörək gətirirlər" deyə sevindim.

Qadının xorultusundan başqa heç bir səs eşidilmirdi. Toz dumanı isə üfüq boyu uzanaraq, göy üzünü bozumtul bir pərdəyə bürüyürdü.

Maşın göründü. Düşərgəyə yan aldı. Gələn kim olsa yaxşıdır? Qəribədir, mən onları nə üçün belə tez unutmuşdum? Aha, yanılmamışdım. Onlardan bir qədər aralı, maşının gerisində DTK nəfəri görünürdü. Mən uşaq kimi sevinib necə qışqırdığımı bilmədim:

– Ceyran xanım!..

O dinmədi, amma gülümsündü. Tezcə yerə sıçrayan Elmanın köməyi ilə maşından düşdü. Mən onlara tərəf yüyürdüm:

– Elman qardaş!..

O da gülümsündü, Ceyranın qoluna girdi. Mən gördüyümə hələ də inana bilmirdim. Soruşdum:

– Gəldiniz?

Ceyran xanım köhnə və mehriban bir dost kimi məni bərk-bərk qucaqlayıb öpdü. Dünən səhərdən bəri heç nə yemədiyim halda, sevincimin çoxluğundan, aclığımı unutdum.

– Axı, sizi nə üçün saxlamışdılar, sizdən nə istəyirdilər? – deyə xəbər aldım.

O, elə bil mənim sualımı eşitmədi, arxasında dayanmış Elmana sarı çevrilərək soruşdu:

– Buranın böyüyünü görəcəyik, hə?

Elmanın əvəzinə mən cavab verdim:

– Rəisimiz hələ qalxmayıb, bilirəm ki, çox yorulub, yəqin bu tezlikdə qalxmaz.

Ceyran xanım zarafat tərzində dedi:

– Nədən yorulub ki? Daş daşıyırdı?

– Yorulub, yorulub, – dedim. – Dünən bütün günü camaatı da işlətdi, özü də işlədi. Həsən Babacanoviç yaxşı adamdır. Görünür, bu da bizim bəxtimizdəndir, axşamüstü bizi çadırlara bölüşdürdü. Bir azdan qalxar, tanış olarsınız.

Ceyran xanım ərinə üz tutdu.

– Get,şeyləri gətir. Son mənzilimiz buradır, gətir görək, başımıza nə gəlir... – Elman maşına doğru yönələndə, mənə müraciət elədi: – Yəqin bizi bir-birimizdən ayrı salacaqlar. Neyləyəsən, gərək birtəhər dözəsən...

Elman ağır çamadanını qov kimi yüngülvarı əlində oynada-oynada bizim yanımıza gətirdi:

– Hə, Səmirə bacı, – dedi, – bilirik, dünəndən sizə yemək verməyiblər. Yolda şoferdən öyrəndik. Hələ bir rəisinizi də tərifləyirsiniz... – O, acı-acı gülümsəyib başını buladı. – Yanımızdakı o hərif başladı ki, əvvəldən heç bir hazırlıq görə bilməmişdik. Yəni onu demək istəyir ki, bura gələnlər çağırılmamış qonaqlardır... Bu yaxında rayon mərkəzi var. Ordan keçəndə, bizim maşınımıza bolluca qara çörək yüklədilər. Ancaq bilmək olmur arpadır, çovdardır, yoxsa jmıx... – O, mənim bu sözləri o qədər də xoşlamadığımı duyub danışığının ahəngini dəyişdi. – Əlbəttə, vəziyyəti nəzərə alsaq gərək allahımıza şükür eliyək. Mühasirə vaxtı Leninqradda bu cür çörək veriləndə, camaat üçün toy-bayram olurmuş... Bizim onlardan nəyimiz artıqdır?

– Eh, Elman qardaş, – dedim, – təki ondan da pis çörək verəydilər, amma bizi uşaqlarımızdan ayırmıyaydılar.

– Əlbəttə, əlbəttə... – deyə Ceyran xanım gözlərinə qəm kölgəsi qonmuş halda köksünü ötürdü. – Adam hər cür əzaba dözər, bircə bu dərdə dözmək olmur. Neçə gündür hey uşaqları yuxumda görürəm, həmişə də “ana” deyib ağlayırlar.

Mən bu söhbəti başladığıma tezcə də peşman olub kiridim, başqa bir mövzu tapmadığım üçün tamam pərtləşdim. Hər üçümüz yanaşı addımlayıb, qadınların çadırına yaxınlaşdıq. Elman diqqət kəsilib, içəridən gələn xorultunu dinlədi və qaşlarını çatıb təəccüblə mənim üzümə baxdı:

– Siz burda olursunuz?

– Bəli, – dedim.

– Bu xoruldayan arvaddır, kişi?.. Vay, vay, lap ÇTZ traktorunu keçdi ki... Pay atonnan yeri! Ceyran, eşidirsən?

– Eşidirəm, eşidirəm. Necə olur ki, mən gecə-gündüz çalıb-oxuyanlarla durub, oturuRam, bu cür basi qulağım almır?

Bu sözlər tamam ürəyimdən oldu:

– Hə, hə, – dedim, – dəhşətdir, dəhşət... Məni də yuxudan o oyatdı, yoxsa elə yorulmuşdum ki, qulağımın dibində top da atsaydılar, bu cür tezdən qalxmazdım. Görmürsünüz hələ gözümdən yuxu tökülür?

Elman nırçıldayıb başını buladı:

– İndi bundan hesabını apar, gör yazıq camaat nə təhər yorulub ki, bu səs də onlara kar eləmir... Yox, Səmirə bacı, belə hallarda gərək heç nəyə baxmayasan, o dəqiqə xoruldayanın böyrünə möhkəm bir dürtmə vurasan, deyəsən ki, qonşu, zəhmət olmasa qalx, təzədən yat...

Mən etiraf elədim ki:

– Doğrusu üzüm gəlmədi.

– Nahaq, nahaq... – Elman yenə diqqət kəsildi. – Bu xorultudan çox tırtıllı tankın səsinə oxşayır!

Ceyran xanım mənim səbrimə məəttəl qaldığını söylədi:

– Siz bir gecə dözmüsünüz, mən bircə dəqiqəsinə dözməzdim... Doğrudan da bu qadın səsidir?

– Özünü görəndən sonra təəccüb eləmiyəcəksiniz, – deyə mən o arvadın ikiqat piyli buxağını, ləngər vuran yoğun bədənini təsəvvürə gətirib, nə üçünsə Ceyran xanımla müqayisə elədim, biri yaxşı bəslənmiş zavod inəyi kimi ətli-canlı, o biri isə iki aylıq göyçək buzov kimi şumal və zərif idi. Ceyran xanım ayrıldığımız gündən bəri hələ bir az da sınıxmışdı. Bu qədər uzun yolda necə əziyyət çəkdiyini görmək çətin deyildi. Gözlərinin altı kölgələnmiş, adəti üzrə ortadan tən ayırıb iki yana daradığı zil qara saçlarının səliqəsi pozulmuşdu. Ordlarının çuxurları bir az böyümüş, zərif üzü, alnı və kirpikləri toza bulaşmışdı. Neçə vaxtdan bəri su dəyməmiş boynunda, boğazında nazik kir zolaqları görünürdü. Ancaq buna baxmayaraq, siması yenə də əvvəlki məlahətini itirməmişdi. Mənim ona nə səbəbə diqqətlə baxdığımı hiss eləyib, qəmgin bir təbəssümlə dedi:

– Bilirəm, bilirəm, üst-başım yaman gündədir. Elə siz də məndən geri qalmazsınız. Görürəm, bu yaxında su deyilən şey gözə dəymir... Eh, təki, siz demiş, dərdimiz elə bu olsun.

– Əlbəttə, Ceyran xanım, əlbəttə, – dedim, – amma sualıma cavab vermədiniz. Axı, Krasnovodskda sizi nə üçün saxladılar? Doğrusu, əvvəlcə sevindim, fikirləşdim ki, yəqin sizi Bakıya qaytaracaqlar. Amma sonra çox kədərləndim. Çünki biz tanış olub dostlaşırdıq, mərdimazarlar qoymadılar... Ümid eləyirdim ki, qürbətdə bir-birimizə

ürək-dirək verib, dərdimizi azaldarıq... Buradakı qadınları hələ yaxşı tanımıram, ancaq hələlik elə bir gözə dəyəni də yoxdur... Bu xorul-dayan da ki...

– Necə? Pis adamdır?

– Nə isə o qədər də xoşuma gəlmədi. Qeybət düşməsin, orta əsrdən bəri adlamayıb.

– Neçə qadın var?

– On iki.

Bu vaxt kim isə dalbadal iki dəfə öskürdü. Biz hər üçümüz səs gələn tərəfə baxdıq. Düşərgənin qərbində, bizimkinə nisbətən dörd-beş dəfə kiçik son çadırın qapısı ağzında durmuş Niyazov, çılpaq qol-larını gərib-qatlayır, yuxarı qaldırır, qıçlarını əyib-düzəldir, bir sözlə, bədən tərbiyəsi ilə məşğul idi.

– Bax, rəisimiz o kişidir, – dedim.

Ceyran xanım azacıq səksəndi; seyrək, uzun kirpikləri titrədi:

– Əgər, – dedi, – o da Krasnovodskda məni tutub saxlayanlar kimi-dirsə, vay bizim halımıza.

Elman hər şeyi əvvəlcədən xəbər verməyi bacaran adamlar kimi, qəribə bir inamla dedi:

– Ona heç şübhən olmasın. Bunlar hamısı bir bezin qırağındandır.

– Axı, ordakılar sizə neylədilər? – deyə mən bayaqkı sualımı Ceyran xanımın yadına saldım.

– Daha neyliyəcəkdilər ki?.. Məni təkləyib apardılar, qapını bağ-ladılar. Üçü birdən üstümə tökülüşdü. Məni bir çək-çevirə saldılar ki, gəl görəsən. Gözlərindən qan damırdı. Ay belə damlayacayıq, ay elə cəzalandıracayıq. Nə bilim, məni bir dəqiqədə döndərib elədilər dün-yanın məşhur oğrusu... Lap böyükləri, mayordu, polkovnikdi, bilmirəm, başladı ki, bu cür moda ilə geyinən oğruları çox tutub ağzıbirə salmı-şıq, sonra da bütün dəstələrini dağıdıb, camaatın yaxasını onların əlindən qurtarmışıq. Bu dəfə özümü saxlaya bilməyib dedim ki: “Əgər onlar da mənim təki oğrudursa, deməli o yazıqları da çirkin böhtana salmı-sınız, bir də axı, oğurluq məsələsi ilə milis, cinayət axtaran idarə məşğul olur, bunun sizə nə dəxli var?” – Mayorun yanındakı qara-yanız, cəhənnəmdən biletsiz qaçmış bir nəfər qışqırdı ki, “mən özüm milis idarəsindənəm, sən pul kassası yaranların dəstəsilə əlbirsən, yoldaşlarını Bakıda tutublar, onlar səni bizə nişan veriblər!.. “ Yaxşı, siz mənim yerimdə olsaydınız, neylərdiniz?

– Vallah, sizdə qəribə səbir var, – dedim, – mən bu təhqirə dözməzdim, əlimə keçəndən qapıb, onun başını partladardım.

Ceyran xanım mənimlə razılaşmadı:

– Yox, mən istəmədim ki, onların əlinə təzə bir dəstəvuz verim. Onsuz da gəmidə o ifritəni birtəhər eləmişdim. Bu dəfə hirsimi boğub, bir kəlmə də artıq-əskik danışmadım. Nə dedilərsə, sakitcə dinlədim, nə qədər çığır-bağır saldılarsa, daşdan səs çıxdı, məndən yox. Amma boynuma alıram ki, küncdə büzüşüb oturmuş o göygöz iblisə baxdıqca, dişim bağırsağımı doğrayırdı. Az qalırdım yenə üstünə atılam, saçını dolayam biləyimə, yerə yıxıb sürüyəm... Ancaq birtəhər dözdüm. Axırda dedim ki, bilirsiniz nə var? Sizdə günah yoxdur, sizi buna məcbur eləyirlər. Ancaq məni tutub qazamata da salsanız, bu hayıfı yerdə qoymayacağam, dəvədən böyük fil var, ölkə sahibsiz deyil, yazacağam, düz birbaşa Moskvaya, açacağam sandığı, tökəcəyəm pambığı!.. Siz hələ məni yaxşı tanımamısınız... Mayor soruşdu ki, bu nə sözdür, bizi kim məcbur eləyir? Dedim ki, əgər mən bir qadın kimi filankəsin arzusunu təmin eləsəydim, nə sürgün olunardım, nə də bu cür iyrənc böhtana düşərdim...

– Ceyran, əzizim, bu sözlərin yeri deyil, – deyə Elman söhbətə qarışdı və mən hiss elədim ki, o, Ceyran xanımın başına gələnləri sirr kimi gizlin saxlamağı məsləhət bilir.

Müğənni qadın əlini havada tovladı:

– Yaxşı, qoy sən deyən olsun. Danışmıram.

Mən də israr eləmədim. Bu vaxt Niyazov gimnastikasını qurtarıb, bizim yanımıza gəldi. Mən ər-arvadı onunla tanış elədim.

– Aha, Ceyran xanım, – deyə Niyazov həm təəccüblə, həm də sevinclə onun əlini sıxdı. – Necə ki, necə ki, sizi Orta Asiyada tanımayan yoxdur. Elə mən özüm dörd-beş dənə valınızı almışam. Hələ bir istəsəniz, bu kobud səsimlə “Qubanın ağ alması”nı oxuya da bilərəm... – O, boğazını arıtlayıb, pəstən dedi:

Qubanın ağ alması,
Yeməyə var alması,
Yarım gələnə qaldı
Yaramın sağalması...

Bu mahnı da, bu mahnının könlümdə oyatdığı xoş hisslər də mənim üçün əziz və qiymətli idi. Sevinən tək mən deyildim. Görünür, Ceyran

xanım özü də, Elman da mənim Niyazov haqqında bayaq dediyim sözlərə artıq inanıb, bu uğursuz səfərin bütün acınacaqlarını bir neçə an tamam unutdular və məsum uşaqlar kimi gülümsədilər.

– Ancaq mən heç birinizə yağlı vədlər verməyəcəyəm, yəni yalan danışmaqla qətiyyən aram yoxdur, – deyə Niyazov qaşqabağını tökdü, təəssüf dolu baxışlarını mənim, Elmanın, ən çox da Ceyran xanımın üzündə gəzdirdi və birdən dönüb sürətlə bizdən aralandı. Mənə elə gəldi ki, o, ürəyində nəyə və kimə qarşı isə oyanan narazılıq hissini gizlətməyə məcbur oldu. Hər üçümüz gözləşdik. Elman, deyəsən, onun barəsində necə yanıldığını boynuna alıb, mənə zənnlə baxa-baxa astadan başını iki-üç dəfə qaldırıb-saldı, “belə görünür ki, siz haqlısınız” dediyini başa düşdüm. Öz təəssüratımızı bölüşməyə hazırlaşırdıq ki, Niyazovun DTK nəfərinə ucadan verdiyi əmri eşitdik:

– Hər kəsin çörək payını ayırın, dünənki kimi aləm bir-birinə qarışmasın, yəni nizam-intizam olsun!

DTK nəfəri:

– Baş üstə! – deyib rəsm-təzimlə cavab verdi. – Gündə hərəyə iki yüz qram hesabı ilə, deyilmi? Ancaq məndə tərəzi yoxdur. Gözəyarı bölüşdürə bilərəm.

– Eybi yoxdur, eybi yoxdur, – deyə Niyazov yenə bizə tərəf gəldi, yarımçıq qalmış söhbəti təzələdiyinə sevinmiş kimi, bir zamanlar gördüyü xeyirxah işləri yada salmağı xoşlayan yaşlı adamların ədası ilə nağıl etməyə başladı: – Cavan vaxtı bizim hamımız qurmaq, yaratmaq eşqi ilə gecəni gündüzə qatardıq... Özünü tərif olmasın, yurdsuz uşaqları yığıb koloniyalarda tərbiyə elədiyim üçün aldığım mükafatın sayı-hesabı yadımdan çıxıb...Feliks Edmundoviçin əmri ilə tikdirdiyim binaları barmaqla göstərirdilər. Mənim koloniyalarımda tərbiyə alan uşaqların çoxusu adlı-sanlı, evli-eşikli adam olub, yəni onlara baxanda öz-özümə deyirəm: “Ey qoca, sən özünə ailə qura bilmədin, amma yüzlərcə övlad yetirmisən, Sovet hökumətinin çörəyini yeyəndə xəcalət çəkməyə bilərsən” Yəni inşaat məsələsində bir qədər təcrübəm var. Qorxmayın, bir azdan burda elə kənd salacağıq ki... Vətəndaş Aydın da bu barədə mənə yəqin ki, köməyini əsirgəməyəcək... Elə deyilmi, vətəndaş Aydın?

Mən nə deyə bilərdim? Onun xətrinə dəymək olmazdı. Əgər o, bu yaşda (əllini çoxdan haqlamışdı) hələ də qurub-yaratmağa belə həvəs göstərirdisə, mən nə haqla ona “yox” deməliydim?

– Əgər bacarsan, əlbəttə! – dedim.

– Bacararsınız, bacararsınız!..-dedi.

Bu vaxt adamlar bir-bir, iki-bir çadırlardan çıxıb öz aralarında nə isə danışa-danışa Niyazova və bizə baxırdılar. Çörək gətirmiş DTK nəfəri maşının kuzovundan səsləndi:

– Vətəndaşlar, indidən gəlin, çörək payınızı alın ki, sonra basha-bas olmasın!

Yuxudan qalxmış adamlar maşına tərəf yönəldilər. Dünən su üstündə qalxan həngamə, bu dəfə təkrar olunmadı, növbə düzəltməyə heç ehtiyac da qalmadı.

– Əvvəlcə yeməkxana tikiləcək, – deyə Niyazov öz planını açıb söylədi. – İri su bakları gətirdəcəyəm, əl-üz yuyanlarımız olacaq. Evləri daşdan hördürəcəyik, yəni əməlli-başlı, əsaslı binalar tikəcəyik ki, siz köçüb evinizə gedəndən sonra onlar bizdən yadigar qalsın.

“Aha, deməli evə köçəcəyimiz günü də görəcəyik” deyə düşündüm və tezcə də məyus oldum. O günün neçə ay, neçə il sonra gələcəyini indidən söyləmək mümkün deyildi.

– Ancaq hələlik, bu çadırlarda birtəhər dolanmalısınız, – deyə Niyazov Ceyran xanımla Elmana üz tutdu: – Siz qadınlarla, siz də kişilərlə birgə... Bu gündən adamları dəstələrə ayıracağam. Hamını işə göndərmək üçün siyahı düzəldirəm. Nizam-intizamı pozmasanız, mənim tərəfimdən ancaq hörmət görəcəksiniz. Hələlik, mən getdim... – O öz çadırına tərəf uzaqlaşdı və birdən nə fikirləşdisə, çörək paylayan DTK nəfərinə tapşırdı: – işin qurtaran kimi mənim yanıma gələrsən.

Biz də gedib öz çörək payımızı aldıq. Mən Ceyran Xanıma dedim:

– Elman qardaş demişkən, bir tərəfə baxanda, heç pis çörək deyil. Biz elə Bakıda da bundan yeyirdik.

Düz saat səkkizdə, hardansa tapıb gətirdikləri pioner borusunu çalıb, düşərgə əhlini bir yerə topladılar, Niyazov havayı söz danışmağı sevməyən bir adam olduğunu elə bu gündən sübuta başladı. Yük maşınının üstünə qalxıb, əlində tutduğu uzun siyahını oxudu. Əlli nəfərdən (yalnız kişilərdən) ibarət briqadaya, düşərgə üçün arx çəkmək vəzifəsini tapşırdı:

– Briqadiri özünüz seçəcəksiniz, – dedi, – mən hələlik sizinlə əməlli-başlı tanış deyiləm. Seçərsiniz, baxarıq, yoxlarıq. Əgər pis olsa, daha fəal, əlli – ayaqlı adamla əvəz eliyərik. Hələlik tərəvəz, pomidor, xiyar, qovun-qarpız bostanı salacağıq... Çox təəssüf ki, müharibə başlanan

gündən bəri su bəndi yarımçıq qalıb. Ona görə Rudəki kolxozunun arxından özümüz üçün su gətirməyə məcburuq. Bunu lazımi yerlərdə razılaşdırmışıq... Deməli, siyahıda oxuduğum vətəndaşların vəzifəsi aydındır...

Sədi Kamal bizim yanımızda dayanmışdı. Niyazov sözünü deyib qurtaranda, o, şagird kimi əlini qaldırıb soruşdu:

– Həsən Babacanoviç, bizə qəzetdən-kitabdan verəcəksiniz, ya yox? Camaat son xəbərləri bilmək istəyir, yəni cəbhə yeniliklərini... Əgər bir nüsxə qəzet olsaydı...

– Olacaq, olacaq, – deyə Niyazov onun xahişində heç bir qeyri-təbii şey görməyib, hörmətlə cavab verdi.-Bir qədər səbir eləyin.

Sədi Kamal onun sözlərindən ruhlanıb, maşına lap yaxın gəldi:

– Bir nüsxə ya rusca, ya da tacik dilində olsa kifayətdir. Mən və Rəcəb Səlimov oxuyub tərcümə elərik, – dedi.

– Qəzetimiz də olacaq, radiomuz da olacaq, – deyə Niyazov maşından yerə düşdü və ayırdığı dəstəni çağırıb, düşərgədən bir xeyli uzağa apardı. Mən onların söhbətini eşitməsəm də, briqadir seçdiklərini bilirdim. Onlar kəndə sarı irəliləyib gözdən itdilər. Niyazov isə geri qayıtdı, ikinci dəstənin siyahısını oxudu.

– Siz də bostan üçün yer qazıb, ləklər düzəldəcəksiniz, – dedi. –Mən MTS-dən traktor istəmişəm, bu gün olmasa da, sabah gəlib nəzərdə tutduğumuz sahəni şumlayacaqlar... Özünüzə briqadir seçin, aranızda sahəni bölüşdürün...

Mən Niyazovun təklənməyini gözləyirdim, evə kağız yazmaq üçün bizə qələm-kağız verilib-verilməyəcəyini soruşmaq istəyirdim, ancaq o, əlində uzun siyahı, adamları müxtəlif sahəyə ayırmaqla məşğul olduğundan, buna imkan tapa bilmirdim. Birdən necə oldusa gözü gözümə sataşdı, görünür yenə qadınlar barədə olan nə isə deyəcəyimi düşünüb, məni qabaqladı:

– Mən qadınları bu dəstələrin heç birinə daxil eləmirəm. Onları nisbətən asan işə qoşmaq fikrindəyəm, məsələn, yemək, mətbəx, qabqacaq... – deyib, yenə siyahını oxumağa başladı, adlarını çəkdiyi adamlardan "mən, mən" cavabını aldıqca: – Bu tərəfə, bu tərəfə!.. – deyə bizdən iki-üç addım aralıda nisbətən cavan və sağlam kişilərdən xüsusi bir dəstə düzəltdi. – Bax, vətəndaşlar, siz tikinti üçün taxta-şalban, qum, daş və sair inşaat materialı daşıyacaqsınız. Yəni bunları maşınlara yükləyib, boşaltmaqla məşğul olacaqsınız... Bu gün maşınımız

yoxdur, amma söz veriblər, göndərəcəklər, özünüz bilirsiniz ki, müharibədir, belə şeylərə çox böyük ehtiyac var... Siz də öz aranızdan briqadir ayırın.

Ən axırda Niyazov bizə yaxınlaşdı. Biz deyəndə mən ondan heç bir tapşırıq almamış qadınları və kişiləri nəzərdə tuturam. Bunların sayı çox deyildi. Ceyran xanımdan, Elmandan, Sədi Kamaldan və Rəcəb kişidən başqa iyirmiyə qədər adam olardı. Onların içərisində dayanmış şişman qadın birdən gözümə dəydi, xoruldamağı yadıma düşdüyü üçün məni gülmək tutdu, ancaq özümü saxlayıb gülmədim. O, tünd yaşıl kəlağayı örtmüş uzunsov başını dim-dik tutduğu üçün, buxağının qatları dartılıb açılmışdı. Elə baxırdı ki, elə bil rəisdən özünə dair bir söz eşitməyə bənddir, ona acı bir cavab qaytarmağa və savaşmağa cüzi də olsa bir bəhanə axtarır, amma rəis də sanki onun məqsədini başa düşüb, qəsdən ona sarı baxmır, ona bir söz demir və demək fikrində də deyildi.

Sədi Kamalla Niyazov arasında söhbət başlandı:

– Həsən Babacanoviç, görürsünüz də, heç kim işdən boyun qaçırmadı aramızda müftəxor yoxdur, ancaq mənəvi qida barədə fikirləşmək heç də pis olmazdı.

– Vətəndaş Sədi, soruşdunuz, cavab verdim, qəzet və radio olacaq...

– Bağışlayın, Həsən Babacanoviç, onlar öz qaydasında, mən ümumiyyətlə düşərgədə aparılacaq mədəni-maarif işlərini nəzərdə tuturam.

– Məsələn?

– Məsələn divar qəzeti, dram dərnəyi, xor, xalq çalğı alətləri orkestri... Əgər icazə versəydiniz, bu işlərin hamısını mən özüm boynuma götürərdim.

– Çox gözəl. Etiraz eləmirəm.

– Onda sizdən xahişim var.

– Buyurun.

– Qəzet üçün qalın kağız, rəngli karandaşlar, qəzeti asmağa lövhə... Kiçik formalı pyes, rus dilində, tacik və ya Azərbaycan dilində olsun, bizim üçün fərqi yoxdur, Rəcəb kişinin köməyi ilə tərcümə də eləyə bilərəm.

– Vətəndaş Sədi, təklifiniz çox faydalıdır, yaxşı olar, bunların siyahısını düzəldib verəsiniz, birdən unuda bilərəm.

– Vətəndaş Sədi, təklifiniz çox faydalıdır, yaxşı olar, bunların siyahısını düzəldib verəsiniz, birdən unuda bilərəm.

– Siyahını yazmaq üçün də kağızım yoxdur.

– Gedək, mənim çadırımda var, – deyə Niyazov bizim dəstəmizdən aralandı və mən yenə də öz sualımı verməyə fürsət tapmadım. Yanımda dayanmış Ceyran xanıma üz tutdum:

– Soruşa bilmədim, biz evə məktub yollaya bilərik ya yox?

– Əlbəttə yollayacağıq, biz məhbus-zad deyilik ki?

Biz dağılışdıq, Ceyran xanım qadınların çadırına baxdı və mənimlə yanaşı özünə yer düzəltdi:

– Yuxum gəlir, amma yatmayacağam, – dedi, – gündüzlər yatanda, gecələr sağa-sola çevrilməkdən cana doyuram. Gedək, bu tərəfləri gəzək...

Bizi eşikdə gözləyən Elman, yaxın kənddən (yəni Rudəki kolxozundan) xırda-xuruş almaq üçün getdiyini söyləyib məndən də, Ceyran xanımdan da nə istədiyimizi soruşdu.

– Əgər mümkünsə qələm, kağız, – dedim. – Uşaqlara məktub yazacağam. Onlardan vaxtlı-vaxtında xəbər tutsam, dünyada heç bir dərdim olmaz.

– Yaxşı, hələlik, – deyə Elman uzaqlaşdı.

Biz çadırlardan aralanıb, söhbət eləyə-eləyə, dünən gecə məstedici rayihəsini duyduğum otlu, çiçəkli düzdə gəzib-dolanmağa başladıq. Adlarını yaxşı bilmədiyim yabanı çiçəklərdən dəstə bağladıq. Ceyran xanım mənim xahişimi gözləmədən qədim, çox qədim, həm də qüssəli bir xalq mahnısı oxumağa başladı. Mən bu mahnını uşaqlıq illərində, həyət qonşumuz – cavan bir gəlindən eşitmişdim. Vəfasız sevgilisindən şikayət eləyən bir qadın, dərd-sərini axan sulara, əsən yellərə deyir, nə sular, nə yellər onun dərdinə şərik olur, nə də vəfasız yardan bir səs-soraq çıxır... Ceyran xanım sadəcə bir ifaçı kimi oxumurdu. Elə bil o, gəlinin yerində, evin damı üstündə oturub, gözlərini uzaq yollara dikərək oxuyurdu. Elə bil onun ürəyindən qopub gələn sadə və mənalı bir el mahnısı deyil, ah-nalə idi. Mən onun gözlərində titrəyən yaş damcılarına baxdıqca, elə bu anda hönkürüb ağlayacağını düşünürdüm. Ancaq yox, o ağlamırdı, nəğmədə yaratdığı qəhrəmanın roluna girmişdi. O, özünün şəxsi iztirab və həyəcanını da bu nəğmənin məzmununa əlavə eləyə bildiyi üçün, məndə daha böyük təəssürat oyadırdı. (Mən, əlbəttə, bədii sənət haqqında yalnız bir tamaşaçı və ya dinləyici kimi danışıram. Ceyran xanımın ifaçılıq məharəti mənə Bülbülü xatırladırdı. Xalqımızın misilsiz nəğməkarı Bülbül Məmmədovu deyirəm. Ceyran xanım onun yaratdığı ifaçılıq məktəbində tərbiyə

almış bir müğənni idi. Azərbaycan xalq mahnılarının dərin fəlsəfi mənasını və hədsiz dərəcədə lirik ahəngini bütün varlığı ilə duymağı bacaran Bülbül, İtaliya ifaçılıq mədəniyyəti ilə biz azərbaycanlılara xas parlaq emosiyalılığın sintezini vermiş nadir bir sima idi. Mənim mənsub olduğum nəsil, özünün musiqi zövqünün tərbiyəsində iki dahiyə borcludur: Üzeyir Hacıbəyovla Bülbül Məmmədova!.. – Bu fikirlə sonrakı söhbətlərimizdən birində Ceyran xanım da ürəkdən razılaşdı).

Biz düşərgədən çox uzaqlaşmadıq. Bu yerlərə bələd deyildik. Mən Ceyran xanıma, o da mənə öz həyatımıza dair gah əhəmiyyətli, gah çüzi və xırda-xuruş suallar verirdik. Tanıdığımız adamlardan, müharibə cəbhəsində həlak olmuş dost-aşnadan, qohum-əqrabadan danışırdıq. Bakıdan ayrı düşməyimiz bizim ikimizi də qəzəbləndirirdi: Hitler Almaniyası məğlubiyyətə uğrayır, amma biz cəbhədə vuruşanların, canını-qanını əsirgəməyən əsgərlərin ailələrindən və ata-analarından şübhələnirik; günahsız adamların bu cür ləkələnməyi hər ikimizə çox süni və mənasız görünürdü. Mən Ceyran xanıma dedim:

– Fikirləşirəm, hərdən lap məətəl qalıram. Axı biz hamımız Mollayevi müqəddəs adam hesab eləyirdik! Başa düşə bilmirəm ona nə olub. Axı hesabla, Mollayev belə ədalətsizliyə yol verməməli idi.

İndiyəcən məni sakit və diqqətlə dinləyən müğənni qadının birdən rəngi-ruhu dəyişib, dil-dodağı təpidi, bütün bədənini əsmə tutdu, nə isə yanlış bir söz, yersiz bir ifadə işlətdiyimi güman eləyib, xəcalətimdən yerə keçdim.

– Ceyran xanım, – dedim, – mən sizi əsəbiləşdirmək fikrində deyildim. Görünür nə isə çox səfeh danışdım, hə? Siz allah məni bağışlayın.

O güclə özünü ələ aldı və qaşqabağına nifrət dolu bir ifadə verib dedi:

– Sizdən acizanə xahiş eləyirəm, bir də onun adını mənim yanımda çəkməyəsiniz.

– Kimin adını?

– Mollayevin!.. Siz hələ onun ədalətinə inanırsınız da?

– İnanmaq deyəndə... sözün açığı mən sarsılmışam, Ceyran xanım. Bizim institutda nə isə ədalətsiz bir iş olanda dərhal Mollayevə şikayət elərdilər. İndi isə...

– Eh, Səmirə xanım, siz də mənim kimi dünyaya sadəlövh gəlib, sadəlövh də gedəcəksiniz. Mollayev...hımm...Ədalət...Düşündüm ki, yəqin bu sözləri istehza ilə deyirsiniz, bilirsiniz ki, o cür iblisdən ədalət gözləmək axmaqlıqdır.

“İblis?!” – mən diksinib ayaq saxladım.

Ceyran xanım gözlərini mənə dikib xeyli baxdı:

– Bir zamanlar mən də onu müqəddəs adam hesab eləyirdim, Səmirə xanım. Ancaq gördüyüm, bildiyim şeylər məni qəflət yuxusundan oyatdı. Mən həmişəlik başa düşmüşəm ki, Mollayev öz kefi üçün tək-tək adamları yox, bütün xalqı da güdaza verə bilər!.. Bilirsiniz mən Bakıdan niyə uzaqlaşdırılmışam? Ona görə ki, gördüyüm, bildiyim acı həqiqət həmişəlik üstüörtülü qalsın, hamı da bu fikirdə olsun ki, Mollayev namuslu adamdır, onun sərtliyi də, qabalığı da cüzi qüsurlardır. Yox, yox, yox!..

Ceyran xanım ürəyində qövr eləmiş dərdi açıb söyləməsəydi, özünü çox ağır hiss eləyə bilərdi.

– Çalışın, özünüzü ələ alın, – dedim, – bu çölün düzündə həkim yox, dava-dərman yox...

O, hekayəti belə danışdı:

– Mən bu hadisəni söyləməkdən utanmıram... Hələ mənim əlimə yad bir kişinin əli dəyməyib. İnanmırsınız? Özünüz bilin.

– Yox, inanıram. Ceyran xanım, – dedim. – Siz nədən bu nəticəni çıxardırsınız ki, mən sizin haqqınızda belə pis fikirdəyəm?

– Qulaq asın, mən danışım, siz də görün mən aktrisa namussuzam, yoxsa başına and içdiyiniz Mollayev... Qulaq asın!

– Məmnuniyyətlə, – dedim..

O başladı:

“Mən çarpayıda uzanıb, kiçik qızımı əmizdirirdim, laylay deyirdim. Hələ onun gözünə yuxu getməmiş, telefonun zəngi səsləndi. Evdə məndən başqa heç kim yox idi. Elman qastrolda idi, qayınanam oğlumu da götürüb, qardaşı evinə getmişdi. Nə qədər cavab verməmdimsə də, zəng səsi kəsilmədi ki, kəsilmədi. Axırda uşağı ağlaya-ağlaya qoyub, telefona yanaşdım, danışanı soruşdum. Mollayevin tapşırığı ilə zəng elədiyini söylədi. Adını da, familini də dedi. Ancaq mən onu tanımadım.

– Sabah axşamüstü Mollayevin dəniz qırağındakı bağına qonaq çağırılırsınız, – dedi. – Saat səkkizdən gec gəlməyəsiniz, ha...

Mən təşəkkür elədim:

– Çox sağ olun, çox razıyam, hörmətiniz artıq olsun, ancaq südəmər uşağı tapşırmağa adamım yoxdur.

Telefondakı yoğun səs:

– Uşağınızı da gətirin, Ceyran xanım, – dedi. – Mollayevin evində o qədər qulluqçu var ki, verərik, saxlarlar. Siz o barədə heç narahat olmayın...

Mən bir də təşəkkür elədim:

– Əgər gəlsəm də oxuya bilməyəcəyəm. Xəstəlikdən yenicə qalxmışam, səsim hələ yerinə gəlməyib.

Telefondan xahiş əvəzinə təhdid eşitdim.

– İndiyəcən hələ Mollayev yoldaşın dəvətinə yox cavab verən olmayıb. – Siz qəribə adamsınız, lap qurd ürəyi yemisiniz.

– Ay əzizim, mən də yox demirəm. Mollayev yoldaşa dünyalar qədər hörmətim var, onun məclisində oturmaq hər kəs üçün şərəflidir, ancaq çox üzr istəyirəm, gələ bilməyəcəyəm.

Qızım ağlayıb özünü öldürürdü.

Bağışlayın, körpəm ağlayır, – deyib, dəstəyi yerindən asdım.

On dəqiqə belə keçməmiş telefonun zəngi ara vermədən uzun-uzadı səslənib, uşağın yuxusunu tamam qaçırtdı. Mən tez yüyürüb, dəstəyi götürdüm, elə bildim ki, məni çağıran Elmandır.

– Hə, hə, mənəm, Elman, necəsən, – deyəndə yenə həmin səsi eşidib pərt oldum.

– Ağəz mənəm, Elman deyiləm. Sabah axşam saat yeddidə maşınla gəlib səni özüm aparacağam.

Eyni sözü nə qədər təkrar eləmək olardı? Az qaldı yalvarmağa başlayım:

– Ay qardaş, zəhmət çəkməyin, bu vəziyyətdə uşağı havaya çıxarmağı doktor məsləhət görmür.

– O hansı doktordur, ağəz? Mollayevin adını eşidən kimi özü tullana-tullana gəlib, sənin yanını kəsəcək, qoymayacaq uşağın başından bir tük əskik olsun.

– Körpə təzəcə yumurtadan çıxmış cücəyə oxşayır, başında tükü nə gəzir ki?.. – deyib güldüm. – Axı, bu qədər adama niyə zəhmət verək? Mənim qonaqlığa gəlməyim nə vacib olub ki? Əgər oxuya bilsəydim o başqa məsələ.

– Evdə ol, saat yeddidə gələcəyəm! – O, dəstəyi bərkdən yerinə çırpdı.

Sabahısı, axşam, düz vaxtında, nə bir dəqiqə tez, nə də bir dəqiqə gec, qapımızın zəngi çalındı. Dünənki tanış səsi eşitdim, qapını açdım, yoğun, ucaboy, yanaqlarından qan daman yekəpər bir kişi, əlləri boz şinelin ciblərində, qarnını irəli verib dayanmışdı:

– Hazırsan, ağəz? Buyur, gedək. Bah, sən heç paltarını da geyməmisən ki?

– Gərək məni bağışlayasınız, gedə bilməyəcəyəm. Təəssüf eləyirəm. O cür hörmətli bir kişinin ziyafətindən boyun qaçırmağa məcburam.

– Boyun qaçırmaq nədir, ağəz? Heç bilirsən bu söz sənə necə baha oturar?

O, gözlərini necə bərəltdisə, qorxumdan boğazım qurudu. Əlbəttə, Mollayevin adamları ilə danışan hər bir kəs gərək son dərəcə ehtiyatlı olaydı, hər sözünün dalını-qabağını fikirləşəydi.

– Tez ol, get paltarını geyin, bu cür xalatda əyibdü...

– Axı, mən getmirəm. Görürsünüz ki, hava necə soyuqdur. Xəzrinin vıyıltısından qulaq tutulur. Mənim adımdan Mollayev yoldaşa çox-çox təşəkkür eləyin, deyin ki, tezliklə sağalıb, konsert verəcəyəm, lap Mollayev yoldaşın qabağında onun dostları, aşnaları üçün istədiyi qədər oxuyacağam. İndi körpəmi eşiyə çıxara bilmərəm...

– Ağəz, sən nə inad adamsan. Mən sənsiz onun yanına qayıtsam, bilirsən neylər? Xirtdəyimi üzər. Dəlinin biridir, atamı dalıma səriyər.

– A kişi, sən nə danışırsan, – dedim, – necə yəni dəlinin biridir? Mollayev yoldaş bu boyda respublikaya rəhbərlik eləyir. Dəlidən nə rəhbər?

Kişi necə böyük qələt dartdığını yalnız indicə başa düşüb, bənizi qaçmış halda kəkələdi:

– Aaağəz, sssöz gəlişi dedim. Elə dəli yox ey, yəni acıqlı dəli... Beyni qızanda, allah göstərməsin, heç öz doğma qardaşına da xətir qoymur. Tez ol, geyin, tez ol!.. Vaxtında gedib çatmasaq, səni də mənə qatar, hələ onu tanımamısan...

Ağlamaqdan özünü yırtan qızım, söhbəti yarımçıq kəsməyə məni məcbur elədi. İçəri yüyürdüm. İndi qəsdən vaxtı uzatmağa çalışırdım. O kişi isə qır-saqqız olub yapışmışdı, əl çəkmirdi ki, çəkmirdi. Yaxşı, körpəni də aparıb qonaqlığa getsəydim, nə ləzzət alacaqdım? Mən ki, oxuya bilməyəcəkdim, səsim hələ doğrudan da yerinə gəlməmişdi. Belə hallarda musiqini, ifaçılıq sənətini az-çox qanan adamlar bizi oxumağa məcbur eləmirlər, bunun ağır nəticəsini yaxşı bilirlər. Axı, mən bu yekəpər kişini necə başa salaydım ki, mədəni insanlar hər cür şəraitdə müğənninin səsini qoruyurlar, öz kaprizlərinə qurban vermirlər?..

– Ağəz, qurtar də... Bax, yoldaş Mollayevin cavabını özün verəcəksən, – deyə kişi, bir vaxt gördüm, şinelli-şinelli içəri girib, yataq otağının qapısı ağzına qədər gəlib. – Hələ də paltarını geyinməmisən?

Onun bu hərəkəti məni bərk qəzəbləndirdi:

– Bağışlayın, adınızı da bilmirəm, – dedim, – axı, mən uşaq deyiləm ki, şıltaqlıq eləyəm, siz də mənim könlümü alasınız, sözüm-sözdür, getməyəcəyəm, vəssalam!

O, mənim bu sözləri qəti dediyimə yenə də inanmaq istəmirdi, görünür doğrudan da Mollayevin bir sözü heç vaxt iki olmamışdı. Mən uşağın yanından qalxdım, yataq otağının qapısını bərk örtdüm və daldan açarla kilidlədim. Daha bundan sonra onun rədd olub gedəcəyinə şübhəm qala bilməzdi. Ancaq mən yanılmışdım, beş-on dəqiqədən sonra qapı ardından yenə onun səsini eşitdim:

– Ceyran xanım, ay Ceyran xanım, axı, bu yaxşı deyil, kişi orda xörəyini yeməyib sizi gözləyəcək... Mən onun yanına tək qayıda bilmərəm, mənə yazığınız gəlsin...

Mənə əvvəlcə “siz”, sonra “sən”, ən axırda yenə “siz” deyə, müraciət eləyən bu adam, indi mənim nəzərimdə kobud və pəzəvəng bir hərif idi. İnanırdım ki, Mollayev onun ədəbsizliyindən xəbər tutsaydı, məndən də çox qəzəblənərdi. Əlbəttə, “respublikanın sahibi”nin məni pis məqsədlə bağına dəvət elədiyini ağlıma gətirmirdim. Adəti üzrə, yenə də tanışlarını, dostlarını yığıb, istirahət saatlarını onlarla birgə keçirdiyini, mənim kimi bir neçə artisti də çağırtdırıb, məclisdəkiləri əyləndirmək istədiyini düşünürdüm. Əlbəttə, bizim üçün bu da təhqirdi, amma neyliyəsən, ixtiyar sahibi idi, etiraz eləməyə, boyun qaçırmağa adamın üzü gəlmirdi. Bu dəfə isə cana doydum, bir növ kəfənimi boğazıma doladım, daha dinməməyi qərara alıb yekəpər kişinin qapı ardından dediyi sözləri də cavabsız qoydum. O, ucadan deyinərək, çəkmələrinin zorba dabanlarını bərkdən döşəməyə vura-vura çıxıb getdi və mən “allah, sənə şükür!” deyib, qızıma laylay çalmağa başladım... Doğrusu, bir azdan sonra ona yazığım gəldi. Axı, tək mən yox, çoxları Mollayevi sözünün üstündə möhkəm duran, inadını yeritmək üçün hətta güllə qabağına getməkdən də qorxmayan bir adam kimi tanıyırdı. İndi bu yekəpər bədbəxtin inadkarlığını da şefinin ayağına yazırdım, düşünürdüm ki, məni aparmamış getdiyi üçün Mollayevdən ağır tənbeh alacaq, bəlkə də işdən qovulacaq. Daha mən hardan biləydim ki, bu zırpı hərif illərdən bəri onun oğraşlığını eləyirmiş? Axı indiyəcən təmiz ailədən və saf əxlaqdan söhbət gedən yerdə Mollayevi hamıya nümunə göstərmişdilər, əxlaq pozğunluğu üstündə neçə nəfər görkəmli işçinin vəzifədən və partiya sırasından necə çıxartdığını Elman

özü mənə danışmışdı. “Kişi əsil kommunistdir, həm düz siyasət aparır, həm də xalqın adətinə, ənənəsinə hörmət eləyir” demişdi. Onun barəsində bu sözləri tək Elmandan yox, yaxşı tanıdığım və inandığım qocaman sənət ustalarından da çox eşitmişdim...

Yekəpər kişi gedəndən yarım saat belə keçməmiş telefonun zəngi bir də cingildədi, özümə söz verdim ki, dəstəyi götürməyəcəyəm. Bir yox, beş yox, ən azı iyirmi, iyirmi beş dəfə səsləndi: “Lap səhərəcən zəng eləsə də götürməyəcəyəm” deyib, yorğanı başıma çəkdim. Görünür məndən cavab gözləyən adam nəhayət təngə gəlib, dəstəyi yerindən asdı. Amma, deyəsən o, məndən hayıf almaq fikrində idi. O gecə zəng səsindən yata bilmədim. Kimə şikayət eləyəydim? Məsəl var: “camaat dəli olanda mollanın yanına gedər, molla dəli olanda kimin yanına gedər?”.

Səhər rayondan qayınanam gəldi. Mən çox sevindim. Elə bil meydanda tək qalmışdım, o mənə arxa olacaqdı.

Günorta vaxtı telefon yenə cingildədi. Qaynanam dəstəyi götürüb, adəti üzrə, sorğu-suala başladı: “Kimdir danışan? Hardandır? Uşağı əmizdirir. Sonra zəng eləyəmməzsən?”.

Mənim gözüm arvadda idi. O, birdən nitqi tutulmuş kimi duruxdu: “Hə, bu saat, bu saat” deyib, dəstəyi mənə sarı uzatdı. Götürdüm və o dəqiqə də yerimdə donub qaldım. Sanki günün günorta çağı məni ildırım vurdu. Danışan – Mollayevin özü idi. Çox nəzakətli başladı:

– Deyir bikefsiniz. Olmasın azar. Səhiyyə nazirliyinə tapşırmışam. Ən yaxşı həkimlərdən bir neçəsini yollayacaqlar.

Mən təşəkkür elədim, dedim ki, bu xəstəlik – müalicəsiz keçib gedəcək, uşaq olandan sonra həkimlər yarım ay evdən eşiyə çıxmağımı məsləhət görüblər.

– Dünən bizi sayıb gəlmədiniz. Telefona cavab verməyə də tənəzzül buyurmadınız...

Mən yataq otağından telefonun səsini yaxşı eşidilmədiyini bəhanə gətirdim, amma bu yalanımdan dərhal özüm də dəhşətə gəldim və tezcə səhvimi düzəltdim:

– Ola bilər bərk yatmışam, telefonun səsinə oyanmamışam.

– Əmr verərəm, yataq otağınıza paralel aparat qoyarlar...

– Zəhmət çəkməyin, nə lazımdır? Çox sağ olun, – dedim, ancaq nə üçün təşəkkür elədiyimi heç özüm də bilmədim.

– Sağalın, sağalın, – dedi və dəstəyi asdı.

O gün həkimlər qapının kandarını ağartdılar. Biri qapıdan çıxmamış o biri gəldi. Mollayev kimi bir adamın bu qayğıkeşliyi məni çox həyəcanlandırırdı. Amma bunun mənə nə xeyri vardı? Hansı doktor içəri girirdisə, "nədən şikayət eləyirsiniz?" deyə soruşur, heç bir xəstəliyim olmadığını öyrənəndən sonra da uzun və yorucu bir müayinə başlamağı özünə borc bilir, fonendoskopunu, tonometrini işə salır, ürəyimi dinləyir, qarnımı əlləşdirir, axırda da dərman yazıb gedirdi. (Reseptləri bir-birinin üstünə yığanda, az qalmışdı kitab düzəlsin). Doktorların məsləhətini eşidəndən sonra qorxdum ki, doğrudan da xəstələnəm. Hansı kitabdasa oxuduğum bir sözü xatırladım: "Doktorlara işi düşənin canı gərək möhkəm olsun".

O gündən sonra Mollayev mənə göz verdi, işıq vermədi. Səhər, axşam, günorta telefon zənglərinin ardı-arası kəsilmədi. Hər dəfə də halımı soruşur, "siz oxumayanda, konsertlər çox maraqsız keçir" deyə qoltuğuma qarpız verirdi. Əlbəttə bunu eşitmək mənim üçün xoş idi, çünki bu sözləri adi, sıravi bir adam demirdi, Mollayev deyirdi. Bilirdim ki, onun bu sözlərini eşidən başqa adamlar da istər-istəməz mənə hörmət eləyəcək, yeri düşəndə maaşımı artıracaq, böyük konsertlərin proqramında adımı başdan yazacaq, təltif olunmaq məsələsi gələndə, məni yaddan çıxarmayacaqlar. Mən yaxşı bilirdim ki, yuxarıdan verilən bu cür komandanı hamı eşidir, hər kəs öz növbəsində sənə ehtiram göstərir, qəzetlər portretini tez-tez çap eləyir, səni tərif üçün daha ifadəli sözlər axtarır. Axı, kim belə şeyi xoşlamır? Şöhrət elə bir çərəzdir ki, onu yedikcə, daha da iştahan artır...

Sən demə, özümü xoşbəxt sandığım bu günlərdə mənim fəlakətim başlanırmış.

Opera və balet teatrında verdiyimiz böyük konsertin sonunda, filarmoniyanın direktoru mənə yanaşıb xəbər verdi:

– Saat on birdə Mollayev yoldaşın evinə qonaqlığa çağırılırsan!

Əlbəttə, sevindim. Konsertdə altı-yeddi nömrə oxumağa məcbur eləmişdilər. Yenə də əl çəkmirdilər. Mən isə oxumaq istəmirdim (həmişə bir qədər az oxumağı, həddindən çox oxumaqdan üstün tuturam). Hökumət lojasında qonaqlarla birgə oturmuş Mollayevdən əmr gəldi:

– Oxusun!..

Bundan sonra qonaqlığa çağırılmaq da xüsusi hörmət nişanəsi idi. Getdim. Trio ilə xalq mahnıları oxudum. Amma çox yorulmuşdum. Fürsət tapıb evə qaçmağa çalışırdım. Bu vaxt tənəffüs verdilər. Saat

birdi. Kino-film göstərəcəkdilər. Mollayev məni yanına çağırtdırdı, özü ilə yanaşı oturtdu. Bu da, şübhəsiz, ehtiram əlaməti idi. Film göstəriləndən, tez-tez qulağıma sarı əyilib, bəzi eyhamlar vurmağa başladı: guya mən ona qarşı etinasızam. Başqaları onun təklifindən məmnun olduğu halda, mən asanlıqla boyun qaçırıram. Ancaq nahaq. Ehtirama qarşı ehtiramsızlıq heç də məziyyət sayıla bilməz.

– bu gün qəsdən sifariş yolladım ki, ən yaxşı nəğmələrindən birini oxuyasan, bu yoldaş, – o, sağ tərəfində oturmuş moskvalını deyirdi, – sənin mükafat almağına kömək eləyə bilər.

Mən soruşdum:

– Nə mükafat?

– Ölkəmizdə ən yüksək mükafat!.. – deyə o, kiməsə eşitdirmək üçün ucadan səsləndi, tamaşa salonunda işığın sönməyindən istifadə eləyib və yəqin ki, sərxoş olduğu üçün hər növ etikanı unudub, mənim açıq çiynimdən öpdü.

– Yaxşı deyil, – dedim.

– Sənin üçün, yoxsa mənim üçün?

– Elə hər ikimiz üçün.

Görünür, o, özünü iyirmi-iyirmi beş yaşlarında gəncə bənzətməyin nə qədər gülünc olduğunu hiss eləyib, bir daha o cür açıq-saçıq hərəkətə yol vermədi və qulağıma sarı əyilib heç nə demədi, yalnız axırda, qonaqlar dağılışıb getməyə hazırlaşanda, məni bayaq yanında oturmuş moskvalıya təriflədi:

– Özü öz qiymətini bilmir, bu cür müğənni bütün Sovetlər İttifaqında iki, ya üçdən artıq olmaz, deyilmi?

Qonaq, deyəsən, onun cəhalətinə kinayə ilə gülümsəyərək üzünü başqa səmtə çevirdi. Mən özüm də onun tərifinə şərik deyildim. Mənim kimi oxuyanların sayı Mollayevin düşündüyündən qat-qat çox idi və məni kimin isə nəzərində ucaltmaq üçün həqiqəti belə gülünc şəklə salmağa da heç bir ehtiyac yox idi.

Bu qonaqlıqdan iki gün sonra Elman qastroldan gəlib çıxdı və onun yanında məni təkrar Mollayevin bağına çağırdılar.

– Xəstəyəm, gələ bilməyəcəyəm, – dedim.

Elman soruşdu:

– Kim idi, hara çağırırdı?

Mən Mollayevin məqsədini Elmana söyləyib ürəyinə şübhə salmaq istəmədim.

– Konsertə çağırırlar, – dedim.

Yekəpər kişi qapının ağzında görünəndə Elman onu tanıdı:

– Yoldaş Mollayevin mühafizəçisidir, – dedi. – Xeyir ola, görəsən niyə gəlib? Buyurun, yoldaş Soltanəli, sizə kim lazımdır?

O, muştuluq almaq üçün şad xəbər söyləməyə hazırlaşır kimi fərəhlə dedi:

– Xozeyin Ceyran xanımı çağırır! Qonağı var...

– Mən dedim ki, getməyəcəyəm Boğazım xəstədir, soyuqlamışam.

Elman bu cavabımdan razı qalmadı.

– Ceyran, o cür adamın təklifindən boyun qaçırmaq olmaz, axı.

– Niyə olmur? – dedim. – Mollayev yoldaş mədəni adamdır, bilir ki, bu cür xəstə boğazla oxumaq mənə çox ziyan vura bilər.

– Hər halda get, Ceyran, hörmət üçün, özü də görər ki, doğrudan da xəstəsən.

– Yox, o mənim sifarişimə də inanar, – dedim, – qoy məclisinə başqa bir oxuyan çağırtdırsın.

– Ağəz, sən tək özünü yox, Elman qədəşi də bədbəxt eləyirsən, – deyə Soltanəli öz şefinin neyləyəcəyini əvvəldən bilirmiş kimi, kədərdən qəddi bükülmüş halda çıxıb getdi və mən ilk dəfə yalnız indi başa düşdüm ki, xalq demişkən, mənim ələyim, xəlbirim də göydə fırıldayıb.

O günün sabahısı tanımadığım bir adam gəlib Elmanı apardı. Bir saat gözlədim, gəlmədi, iki saat gözlədim, xəbər çıxmadı. Axşam oldu. Şər qarışdı. Nəhayət qapı döyüldü. Elman, o bahadır oğlan, cücə kimi büzüşüb qayıtmışdı. Hər ikimiz – mən və qayınanam ona eyni sualı verdik?

– Hardaydın? Sənə neyləyiblər?

O, mənim gözlərimə düz baxa bilmirdi. Sualıma cavab vermək istəmirdi.

– Niyə dinmirsən, Elman? Hardaydın?

– Sonra, sonra... – dedi, paltarlı-paltarlı divanda uzandı və əllərini başının altına qoyub gözlərini yumdu, ancaq bir dəqiqə belə yatmadı.

Gecədən xeyli keçmiş, yazıq anasını də intizarlı qoyub, yataq otağına getdi. Başına gətirilən müsibətləri heç kimə, hətta ailə üzvlərinə də danışmayacağını vəd elədiyi aydın idi.

Üst paltarını çıxaranda, özümü saxlaya bilməyib qışqırdım. Kürəyinin, çiyninin, qollarının yumşaq ətində gördüyüm qara zolaqlar, əfi ilanlar kimi qorxunc və heybətli idi.

– Dəniz qırağına aparmışdılar, – dedi, – bax, bir daş altda, bir daş üstdə. Bir mən bilirəm, bir də sən. Dedilər ki, "bu günlərdə əxlaqsız qadınların gizli mənzilini tapmışıq. Arvadın Ceyran xanımı da orda tutmuşuq". Əlbəttə, o dəqiqə bildim ki, böhtandır, amma yenə də soruşdum: "Nə vaxt?". Dedilər ki, "bu ayın dördündə". Mən güldüm. Soruşdular: "Niyə gülürsən?". Dedim: "Ağlamayacağam ki? Bu ayın dördündə Ceyran xanım doğum evində idi. Əgər onu böhtana salmaq lazımsa, heç olmasa günahını ağıllı uydurun". Dedilər: "O qəhbəni boşa getsin". Dedim: "Hər nədir, məqbuldur"; dedilər: " yoldaş Mollayev də belə məsləhət görür". Dedim: "Mollayev böyük adamdır, ixtiyar sahibidir, onun ayağı biləni, bizim başımız bilməz, ancaq mənim ailə məsələmə nahaq qarışır". Quduz it kimi töküldülər üstümə. "Onu boşamağa söz verməyincə, səni bax beləcə əzişdirəcəyik" dedilər. Əlacım kəsildi, razı oldum. Dilimdən kağız alıb buraxdılar... Hazırlaş, Ceyran, sabahdan gərək başımıza bir çarə qılaq. Köçüb bir yana əkilək...

Sabahısı biz əkilənəcən üstümü aldılar. Qabaqlarına qatıb, dəniz qırağına gətirdilər. Sonrasını özünüz gördünüz..."

Ceyran xanımın dedikləri əvvəlcə mənə yuxu kimi göründü, yəni düşündüm ki, belə hadisələr, yalnız röyada ola bilər, ancaq bir azca sonra gəlib düşərgəyə çatdıq, yeni tanışlarımızı gördük. Bu vaxt müğənni qadından eşitdiyim hekayətin acı və qorxulu bir həqiqət olduğunu yəqin elədim...

## GÜNLƏR

Səhər tezdən hələ gün doğmamış şeypur səsinə yuxudan oyanan adamlar, çörək paylarını alıb, dəstə-dəstə tarlaya və arx qazılan yerə işləməyə gedir, yalnız axşam, qaranlıq düşəndə qayıdırdılar. Düşərgədə heç kimə imtiyaz verilmirdi. Hərə bir sahədə öz bacarığını göstərirdi. İşdən yalnız xəstələri azad eləyirdilər. Son günlərdə Sədi Kamalın xahişi ilə divar qəzeti buraxmaq üçün və dram dərnəyinin məşqlərində iştirak etmək üçün ayrılmış bir neçə nəfəri işdən üç-dörd saat tez buraxırdılar. Mən Niyazovun, vəd elədiyi tikintini gözləyə-gözləyə, mətbəxdə, şorba bişirən qadınlarla bərabər kartof soyurdum. (Əlbəttə, mən "şorba" sözünü şərti işlədirəm, çünki bu xörəyi adicə

bulanıq sudan fərqləndirmək üçün hamıdan, o cümlədən də məndən zorba qazanın künc-bucağında üzən xırda-xuruş kartof parçalarını görmək bacarığı tələb olunurdu).

Düşərgəmizdə hələ Niyazovdan narazılıq eləyən yox idi. O, bizə firavan həyat vəd eləmirdi və biz də ondan bu cür həyat gözləmirdik.

Günlərin birində xəbər çıxdı ki, hardasa, kim isə Niyazovun ünvanına yeddimərtəbəli söyüş yağdırıb, düşərgə əvəzinə istirahət evi açdığına görə qəzəblənmiş və qoca vaxtı xəriflədiyini söyləmişdir. Bu xəbəri əvvəlcə şayiə adlandıranlar oldu, ancaq iki-üç gündən sonra Sədi Kamalın dilindən başqa bir söz eşitdik:

– Niyazovu burdan götürürlər. Yerinə də bilirsinizmi kimi yollayıblar?

Hamı maraqlandı:

– Kimi?

– O gün Niyazovun həbs etdirdiyi DTK leytenantını!

Bu xəbərə çoxları inanmadı.

– Ola bilməz, canım!

Rəcəb kişi isə inandı:

– Mən bu təzələrdə gördüyümü görmüşəm. Yəqin gedib Niyazovu elə böhtanlayıb ki, o kişi bundan sonra qurandan köynək də geysə sözünə inanan olmayacaq...

Ertəsi günü sədi Kamal bu xəbərə bəzi təfsilatlar da əlavə etdi:

– Hamısı Mollayevin işi imiş. Niyazovun işdən götürülməyi də, onun yerinə leytenantın təyin olunmağı da.

– Ola bilməz! – deyə mən özüm də hiss etmədən etirazımı bildirdim. – Mollayevin hökmü öz respublikasından qırağa çıxmaz.

Bunu dedim və Ceyran xanımın məzəmmətli baxışını üzümdə hiss etdim:

– Yenə sadəlövhlük eləyirsən, Səmirə!

– Səd heyf! Mollayev təkcə öz respublikasında xozeyinlik eləsəydi dərd yarı olardı, qızım, – deyə Sədi Kamal köksünü ötürdü. Sonra rişxəndlə gülümsəyib, əlavə etdi: – Hə, deməli, burdaca da Mollayevin zakonu ilə oturub-durmalı olacağıq.

Bu söhbətin ağır təəssüratı ilə, biz artıq hər yandan əlimizi üzüb, leytenantı gözləyirdik və başımıza nə oyun açacağını təsəvvürümüzə gətirdikcə, yazın, cırhacır istisində bədənimizdən buz kimi soyuq bir cərəyan keçirdi. Ceyran xanım isə, adəti üzrə, qorxaqları, xüsusən başıpapaqlıları istehzaya qoyur, ağız-burnunu əyərək, acı-acı gülürdü:

– Sizi ki, belə görürəm, o yalın əlnən də hamınızı qorxudub əsir-yesir eliyə bilər. Qoy bir gəlsin, onda görərsiniz tapançasını əlindən alıb başına çırpıram ya yox?

Mən o gün sudan ötrü necə etiraz qalxdığını, həmin bu leytenantın necə adam öldürməyə hazırlaşdığını, yalnız Niyazovun çevikliyi sayəsində nahaq insan qanı tökülmədiyini ona söylədim, amma bu da Ceyran xanımın halına təfavüt eləmədi:

– Tutaq ki, tapançanı ataydı, bir adamı da vurub yerə sərəydi, sonra? Bəs qalanınız kişi deyilsiniz?

Sədi Kamal müğənni qadına qəribə bir iftixarla baxa-baxa vəcdə gəldi:

– Balam, bu Ceyran xanımdan əla Laurensiya çıxar ha!.. Əlimizdəki pyesi qurtaran kimi "Qoyun bulağı"nı başlayacağam!

Rəcəb kişi arada söz atdı:

– Əşi, rəhmətliyin oğlu, xalq nə haydadır, sən nə haydasan? Biz burda həyat-məmat məsələsindən danışırıq, sən də başlamısan ki, pyes elə gəldi, tamaşa belə getdi.

Sədi Kamal sözünün üstündə möhkəm durdu:

– Elə mən də həyat-məmat məsələsindən danışıram, intahası sən müstəqim qəzet dilində danışırsan, amma mən bədii surətlərin dilində... Elədir ya yox, Rəcəb kişi?

Hələ bu söhbət qurtarmamış torpaq yoldan qara bulud kimi toz qopardaraq gələn yük maşını düşərgədən dörd-beş addım kənarda dayandı və şoferin yanından leytenant düşdü:

– Mayor Niyazov hardadır? – deyə bağıra-bağıra soruşdu. – Yuxarıdan onun adına təcili əmr gətirmişəm.

Bu anda Niyazov çadırından çıxdı:

– Əgər əmr varsa, – dedi, – bunun üçün adi nəzakət qaydalarını pozmağa heç bir ehtiyac yoxdur. Bağırmaqla əmrin qiyməti artmır.

– Belə bağırmaqdan məqsədim başqadır. İstəyirəm ki, bütün düşərgə mənim sözlərimi aydın eşitsin, – deyə leytenant planşetindən çıxardığı paketi gətirib, rəsm-təzim etmədən Niyazova uzatdı. – Oxuyun və hər şeydən əvvəl, mənim qeyri-qanuni alınmış silahımı özümə qaytarın!

Niyazov paketi açdı və içərisindən çıxan qısa əmri oxudu, kağızı yenə qatlayıb, üst köynəyinin döş cibinə qoydu.

– Tapançanın qeyri-qanuni alınmağına dair əmrdə bir kəlmə də yazılmayıb, – dedi.

Biz uzaqda dayanmışdıq, amma onların mükaliməsini aydın eşidirdik. Leytenant bu dəfə onu təhqir elədi.

– Sən daha kif atmısan, Həsən Babacanoviç... Ancaq pərt olmaq nahaqdır.

Niyazov da hirsləndi:

– Vəzifədən çıxarıldığım üçün pərt deyiləm, onun üçün pərtəm ki, bu qədər adamın məsuliyyətini sənin kimi məsuliyyətsiz adama tapşırırlar. Bunların içərisində elə ziyalılar var ki, sən heç onların kəsik dırnağı da ola bilməzsən!

– Savadlı düşmən bizim nəzərimizdə daha qorxuludur, – deyə leytenant yəqin ki, bizi də bu cür düşmənlərdən sayıb kinli baxışlarını yuxarıdan aşağı üzümüzdə gəzdirə-gəzdirə, hamımızı hədələdi. – Mən bilirəm onlara necə ot yolduracağam!.. Sənin müdafiə elədiyin bu ziyalılar hökumətin hesabına təhsil alıblar, ona da nankorluq eləyirlər. Bir də, yoldaş mayor, bizim yeni üsullarımızdan xəbərin yoxdur... Get, təqaüddən-zaddan versinlər, allahına şükür elə... İndi ziyalıları bizim tərəfimizə çəkməyə ehtiyac qalmayıb, bu səbəbdən də onları yenidən tərbiyə eləmək lazım deyil... Eh, səni başa salmaq çətin olacaq, Həsən Babacanoviç... Biz ayrı-ayrı dövrlərin adamıyıq. Sən hələ iyirminci ildən bəri adlamamısan.. Söhbətimiz qurtardı!.. Sən əvvəlcə mənim tapançamı gətir, sonra da düşərgəni təhvil ver!

Niyazov leytenantla mübahisəyə girməyi faydasız hesab eləyib, əli ilə havanı yararaq, geriyə döndü və çadırına girdi.

Rəcəb kişi dərdinin çoxluğundan qəhərlənmiş halda, Sədi Kamalın qulağına sarı əyilib dedi:

– Allah göstərməsin, bu adam baş kəsəndə də uf deməz.

Sədi Kamal onun qoluna girdi, bizə də göz eləyib leytenantın nəzərindən yayınmağı məsləhət görüb, gedə-gedə deyindi:

– Eşitdin? “Ziyalıları bizim tərəfimizə çəkməyə ehtiyac qalmayıb”, hə? Əgər mən ziyalıyamsa, onun tərəfinə keçməyə çalışmayacağam. Amma, Rəcəb kişi, “Qoyun bulağı” lap yerinə düşəcək. Leytenant onu görən kimi həstəyəcək.

Rəcəb kişi məyusluğunu gizlədə bilmədi:

– Adamdan-adama təfavüt var, a kişi. Görmədin? Bircə bu söhbətini eşitdim, o dəqiqə dabbaqda gönünə bələd oldum. Elə bilirsən bu da Niyazov kimi sənə dərnək düzəltməyə izin verəcək ki, sən də ona tamaşa göstərəsən?

– Ağzı nədir, verməsin? Bu ixtiyardan heç məhbusları da məhrum eləmirlər.

– Baxarsan, mən də bu fani dünyada əlli iki il ömür çürütmüşəm, adamları azdan-çoxdan tanıyıram.

Heç birimizdən səs çıxmadı. Elə bil ən istəkli adamımızın ölüm xəbərini almışdıq...

Niyazovun düşərgədən necə və hara getdiyini bilən olmadı. O günün sabahısı şeypur səsi bizi yuxudan oyadanda, hamımız daha onu yox, leytenantı gözləyirdik. Bizə elə gəlirdi ki, təzə rəis də Niyazov kimi çadırların qarşısına çıxıb adamları bölüşdürəcək, hər dəstəyə müəyyən bir iş tapşıracaq, gözətçilərdən birini səsləyib, filan yerə gedirəm, gözdə-qulaqda ol, deyib özü yük maşınına minəcək, düşərgə üçün tikinti materialı, əkin və səpin maşınları vəd eləmiş idarələrə yola düşəcəkdi. Ancaq leytenant görünmədi. Çörək paylarını alıb, onu səliqə ilə üç yerə bölən və bir parçasını konfet kimi sora-sora yeyən adamlar, dünənə kimi Niyazovun yaşadığı balaca çadıra baxa-baxa yeni rəisi gözlədilər, ondan nə isə təzə bir tapşırıq almaq istədilər. Əlbəttə, onları hər şeydən çox maraqlandıran leytenantın xasiyyəti idi. Mən də onun barəsində deyilən qorxulu sözlərin əsası olub-olmadığını öyrənməyə tələsirdim.

Beş dəqiqə keçdi, on dəqiqə keçdi, amma leytenantdan heç bir xəbər çıxmadı. Nəhayət arx çəkənlərin başçısı və bura gələli üzünü qırxdırmamış, qısaboy və göygöz kişi – Qədiroğlu Haşım – camaata əl elədi:

– Ay canım-gözüm, bəri gəlin, – dedi, – biz onu niyə gözləyirik, axı? Daha gəlib bizə deməyəcək ki, yorğunsunuz, bir az yatın, dincinizi alın? Yaxşı olmazmı vaxtımızı boş, havayı söhbətə sərf eləməyək?

Rəylər haçalandı:

– Əşi, bizim başımızın ağası odur, yoxsa sən? Biz gedəndən sonra yuxudan oyanıb görsə ki, onu saymamışıq, dərimizə saman təpməz? Görmədin, hikkəsini yeridib, o boyda kişini yerindən necə dəbərtdi?

Bu halda Rudəki kolxozu tərəfdən motosikl səsi eşidildi. Hamının gözü bir nöqtəyə dikildi və mübahisə kəsildi. Mən Ceyran xanımla yanaşı dayanmışdım. Elə bil mənim ürəyimdən keçənləri duyub, yəqin ki, sevincinin çoxluğundan, sağ əli ilə böyrümə möhkəm bir dürtmə vurub dedi:

– Ay qız, ay qız, görürsən, poçtalyondur, bu gün uşaqlardan kağız olmamış olmaz.

Dalınca tünd mavi tüstü buraxaraq sürətlə yaxınlaşan motosikl gəlib düz qabağımızda dayandı. Bir həftə bundan əvvəl məktublarımızı yığıb aparmış qoca poçtalyon əlini yuxarı qaldırıb hamımızı salamladı. Əvvəlcə Sədi Kamalla Rəcəb kişinin camaat üçün oxuyub tərcümə elədikləri qəzetləri verdi, sonra da zərfləri bir-bir çıxarıb üstlərini oxumağa və sahiblərinə verməyə başladı. Öz adına məktub olub-olmadığını bilməyə tələsən və az qala çantanı dartıb onun çiynindən qoparmaq istəyən adamlardan güclə yaxasını qurtaran solğun sifət, ordları batıq, cılız qoca, yarızarafat, yarıciddi dedi:

– Belə getsə, kolxoz da, siz də poçtalyonsuz qalacaqsınız... – O, şəhadət barmağını təkləyib, alnının tərini siyirdi, nəfəsini dərdi. – Ay camaat, niyə tələsirsiniz? Nədən bilirsiniz ki, şad xəbər yazırlar? Bəlkə bir az gec oxusanız daha yaxşıdır?

Mənim də səbir kasam daşırdı, hamının da bu cür darıxdığına şübhəm yox idi, ancaq adamlar qocaya doğrudan da mane olurdular. Səbirlə gözləsəydilər, bəlkə də çoxdan hamının məktubu özünə çatmışdı.

Bu vaxt heç gözləmədiyimiz halda çılğıncasına qışqıran leytenantın səsini eşitdik:

– Bu nə mitinqdir? Dağılın!

Onun hədə-qorxusu bir nəfərin də tükünü tərpətmədi. O gün su üçün düzəlmiş həngamədən də dəhşətli bir hay-haray və basabas vardı. Leytenant, hələ də tapançasını özünə qaytarmamış Niyazovun ünvanına ədəbsiz bir söyüş söydü və izdihama baxa-baxa dişini qıcadı:

– Allahınıza şükür eləyin... Sizi ananız namaz üstündə doğubmuş, yoxsa birinizi çoxdan vurub yerə sərmişdim.

Poçtalyon hücumun qabağında duruş gətirə bilmədi, gücdən düşüb yerə oturdu.

Bir də onu gördüm ki, Elman izdihamı yarıb ikiyə böldü və əlini yuxarı qaldırdı:

– Vətəndaşlar, – dedi, – siz neyləyirsiniz? Bu kişini ayaqlayıb öldürmək istəyirsiniz? – Çantanı qocadan alıb, məktubların üstünü oxuya-oxuya sahiblərinə ötürdü. – Aha, bizim üçün də var, – deyib zərflərdən birini götürdü, üst köynəyinin cibinə qoydu. – Hə, Səmirə bacı, bu da sizin... Vətəndaşlar, təəssüf ki, daha məktub yoxdur. Görünür, hələ indi yazırlar.

– Axx... neyləyim? Tapançam olsaydı... – deyə leytenant ilk əmrinin bu cür etinasız qarşılanmağından pərt olub, çadırına qayıtdı.

Ceyran xanım məndən soruşdu:

– Tapançası olsaydı, neylərdi ki?

Ona Rəcəb kişi cavab verdi:

– Hikkəsini yeridərdi.

Camaat birdən süst düşdü. Elman bizə yanaşdı, Ceyran xanımın da, mənim də kağızımı verdi. Dünyada bu kağız parçasından qiymətli nə ola bilərdi! Bu yarım ay müddətində bir dəfə də olsun qarnım doymamışdı, bir gecəni də səhərəcən rahat yatmamışdım, indi elə bil aydın, iri hərflərlə yazılmış bu bir neçə sətir mənə hər şeyi: aclığı da, susuzluğu da, yuxusuzluğu da unutdurdu: uşaqlarım sağ-salamatdı, məndən kağız aldıqları üçün sevinirdilər!

Adamlar yavaş-yavaş dağılışırdılar. Mənim böyrümdə dayanmış Qədiroğlu Haşım, evindən heç nə almadığına görə çox məyus idi. Bir az əvvəl Elmanın üzünə ümidlə baxdığı halda, indi başını sinəsinə endirib, qaşqabağını sallamışdı. Elmandan çantasını alıb çiyninə taxan və motosiklinin motorunu işə salan poçtalyon, "hələlik" deyib bizdən uzaqlaşanda, o birdən özünü topladı, "allah kərimdir, bu gün olmasın, sabah olsun" deyə izdihamdan kənara çıxdı:

– Ay uşaqlar, daha niyə durmusunuz? – deyə yəqin ki, hər gün səhər tezdən arx qazdırmağa apardığı adamları səslədi. – Bəri gəlin, gedək, hava sərinkən bir azacıq işləyək. Sonra isti düşür, dözə bilmirsiniz... Göz işlədikcə baxırsan, bir kölgəliyi də yoxdur ki, beş-on dəqiqə oturub dincini alasan. Bəri gəlin, onsuz da bu işi bizə gördürəcəklər...

Qədiroğlunun dəstəsi nə üçünsə çox könülsüz toplanırdı. Ondan bir-iki addım bəridə durmuş Mollayi Kəbir (onun əsil adı Əkbər idi, həmişə əlində tutduğu kəhraba təsbehini çevirə-çevirə, dodağının altında nə isə pıçıldadığından, Sədi Kamal onun öz-özünə dua oxuduğunu yəqin eləyib, ona zarafatla Mollayi Kəbir adı qoymuşdu) dövrəsindəki adamları həvəsləndirmək fikri ilə dedi:

– Ay camaat, kişi haqlıdır... Sabahda, birigündə mənim dəstəm bostanın toxumunu səpəcək... Elə olsun ki, həmin gün də sulaya bilək, daha əlimiz yananda ağzımıza təpməyək. Onu da deyim ki, bu torpaqda yetişən qovun-qarpızı yığıb-yığışdıra bilməyəcəyik.

– Sənə versələr yığışdırarsan, – deyə dal tərəfdən kim isə kinayə ilə söz atdı. Mollayi Kəbir boy-buxundan çox kasıb olduğu üçün geridəki

adamları yaxşı görə bilmirdi. Daldan söz atanı tanımaq istəyib boğazını xoruzsayağı dikəltdi, ancaq sağa-sola nə qədər göz gəzdirdisə də, onu görmədi, yalnız qarasına deməklə kifayətləndi:

– Niyə vermirlər, bala? Biz dəridən çıxa-çıxa məhsul becərəcəyik, xeyrini özgələr görəcək? Qanun-qayda var, yoxsa hərki – hərgiklikdir?

Kimin isə dalında gizlənib özünü Mollayi Kəbirə göstərməyən adam söz altında qalmadı:

– Qanun var, niyə yoxdur? Ancaq bu düzün ortasında qanuna əməl eləyən kimdir?

– Eyy, nə boş-boş danışırsan? – deyə yenə də bayaqkı çılğınlıqla qışqıran leytenantın səsi bu dəfə məni də, yanımdakı adamları da səksəndirdi. – Bu düzün ortası sovet torpağıdır, yoxsa Seylon meşəsi?! Hələ bir deyin görüm indiyədək niyə işə getməmisiniz?

Qədiroğlu Haşım bayaq sözünə baxmayan yoldaşlarını danlayışlı bir nəzərlə süzüb onlara təkrar əl elədi:

– Dedim, axı, gecikirik. Bəri gəlin də!

Bu ana qədər kimə və nəyə isə ümid bağlayıb ayaq sürüyən adamlar, tez-tələsik bir yerə toplaşıb Rudəki kolxozuna tərəf yönəldilər. Qədiroğlu Mollayi Kəbirə müraciət elədi, sözlərini leytenanta da eşitdirmək üçün (əlbəttə, o, rəisin yanında yoldaşlarının günahını azaltmaq istəyirdi) ucadan dedi:

– Sən bu gün də səpini başlaya bilərsən. Niyə artıq vaxt itirəsən? – O, qaz kimi iki yanını basa-basa yeriyib dəstəsinin dalınca beş-on addım gedəndən sonra bizə sarı üzünü tutub sözünü tamamladı. – Ən geci sabah axşama arxı qurtararıq!

Bu xəbər yalnız qovun-qarpız əkənləri deyil, hamımızı sevindirdi. Deməli, sabahdan bir stəkan su üçün heç kəsə minnət eləməyəcəydik. Arx suyu bulanıq olsa da, bu bizi qorxutmurdu. Düşərgənin on beş-iyirmi metrliyində göl üçün yer düzəltməyə başlamışdıq. Bulanıq suyu burda duruldub içəcəydik...

Mən sevinə-sevinə kartof payımı soymaq üçün mətbəxə getdim. Şişman arvad (mənim çadır qonşum) qeyri-rəsmi də olsa düşərgənin baş aşpazı sayılırdı. Ocaqda su qızdırıb, nəhəng qazanı yumağa hazırlaşırdı. Mən də, o biri qadınlar da (Ceyran xanımdan başqa) ocaq qalamaqda, alümin qab-qaşığı yumaqda, kartof soymaqda ona kömək eləyirdik.

Bu dəfə ona yanaşanda, qəribə bir təfərrüatın şahidi oldum: köhnə qəzetlərin qırağını lenta şəklində kəsib, səliqə ilə bir-birinin üstünə yığırdı. Soruşdum:

– Bunları neyləyirsən?

Şişman qadın deyəsən bu tezliklə məni gözləmədiyi üçün, sualımı eşidən kimi duruxub üzümə baxdı.

– Kəsib saxlayıram, deməli lazımdır də.

– Elə məni də maraqlandıran budur ki, nəyə lazımdır?

– Yazıram.

– Məktub?..

– Canım, nə tutmusan məni sorğu-suala? Bu da xoruldamaq deyil ki, gecədə dörd-beş yol böyrümü dürtmələyib yuxumu qaçırdasan, "qalx, təzədən yat" deyəsən?

– Bax, – dedim, – burda mübaliğə elədin. Son günlərdə çox az dürtmələyirəm. Cəmisi iki-üç dəfə... Yəni əslinə baxsan, elə sən özün də az xoruldayırsan... Hə, doğrudan da bu kağız lentlərini neyləyəcəksən?

– Şeir yazacağam.

– Şeir? – Mənimlə zarafat elədiyini düşündüm. – Sən şairsən?

– Necə məgər? Yoxsa şairə gərək getmə gözümdən, gedərəm özümdən ola? Demək istəyirsən ki, bu boyda vücuddan nə şeir? Yanılırsan. Həm təcrübi, həm də nəzəri cəhətdən. Şerdə vücudun yox, qəlbin incəliyi tələb olunur.

– Əgər əsərin varsa, oxu, qulaq asım. Özüm yazan olmasam da, yazanlardan bəziləri ilə dostam.

– Məsələn, kiminlə? İndi yazıçı hardadır? Bir neçəsi vardı, onların da hamısını otuz yeddinci ildə gedər-gəlməzə yolladılar.

– Sən sağ qalmısan, deməli hamısını yollamayıblar də... Oxuyacaqsan, ya yox?

– Yox.

– Niyə ki?

– Sənə o qədər də etibar yoxdur. Gah bunların əleyhinə olursan, gah da leyhinə.

– Bunlar kimdir, ay arvad?

– Guya bunları tanımırsan? Kommunistləri deyirəm də.

– Bəs mən özüm kiməm? Kommunist deyiləm?

– Bir vaxt kommunistsənmiş, bunlara ləbbey deyirsənmiş. Amma nə qədər yaltaqlanmısansa, sənə etibar eləməyiblər, firqədən çıxardıblar... Yaxşı, nə tövr olur ki, bunlar sənə inanmırlar, ancaq sən bunlara inanırsan?

– Bu sualını başa düşmədim, arvad. Əlbəttə, mənim də inanmadığım adamlar var. Onların adlarını də sənə deyə bilərəm, ancaq inandığım adamlar o qədərdir ki, saymaqla qurtaran deyil... Şerini oxuyursan, ya yox?

O, araya söz qatmaq üçün əlimdəki zərfi göstərib soruşdu:

– Uşaqlarından nə xəbər var?

– Yaxşıdırlar, vəziyyətlərindən narazılıq eləmirlər.

– Sən də lap gülməli söz deyirsən. Tutaq ki, narazılıqlarını sənə yazdılar. Onların da, sənin də atana od vurmazlar?

Mən güldüm:

– Daha bundan artıq nə od vuracaqlar?

Elə bil şişman qadının əlinə gözəl bir fürsət düşdü, mənim sözlərimdəki ziddiyyətdən xoşlanır, kinayəli, hiyləgər təbəssümlə gülümsündü və baxışlarını qəsdən bir xeyli üzümdə saxladı:

– Yaxşı, – dedi, – bəs soruşmaq ayıb olmasın, vəziyyətlərinin nəyindən razıdırlar? Yəqin sən onları öyrətmisən.

– Sən şerlərində də belə həssassan? – deyə mən də onun kinayəsinə kinayə ilə cavab verdim.

– Oxuyaram, görərsən. Hələlik, gəl, bu qazanı düşürək, köməkləşib yuyaq, – deyə şişman qadın əsginin birini mənə verib, birini özü götürdü. – Ehtiyatlı ol, əlini yandırarsan. Pis də olsan, yaxşı da olsan bizdənsən. Sənə yazığım gəlir...

Bu anda bostan üçün ayrılmış torpaq sahəsindən bəridə, yanıb saralmış otlaqdan müdhiş bir səslə bağıran Mollayi Kəbirin fəryadı eşidildi. Mən qazanın qulpunu əlimdən buraxıb o tərəfə boylandım. Tarlada işləyənlər və düşərgədən hələ heç yana getməmiş adamlar yüyürüşüb Mollayi Kəbirin dövrəsini bürüdülər. “Nə olub, nə olub?” deyə bir-birindən soruşmağa başladılar.

Mən də yüyürüb izdihama qarışdım. Kim isə adamları tələsdirirdi:

– Nə durmusunuz, ay camaat, tez komendanta xəbər verin, doktor çağırtdırsın! Görmürsünüz qılçası necə xal-xal olub! Yazıq kişini yaman zəhərləyib... Biriniz yüyürün, leytenanta deyin, tədbir görsün!

Adamların əhatəsində aşağı çöməlib Mollayi Kəbirin qılçasını müayinə eləyən Rəcəb kişi, təəssüflə ağzını nırçıldadıb, başını bulayır, amma nə üçünsə o qədər də tələsmədən deyirdi:

Maşın versəydilər, tez həkimə çatdırardıq. Bir o yana, bir bu yana gedib-gələnəcən, iş-işdən keçər, yəni zəhər bütün bədəninə yayılar... Yəqin gürzədir... Mollayi Kəbir, ilanı gördün, görmədin?

Mollayi Kəbirdə cavab verəsi hal yox idi. Ağrı ona güc gəldikcə zarıyır, canını dişinə basıb, qışqırmamağa çalışırdı.

– Kimdə iti bıçaq var, ay camaat? – deyə Rəcəb kişi yanındakı adamlara göz gəzdirib soruşdu. – Tez olun, bıçaq verin!..

Ayaq üstündə durmuş kişilərdən bir neçəsi cib bıçaqlarını cəld çıxardıb, tez-tələsik irəli uzatdı. Mollayi Kəbir iri tiyəsi parıldayan ov bıçağını Rəcəb kişinin əlində görüncə, təkrar qışqırdı:

– Canım, bu neyləmək istəyir? Yox, yox, lazım deyil!..

– Qorxma, boğazını kəsmiyəcəyəm, – deyə Rəcəb kişi oyan-buyana göz gəzdirdi. Bıçağı itiləmək üçün daş axtarırdı, ancaq heç nə tapa bilməyib, yanında dayanmış oğlanın əlindəki bıçağı dartıb aldı. – Mollayi Kəbir, hərçənd bu molla tayfası ilə elə uşaqlıqdan aram yoxdur, onları bircə-bircə kəssəm də yeri var, amma səni ölümdən qurtarmaq istəyirəm, çünki sən molla deyilsən, görürəm zəhmətkeş adamsan, bu bostanın ucbatından belə əzab çəkirsən... Ya allah, Mollayi Kəbir... Gözünü yum, bu saat sənin də, özümün də kəfənimi boğazıma dolayıram. Ya ikimiz də gedəcəyik, ya səni ölümdən qurtaracağam... – Rəcəb kişi uzun tiyəli bıçaqla Mollayi Kəbirin topuğundan bir azca yuxarıda qılçasını çərtdi, tezcə də dodaqlarını yaraya yapışdırıb, zəhəri sormağa başladı. Bir dəfə sorub tüpürdü, iki dəfə sorub tüpürdü, üç dəfə sorub tüpürdü, sonra qanı bir xeyli buraxdı... – Mollayi Kəbir, səndən əcəb donor olarmış, nə bolluca qanın var, a kişi, lap elə bil fantan vurur!..

Doğrudan da onun qanı fəvvarə kimi göyə qalxır, günün ziyasını əks elədikcə rəng verib-rəng alırdı. Məndən sonra izdihama yanaşmış Sədi Kamal zarafata başladı:

– Balam, bu Rəcəbin bilmədiyi bir sənət var görəsən?.. Hə də, qazaxlılar at oğurlamağa qədimdən vərdiş elədikləri üçün, baytarlıq sənətəni də yaxşı bilirlər...

Rəcəb kişinin bütün fikri-zikri Mollayi Kəbirdə olduğu üçün, Sədi Kamalın zarafatına sonradan sonraya cavab verdi:

– Məni ələ salarsan də... Dilin gəlməz ki, deyəsən Rəcəb Səlimov diplomsuz cərrahdır, ilan vuranı ölümün caynağından bu cür məharətlə qopartdı!.. – Cibindən köhnə qəzet parçası çıxardıb yandırdı, külünü yaranın üstünə basdı – Mollayi Kəbir cibində təmiz yaylığın var?

– Uf-ufff... – deyə Mollayi Kəbir yerində qıvrıldı. – Öldüm, ay tanrı... Yoxdur yaylığım... Ufff...

Rəcəb kişi ondan təşəkkür əvəzinə bu sözləri eşitdiyi üçün, inciyib qaşqabağını tökdü:

– Yox, əmi oğlu, bunu yalan dedin... Ölməyəcəksən... Bax, indi əsil, yəni diplomlu doktor lazımdır ki, gəlib baxsın, qanını analizə versin, desin görək bədənin tamam təmizlənib, yoxsa hələ zəhər var... Məncə yoxdur... Allah üzünə baxdı, Mollayi Kəbir, təsbeh çevirə-çevirə oxuduğun dualar səni qurtardı... Elə mənim də üzümə baxdı, zəhər bədənimə sirayət eləmədi...

Yenə leytenantın bağırtısı eşidildi:

– Bu nədir? İşləmək əvəzinə niyə avaralanırsınız?

Adamlar ortadan bölünüb, ona yol verdilər. Dalı üstə uzanmış Mollayi Kəbiri təpədən-dırnağa qədər gözdən keçirən leytenantın qaşları çatıldı və o, birdən hirsi yatmış halda soruşudu:

– İlan vurub?

Rəcəb kişi sağ əlini yerə dayayıb, ayağa qalxdı və leytenantla üzbəüz dayandı:

– Bəli, – dedi, – ilan vurub... Bəlkə doktora aparaq, hə?

Leytenant acı-acı güldü:

– Hı, hı... Doktora? Nə üçün? Buranın ilanları hansı adamı çalsa, qurtardı, gərək ona kəfən sifariş eliyəsən... – Bu anda Mollayi Kəbirin iniltisini eşidib, hələ də onun ölmədiyinə təəccüb eləyərək baxdı. – Sağdır? Nə əcəb? Belə görünür ki, canı bərkdir...

Bu dəmdə şişman qadını böyrümdə gördüm.

– Doğrudan da nə əcəb? – deyə o da Mollayi Kəbirin indiyəcən sağ qalmağını möcüzə sayaraq, məni də bu fikrinə şərik eləmək üçün, qarnımın sağ tərəfinə bərk bir dürtmə vurdu. – Sən bunun faqqıllıq eləmədiyinə inanırsan? Əgər ilan vursaydı, o saat canı çıxardı.

– Ay arvad, – dedim, – günahım nədir, məni niyə vurursan?

– Gündə on dəfə sən vurursan, cəmi-cümlətanı bir dəfə mən vururam... Allah götürməz?

Leytenant bir də bağırdı:

– Çəkilin, gedin, işinizdə olun!..

Rəcəb kişi burdakı adamların Mollayi Kəbirlə bərabər bostan yerini səpinə hazırlamaq üçün toplaşdıqlarını bildirəndən sonra da, leytenant əmrini təkrar elədi:

– Dağılışın!..

– Bəs bunu doktora aparmayaq? – deyə Rəcəb kişi soruşdu. – Hər halda müayinədən keçirsələr yaxşıdır... Bəlkə, əlavə köməyə ehtiyacı var?

Leytenant indi artıq istehza ilə deyil, tamam ciddi dedi:

– Nə doktor, canım? Hələ bunun sağalmağına ümidin də var?

Onun bu etinasızlığı mənə tamam qeyri-təbii görünürdü: insan adlanan bir məxluq, hətta sevmədiyi və ya nifrət elədiyi bir adamın əzablarına bu cür soyuqqanlı baxmağa haqlı deyildi. Yəqin belə düşündüyüm üçün də leytenantın sözləri məni haldan çıxartdı:

– Yoldaş, – dedim, – ümid oldu, olmadı, ona tibbi yardım göstərilməlidir!..

– Bu əmrdir, yoxsa xahiş? – deyə leytenant dişlərini qıcadı, rəhmsiz bir ifadə ilə parıldayan damarlı gözlərini mənə dikdi. – Sən mənə yoldaş deyilsən!.. Niyazov işdən qovulduğuna görə, bundan sonra vətəndaş sözü ilə yoldaş sözünə fərq qoyulacaq. Anladınızmı?

– Hər halda siz də sovet qanunlarına ehtiram göstərməlisiniz! – dedim.

O, qəzəbinin şiddətindən müvazinətini itirdiyi üçün, mənə tutarlı bir cavab verə bilməyəcəyini dərk eləyib o dəqiqə məndən aralandı və yenə qışqırdı:

– Eşitmirsiniz? Dağılın deyirəm!.. Nəzərdə tutun ki, işləməyənə nə çörək veriləcək, nə də su!

O, yenə izdihamı yarıb uzaqlaşdı. Adamlar dağılışmağa başladılar. Rəcəb kişi ilə bir nəfər Mollayi Kəbiri qollarının üstünə götürüb, çadıra apardılar.

Mən də mətbəxə sarı addımladım. Şişman arvad məndən əl çəkmirdi:

– Gördün də, hökumət nümayəndəsi nə dedi?

Bu qadının hər bir sözü mənim əsəbimə toxunurdu. Ancaq bu dəfə dinmədim: leytenantın hərəkəti məni də hədsiz dərəcədə qəzəbləndirmişdi. Hiss eləyirdim ki, şişman qadın leytenanta söz qaytardığımı görəndən sonra məni də özünün həmfikri saymağa başlamışdı, aramızdakı ixtilafı unudub “doğru yola” qayıtdığımı düşünürdü, kim bilir, bəlkə elə bu səbəbdən də ürək sirlərini mənə açıb-söyləməyə imkan tapdığına sevinirdi.

– Bəri gəl, bəri gəl, gedək şorbamızı bişirək... Sənə bir şey oxumaq istəyirəm... – O, qolumdan yapışıb piyli bədənini mənə qısdı, boynunu irəliyə sarı uzadıb altdan-altdan üzümə baxdı, pıçıltı ilə dedi: – Yaxşı olardı ki, Ceyran xanım da qulaq asaydı, xoşuna gəlsə, segah üstündə mənim sözlərimi oxuyaydı... Düz deyirəm, yox?

Mən cavab vermədim. O, müğənni qadını axtarıb tapmaq üçün ayaq saxlayıb ətrafa göz gəzdirdi. Məyusluğunu gizlətmədən başını buladı, ağzını nırçıldatdı:

– Hayıf... Görəsən hara gedib?

– Bizim çadırımızda olar, – dedim. – Sədi Kamal camaat üçün konsert hazırlayır. Proqramının çox yarısını Ceyran xanım oxuyacaq... görürəm, çadırda tək qalanda, balaca, qırmızı cildli bloknotunu çıxardıb mahnıların sözünü əzbərləyir. Ancaq buralara gələndən bəri bir dəfə də olsun qaş-qabağı açılmayıb...

– Bu daha yaxşı... Kədərli oxuyanda daha təsirli çıxır. Elə mənim də sözlərim çox yanıqlıdır. Görəcəksən... Hamının ürəyindən xəbər vermişəm...

– Bu gün yazdın? İki daşın arasında?

Mənim sualım onu təəccübləndirmədi:

– Əsil şair, – dedi, – gərək hər cür şəraitdə yazmağı bacarsın. – O tumbul barmaqlı gödək əlini zərblə döşünə çırpdı. – Bax, mənim kimi! Başqalarını bilmirəm, ancaq mən əsərlərimi əvvəlcə ürəyimdə tamam-kamal yazmamış dünyasında kağıza köçürmərəm. Bilirsən bunun nə kimi gözəl məziyyətləri var?

– Yox, bilmirəm, – dedim – hardan biləcəyəm? Evdə bişməyib, qonşudan gəlməyib...

O, məni darta-darta aparıb, adamlardan xeyli uzaqlaşdırdı və görünür yalnız ən yaxın dostlarına qızdığı bir sirri mənə söyləmək üçün, bir xeyli ətrafına boylandı, yaxında heç kəs olmadığı halda, yenə də pıçıltı ilə dedi:

– Elə şeirlərim var ki, onlardan bircəciyi ələ düşsə, dərimə saman təpərlər, yəni ən azı onca il həbsi var. Bu cür əsərlərimi əzbərləyib yadımda saxlamağa məcbur oluram. Gələcək nəsilləri nə üçün onlardan məhrum eləyim?

Mən qadının sözlərini artıq əvvəlki kimi istehza ilə dinləyə bilmirdim. Özümdən asılı olmayaraq məndə onun şerlərini eşitməyə nə isə yenilməz bir maraq oyanmağa başlayırdı. Hətta, mən ondan soruşdum da:

– Ümumiyyətlə əsərin çoxdur?

– Çoox, çoox...

– Bəs niyə indiyəcən çapa verməmisən?

– Çapa?.. – O, mənim sadəliyimə acı-acı güldü. – Sənə ağzımda söz deyirəm. Kim onları çap eləyər? Heç eləsələr də vermərəm. Bilmirsən bunların tənqidçiləri qazdan da ayıqdırlar? Bu şerlərdən bircəciyi çap olunsa məni şil-küt eləyərlər... – Şişman qadın ağır-ağır başını buladı.

– Yox, bacım, keçəl suya girməz. Məsəl var: "Tülkünün meydanda nə işi var ki, dərisinə qiymət qoysunlar..." Məncigəz şeirlərimi bircə-bircə yazıb yığıram sandığa. Vaxt gələr, əsil milli şair kimi məni əl üstündə gəzdirərlər... Lap bu tənqidçilərdən də mənə tərifnamə yazanlar olar. Elə bilirsən bunların içində üzdə bir, ürəkdə ayrı cür olanı yoxdur?

– Deyirsən bir vaxt gələr. Yəni sən hansı vaxtı nəzərdə tutursan?

– O vaxtı ki, bunların külü göyə sovrulacaq!.. Elə bilirsən bu qəzetdə yazılanlar, bu radioda deyilənlər doğrudur? Guya Hitler məğlub olub geri çəkilir? – O, əlini havada oynatdı. – Ay-hay, ölmüşdü Hitler... Darıxma, indi elə əks-hücuma keçsin ki, kefin istəyən kimi.

– Mənə də o cür şerlərdən oxumaq istəyirsən?

– Bəs necə?.. Mən başqa cürünü heç yazmıram da...

Deyəsən o, mənim sualımdakı istehzanı duya bilmədi və daha da ruhlanıb, suallarıma məmnuniyyətlə cavab verməyə başladı:

– Soruşsan ki, nə vaxt bunların külü göyə sovrulacaq? Çox tez. Səhih yerdən eşitmişəm, almanlar təzə silah icad eləyiblər, bu saat onu işə salmağa bərk hazırlaşırlar... Hə, qulaq as, şerimi oxuyum... – O, azacıq nəfəsini dərdi, əlini koftasının döşünə atdı, qəzetlərin qırağından lenta kimi kəsilmiş kağızlardan bir neçəsini çıxartdı, ərəb əlifbası ilə yazılmış qarma-qarışıq misralarını qəribə bir səlisliklə oxudu, sonra isə kağıza baxmadan əzbərdən deklamasiya söylədi. Deyəsən o, mənim burda olduğumu unudub gözə görünməyən bir aiditoriyaya üz tutaraq və get-gedə coşaraq, səsini ucaltdı. Şer, uzun həsrətdən yorulmuş adamları səbirli olmağa çağırırdı. Daha üzüntülü həsrətə dözmək üçün, deyirdi, gərək ürəyində daha ülvi bir məhəbbəti yaşatmağı bacarasan, bu məhəbbət səndən böyük fədakarlıq və məhrumiyyət tələb edəcək, sən buna dözməlisən. Bu məhəbbətin gücü gərək sənin qəlbinə iradə və səbir aşılasın. Çəkdiyin intizar səni ruhən yüksəldəcək, çünki bu tntizar gözəl arzu və əməllərlə bağlıdır. Sənə düşmən kəsilmiş qara qüvvələr qara buludları andırır. Qərbdən günəş doğacaq, mütləq doğacaq, bu qara buludları parçalayacaq!.. – O, susdu və nə isə daxili bir atəşlə yanan gözlərini mənə dikdi. – Hə, necədir, xoşuna gəlirmi?

Birdən-birə cavab verə bilmədim. Şeri bəyənmirdim. Simvolik işarə və eyhamları zəif istedadlı şairlərin işlətdiyini çoxdan bilirdim. Şişman qadın məndən gözlərini çəkmədiyi üçün pisdən, yaxşıdan bir söz deməliydim.

– Vəzni, qafiyəsi yerindədir. Görünür ədəbi qaydaları bilirsən, – dedim. – Ancaq...

Mən fikrimi tamamlamamış o güldü. Cantraq bədəni ləngərləndi.

– Mənə gülürsən, yoxsa öz şerinə? – deyə mən hirsimi boğa bilməyib, onun üzünə bozardım.

– Xeyr, – dedi. – Şerimə gülmürəm, sənə gülürəm

– Mənim nəyimə gülürsən ki?

– Görünür, indiki tənqidçilərin üslubuna yaxşı bələdsən. Sən də əvvəlcə bir-iki kəlmə boğazdan yuxarı tərif deyib, ən axırda əsəri yerə vuracaqsan, yoxsa nə "ancaq"?

Bu anda yadıma bir lətifə düşdü, mən də gülməyə başladım. Şişman qadın o dəqiqə gülməyinə ara verdi:

– Niyə hırıldayırsan? – dedi.

– Hırıldamıram, gülürəm, – dedim. – Sənin şerinə qulaq asanda, çoxdan eşitdiyim bir anektodu xatırladım.

– Hə, nə anekdot? Mənim xeyrimədir, zərərimə? Danış, danış!..

Mənim çox zəif bir cəhətim var: müsahibimə məzəli əhvalat danışanda, gülməkdən özümü saxlaya bilmirəm. Bu dəfə də güc-bəla, əlimlə ağzımı tuta-tuta, xatırladığım lətifəni danışdım, amma sona çatmamış yenə də qəhqəh çəkib güldüm. Şişman qadın, yəqin ki, mənim dediklərimdən pərt olduğunu gizlətmək üçün bir növ zorakı güldü, ancaq birdən gülüşünü xırp kəsdi, hirsləndiyini istər-istəməz büruzə verib dedi:

– Mən sənin gülməyinə gülürəm. Elə danış ki, biz də bir şey qanaq də... Lap başdan danış.

Mən lətifəni bir də söyləməyə məcbur oldum:

– Xarici ölkədən gəlmiş bir səyyah İranın kəndlərini, şəhərlərini gəzirmiş... Bazarların birində qarpız satana rast gəlir. Bu qəribə meyvəni ömründə ilk dəfə görürmüş. Xeyli dayanıb həm qarpız satanı, həm də müştəriləri müşahidə eləməyə başlayır. Görür ki, bəzisi zorba bir qarpız götürüb iki tərəfdən sıxır, qulağına tutur, bəzisi çırtmıq vurmaqla kifayətlənir, bəzisi də elə-belə üzünə baxıb götürür. Səyyah da onlara təqlidən hansı qarpızı götürüb kəsirsə, dümağ çıxır. Qarpız satandan soruşur: "Dostum, gəl bu sirri mənə başa sal görüm, bu camaat qarpızların yaxşılığını, pisliyini nədən bilir?". Qarpız satan cavabında heç bir söz demir. Divarın dibindəki iri qarpızı göstərir. Səyyah dərhal onu götürür, kəsir, cırıltı ilə ortadan iki yerə bölünən

qarpızın rənginə baxanda, yanaqları qızılgül kimi açılır: "Əhsən!" deyib sevinclə əlini-əlinə vurur. Qarpız satanın işarəsi ilə neçə qarpız götürürsə, hamısı bir-birindən qırmızı çıxır. Səyyah heyrətlə baxır, baxır, nəhayət deyir: "Bərəkallah, yaxşı başın var, amma heyf, səd heyf ki, belə boş şeylərə işlədirsən"...

Şişman qadının rəngi bulud kimi tutuldu. Üzünü başqa səmtə çevirib, dodağının altında deyinməyə başladı:

– Hə, fəzilət məlum... Əslinə baxsan əvvəldən bilirdim ki, belə incə şerləri anlamağa sənin dərrakən çatmaz...

– Gedək, şorbanı bişir, – dedim. – Bir azdan camaat gələcək... Hərçənd şorban da şerin kimi dadsızdır, ancaq çarəmiz nədir, içməyə məcburuq... Doğrudur, mən ədəbiyyatçı deyiləm, amma bircə şeyi anlayıram ki, ölü ideyadan ölməz əsər heç vaxt yaranmayıb...

Bu söhbətdən sonra şişman arvad heç bir sirrini mənə açıb söyləmədi və mən onun hər dəfə fürsət düşdükcə, qəzetlərdən kəsib saxladığı kağız lentalarında necə şerlər yazdığından xəbər tuta bilmədim. Çadırda yerimi dəyişməyə nə qədər çalışdımsa da, bir nəticə vermədi. Axırda mən bu fikrimdən daşınmalı oldum. Doğrusu, indi yerimi dəyişməyə artıq ehtiyac da qalmamışdı: şişman qadın get-gedə arıqladığından, o qədər də bərkdən xoruldamırdı...

## AXTARAN TAPAR...

Düşərgəyə gəldiyimiz vaxtdan çox keçməmişdi, buna baxmayaraq, bir-birinə bənzəyən günlərin sayını-hesabını itirmişdim. Məzmunsuz və faydasız keçən günlər deyil, dəqiqələr belə bəzən insana əbədiyyət qədər qəmgin və intəhasız görünür. Son zamanlarda mən hər şeyə nə isə çox laqeyd və biganə baxırdım. Az qalırdı, hətta, qızlarımın da taleyini unudam. Fürsət düşdükcə Bakıya məktub yazıb evimizdən cavab almasaydım, doğrudan da onları yadımdan çıxara bilərdim. Düşərgə həyatı, xüsusən leytenantın ən cüzi bir şey üstündə hədsiz dərəcədə kobud rəftarı yalnız məndə deyil, çoxunda ümidsizlik, bəlkə də bədbinlik hissi oyatmışdı. Leytenant ən adi sözümüzə və hərəkətimizə irad tutur, qanunsuz olaraq çörək payımızı kəsir, bəzimizi günlərlə ac-susuz qoyub, həbsdə saxladırdı. Əlbəttə, bu hamının bildiyi həbsxana deyildi. Müqəssir saydığı adamları özünə ram etmək

üçün leytenant Rudəki kolxozundan bir otaq alıb, pəncərəsinə dəmir barmaqlıq vurdurmuşdu. Bu otaağa düşənlərə çörək və su vermək leytenantın keyfindən asılı idi. Vaxtı ilə hansı səbəbdənsə həbsə düşmüş adamlar bu hərki-hərkiliyi gördükcə deyirdilər:

– Orda heç olmasa intizam var. Məsələn, bilirsən ki, səhər tezdən həyətə çıxardıb, təmiz havada gəzdirəcəklər, saat səkkizdə, məsəl üçün, bir parça çörəyin, bir stəkan isti suyun var, saat üçdə pisdən-yaxşıdan nahar gətirəcəklər. Müəyyən vaxtlarda nəzarətçiyə pul verib, bazardan yemək şeyləri aldırmağa ixtiyarın var...

Düşərgənin "qayda-qanunları" çoxunda yaşamaq və ağır intizara dözmək həvəsini öldürmüşdü. Görünür, elə leytenantın məqsədi bu idi. Yoxsa nə üçün ən adi həbs düşərgələrində dram dərnəyinin çalışmağına imkan verildiyi halda, bizdə Sədi Kamalın ətrafına toplaşmış həvəskarları həvəsdən salıb dağıtmışdı? May bayramına iki-üç gün qalmış, bu barədə öz narazılığımızı bildirə-bildirə, həmişəki kimi yerdə oturub nahar eləyirdik. Yəni şişman qadının bişirdiyi dadsız-duzsuz şorbanı içirdik. Birdən motosikl səsi eşitdik, gələni poçtalyon bilib yenicə sevinməyə başlamışdıq ki, o dəqiqə də qaşqabağımızı salladıq: gələn leytenant idi. Görünür, hər dəfə uzaq məsafəyə gedib-gələndə yük maşınında ona əziyyət olmasın deyə motosiklet vermişdilər. Yoldaşlarımızdan kim isə hətta arada bir onun ünvanına söz də atdı:

– Yaxşı işlədiyinə görə mükafat alıb.

Motosikl tırıldaya-tırıldaya bizə yan aldı. Leytenant salamsız-kəlamsız (o, hələ bir dəfə də olsun bizə salam verməmişdi) Ceyran xanıma üz tutub nə isə demək istəyəndə Rəcəb kişinin səsini eşitdim:

– Salam, vətəndaş rəis!

O, yalnız bircə an tutuldu, arıq və dartılmış yanaqlarına xəfif bir qızartı çökdü. Dodağının altında:

– Salam, salam, – deyə mızıldanaraq, təkrar Ceyran xanıma müraciət elədi: – Vətəndaş Eldarova, doğrusu sizin...

Rəcəb kişi onun sözünü kəsdi:

– Buyurun, siz də nahar eləyin, uzaq yoldan gəlmisiniz.

Bu dəfə leytenant qisas almaq üçün əlinə bəhanə düşdüyünə sevinmiş kimi, motosikldən enib, Rəcəb kişinin üstünə şeşələndi:

– Canım, bu nə ədəbsizlikdir? Görmürsünüz bu xanımla danışıram?.. – Aralığa ölüm sükutu çökən kimi yenə Ceyran xanıma üz tutdu: – Mən

çox təəssüf eləyirəm ki, sizin bu qədər məşhur bir müğənni olduğunuzu bilməmişəm, yoxsa dünyasında özfəaliyyət dərnəyini ləğv eləməzdim... Nə üçün əvvəldən bunu mənə deməmisiniz? Yoxsa heç vaxt ərinizi sizdən ayırmazdım, ikiniz üçün xüsusi çadır gətirdərdim... Siz tək düşərgəyə yox, Rudəki kolxozuna da mədəni xidmət eləyə bilərsiniz.

– Bu gün hardan doğub ki? – deyə Ceyran xanım başını qaldırmadan, nifrət dolu bir istehza ilə soruşdu.

– Bu sizi sevindirmir?

Hamının gözü Ceyran xanımda idi. Mən onun cavabını leytenantdan yüz qat səbirsiz gözləyirdim. Mənə elə gəlirdi ki, əgər o, razılığını bildirsəydi, hamımız özümüzü təhqir olunmuş və alçalmış sayardıq.

Müğənni qadından səs çıxmadı. Onun bizim təhdidimizlə və yaxud mənəvi təzyiqimizlə deyil, öz ağlı ilə, leytenanta nifrət elədiyinə görə müsbət cavab verməyəcəyi şəxsən mənə o dəqiqə aydın olmuşdu.

Leytenant israrla soruşdu:

– Siz sevinmirsiniz?

Ceyran xanım duru baxışlarını müsahibinin üzünə dikib, qəti və sərt dedi:

– Yox, sevinmirəm!

– Nə üçün?

– Ona görə ki, sizə inanmıram!

– Mən yalnız mən deyiləm, Ceyran xanım. Axı, mən burda Sovet hökumətinin nümayəndəsiyəm!

Ceyran xanım bu dəfə qəzəblə qaşlarını çatdı:

– Xeyr, – deyə az qala qışqırdı. – Buna heç inana bilmirəm!

– Axı, nə üçün?

Əvvəlcə elə düşündüm ki, müğənni qadın ifrat dərəcədə kobud cavab verdiyini dərk eləyib, bir daha dinməyəcək. Ancaq mən yanılırdım. O, ayağa qalxdı:

– İnanmıram! – deyə daha da ucadan səsləndi. – Siz də eşidin, camaat da eşitsin. Ona görə inanmıram ki, Sovet hökuməti insanları heç vaxt sizin qədər alçaltmayıb, öz vətəndaşlarını yox, düşmənlərini belə sizin qədər təhqir eləməyib!

Leytenant gözləri ilə kimi isə axtarmağa başladı:

– Vətəndaş Sədi Kamal, – dedi, – bu gündən dram dərnəyi də, xor da işə başlaya bilər.

Sədi Kamaldan səs çıxmadı. Leytenant motosikletini çəkə-çəkə öz çadırına tərəf getdi. Ceyran xanım mənimlə gözləşdi:

– Kartof soyaram, ancaq onun qabağında oxumaram!-dedi.

O günün sabahısı Ceyran xanım özü üçün fərəhli, amma mənim üçün son dərəcə qüssəli bir xəbər gətirdi:

– Deyəsən məni burdan buraxacaqlar!

– Doğrudan? Bakıya?

– Yox, elə Tacikistana. Buranın böyüklərindən hansı allah bəndəsi isə mənim burda olmağımdan xəbər tutub, deyib ki, buraxın öz sənətində işləsin... Çox ola bilir ki, tacik artistlərindən kim isə məsələyə qarışıb. Onların içərisində çox yaxın dostlarım var... Bizim sənətimiz belədir, Səmirə xanım, hara ayaq basırıqsa, özümüzə bolluca dost qazanırıq.

– Əlbəttə, hamınız belə deyilsiniz, amma nadir istedadların hər yerdə pərəstişkarı var. Bəs nə vaxt gedirsiniz?.. – Mən bu sözləri deyərkən, iradəmdən asılı olmayaraq səsimin qırıldığını hiss elədim. Axı, onun getməyi mənim ürəyimdən deyildi. Ən ağır dəqiqələrimdə həm Ceyran xanım, həm də Elman mənə hayan olub, dərdimi-kədərimi az-çox unutdurmağa kömək eləyirdi. Elman indiki Rudəki kolxozunda otaq tutub qalırdı. Tez-tez arvadına yemək-içmək gətirdikcə, mənə də pay verirdilər. Ancaq məni kədərləndirən yalnız bu maddi yardımdan məhrum olmaq qorxusu deyildi. Ceyran xanım bizdən ayrılıb gedəndən sonra, mən ən yaxın dostumdan, bəlkə də sirdaşımdan uzaq düşəcəkdim.

Ceyran xanım mənim kədərləndiyimi hiss eləyib, nə vaxt və hara gedəcəyini mənə demədi, araya başqa söz salmaq istədi:

– Leytenantın kürkünə yaman birə düşüb.

– Niyə ki?

– Qorxusundan. O bizi də özü kimi gönü qalın sayır... Guya biz onun dünəndən bəri niyə belə əl-ayağa düşdüyünü, canfəşanlıq elədiyini anlamırıq.

Mən özüm də bunun səbəbini başa düşmürdüm. Ceyran xanım ondan izahat gözlədiyimi duyub, mənim bu qədər sadədil olduğuma bir növ inanmaq istəmədiyi halda dedi:

– Qorxur ki, mən burdan gedəndən sonra respublikanın böyükləri ilə görüşə bilərəm, günahsız adamlarla necə qansız rəftar elədiyini onlara danışa bilərəm... görmədin necə yaltaqlanırdı? İstəyir lap qabağımda diz çöksün, mənə də Ceyran deyərlər, gərək açam sandığı, tökəm pambığı.

– Yəni bunun camaata faydası olar?

– Nə üçün olmasın? Bilmirəm siz necə, amma mən bütün bu həngamələrdən sonra da adamlar barədə yenə bədgüman deyiləm. Bizim bu leytenant kimiləri cəmiyyətin sağlam bədənində peyda olmuş sızanaqdan başqa bir şey deyillər. Belə qəddar adamlar çox qorxaq olurlar. Əgər bircə nəfər buna yuxarıdan göz ağartması versə, tülküyə dönər... Niyə belə təəccüblə baxırsınız, yoxsa mən haqsızam?

– Əksinə, Ceyran xanım, siz tamamilə haqlısınız, – dedim, – sözləriniz tamam mənim ürəyimdəndir. Xüsusən sızanaq barədə. Mən sizə təəccüblə yox, heyrətlə baxıram. Mən də bu fikirdəyəm, ancaq təəssüf ki, öz düşündüyümü sizin kimi aydın, sərrast ifadə eləməyə alışmamışam... Əgər böyüklərlə də bu cür danışsanız, leytenantı heç bir gün də burada saxlamazlar.

Ceyran xanım, yaxınımızdan keçən adamlar bizim söhbətimizi eşitməsinlər deyə səsini yavaşıtdı.

– Elmanın dediyinə görə burdan bir dəstə adamın imzası ilə mərkəzə şikayət gedibmiş, Stalinabaddan xüsusi bir komissiya gözlənilir... Görmürsən, indiyəcən düşərgədə tikinti işləri başlanmayıb? Bunun təqsiri kimdədir? Bax, bizim bu cənab leytenantda. Dünən Rudəki kolxozunun sədrinə yalvarırmış ki, arabadan, maşından versin, tikinti materialları daşıyaq. Bu söhbət zamanı Elman da kolxoz sədrinin kabinetində imiş... Guya ayın əvvəlindən gərək bizim düşərgəmiz üçün daş evlər tikilməyə başlasın. Yuxarıdan əmr var.

Bu xəbər məni o qədər də sevindirmədi. Çox gecikmişdik. İndi tikintini başlasaydıq, soyuqlar düşənəcən ən yaxşı halda binanın divarlarını hörüb qurtara bilərdik. Deyirdilər ki, buralarda qış vaxtı şiddətli şaxta olur, xüsusən cənub küləyi əsəndə insanın ağzında tüpürcəyi donur. Belə soyuqda yarıac, yarıtox insanlara ağır fiziki iş gördürmək o qədər də asan olmayacaqdı.

Ceyran xanımın komissiya barədə dediyi düz çıxdı. Axşamüstü, hələ qaş qaralmamış, uzaqdan leytenantın motosikli göründü. Biz yorğun-arğın işdən qayıtmış adamlarla birgə oturub, çay üçün növbə tutmuşduq. Leytenant, dalınca toz dumanı qaldıraraq, bizə yanaşanda, onun nə isə çox pərt və tutqun olduğunu yalnız mən yox, çox adam hiss elədi. O, heç kimin üzünə baxmadan, motosiklini düz çadırının qabağına sürdü, uzaqdan-uzağa bizə qışqırdı:

– Çay içəndən sonra yatmayın, şəhərdən adamlar gələcək.

Ceyran xanım mənalı-mənalı mənə baxdı: "Gördün, mən deyən oldu?".

Doğrudan da üç nəfərlik komissiya gəldi. Oturduğumuz yerdən qalxmadıq. Hardansa palaz gətirib yerə sərdilər. Komissiya üzvləri tacik qaydası ilə bardaş qurub oturdular. Leytenantın əmri ilə kim isə yüyürüb adətən vaqon gözətçilərində olan lampalardan birini gətirdi, əlindəki haça ağacı yerə çalıb, lampanı onun üstündən asdı. Komissiya üzvlərinin ortasında əyləşmiş arıq, uzun və sarışın adam (bir azdan sonra onun komissiya sədri olduğunu öyrəndik) uzun müştüyə taxılmış eşmə papirosunu tüstülədib camaatdan soruşdu:

– Şikayət yazan vətəndaşların hamısı burdadırmı?

Komissiya üzvlərinə yaxın oturmuş adamlardan bir neçəsi dönüb geriyə baxdı. Onların təəccüb və heyrətdən böyümüş gözlərində aydın oxunan bir ifadə vardı:

"Bu zalım uşağı görünür qurd ürəyi yeyib..."

Düşərgə elə bil ölüm sükutuna qərq olmuşdu, sanki heç kəs cınqırını çəkmək fikrində deyildi.

– Ay yoldaşlar, kim şikayət kağızını imzalayıbsa, hay versin də... Balam, niyə ağzınıza su alıb oturmusunuz? – deyə arxadan söz atan Sədi Kamalın səsini eşitdim. – Yazanlardan biri mən!

– Yaxşı, biri siz... Axı, burda... – Komissiya sədri dizinin üstündəki iş qovluğundan iki vərəqli dama-dama dəftər kağızı çıxardıb, uzununa açdı, şəhadət barmağını yavaşcadan ona vura-vura imzaları saydı. – Burda on bir nəfərin qolu var. Çox xahiş eləyirəm ki, heç nədən çəkinməyəsiniz. Biz əsil həqiqəti öyrənməyə gəlmişik. Bəlkə elə siz danışmağa başlayasınız, o biri vətəndaşlar da hazırlaşsınlar. – Sədr əli ilə Sədi Kamalı irəliyə dəvət elədi: – Buyurun!

– Mən niyə, vətəndaş komissiya sədri? Mən orda yazılanların nəinki bir sözündən, heç vergülündən, nöqtəsindən də boyun qaçırmıram. Yaxşı olmazmı ki, oxuyasınız, camaat da eşitsin!

Sədr kağızı qatlayıb yenə qovluğa qoydu:

– Oxumuşuq, diqqətlə oxumuşuq, tək biz yox, bizi bura yollayan idarənin rəhbərləri də oxuyublar. Məktubun sonunda belə bir cümlə də var: "Əgər bizə inanmırsınızsa, komissiya göndərin, yazdıqlarımızı leytenantın üzünə deyək". Doğrudurmu, vətəndaş?..

– Bəli, tamamilə doğrudur. Buna görə də mən deyirəm ki, yazdıqlarımızı oxuyun, leytenant da eşitsin, camaat da... – Sədi Kamal yerindən

qalxıb, lampanın yanına qədər gəldi. – Əgər mənim danışmağıma ehtiyac varsa, izin verin, danışım... – O, sədrin razılığını gözləmədən sözünə davam etdi. – Burdakı adamların heç birini məhkəmə cəzalandırmayıb. Heç birinin də səsi alınmayıb. Deməli, biz məhbus deyilik, bərabər hüquqlu sovet vətəndaşıyıq. Bəs vətəndaş rəis nəyə əsasən bizi ən adi hüquqlardan məhrum eləyir?.. Bax, özü də burdadır, mən deyənləri eşidir. Qoy cavab versin görək kim və harda belə bir qanun qoyub ki, bizim özfəaliyyət dərnəyi düzəltməyə, divar qəzeti buraxmağa haqqımız yoxdur? Bəlkə, vətəndaş rəis elə fikirləşir ki, biz sovet dövlətinə öz sədaqətimizi göstərməyə də haqlı deyilik? Bizim yoldaşlarımızdan yeddi-səkkiz nəfər cavan oğlan ərizə verib, cəbhəyə könüllü getmək istəyir. Nə üçün rəis onların xahişini hökumətə çatdırmayıb?

– Doğrudur! – deyə bir kişi Sədi Kamalın sözlərini təsdiq elədi. O, lampadan çox uzaqda əyləşdiyi üçün üzünü görə bilmədim. Bir neçə adam da yerdən ona səs verdi:

– Bəli, düz deyir. Yarım aydan çoxdur cavab gözləyirik!

Sədi Kamal bir qədər susub, adamların sakitləşməyini gözlədi, yenə də eyni təmkinlə danışmağa başladı:

– Ola bilər ki, vətəndaş rəis o cavanların xahişini lazımi yerinə çatdırıb, amma rədd cavabı alıb... Əgər belədirsə, nə üçün bu barədə ərizəçilərə məlumat vermir?

– Yox, çatdırmamışam, çatdırmağı da lazım görməmişəm! – deyə leytenant komissiya üzvlərinin arxasından dilləndi. – Onun üçün ki, bu gündə, sabahda müharibə qurtarır. Əgər onlar yaxşı vətəndaş olsaydılar, Bakıda ikən könüllü gedib, cəbhədə vuruşardılar.

Bir azca əvvəl arxadan Sədi Kamalın sözünü təsdiqləyən kişi yenə dilləndi:

– Elə orda ikən ərizə vermişdik, xahişimiz qəbula keçmədi.

Sədi Kamal əlini yuxarı qaldırıb, onu sakitliyə çağırdı:

– Deməli, yoldaş rəis...

– Yoldaş yox, vətəndaş!.. – deyə leytenant hirsli-hirsli qışqırdı.

– Bəli, vətəndaş rəis bu faktı danmır. Görürsünüz ki, ərizə verib könüllü getmək istəyən cavanlar da bizim imzaladığımız məktubu təsdiq eləyirlər. Mən əvvəllər həbs lagerində olmuşam. O zaman məni haqlı olaraq cəzalandırmışdılar. Onillik cəza müddətimdə bircə dəfə görmədim ki, hər hansı məhbusu yeməkdən, içməkdən məhrum eləsinlər. Amma vəziyyət burda necədir? Kim bir balaca ayağını yan qoyursa,

rəis onu tutub kəndə yollayır, həbsə saldırır, özünü də ac-susuz saxlayır. Biz rəisdən nə istəyirik? Bircə şey: qayda-qanunu ayaqlamasın! Bizim aramızda hüquqşünas da var. Ondan da məsləhət almışıq. Heç kəs qeyri-qanuni bir tələb irəli sürmür. Məlumdur ki, hətta güllələnmək cəzasına məhkum olunmuş bir cani belə xəstələnərsə, onu müalicə eləyib sağaltmaq məcburidir. Bir neçə gün bundan əvvəl Mollayi Kəbiri ilan vurmuşdu. Xoş təsadüf nəticəsində o ölməyib sağaldı. Amma rəis onu həkimə yollamalı idi. Yolladımı? Xeyr, yollamadı. Nə üçün? Bilmirəm. Doğrudur, bu əhvalatı biz ərizədə yazmamıışıq, amma burda oturanların çoxu mənim dediyimi təsdiq eləyə bilər. Düz demirəmmi, ay camaat?

Hər tərəfdən uğultu qopdu:

– Doğrudur, doğrudur!..

Biz bura gələli iki aydan çoxdur, ancaq bir dəfə də bədənimizə isti su dəyməyib. – Sədi Kamal duruxdu, sözünü təsdiq üçünmü, yoxsa bu anda bədəninin gicişmə tutduğundanmı, qulağının ardını bərkdən qaşıdı. – Birdən işdir, qəzadır, bir nəfər tif azarına tutuldu, epidemiya başladı, bunun məsuliyyəti kimin boynuna düşəcək?.. Əgər yalan deyirəmsə, bu meydan, bu şeytan, qoy rəis bunun tərsini sübut eləsin.

Elə bu anda Sədi Kamalın gözü mənə sataşdı. Görünür, təkdənbir öz narazılığını bildirmək üçün ona dediyim sözləri xatırladı.

– Bizim aramızda yaxşı mütəxəssislər var, – dedi, – nə səbəbə onlardan faydalı işlərdə istifadə olunmur? Mən inanıram ki, bir vaxt bizi burdan buraxacaqlar, amma kim istəməz ki, özündən sonra yaxşı bir yadigar qoyub getsin? Bizdən sonra nə üçün insanlar deməsin ki, filan vaxt nə səbəbdənsə bura göndərilmiş adamlar filan evi, filan klubu, filan mədəniyyət sarayını tikiblər?

Bizim baxışlarımız yenə bir-birinə sancıldı. Mən hiss elədim ki, Sədi Kamal onun bu fikrini ən çox mənim təsdiqləməyimi istəyir, "doğrudur! Deməyimi gözləyir, ancaq mən razılığımı bildirmək üçün yalnız başımı qaldırıb-saldım. O, nitqini qurtarıb, yenə qulağının dalını qaşıya-qaşıya yerinə qayıtdı.

Komissiya sədri iş qovluğunun üstündəki bloknotuna nə isə qeyd eləyib, yığıncağa göz gəzdirdi:

– Çox gözəl... – dedi, – ərizəni imzalayan o biri vətəndaşlardan danışmaq istəyən varmı? Buyursunlar!

Belə hallarda yığıncaq sədri adətən vaxtın hədər getdiyinə təəssüflənir, tək-tək adamlara müraciətlə, "bəlkə siz danışasınız"

deyə üz vurur, amma heç kəsdən cavab almayanda, gözlərini yığıncaqdakıların üzündə gəzdirməkdə davam eləyir, yenə də söz istəyən olmur, bəzisi utandığından, bəzisi ümumiyyətlə danışmağı sevmədiyindən, bəzisi də bu və ya başqa adamın ünvanına deyəcəyi tənqidin mənfi nəticəsindən qorxduğu üçün susur, bir başqasının danışmağını gözləyir. Komissiya sədri, əlbəttə, heç birimizin üzünə baxa-baxa əli ilə "xitabət kürsüsünü" göstərir, dəqiqədə bir cümlə təkrar eləyirdi:

– Buyurun, vətəndaşlar...

Xeyli müddət ağır bir sükut oldu. Hardasa çölün düzündə ötən bir quşun səsi eşidildi, elə bil uzaq və unudulmuş bir xatirəyə dalmaqdan qorxub, əlimi yuxarı qaldırdım:

– Vətəndaş sədr, olar? Ərizədə mənim imzam yoxdur. Ancaq bir neçə kəlmə demək istəyirəm.

Sədi Kamalın dayandığı yerə gələndən sonra gözüm hey Ceyran xanımda idi. İclaslarda tez-tez nitq söyləməyi sevmədiyimdən və effektli sözlər deməyə alışmadığımdan, bu günkü danışmağımdan da elə müsbət bir nəticə gözləmirdim. Ancaq buna baxmayaraq dedim:

– Mən aclıqdan, susuzluqdan şikayət eləməyəcəyəm. Vətəndaş rəisi bu barədə günahlandırmaq fikrində də deyiləm. Ona görə yox ki, mən aclıqdan əziyyət çəkmirəm. Yox, burdakı adamların hamısı kimi mən də yarıac, yarıtox yaşayıram, amma mənə elə gəlir ki, bizim aramızda bu qıtlığın səbəbini başa düşməyən adam tapmaq da çətindir. Mən aclıqdan yox, işsizlikdən narazıyam. Sədi Kamal doğru dedi, biz məhbus deyilik, heç kəs bizim qurmaq və yaratmaq haqqımızı əlimizdən ala bilməz. Mən inşaat mühəndisiyəm, nə üçün bu çölün düzündə avara, sərgərdan gəzməliyəm? Doğrudur, kartofu soymağa da adam lazımdır, amma insanın bacarığından beləmi istifadə eləyərlər?

Ceyran xanım gözlərini qırpıb başını tərpətdi: "Yaxşı danışdın" demək istədi. Mən də mətləbi çox uzatmadım:

– Belə cılız olmağıma baxmayın, mən işləyə bilərəm, – dedim və çəkilib öz yerimdə oturdum. Məndən sonra iki nəfər də danışdı. Onlar da mənim kimi elə təzə bir söz demədilər. Sədi Kamalın fikri ilə razılaşdıqlarını bildirdilər. Axırıncı natiq – cəbhəyə könüllü getmək üçün ərizə vermiş cavanlardan biri – rəisin üstünə az qala hücum çəkdi, kəfənini boğazına doladığını gizlətmədən ötkəm-ötkəm dedi:

– Vətəndaş rəis, siz bu qədər günahsız vətəndaşın başına it oyunu açanda elə zənn eləyirsiniz ki, guya Sovet hökumətinin düşmənlərinə

qan uddurursunuz, siz bizə inanmırsınız, deyirsiniz ki, cəbhəyə yalnız Vətənə sadiq adamları yollayırlar. Ancaq hələ o məlum deyil ki, Vətənə sizmi çox sadiqsiniz, yoxsa biz? – O, səsini bir qədər yavaşıtdı. – Hörmətli komissiya üzvləri! Biz buraya yeni gələn zaman rəisimiz Niyazov adlı köhnə bir çekist idi. Ondan hamımız razıydıq, çünki o, nə qədər tələbkar olsa da, bu leytenant kimi bizə pislik eləməkdən ləzzət almırdı. Əgər o indi də burda olsaydı, sizi inandırıram ki, özümüzə yurd-yuva da salmışdıq, yaz şumunu qurtarıb, payız üçün göydən-göyərtidən, güldən, çiçəkdən də əkmişdik.

– Əlbəttə, əlbəttə, Təhlükəsizlik Nazirliyi sizin məsləhətinizlə iş görməliydi... – deyə leytenant qaranlıqdan iynələdi...

O günün sabahısı səhər tezdən yuxudan qalxıb Ceyran xanımla bərabər əl-üzümü yuyurdum. Bu vaxt düşərgəmizdən bir qədər aralı dayanan "M-1" maşınından düşən Elmanı gördüm. Əlində böyük bir bağlama vardı. Adi günlərə nisbətən bizi xeyli şad salamlayıb bizə sarı gələ-gələ dedi:

– Təbrik edirəm!.. Nəhayət canımız qurtardı. – O, şalvar cibindən çıxartdığı qəzeti irəli uzatdı: – Heyf ki, bu gün şəhərdə olmayacağıq, qələbə bayramını görə bilməyəcəyik.

Mən özüm də fərqinə varmadan, əl-üzümü qurulamamış, ona tərəf yönəldim. Qəzeti əlindən qapıb tələm-tələsik gözdən keçirməyə başladım. Birinci səhifədə iri hərflərlə, Hitler Almaniyasının qeydsiz-şərtsiz təslim olmağı münasibəti ilə Ali Baş Komandanın xalqa müraciəti çap edilmişdi. Sevincimdən gözlərim doldu. Qeyri-ixtiyari Ceyran xanımın üstünə atıldım, o üzündən – bu üzündən marçıltı ilə öpməyə başladım, sanki bu şad xəbərdən bircə saat belə keçməmiş bizim hamımızı yenə də böyük yük maşınlarına doldurub, bu dəfə artıq sürgünə yox, evlərimizə yola salacaqdılar.

Ceyran xanım uşaq sadəliyi ilə ərindən soruşdu:

Bundan sonra bu camaat hökumət üçün qorxulu olmaz, hə? Daha bizi buraxarlar, yox?

– Buraxdılar, buraxmadılar, hər halda...

Elmanın sözü ağzında yarımçıq qaldı. Yan tərəfdən leytenantın hədələyici səsini eşitdik:

– Xeyr, buraxmayacaqlar! – O, üz-gözünü əydi. – Elə sevinirsiniz ki, guya cəbhədə vuruşub qələbə qazanan siz olmusunuz... Vətəndaş Aydın! Yoxsa elə bilirsiniz ki, ərinizin vətən xaini kimi ömürlük sürgün olunmağından xəbərsizəm? Bu qələbənin sizə heç bir dəxli yoxdur!

Elman yalnız ikimizin eşidəcəyimiz bir səslə pıçıldadı:

– Bu niyə belə köntöy danışır? Yoxsa dünənki komissiya quyruğunu bərk basdalayıb?

– Nahaq pıçıldaşırsınız, – deyə leytenant bu dəfə qəzəbini bir az da artırdı. – Hər halda hökumət fəxri çekisti qoyub sizə qahmar çıxmayacaq.

Elman "əstəğfurulla" deyə fısıldadı və güclə hirsini boğub cavab verdi:

– Ay yoldaş rəis, bilmirəm siz niyə qan-qan deyirsiniz, hər halda nə mənimlə, nə də Ceyran xanımla belə danışmağa haqqınız yoxdur.

– Sizinlə hə, amma Ceyran xanıma hər cür söz deməyə haqqım var.

– Onun günahı nədir ki? Ay arvad, yoxsa dünən onun əleyhinə danışmısan?

– Yox, mən heç danışmadım, Səmirə xanım da elə ürəyə toxunan bir söz demədi.

– Guya danışanların ağzına baxıb məni işdən çıxardacaqlar? Ay-hay... Siz ömürlük burdasınız, vəssalam! Bunu sırğa eləyib qulağınızdan asın!

Elman pencəyinin qoltuq cibindən surquc möhürlü bir zərf çıxartdı:

– Görünür, hələ əmri almamısınız, yoxsa əlbət ki, Ceyran xanıma hörmət elərdiniz, budur, mənə cavab yazıblar. Onu bu gündən azad eləyəcəksiniz.

– Mən əmr-zad bilmirəm! – deyə leytenant dalını bizə çevirib öz çadırına sarı uzaqlaşdı və birdən geriyə dönüb qəddar düşməninə yanıq verən adamın kinli ədası ilə dedi:

– Siz dustaqdan da pis vəziyyətdəsiniz... Onların vaxtı, vədəsi məlumdur, müddətləri qurtarandan sonra bir dəqiqə də saxlaya bilməzlər. Amma siz ömürlük burdasınız!

– Səmirə bacı, siz onun sözünə fikir verməyin – deyə Elman əlini qaldırıb-saldı. – Belə tiplər adamda həyat eşqini öldürməkdən başqa heç nəyə yaramırlar. Biz burdan getsək də sizi unutmayacağıq.

Ceyran xanımın əmri yalnız axşama yaxın gəldi. Biz ayrılan zaman, Elman da, Ceyran xanım da məndən az kədərlənməmişdi.

– Mən heç, – dedim, – siz insanlara lazımsınız, Ceyran xanım.

O, mənim boynumu qucaqladı, hönkürtü ilə ağladı.

Onlar kəndə piyada getdilər. Mən dallarınca çox baxdım. Elə bil son ümidim uzaqlarda bir nöqtə kimi kiçilərək, əriyib yox oldu...

Leytenantın son sözü isə hələ də qulağımda səslənirdi: "Siz ömürlük burdasınız!". Bu fikirdə olan yalnız o deyildi. Günlər, həftələr və aylar ötüb-keçdikcə, bizim iztirablarımıza yaxın zamanda son veri-

ləcəyinə mənim də o qədər ümidim yox idi. Amma görünür, bir çoxu kimi mən də yanılmışdım. Bu səhvimi başa düşmək üçün uzun illərin əzab və işgəncələr dolu yolunu keçib-gəlməyim lazımmış. Əgər bu illər ərzində başıma gələn müsibətləri sadalamağa başlasam, indiyicən həbs düşərgələrinə dair yazılmış hekayətlərin çoxusu sizə idillik lövhələr təsiri buraxa bilər. Mən bunları yazmaq fikrindən qəsdən vaz keçirəm. Tutaq ki, qəbirdən xortlamış ölüləri xatırlayıb, bədbəxt insanların sonsuz iztirablarını təsvir eləyib sizi daha çox dəhşətə gətirdim, nə olsun? Bəzən mənə elə gəlirdi ki, biz hamımız ölmüşük, indiyəcən görmədiyimiz və bilmədiyimiz, ancaq hansı məşum bir təsadüf nəticəsində isə görməyə və hətta yaşamağa məhkum olunduğumuz müdhiş bir aləmə düşmüşük, heç bir qüvvə də bizi burdan çəkib çıxarmağa qadir deyil. Mən axirət dünyasına hələ uşaqlıqdan inanmadığım halda, şüurum keyləşib dumanlandığı zaman öz-özümə deyirdim: “Belə görünür ki, qoca babamın və qarı nənəmin həmişə qorxduğu cəhənnəm elə bura imiş!” – Sanki mən son dərəcə ağır bir günah işlədiyim üçün milyon-milyon illər müddətində hər növ ağlasığmaz məşəqqətlərə dözməyə məcburdum. Lakin mən hansı günahı işləmişdim? Bu barədə fikirləşməyə başlayana, dəli kimi qışqırmaq, kimə və nəyə isə üsyan etmək, müqəssirin kim və nəçi olduğunu yəqin eləyə bilmədiyim üçün isə özümü boğub – öldürmək istəyirdim. İntihar fikri, bəlkə də heç mənim ağlıma gəlməyə idi, bunu mənə xatırladan bizim çadırda yaşayan bir qadın oldu. O, bizimlə bərabər mətbəxdə kartof soyurdu. Şişman qadının cibindən kibrit oğurlayıb, düşərgədən qırx-əlli addım uzaqda, həm də qaş qaralandan xeyli sonra özünü yandırmışdı. Adamlar ona yetişənəcən, iş-işdən keçmişdi. Onu ölümdən xilas eləmək mümkün olmamışdı. İlk günlərdə bu hadisədən sarsılıb qorxsam da, bir neçə gündən sonra özüm də onun kimi həyatıma qəsd eləmək fikrinə düşdüm. Ancaq uzun zaman tərəddüd göstərdim. Deyəsən bu qara fikri özümdən uzaqlaşdırmaq üçün yalnız iradəm köməyimə gəldi. Şüurum mənə dedi: “Yox, Səmirə, belə ölmək – cəsarət deyil, zəiflik əlamətidir. Sənin və yoldaşlarının düşdüyü bu cəhənnəm əbədi deyil!”.

Kim bilir, bəlkə də məni bu günəcən yaşadan yalnız bu şüurum və iradəmdir?

Ən nəhayət şüurum haqlı çıxdı. Əgər buna inanmaq üçün dəlil istəyirsinizsə, mən on il sonra baş vermiş bir məhkəmə iclasını sizin yadınıza salmalıyam.

Xatirələrimin bu yerində Kamran iri bir sual işarəsi qoyub, etirazını bildirmişdi: “Səmirə! Elə düşünmə ki, mən xudpəsəndəm və mütləq özümün də rolumu necə olur-olsun sənin yazılarında görmək üçün bu qeydi yazıram. Bəs mənim gəlişim? Səni düşərgədən aparmağım? Yoxsa unutmusan? Bir də, axı, bu qədər hadisənin üstündən adlayıb keçmək nə dərəcədə doğrudur?

Axşam Kamran işdən qayıdanda mən ona belə cavab verdim:

– Heç bir şeyi unutmamışam. Amma mənə elə gəlir ki, o günləri sən məndən yaxşı xatırlayırsan, buyur, özün yaz, xoşuma gəlsə, istifadə eləyərəm, amma bircə şərtim var: çox uzun olmasın.

İki gün keçməmiş, dəftərimin arasından bu səhifələri tapdım, oxudum, bəyəndim, üzünü köçürüb, xatirələrimə əlavə elədim:

(“Mən sizin Bakı ünvanınızı bilmirdim. Tanışlar köhnə mənzilinizi nişan verdilər. Getdim. Qonşulardan soruşdum, “Onlar çoxdan köçüb” dedilər, amma harda yaşadığınızı söyləyən olmadı. Kor-peşman evimə qayıdanda, küçədə Səidə xanıma rast gəldim. O, yenə də bərli-bəzəkli idi, elə bil müharibə illərinin məhrumiyyətlərinin zərrəcən duymamışdı və bunu hamıya göstərmək üçün, vaxtı ilə sənin xəstəxanada gördüyün yeni modalı paltarını geymiş, gün işığında bərq vuran sırğalarını taxmış, hələ bir dodaqlarına azacıq göyümtül rəngə çalan bir pamada da vurmuşdu. Mən ona əl verib görüşəndə, nə isə çox xəfif və xoşiyli bir ətirlə ətirləndiyini hiss elədim. Əgər mən onu əvvəldən yaxşı tanımasaydım, hamı üçün iztirablı keçən günlərdən ləzzət aldığını düşünər və nifrətlə ondan üz döndərib uzaqlaşardım... O mənim kefimi-əhvalımı soruşdu, xəstəxanadan çıxandan bəri (o gündən iki həftəyə yaxın bir müddət keçmişdi) özümü necə hiss elədiyimlə maraqlandı. Məni də, yoldaşlarımı da diqqətli müalicə elədiyi üçün ona səmimi təşəkkürümü bildirdim:

– Xoşbəxt olasınız, balalarınızla birlikdə... Sizin palatanızdan sağ-salamat çıxan yoldaşlarım da həyatları ilə sizə borcludur...

Səhərdən bəri şəhərin küçələrini nə məqsədlə gəzdiyimi unudacağımdan qorxmuş kimi dərhal da sizin evinizi soruşdum. O mənim üzümə çox zənnlə baxdı, sanki, məndən gizlətmək istədiyi bir sirri ört-basdır üçün elə o dəqiqə də naz-qəmzə ilə gözlərini süzdürdü:

– Yəni inanım ki, bu vaxtacan Səmirə xanımın ünvanını bilmirsiniz? – deyə buna şübhə elədiyini söyləməyə hazırlaşırdı ki, görünür, mənim bu zarafatdan o qədər də xoşlanmadığımı duyub, sözünü dəyişdi:

– Əlbəttə, Kamran yoldaş, mən bu barədə yanıla bilərəm... Onların evində kimi görmək istəyirsiniz, qızlarını, yoxsa qayınanasını?

– Özünü! – dedim. – Necə məgər, olmaz?

Səidə xanım alnını qırışdırdı, qaşları sınmış quş qanadları kimi aşağı əyildi. Dodaqları titrədi:

– Elə isə doğrudan da adresini bilmirsiniz, – dedi. – Mən onun xəstəxanadan buraxılmağına bacardığım qədər mane oldum. Bilirdim ki, ordan çıxan kimi başına nə isə bir fəlakət gələcək. Özü günahkardır. Çox israr elədi, razılaşmaqdan başqa çarəm qalmadı. – O, kirpiklərini aşağı salıb, qüssəli baxışlarını məndən gizlətdi, amma səsindəki həyəcandan sənin taleyinə ürəkdən acıdığını duymaq o qədər də çətin deyildi. – Bəs sürgünə göndərildiyindən hələ xəbəriniz yoxdur?

Sinəmdən sancı qalxdı. Ehtiyat üçün cibimdə gəzdirdiyim nitroqlitserini çıxardıb, bir tabletkasını dilimin altına qoydum. Səidə xanım dərhal biləyimdən yapışıb nəbzimi yoxladı:

– Belə hallarda o dəqiqə uzanın, sərt hərəkətlər eləməyin... – dedi. – Yəqin səhərdən bəri çox gəzmisiniz. Bir az da məndə günah oldu... Hə, indi necədir, spazm kəsildi?

– Yox, hələ... Deməli sürgün olunub?

Soruşa bilərsən ki, bəs bu iki həftədə nə üçün səni xatırlamamışdım? Yox, xatırlamışdım, yəni əslinə baxsan, səni unutduğum bir saat belə olmamışdı, ancaq xəstəxanadan çıxan gün, rayonda, kiçik qardaşımın yanında qalan anamı görməyə getdiyimdən, sənin ünvanını axtara bilməzdim.

– Hə, ağrı kəsildi?

– Bəli, kəsildi.

– Bu cür qüssəli xəbərləri eşidəndə, heç olmasa bir neçə saat qulaqardına verin...

– Yox, Səidə xanım, – dedim. – Məni həyəcanlandıran odur ki, Səmirə xanımın bu əhvalatından çox gec xəbər tutmuşam, yəni ilk dəfə bunu sizdən eşidirəm. Evlərini görməmisiniz? – Mən indi ondan ayrılmaağa və necə olur-olsun elə o gün sizə baş çəkməyə tələsirdim. Səidə xanım mənim qoluma girdi:

– Sizi tək buraxmaq istəmirəm, – dedi, – yaman həyəcanlandınız. Birdən işdir...gedək, göstərim. O qədər də uzaqda deyil...

Mən Səidə xanımın yanında sənin uşaqlarınla və qayınananla istədiyim kimi sərbəst danışa biləcəyimə şübhə eləyirdim, ona görə də

hardasa, sizin evə yaxın bir yerdə üzr istəyib ondan ayrılmağa bəhanə uydurmağa çalışırdım, qəsdən ağır-ağır yeriyir və tez-tez ayaq saxlayıb, dərindən köksümü ötürürdüm. Həyətə, yaşadığınız zirzəminin pilləkəninə çatanda, Səidə xanım özü məndən üzr istədi:

– Evdə bir-iki gün uzanmağınız məsləhətdir, – deyib təlqinli baxışları ilə gözlərimin içinə baxdı və geriyə dönüb məndən uzaqlaşdı.

Mən səssizcə addımlarla zirzəmiyə enib qapını döydüm. İçəridən zəif və xəstə bir səs eşitdim:

– Buyurun!

Küçə tərəfdəki əl boyda pəncərədən düşən işıq otağın qapıya yaxın bir parçasını az-çox aydın görməyə imkan verirdi. Gözlərim qaranlığa alışsın deyə bir-iki dəqiqə qapı ağzında dayanıb gözləməyə məcbur oldum. Özün yaxşı bilirsən ki, mən ürəyinazik adamlardan deyiləm, amma bu rütubətli və qaranlıq evinizdə gördüyüm mənzərədən bərk sarsıldım. Hər iki qızın, bir də Bədirnisa xala cərgə ilə yerdə uzanıb yatırdılar. Məni tanımadıqlarına görə, baxışlarında həm təəccüb, həm də qorxu ifadəsi vardı. Mənim yerimdə kim olsaydı, onların hər an xof içində nə isə daha yeni, daha böyük bir fəlakət gözlədiklərini duya bilərdi. Mən onların bu qüssəli halına ürəkdən şərik olduğumu və acıdığımı bildirmək üçün, bacardığım qədər mehriban görünməyə çalışdım.

– Xoş gördük, Bədirnisa xala... Salam, qızlar. Olmasın azar... – dedim.

Bədirnisa xala kəsik-kəsik nəfəs alaraq, mənim gəlişimdən sevindiyini və ya kədərləndiyini bildirmədən, son dərəcə biganə bir tərzdə cavab verdi:

– Hər şey allahın əlindədir, oğul, neyliyəsən? Olacağa çarə yoxdur... – Yorğandan qırağa sallanmış arıq, damarlı əli ilə qızları göstərdi. – Mən heç... Bunların dərdi məni diri gözlü öldürüb... Kiçik qız ayaq üstündə olanda, qohumlara xəbər göndərirdik. Tərs kimi o da bu gün yıxıldı...

Mən evə göz gəzdirdim, dava-dərman adına heç nə görmədim:

– Bu saat, – deyib eşiyə atıldım, vaxtı ilə müharibədən əvvəl dişimi çəkdirməyə gəldiyim rayon poliklinikasına tərəf yönəldim. Baş həkimin qapısı ağzında uzun bir növbə vardı. Zabit libasında olduğum üçün növbə gözləyənlər mənə o dəqiqə yol açdılar. Qapını bircə dəfə vurub, cavab almadan içəri girdim. İlk dəfə burda gördüyüm qadın həkimə ucadan salam verdim:

– Üzr istəyirəm, bacı, bu yaxında bütün bir ailə çox ağır vəziyyətdədir, əgər mümkünsə onlara təcili yardım göstərin.

Pərdə arxasından paltarını geyinən və təşəkkür eləyib çıxan xəstəni müayinədən keçirəndən sonra əllərini yuyan həkimin məni növbədənkənar içəri girməkdə təqsirləndirəcəyini gözlədiyim halda, tamam başqa bir cavab eşitdim:

– Yoldaş Kamran, necəsiniz? Məni tanımadınız?

Mən donub qaldım. "Bu qadın kimdir? Necə olub ki, o məni tanıyır, ancaq mən onu tanımıram?.." deyə, özüm-özümə danlamağa hazırlaşırdım ki, o, iri və yumru gözləri ilə gülüb dəsmalla əllərini qurulaya-qurulaya dedi:

– Təəccüb eləməyin, siz məni tanımırsınız, amma mən sizi tanıyıram. Tibb institutunu sizin arvadınız Lətafət xanımla bir ildə qurtarmışıq...

Bu adı eşidəndə elə bil ürəyimin üstündən ağır bir dürtmə vuruldu. Mən qeyri-ixtiyari dalı-dalı çəkilib, divara söykəndim. Sir-sifətimdə necə dəyişiklik əmələ gəldisə, həkim onun sözlərindən sevinmək əvəzinə pərt olduğumu dərhal başa düşüb, yoğun qaşlarını çatdı, tezcə də irəliləyib, mənimlə nəfəs-nəfəs dayandı:

– Sizə nə oldu, yoldaş Kamran?

Mən bir daha bu otaqdan sağ çıxa biləcəyimə ümid eləməyib, tez-tələsik xahişimi ona deyib qurtardım:

– Bax, onların evi burdan da görünür. Baxın. O beşmərtəbəli binanın zirzəmisində olurlar. Familiyaları Aydındır.

– Sakit olun, gəlin, divanda uzanın, – deyə həkim qadın qolumdan tutub, pərdə arxasındakı divana tərəf çəkdi və içəri girən tibb bacısına əmr verdi. – Kofein iynəsi!

Mən uzanmadım:

– Zəhmət çəkirsiniz, – dedim, – keçib gedər. Son zamanlarda bu ağrılara öyrəşmişəm. Daha ürəyim mənə qulluq eləməkdən boyun qaçırır, bu qədər əzaba dözməyib üsyan qaldırır...

– Cəbhədə xəstələnmisiniz? – Həkim özünü mənə daha məhrəm göstərmək üçün, kitelimin düymələrini açdı. – Uzanın, uzanın, – deyə əlindəki iynəni havaya qaldırıb yoxlayan tibb bacısına döndü. – Mən daha heç kimi qəbul eləmirəm... – O, yenə mənə üz tutdu: – Deməli, cəbhədə xəstələnmisiniz, hə?

– Yox, burda, – dedim. – Əgər Lətafət xanımı yaxşı tanıyırsınızsa, bu xəstəliyin də səbəbini bilməmiş olmazsınız... Mən heç... O xəstə ailəyə kömək eləyin...

Tibb bacısı sağ qoluma iynə vurdu:

– Hər halda uzansanız yaxşıdır, – dedi. – Onsuz da tamam özünüzü yaxşı hiss eləməmiş sizi buraxan deyilik.

Həkim qadın mənim xəstə uşaqlar sarıdan çox həyəcanlandığımı görüb, xalatını çıxartdı, tonometrini və fonendaskopunu qoltuğuna vurub dedi:

– Arxayın olun, yoldaş Kamran, gedirəm... Sözünüzdən belə çıxdı ki, xəstəliyinizə bais Lətafət xanımdır, hə?

– Yanılmamısınız, ancaq, görünür, siz öz tələbə yoldaşınızla çoxdan əlaqəni kəsmisiniz. Yoxsa bu barədə heç sual da verməzdiniz...

– Doğru buyurursunuz, yoldaş Kamran, beş-altı ildir mən ona rast gəlməmişəm. Kefi-əhvalı necədir?

Bu xüsusda dediyi hər bir sözlə mənim ağrılarımı necə artırdığını duymayan həkim qadına, özüm də fərqinə varmadan, sərt cavab verməyə məcbur oldum:

– Onun pisliyindən başqa heç nə deyə bilmərəm.

İynədən sonra bədənimin hər yerinə elə bil isti bir cərəyan yayıldı və sinəmin ağrısı kəsildi:

– Bağışlayın məni, doktor, adınızı da bilmirəm (o, “Esmeralda” deyə öz adının əzəmətindən qürur duyan bir tövrlə cavab verdi,) – deyə mən də onunla bərabər sizə getməyə hazırlaşdım, – bu yaxşılığınızı heç bir vaxt unutmayacağam.

Həkim üzümə təəccüblə baxdı:

– Hansı yaxşılığımı, yoldaş Kamran? – Sizə iynə vurmağımı? Bunun üçün nə təşəkkür?

– Yox, o sahibsiz ailəyə köməyinizi nəzərdə tuturam. Siz bilmirsiniz, belə hallarda təsəlli üçün deyilən ən adi bir söz də insanın ömrünü uzada bilər. Daha mən özümü yaxşı hiss edirəm, doktor, gedək. Onların evini sizə göstərim...

Getdik. Mən doktorun əlindən tutub ondan irəlidə pillələri enə-enə, zirzəminin qapısına qədər apardım. Bu halda içəridən kiminsə öskürək səsini eşitdim. Doktor diqqət kəsilib bu səsi dinlədi. Qapını döydü və cavab gözləmədən içəri girdi. Eşikdə hava tutulduğundan, içəri bayaqkından da qaranlıq idi. Mən heç kimə müraciət etmədən:

– Doktor gətirmişəm, – dedim və Esmeralda xanıma sarı döndüm, – buyurun...

– Nə yaman qaranlıqdır, işığı niyə yandırmamısınız? – deyə həkim, yəqin ki, xəstələrin heç birini görə bilmədiyi üçün gözlərini döyə-döyə soruşdu.

Ah çəkirmiş kimi dərindən köksünü ötürən Bədirnisa xala dilləndi:

– Bayaq Kəmalə yandırmışdı. Birdən söndü... Görünür lampamız yanıb...

Gözləri qaranlığa alışan həkim stul çəkib qoltuğundakı şeyləri onun üstünə qoydu. Hamıdan əvvəl Bədirnisa xalaya üz tutdu:

– Ay arvad, qızdırman var?

– Var da sözdür?.. Yoxsa dalı üstə uzanmaqdan ləzzət alıram, nədir?

– Ölçmüsən?

– Xeyr.

– Bəs hardan bilirsən ki, qızdırman var?

– Ondan bilirəm ki, ağzımda dilim də od tutub yanır.

Esmeralda xanım hərarətölçəni silkib, qarıya uzatdı:

– Ölç görüm, – sonra Kəmalədən soruşdu: – Sənin necə, qızdırman var?

– Boğazım tutulub... Çətin nəfəs alıram. Yəqin anginayam.

– Bu cür qaranlıqda müayinə eləmək çətin olacaq... – Həkim dizi üstə qapandı. – Üzünü pəncərəyə sarı çevir, qız... Aaa deginən... Çay qaşığı yoxdur? – O, cəld ayağa qalxdı, balaca yemək stolunun üstündəki stəkan-nəlbəki arasından çay qaşığını götürdü, amma onun yuyulmamış olduğunu görüncə, qızın boğazına salmaq fikrindən daşınıb, yenə stolun üstünə qoydu. – Bir də aaa de görüm... aha, məlum oldu. Düz deyirsən, anginasan, özü də ikitərəfli, qlandanın hərəsi bir qoz boyda. Bu qədər də morojna yeyərlər?

– Nə morojna, ay arvad? Sən lap bəxtəvərlikdən danışırsan, – deyə Bədirnisa xala dodağının altında deyindi.

Həkim onun üzünə baxa-baxa udqunub, birdən gözlərini geniş açdı:

– Ay xala, sən Səmirə Aydının qayınanası deyilsən? Məni tanımadın?

– Tanıdım, bala, tanıdım, niyə tanımıram? Kor deyiləm ki? Görürəm, Asmasan. Maşallah, göz dəyməsin, şir-şikil açmısan, – deyə qarı sonradan-sonraya, nə isə çox könülsüz cavab verdi. – Uşaq vaxtı bizə tez-tez gələrdin, amma çoxdandır bizi arayıb – axtarmırsan...

Həkim qadın qəmli bir tərzdə gülümsündü və gileylənməyə başladı:

– Görünür, sən də məni arayıb – axtarmaq istəməmisən... Yoxsa naxoşlayanda, xəbər yollayıb məni çağırtdırardın.

Bu dəfə Bədirnisa xala ucadan ah çəkdi:

– Neyləyim, ay qızım, – dedi, – bizə salam verənləri də çək-çevirə salırlar. Ona görə də elə fikir eləyirəm ki, tanış-tunuşdan mümkün qədər gen gəzmək yaxşıdır. Onun-bunun bədbəxtliyinə niyə səbəb olasan ki?

Həkim hərarətölçəni alıb baxdı:

– Hə, yəqin özünü bərk soyuğa vermisən, xala... Qoy bir ürəyini, ciyərini də yoxlayım...

Müayinə vaxtı qızlar məndən gözlərini çəkmirdilər. Deyəsən məni yalnız indi tanımışdılar. Kəmalə arada bir bacısına sarı əyilərək: "Kamran əmidir, anamgilin xəstəxanasında görmüşəm", – deyə onun qulağına pıçıldadı.

Həkim Bədirnisa xaladan sonra qızları da yoxladı, dərman yazdı:

– Sabahdan tibb bacısını yollaram, nə lazımsa analizə verər, – dedi, – penisillin iynəsi vurulsa yaxşıdır. Doğrudur, çətin tapılır, amma qəribə dərmandır, dostdan-tanışdan istərik... Ay xala, o ki, qaldı sizə salam verənlərin məsələsinə, o barədə məndən arxayın ol... Sənətimi əlimdən almayacaqlar ki? Lap həbsxananın özündə də həkim lazımdır.

Ancaq mən Esmeralda xanımın danışıq tərzindən yalnız sənətinə yox, nə isə daha nüfuzlu bir qüvvəyə də (kim bilir, bəlkə ərinin adına-sanına da) güvəndiyini duyurdum.

Mən onu küçəyə qədər ötürüb, reseptləri aptekə verdim. Axşam qaş qaralandan sonra dərmanları alıb gətirdim. İki gün dalbadal bazara getdim, əlimə düşən yemək şeylərindən: yumurtadan, toyuqdan, meyvədən alıb gətirdim. Onlar üçün gündə üç-dörd dəfə təzə çay dəmlədim. Gecə yarıdan ötənəcən zirzəmidən çıxmadım. Səhər tezdən sizə gedəndə, uşaqların da, qarının da vəziyyəti xeyli yaxşılaşmışdı. Hətta qapı arxasından onların nə barədə isə ucadan deyib-güldüklərini də eşitdim və bununla da elə bil bu cüzi yaxşılığımın əvəzində mənə çox qiymətli bir mükafat verdilər...

Qaynın Faiq gəlmişdi. Onların sevincinin də əsil səbəbi bu imiş. Mən Faiqi uzaqdan – uzağa, xəstəxanada qızlarınla bərabər sənə baş çəkməyə gəldiyi vaxtdan tanıyırdım. O məni görərkən əvvəlcə tutulan kimi oldu. Baxışlarından "sən hara, bura hara?" sualı oxunurdu. Kəmalə əmisinin mənə təəccüblə baxdığını hamıdan əvvəl sezib, təşəkkürünü bildirmək üçün fürsət tapdığına sevinmiş kimi dedi:

– Kamran əmi vaxtında özünü yetirdi, doktor çağırdı, dərman aldı, yemək gətirdi. Qonşular hamısı işdə, uşaqları da məktəbdə. O olmasaydı, bu angina məni boğub öldürmüşdü...

Faiq hələ də mənə nə isə dostanə bir nəzərlə baxmırdı. Mənim bu evə gəlib çıxmağımın səbəbi haqqında yenə də həyəcanla düşündüyünü məndən gizlətmək istəsə də, mən bunu aydın hiss eləyirdim.

– Zəhmət çəkmisiniz, yoldaş... – dedi və adımı unutduğu üçün yanağına xəfiif bir qızartı çökdü.

– Kamran əmi, – deyə Rəhilə tez onun yadına saldı. Qaynın:

– Bəli, bəli yoldaş Kamran, çox sağ olun, – dedisə də, mənə yenə o qədər də rəğbətlə baxmadı, amma görünür özü də hərəkətinin qəbahətini tez başa düşüb, oturduğu stulu mənə təklif elədi: – Buyurun, əyləşin...

Doğrusu, xəstələrin vəziyyətini belə görəndən sonra mənim burda dayanmağıma ehtiyac qalmamışdı. Bir də Faiqin qısqanc (mənim bura gəlməyimə qısqandıqını yəqin eləmişdim) baxışlarına nə qədər dözə bilərdim ki? Mən getməyə tələsdim:

– Qızım, anandan məktub almısınız, yox!.. – deyə Kəmalədən soruşdum.

– Bəli, almışıq, – dedi.

– Adresini öyrənmək olarmı?

– Olar, niyə olmur? – Kəmalə əlini uzadıb, yastığının altından qalın bir kitab götürdü və onun arasından çıxartdığı zərfi mənə verdi: – Poçta qutusunun nömrəsi var. Onları Tacikistana yollayıblar...

Mən əlimdəki təzə qəzetin qırağına adresi yazdım. Getmək istəyəndə, Faiq qabağımı kəsdi:

– Yox, bu olmadı, yoldaş Kamran. Bu qədər yaxşılıqdan sonra dost olmamağımız düz deyil.

– Belə yaxşılıbı hər kəs bacarar, – dedim.

– Doğrudur, hər kəs bacarar, amma hər kəs bacardığını əsirgəməsə. Buyurun, əyləşin, ceyran ətimiz var. Oturun, kababa qonaq olun!..

Deməli, bir az bundan əvvəl içəri girəndə qapı ağzında kömürlə dolu gördüyüm manqalı bunun üçün hazırlamışdı.

– Sizi buraxan deyiləm, əyləşin, – deyə Faiq israrla stulda oturmağımı xahiş elədi.

Qızlar da ona səs verdilər:

– Əyləşin, əyləşin, Kamran əmi!

Yalnız Bədirnisa xala dinmirdi. Deyəsən naxoşluq onu bərk karıxdırmışdı, arıq və cılız bədənini yandıran hərarətin çoxluğundan hələ də özünə gələ bilmirdi. Ancaq buna baxmayaraq, o da təşəkkür dolu gözlərini məndən çəkmir, nə isə demək istəyir, amma görünür,

nəvələrinin və oğlunun xahişindən boyun qaçırmayacağıma əmin olduğu üçün əlavə bir söz deməyə ehtiyac duymurdu...

Faiqin də, qızların da məni ürəkdən qonaq eləmək istədiklərinə inandığımdan, artıq onların ricasını yerə salmaqda çətinlik çəkirdim. Lakin mən Faiqin qısğanc baxışlarını unuda bilmirdim. Mənə elə gəlirdi ki, o, öz-özünə hələ də bayaqkı sualları verir və mənə eyni yabancı nəzərlə baxır. Birdən qeyri-ixtiyari gözlərimi qaldırıb ona baxdım, sanki onun səmimiyyətini yoxlamağa mənəvi bir ehtiyac duydum. Yox, bu dəfə onun üzündə tamam başqa bir ifadə vardı, o da qızlar kimi yalvarışlı bir intizarla mənə baxırdı, sanki o, "getmə, yoldaş Kamran. Yaxşılığının əvəzində biz də gərək sənə hörmət eliyək" deməyə hazırlaşırdı.

– Çox sağ olun, – deyib Faiqin qolundan yapışdım. – Bir halda ki, ceyran kababı bişirmək istəyirsən, gəl köməkləşək!..

Faiq məndən aralandı və Bədirnisa xaladan şişlərin yerini soruşdu. Qarı o dəqiqə cavab verə bilmədi:

– Vallah, ay oğul, neçə vaxtdır lazım olmayıb, bilmirəm hara qoymuşam, gərək orda olsun...

Faiq xeyli axtarandan sonra, nəhayət şişləri tapıb gətirdi, nəm əsgi ilə pasını silib təmizlədi. Otağın bucağından üstü cuna ilə örtülü alümin tabağı götürdü. Biz otaqdan çıxdıq.

Doğrusu, əvvəlcə o qədər də iştaham yox idi, ancaq Faiq manqalı yandıranda, tikələri şişə çəkəndə, közlərin üstündə tez-tez onları o üzbu üzə çevirəndə, köhnə ovçu yoldaşlarından ceyran ətini bişirməyin üsulunu necə öyrəndiyini söylədikcə, istər-istəməz ağzım sulanmağa başladı.

Biz xəstələrin payını ayrı-ayrı boşqablara çəkib verdik, özümüz də qabaq-qabağa oturub yeməyə hazırlaşdıq. Mən yanakı oturduğum üçün qızların və Bədirnisa xalanın üzünü görmürdüm. Birdən:

– Canım-ciyərim, niyə yemirsən? – deyə Bədirnisa xalanın səsini eşitdim və onlara tərəf döndüm: yeməyən Kəmalə idi.

– Bəs sən niyə yemirsən? – deyə o da nənəsinin sualına sualla cavab verdi.

– Sən mənə baxma, dinim, imanım. Naxoşlayandan bəri ağzım zəhər dadıyır... Sən mənə baxma, ye, axı doktor dedi ki, naxoşluğun ən yaxşı dərmanı yeməkdir...

– Yox, nənə, mən bilirəm sən nə üçün yemirsən? – deyə Rəhilə söhbətə qarışdı.

– Nə üçün? – Kəmalə bacısının üzünə hirsli-hirsli baxdı. – Sən bizdən çox bilirsən?

– Çox ya az, bilirəm də... Nənəmin yadına atam düşüb. Gördün ki, bilirəm!..

Otağa ağır və qəmli bir sükut qondu. Kəmalə boşqabını özündən bir qədər aralı qoyub, yorğanını başına çəkdi. Doğrusu ilk tikəm boğazımda ilişib qaldı. Rəhilədən başqa heç birimiz kababa əl vurmurduq. Faiq də tutulub, başını bulaya-bulaya ayağa qalxdı və anasını danladı:

– Ay arvad, – dedi. – Yenə qanımızı qaraltma da... Görmürsən hamının iştahını küsdürdün?

– Gözümün işığı, – deyə qarı Kəmalənin çiyninə əlini qoyub yalvarmağa başladı: – Vallah yadıma düşməyib... İştahım yoxdur, daha sən niyə yemirsən?... Yeginən, qadan mənə gəlsin!

Kəmalə yorğanın altında hönkürüb ağladı...

Mən o günün sabahısı ərizə yazıb, yeni təyin elədikləri vəzifədən boyun qaçırdım və gəmiyə bilet alıb, sənin dalınca getdim...”).

(Mən burdaca mötərizə açıb, Kamranın yazdığı bu səhifələrə bir neçə irad tutmağa məcburam. O, Tacikistana gedib məni tapana qədər necə əziyyətlərə qatlaşdığını, məni sürgün düşərgəsindən qurtarmaq üçün kimlərə ağız açdığını, yollar idarəsində işə düzələnəcən bir neçə ay dəmir yolu vağzalında sərnişinlərin baqajlarını daşımaqla qəpik-quruş qazandığını yaxşı xatırladığı halda, bunların üstündən sükutla keçir. Əlbəttə, bizim macəramızı başdan-başa, təfsilatı ilə yazsaydı, onda gərək ən intim mətləblərə də toxunaydı. Bunları yazmamağının səbəbini mən yaxşı başa düşürəm. Görünür o, məni özünə borclu göstərməkdən çəkinir, bir növ təvazökarlıq eləyir. Ancaq mən ona çox borcluyam. Mənim uşaqlarım da ona borcludurlar. Bəlkə elə bunu anladıqlarına görə də Kamranı bir ata qədər sevirlər. Hər ay onlara pul göndərdiyini və bunun üçün ən adi ehtiyaclarını ödəməkdən çəkindiyini mən yalnız sonralar, Bakıya qayıdanda bildim. Mən uşaqlarımın vəziyyətinə dair ona nə bir söz demiş, nə də bir işarə vurmuşdum. Qızlarımdan söhbət düşəndə, mənim necə kədərləndiyimi duymasın deyə hər dəfə bir bəhanə ilə eşiyə çıxıb, harasa, gizlin bir bucağa çəkilir, səssizcə ağlayırdım, üz-gözümü yuyub, açıq havada gəzinəndən

sonra evə qayıdırdım. (Ev deyəndə böyük düşməsin. Biz, üçmərtəbəli köhnə bir binanın zirzəmisində, on dörd metrlik bir otağı kirayələyib, onu da pərdə ilə iki yerə bölüb yaşayırdıq. Mən dib tərəfdə, Kamran isə qapı tərəfdə olurdu). O məni düşərgədən qurtarmasaydı, o birisi yoldaşlarımın çoxu kimi mənim də sağ qalacağıma ümid yox idi. Mənim bu cılız bədənim o uğursuz həyatın ağırlığına nə qədər dözə bilərdi ki?

Düşərgədən şəhərə köçəndən sonra mən bir ildin çox işsiz qalmışdım. Ali məktəbdə laborantlığa düzələnə kimi, başqa dərdlərimi unudub, Kamrana izafi yük olduğumu düşünə-düşünə tamam bədbinləşmişdim. Əlbəttə, Kamran bunu duyurdu, həmişə də eyni sözü təkrar eləyir, mənə təsəlli verirdi:

– Borclu borclunun sağlığını istər, Səmirə xanım. Sizi mütləq işə düzəldəcəyəm. Maaş alandan slnra da borclarımı qaytaracaqsınız...

O, bu bir il müddətində, məni sevdiyini və mənimlə həyat qurmaq istədiyini hətta kiçik bir eyhamla da mənə bildirməmişdi. Ancaq mən onun ürəyindən nələr keçdiyini anlamayacaq qədər key deyildim. Mən bunu bilirdim, hiss eləyirdim. Mən özümün də bir durlu etinasız qarşıladığım, amma inadla ürəyimə soxulan bir hissin bəzən bütün varlığıma hakim kəsildiyini duymağa başlayırdım. Amma onu da bilirdim ki, Kamran ona möhtac olduğum üçün onun məhəbbətinə "hə" deməyə məni məcbur eləmək istəmir. İstəmir ki, mən onu yaxşılığına əvəz olaraq sevim. Mənim bu təxminim sonralar düz çıxdı. Ali məktəbdən ilk maaşımı alan günü Kamran məni təbrik eləyib dedi:

– İnstitutunuzun direktorunu gördüm, bir azdan sizi assistentliyə keçirəcək!

O, indiyəcən görmədiyim qeyri-adi bir nəvaziş ifadəsi ilə yanan gözlərini mənim üzümə dikib susdu və elə bil daxili bir təkandan qüvvət alıb, ilk dəfə mənə ürəyini açdı:

– Səmirə xanım, mən on il də gözləyə bilərdim, ancaq indi siz məndən asılı deyilsiniz, etiraf etməliyəm ki, sizdən ayrı mənə həyat yoxdur! – O, sanki mənim baxışlarımın təsirindən cəsarətini itirdi, sözünə ara verdi, yalnız sonradan-sonraya özünü güclə ələ alıb dedi: – Mənim taleyim sizin bircə "hə" və ya "yox" sözünüzdən asılıdır!..

Mən dinmədim, düşündüm: "Sən bir insan kimi mənim nəzərimdə Müdhətdən də ucasan, amma onun məhəbbətini mənim ürəyimdən qoparıb atmaq mümkün olan iş deyil!.."

– Bilirəm, – dedi, – sizin kimi qadınları komplimentlə aldatmaq istəyən adamın vəziyyəti çox gülünc ola bilər. Ona görə də mən belə yüngül vasitələrə əl atmayacağam. Mən köhnə fikirli adamam. Səmirə, mən qadın vəfasının ucalığı qarşısında səcdə eləyirəm. Mənə key və maymaq deyən dostlarım da olub, ancaq mən heç bir insana, xüsusən qadına hər hansı şəkildə təzyiq göstərməmişəm, ancaq mənim təsəvvürümü dəyişmək istəyən adamları da sevməmişəm...

O, ağır-ağır dönüb otaqdan çıxdı, hara getdiyini də demədi. Zirzəmidə yaşadığımız bu bir il müddətində heç vaxt özgə yerdə gecələməmişdi. Mən səhərə qədər onu gözlədim. Yorğun halda işə getdim. Yollar idarəsinə zəng eləyib, onu soruşdum, dedilər ki, iki həftədən sonra qayıdacaq. “Yəqin mənim soyuq münasibətimdən inciyib” deyə düşündüm. Əlbəttə, mən ona pis, yaxşı bir söz deməliydim, amma bu sözü demək üçün hələ mən hazır deyildim, yəni bu barədə həqiqi mənada yalnız indi düşünməliydim. Kamrana rədd cavabı versəydim də, onun məndən üz döndərib Bakıya qayıdacağını təsəvvürümə gətirmirdim, çünki o, mənim ardımca yalnız insanlıq naminə, heç bir günahım olmadığına ürəkdən inandığı üçün, məni belə ağır vəziyyətdə yalqız və köməksiz qoymamaq üçün gəlmişdi. Əlbəttə, onun qəlbində mənə nə isə qüvvətli bir hiss oyandığını çoxdan, hələ biz xəstəxanada ikən bilirdim. Bu bir ildə o, nə qədər böyük mənəvi dəyanət göstərmiş, könlümə toxunan bir hərəkətə, hətta bir jestə yol verməmək üçün nə qədər ağır məhrumiyyətə dözmüşdü! O, çox vaxt qaşqabaqlı olsa da, mən hər sözü ondan kəlbətinlə qoparsam da, yalnız qadınlara xas bir sövq-təbii ilə duyurdum ki, o mənə biganə deyil, amma nə üçünsə öz arzu və meylini ürəyinin ən dərin bir güşəsində inadla gizlətməyə çalışır. Nəhayət o “Sizdən ayrı mənə həyat yoxdur” sözlərini deyərkən, səsinin titrəyəşindən və qırılmağından da hiss olunurdu ki, o, mənim cavabımı, köhnə təbirlə desəm “Həyat-məmat” məsələsi sayır. Bəlkə mən ifrata varıram? Bəlkə mən, sadəcə olaraq, öz-özümə vurulub, ləyaqətimi xudpəsəndcəsinə artırmaq üçün bu sözləri yazıram? Hər halda Kamran mənim xatirə dəftərimi oxuyur, əgər bir etirazı olsa, yəqin ki, onu da məndən gizlətməyəcək.

O, iki həftəlik səfərdən qayıtdı və aramızdakı son söhbəti unutmuş kimi gülə-gülə içəri girib salam verdi.

– Hardaydınız? – deyə soruşdu.

Buz kimi soyuq əli ilə əlimi sıxdı. Hardasa, dincini alıb gümrahlaşmış bir adam kimi ucadan və məmnun bir səslə dedi:

– Bu gün elə bil üstümdən dağ götürülüb, Səmirə xanım. Nəhayət sizi bu qəbirdən də xilas elədim. Təzə binada hər dəm-dəsgahı ilə, vannası, mətbəxi ilə yaxşı bir otaq aldım. Buyurun, köçün... Hər halda mən sizdən dözümlüyəm, burda hələlik yaşaya bilərəm...

“Tərəddüd” sözünün əsil mənasını elə bil yalnız indi anlamağa başladım. Mən onun təklifinə nə cavab verməliydim? Mənə birdən nə üçünsə elə gəldi ki, “ortaq” kəlməsinin arxasında başqa bir sual gizlənir: “yaxşı, indi mənə cavabınız nədir?”.

– Yox, Kamran, – dedim, – mənim lagerdə çəkdiyim əziyyətlərdən sonra bu zirzəmi mənə şah sarayından da gözəl görünür...

– Yox, Səmirə xanım, – dedi, – zirzəminin bu qədər tərifləməyin. Buranı sizin nəfəsiniz isitdi, ona görə mən də buraya alışmışam, ancaq hər halda... mən istəyirəm ki, yeni mənzili də sizin nəfəsiniz isitsin!..

Mən artıq tərəddüdsüz cavab verdim:

– Elə isə qoy hər ikimizin nəfəsimiz isitsin!..

O, mənim fikrimi başa düşdü. Burada da vərdişini pozmadan ağır-ağır mənə yanaşdı və qollarını boynuma doladı... Sonra heç birimiz dinmədik...

O günün səhəri mən otağı iki yerə ayıran pərdəni götürdüm...).

## AĞIR GÜNLƏRİN SONU

Məni inşaat materialları institutunda öz işimə qaytarmışdılar. Burda rəfiqələrimin yalnız biri qalmışdı: Rima. Məlikə ilə Tura isə ali məktəblərdə dosent vəzifəsində çalışırdılar. Direktorumuz Səmədovu işdən çıxarıb, yerinə baş elmi işçi, dosent Mirzəliyevi qoymuşdular. O məni gülərüzlə qarşılayıb, qolumdan tutmuş və birbaş köhnə otağımıza gətirmişdi. O, hər gün olmasa da, iki-üç gündən bir məni yanına çağırtdırır, dissertasiyam üzərində çalışarkən necə çətinliyə rast gəldiyimlə maraqlanır:

– Heç qəm yemə, qızım, – deyirdi, – geri qalmağında sən müqəssir deyilsən. Hamımız sənə kömək edəcəyik, amma sən utanma, nə lazım olsa gəl, mənə söylə.

İki gündən bəri Mollayevin və əlaltılarının məhkəməsi başlandığını Rima mənə xəbər verdi. Biz işdən çıxıb evə gedəndə:

– Semə, – dedi, – sənin üçün də buraxılış vərəqəsi düzəldərəm... Qəribə adamsan, hamıdan çox sən bu məhkəmə ilə maraqlanmalısan... Sizin taleyinizlə oynayan bu adamlar necə də miskin imişlər... Sən mütləq get, gör indi nə hala düşüblər.

– Yaxşı, gedərəm, – dedim, – buraxılış vərəqəsini sabah gətirəcəksən? Gözləyim, hə?

– Gözlə, gözlə, – deyə o məndən ayrıldı...

O günün səhərisi məni Cəmşid əminin səsi yuxudan oyatdı. Bizim yaşadığımız yeddimərtəbəli təzə binanın zirzəmilərinə dolan suları motorla çəkib küçəyə axıdan bu sadə fəhlə əlli beş – əlli altı yaşlarında, qarayanız, ortaboy, yoğun baldırları qamut kimi əyri, həmişə də nədənsə narazı, qaşqabaqlı görünən bir kişi idi. O, bu səhər də, adəti üzrə alatorandan qalxmışdı. Hey deyinirdi. Kimi isə bərk söyüb yamanlayırdı. Mən ayna qabağındakı saata baxdım. Altının yarısı idi. Hələ bir az da yata bilərdim. Özünüz bilirsiniz, iyul ayında Bakıda hava səhərə yaxın sərinləşir. Bəzən bütün gecəni yata bilmirsən, çılçılpaq olsan da, bürküdən nəfəsin daralır, elə bil bədənin od tutub yanır. Neçə yol soyuq duşda çimsən də, yuxun göyə çəkilir. Azacıq sərin düşəndə, yuxu baldan şirin olur, hər dəqiqəni qənimət bilirsən. Xüsusən işdən yorğun qayıdanda, hələ üstəlik evdə xörək bişirib, pal-paltar yuyanda. Mən dünən gecə kiçik qızım Rəhilə üçün sarafan tikməklə məşğul oldum. Kamran nə qədər “əl, yat, Səmirə, axı sən lap əldən düşmüsən”dedisə də, mən onun sözünə baxmadım. Doğrusu uşaqlar üçün xörək bişirəndə, paltar tikəndə və ya onların dərsinə baxanda, yorğunluğumu tamam unuduram. Ancaq indi də yuxusuzluqdan gözlərim acışırdı. Buna baxmayaraq, mən Cəmşid əmidən incimədim. Cəld yerimdən qalxıb xalatımı geyindim. Çay qoydum. Dünəndən qalmış pal-paltarı vannaya doldurub islatdım. Kamranla mənim maaşım bizi ancaq dolandırırdı. Qulluqçu saxlaya bilmirdik...

Cəmşid əmi məni pəncərə qabağında görən kimi üzünü başqa səmtə çevirdi. Yəqin, məni yuxudan kal oyatdığına görə narazılıq eləyəcəyimi düşündü, amma sözünə ara vermədi, əksinə daha da vəcdə gəlib, səsini ucaltdı. Mən qab-qacağı səsləndirmədən diqqət kəsildim. Onun kimi və niyə söydüyünü bilmək istədim. Eyni sözlər, eyni ifadələr... Amma, o həmişəkinə nisbətən indi daha yanıqlı danışırdı:

– Heç bilmək olmur ki, bu zəhrimar su hardan axıb gəlir... Əgər bostan, qarpız əksəydim, bir damcısı üçün həsrət çəkərdim. Dünən axşam boşaltmışdım. Yenə də dolub. Lap bir boy qalxıb... Gir, içində üz... Belə getsə, evi uçurub dağıdacaq... Zarafat deyil, bu qədər incinarın, fəhlənin zəhməti hədərə gedir. Hələ onu demirəm ki, min ətək pul tökülüb... Ay canım, insafdır ki, gözəl-göyçək imarət zay olub getsin?

O, böyük və dördkünc həyətimizin ortasında köhnə, ora-burası süzülmüş əzik boruları bir-birinə geydirdi. Sonra motoru işə saldı. (Cəmşid əmi zirzəmiyə dolan yeraltı suları çəkib küçəyə axıtmaq üçün hər gün beləcə əlləşirdi). Bir dəqiqə belə keçməmiş boruların deşiklərindən su fəvvarə kimi göyə qalxdı. O qədər ucaldı ki, damcıları mənim üzümə çiləndi, – üst-başımı islatdı.

– Ay Cəmşid əmi, axı, mən günahkar deyiləm, acığını niyə məndən çıxırsan? – deyib güldüm. O, çox hirsli olsa da, başını yuxarı qaldırıb, körpə uşaq təbəssümü ilə gülümsəyərək (mən gözlərimə inanmadım. Allah sənə şükür, ömründə bir yol qaşqabağı açıldı!" deyə, xəyalımdan keçirib sevindim!) üzümə baxdı. Bu sözləri nə üçün dediyimi tezcə başa düşüb, cəld əyildi, borunun altını üstünə çevirdi. Mənim üzərimə çilənən fəvvarənin suyu həyətin asfaltına yayıldı.

Cəmşid əmi bizim evi tikmiş mühəndislərdən narazı idi. Bu barədə bir neçə dəfə, həyətimizdə yaşayan məsul işçilərə dediyi acı sözləri mən öz qulağımla eşitmişdim. "Binanın özülünü qoyanda suların axımını nəzərə almayıblar. Himi sementlə bərkitməyiblər". İndi o heç kəsin adını tutmur, yəqin ki, daldan atılan daşın topuğa dəydiyini yaxşı dərk eləyirdi.

– Hə, qızım, – deyə təkrar mənə üz tutdu, – evi tikəndə sementi oğurlayıblar, indi onların əvəzinə mən əzab çəkirəm...

Mən onun fikrinə şərik olmadım:

– Günah sementdə deyil, Cəmşid əmi, daha doğrusu, himi sementlə bərkitməyənlərdə deyil. Yeraltı çaylar güclüdür, onların təzyiqi qarşısında sement də dözməyib, partlaya bilər...

Cəmşid əmi birdən yumşaldı. Məchul günahkarların ünvanına daha bir söz demək istəmədi, amma mən hiss eləyirdim ki, onun qəzəbini soyutmaq çətin işdir. Mənimlə mübahisəyə girişmək istəmədiyi üçün söhbətin mövzusunu dəyişdi:

– Sən bilən yaxşıdır, qızım, – deyib gözlərini yerə dikdi. – Mən sənintək incinar deyiləm... – Azacıq sükutdan sonra yenə üzünü mənə tutdu. – Yaxşı, mən nə vaxta kimi cəhənnəm əzabı çəkəcəyəm?.. Az qalıb ki, camaat aya uçsun, bəs bu suya bir əlac tapmaq olmaz? Axı, burda camaat yaşayır. Özü də nə təhər camaat? Deyək mən heç. Mən bu gündə, sabahda ömrümü sizə bağışlayacağam, axı, beş-üç mənim kimisini çıxsan hamısı cavanlardır. Biri doktor, biri incinar, biri zavod direktoru, bir neçəsi nazir. Çoxusu da dənizin təkindən nöyüt çıxardan usta... Elə fikir eləmə ki, Cəmşid əminin savadı yoxdur, dünyadan bixəbərdir, bu imarətdə yaşayanların qədrini-qiymətini bilmir... Yox, qızım, bilir, özü də lap yaxşı bilir. Mən onlara baxanda öz-özümə deyirəm ki, lemsə nədir, lap yapon da gəlsə bizə gözün üstündə qaşın var deyəmməz, çünki niyə, bizim adamlarımız nə qədər desən kəlləli adamlardır... Bəs demirsiniz beş-on ildən sonra çim yağ içində halva yeyəcəksiniz?

Mən onun könlünü almaq istədim:

– Qorxma, Cəmşid əmi, sən hamımızdan çox yaşayacaqsan. Çim yağ içində halva yeməyə hamıdan çox sənin haqqın var...

(Doğrusu, bu sözləri deyəndə, rəhmətlik atamı xatırladım. O da həmişə özündən çox başqalarının qayğısına qalardı. "Biz heç, qızım, – deyərdi, – biz neyləmişiksə, siz cavanlar üçün eləmişik, bundan sonra nə qədər yaşasaq qazancdır").

Deyəsən mənim sözlərim xoşuna gəldi. Tez irəli atılıb, fəvvarənin birini yatırtdı. Bu dəfə su həyətin quru tərəfində üç-dörd metrlik yeri basandan sonra, küçəyə doğru istiqamət aldı. Mən daha onun sözlərini eşitmədim. Pıqqıldayıb daşan çayniki götürmək üçün mətbəxə yüyürdüm. Yataq otağından Kamranın səsini eşitdim.

– Bu kişi camaatı yatmağa qoymaz ki...

Mən dinmədim. Kamran bərk yorulmuşdu. Dünən Bakının yüz əlli kilometrliyində yeni kəşfiyyat buruqlarına çəkilən asfalt yolu təhvil almaq üçün getmişdi. Qayıdanda maşının təkəri partladığından, həmişəki kimi axşam saat doqquzda yox, gecə saat ikidə gəlmişdi.

Mən səssizcə addımlarla yemək otağına keçdim. Çörək doğradım. Buz dolabından yağ, pendir çıxartdım. Ancaq Kamran daha yatmırdı. Qalxıb səhər gimnastikası ilə məşğul olurdu. Bir neçə dəqiqədən sonra papiros yandırmaq üçün çəkdiyi kibritin səsi qulağıma gəlib çatdı:

“Tərgidə bilmir” deyə fikirləşdim. O, papirosu məndən gizlin çəkirdi. (Tacikistanda ikən öyrənmişdi.) Neçə dəfə “sən infarktdan yatmısan, burax bu zəhrimarı!” demişdimsə də, sözümə baxmamışdı, “neyləyim, iradəm çatmır” deyib, papirosun kötüyünü külqabına basıb söndürmüş, “yaxşı, bu axırıncısıdır, bir də mənim damağımda papiros görməzsən” deyə verdiyi vədə xilaf çıxmışdı. İndi bu barədə təkrar söz açıb, onu əsəbiləşdirmək istəmədim. O, papirosu ovcunda gizlədib, mətbəxə keçdi, kötüyü harasa atıb mənim yanıma qayıtdı. Mən onun tütün iyi verən nəfəsini duydum:

– Papiros çəkməyəndə, elə bil bağda-bağçada torpaqla əlləşmisən, – dedim, – mən bu qoxunu yaman xoşlayıram...

– Hə, hə, dünən bütün günü bir dənə də çəkməmişdim... Bu axırıncı olsun... mən – təslim!.. – deyib əllərini yuxarı qaldırdı. – Öhə, öhə.. Cəmşid əminin söylənməyə haqqı var. Axır zamanlarda su hədsiz artır... Gündə üç-dörd dəfə boşaltmağa məcbur olur. Boruların da hamısı yırtıq-yırtıq... Fağır əziyyət çəkir... Öhə, öhə, gəlsənə bir layihə düzəldəsən, mən də bizim rəislə danışam, fəhlə qüvvəsi, mexanizm istəsəm...

Doğrusu mən bu haqda fikirləşməmişdim, amma indi fikirləşdim.

– Bilirsənmi, – dedim, – əgər zirzəmiyə dolan suların yerini maili şəklə sala bilsək, onlar bir yerdə dayanmaz, axıb gedər, nə motor lazım olar, nə də Cəmşid əmi... Onsuz da onun təqaüdə çıxan vaxtıdır...

Bu halda, qızlarım yuxudan oyandılar. Məndən əvvəl Kamranı salamladılar.

– Sabahın xeyir, Kamran əmi!

Kəmalə soruşdu:

– Dünən hardaydınız? Bilmirsiniz nigaran qalırıq?

– Telefon olmayan yerdəydim, qızım, xəbər verə bilmədim...

Bu halda qapı döyüldü. Açdım. Gələn Rima idi.

– Məhkəmə iclasına dəvətnamə gətirmişəm – dedi.

Kamran maraqlandı:

– Nə məhkəmə?

– Mollayevin və əlaltılarının... – deyə mən cavab verdim.

Kamranın gözlərində nə isə bir qığılcım yanıb söndü:

– Gecdir, Səmirə, çox gecdir, – deyə o, görünür məndən, qızlardan və Rimadan kədərini gizlətmək üçün o biri otağa keçdi.

– Saat 10-da başlanır, hər halda gedəcəksən, hə? – Rima təklif gözləmədən stul çəkib oturdu. – Mənə bir stəkan çay... Dəvətnamə almağa tələsdim, çay içməyə vaxtım olmadı...

Kamranı işə, qızları məktəbə yola salandan sonra, özüm məhkəmə iclasına getdim. Rima məni Dzerjinski klubunacan ötürüb ayrıldı...

Klubun qarşısında iynə salmağa yer yox idi. Dəvətnaməmi göstərə-göstərə adamları yararaq əvvəlcə qapılardan birinə yan aldım. Qabağımı kəsən milis əlini yuxarı qaldıraraq, sərt və amiranə bir nəzakətlə "Bacı yer yoxdur" deyə ikinci mərtəbəni nişan verdi. Salonun hər qapısında iki milis dayanmışdı. Onlardan biri:

– İclas başlanır, vaxtı itirməyin, yuxarı qalxın, – dedi.

Bu anda arxadan tanış bir səs eşitdim:

– Səmirə xanım, doğru deyiblər ki, bu dünya – Süleyman dünyasıdır!..

Dönüb baxdım: Elman idi. Ceyran xanımla bərabər düşərgədən getdikləri gündən bəri mən onu görməmişdim. Görkəmində, simasında elə bir dəyişiklik əmələ gəlməmişdi. Amma deyəsən yanaqları azca dolğunlaşmış, alnının qırışları bir qədər çoxalmışdı. Mən ondan Ceyran xanımı soruşdum.

– Burdadır, – dedi, – birinci cərgədə oturub. Şahid sifəti ilə çağırıblar. Siz çoxdan Bakıdasınız?

Məndən cavab almamış, qoluma girib, məni çəkə-çəkə foyeni doldurmuş izdihamı yararaq, baş tərəfdəki otaqlardan birinə apardı:

– Gəlin, yoldaşlardan oturmağa yer istəyək, – deyə stol arxasında telefonla danışan adama müraciət elədi. Mən əvvəlcə gözlərimə inanmadım, düşündüm ki, başqa birisini ona oxşatmışam. Yox, qarşımdakı adam, mənim ucbatımdan həbsə alınıb ağır cəzaya məhkum edilmiş köhnə dostumuz Zəfər idi! O, kiminləsə ciddi bir məsələ haqqında danışır, bütün diqqətini toplayıb, müsahibini dinləyir və təkdənbir gözucu mənə baxırdı, ancaq, deyəsən, məni heç görmürdü. Nəhayət danışıb qurtardı və telefonun dəstəyini yerə qoydu, yalnız bundan sonra gözləri mənə sancılıb qaldı və birdən:

– Səmirə?! – deyə az qala qışqırıb, üstümə atıldı. – Sənsən? Şükür allaha!.. Deməli sağ – salamatsan?.. Müdhəti görmüşəm, o da bəraət alıb, gəlib... Necəsən, uşaqlar necədir?

Zəfər çox sınıxmışdı. Nə isə çox böyük əziyyətlərə qatlaşdığı ilk baxışdan bilinirdi. Məni gördüyü dəqiqədən gözləri sevinclə yanır,

qansız, batıq yanaqları yavaş-yavaş solğun – çəhrayı rəngə çalmağa başlayırdı. Sevincdən hər ikimizin dilimiz tutulmuşdu. O gülür, mən gülürdüm. Baxışlarımızı bir-birimizdən çəkməyib, sanki bu uzun və məşəqqətli illərdə sir-sifətimizin və boy-buxunumuzun necə dəyişdiyini diqqətlə öyrənmək istəyirdik.

Hə, demək belə... Hə, demək, hə... – O, yeni dil açmağa başlayan körpə uşaqlar kimi, özü də fərqinə varmadan, eyni kəlmələri təkrar eləyib dururdu.

Nəhayət o, Elianı da tanıdı və ona da əl verdi:

– Bilirəm, siz də mənim kimi ayaq üstündə qalmısınız, – dedi. – Bu saat klub müdirindən xahiş elərik, hələ açılmamış lojalardan birini bizə verdilər... – O, cəld addımlarla qonşu otağa – müdirin kabinetinə yönəldi və bir dəqiqə belə keçməmiş geri qayıtdı. – Yer düzəlir... Yuxarıda, kiçik salonda oturub, radio ilə də qulaq asmaq olar, ancaq onların (Zəfər bu sözü ucadan, xüsusi bir vurğu ilə dedi) yaralanmış ilan kimi necə qıvrıldıqlarını hər dəfə görəndə elə bil mənim yaralarımın üstünə məlhəm qoyurlar...

İkinci mərtəbədəki lojalardan birinə qalxdıq. Yer tutub yanaşı oturduq. Mən salona göz gəzdirdim. Sıralarda bir dənə də boş yer qalmamışdı. Parterin sağında və solunda ayaq üstündə divarlara söykənərək durmuş adamların sayı salondakılardan heç də az deyildi. Lojalardakı tamaşaçılar isə elə bil bir-birinə sarılıb oturmuşdular. Salon uğuldayırdı. Hələ iclasın başlanmadığını görən Zəfər, birdən dili açılmış kimi danışmağa başladı:

– Bildin də, məni nə üçün tutub sürgün eləmişdilər? Mən özüm bunun səbəbini yaxşı bilirdim. Guya xalq düşməninin ailəsinə kömək eləmişdim. Ancaq rəsmən mənə tamam başqa bir ittiham verdilər: hərbi qulluqdan qaçmaq üçün qəsdən özümü yaralamışam... Əlbəttə üzümə duran yalançı şahidlər də tapıldı. Amma indi də anlaya bilmirəm ki, bunun üçün özümə niyə beş yerdən yara vururdum? Bircə bu qolum (Zəfər şikəst olmuş sağ qolunu göstərdi) bəs deyildimi? Sabir demişkən, bu çərx-fələk tərsinə dövran eləməsəydi, mən hələ də Uzaq Şimalın tayqalarında ayaq döyürdüm. – O, birdən doğruldu və sol əli ilə qapını göstərdi. – Müqəssirləri gətirirlər, yaxşı bax...

Doğrudan da bu vaxt silahlı əsgərlər beş nəfər canini dövrəyə alıb, məhkəmə salonuna gətirdilər. Zəfər hamıdan irəlidə gələn Mollayevin dalınca axsaya-axsaya yeriyən tonbur belli müqəssiri nişan verdi:

– Onu görürsənmi? – dedi. – Özünün etirafına görə beş yüz nəfər günahsız adamı güllələyib... “Mənim vicdanım da, qəlbimdə qandır” sözü hamıdan çox ona yaraşır... Şamaxı kolxozçularını hökumət əleyhinə qiyam hazırlamaqda təqsirləndirmək üçün, ot və taxıl tayalarında, təbii öz adamlarının əli ilə, silah gizlədib... Sonra axtarış aparıb, silahları tapan kimi, kolxozçuları damladıb, hamısını da bir gecədə güllələdib... Bu “xidmətinə” görə Beriya ona general rütbəsi verib... Məni də o tutmuşdu, ancaq mənə yazığı gəldi, yüngül cəza verdi, yəni ömürlük sürgünə göndərdi. Sən bir yaxşı bax, Səmirə, gör cəllada oxşayır ya yox? O, bir zamanlar daşnaq partiyasının üzvü imiş...

Mən müqəssirlərə baxdıqca, elə bil damarlarımda qanım donur, gözlərimə zülmət çökürdü.

Komendant salona girdi və “Qalx, məhkəmə gəlir!” deyə səsləndi. Bütün salon ayağa qalxdı. Sədr və məhkəmə üzvləri öz yerlərində oturandan sonra, izdihamın uğultusu yavaş-yavaş azalıb, nəhayət kəsildi. Sədr:

– Şahid Ceyran Eldarlı! – deyə müqəssirlər skamyasının arxasındakı ilk sıralara göz gəzdirdi.

Müğənni qadın ayağa durdu. Pilləkənlə səhnəyə qalxıb, məhkəmə qarşısında dayandı. O, Elmandan fərqli olaraq, bu illər ərzində xeyli dəyişmişdi. Vaxtı ilə tən ortadan ayırıb səliqə ilə daradığı qara saçlarına ağ zolaqlar düşmüşdü. Buxağındakı qırışlar uzaqdan da aydın seçilirdi, amma gözləri parıltısını itirməmişdi. O, sanki qəsdən dartınaraq, qamətini əvvəlki kimi zərif göstərməyə çalışır, amma bunu bacarmırdı, çünki onun hərəkətində, duruşunda, ümumiyyətlə simasında ayların və illərin iztirabından qalmış kədərli izləri gizlətmək o qədər də asan deyildi.

Sədr onun adını, atasının adını, familiyasını, sənətini xəbər aldı və ən axırda “Mollayev haqqında nə bilirsiniz?” deyə soruşdu.

İki min beş yüzə yaxın tamaşaçı cınqırını çəkmədən müğənni qadını dinləməyə başladı. Ceyran xanım ilk cümlələrini bir neçə dəfə udqunaraq, tutula-tutula dedi. Mənə elə gəldi ki, həmişə böyük izdiham qarşısında heç kəsdən çəkinmədən şən və şaqraq nəğmələrini hədsiz dərəcədə sərbəst oxumağı bacaran bu qadını məclis tutmuşdu; o, hər dəqiqə məhkəmə sədrinin köməyi ilə ayrı-ayrı suallara qısa cavablar verməkdən başqa heç nə bacarmayıb, tezcə də yerinə çəkiləcək və bu çətin işdən yaxasını qurtarıb sevinəcək.

Amma bir azdan sonra o, özünü topladı və artıq daxili bir inamla dedi:

– Yox, möhtərəm hakimlər, mən həmişə öz nəğmələrimlə insanları sevindirmişəm, onların qəlbində ümid və məhəbbət oyatmışam, amma bu gün qəzəb və intiqam hissini oyatmaq istəyirəm!...

Ceyran xanım danışırdı demək, o qədər də düz olmazdı. O, yanır, alovlanırdı. Bəlkə də özünü heç ələ almağa və həyəcanını boğmağa çalışmırdı. O, müqəssirlər skamyasının düz ortasında əyləşmiş Mollayevə baxır və onun qalın şüşəli eynək arxasından ölgün – ölgün işıldayan gözlərinin içinə deyirdi:

– Mən bu dəstənin başçısı Mollayevdən şəxsi intiqam almaq fikrində deyiləm. Ondan elə mənsiz də, mənim müdaxiləm olmadan intiqam alınmışdır. Dünənki iclası hamınız xatırlayırsınız, deyilmi? Burda oturmuş camaat müttəhimlərə nə acıyırdı, nə də qəzəblənirdi, elə bil indi mənim dayandığım səhnədə göstərilən komediyaya baxıb gülürdü. Məncə bundan, bu gülüşdən böyük intiqam olmaz. Bu camaat nəyə və kimə gülürdü? Müttəhimlər skamyasında oturmuş bu beş caniyə gülürdü. Mən açıq-aydın hiss eləyirdim ki, bu gülüşdə xalq mənəviyyatının qüdrət və zəfəri səslənirdi. Demək şər qüvvələr üzərindəki qələbəsini bayram eləyən insanlar, dünənin faciəsindən gülə-gülə ayrılmaq istəyirdilər!.. Ancaq hamı üçün bir şey aydındı ki, bu intiqam çox gecikmişdir, həddindən çox!.. Axı, bu cəlladların həlak elədiyi inqilab qəhrəmanlarını, alimləri, mühəndisləri, yazıçıları, aktyorları geri qaytarmaq mümkün deyil. Biz ağlamalı ikən gülürdük. Bəs nəyə və nə üçün gülürdük? Ona gülürdüm ki, xalqın sonsuz bir məhəbbətlə sevdiyi söz ustalarını, şairləri, romançıları, yəni cəmiyyətimizin boya-başa çatdırdığı, müstəsna istedadları güllələyən bu adamların özləri kəmsavadmışlar. Bunların heç ibtidai savadları da yoxmuş. Demək zülmət və nadanlıq – mədəniyyətə və işığa divan tuturmuş...

Salon uğuldadı. Arada Zəfər qulağıma pıçıldadı:

– Yox, bu gün dünənki kimi gülmürlər. Bu artıq qəzəbdən doğan bir uğultudur. Dünən hamı müttəhimlərə gülürdü. Bu uğultuda həlak olmuş qiymətli adamların ölümünə təəssüf və kədər səslənir.

– Bəli, möhtərəm hakimlər, bu zülmət fədailəri öz nadanlıqlarının qisasını Azərbaycan ziyalılarının qaymağı sayılan insanlardan alışmışlar. Mən sənət adamıyam, müğənniyəm. Ona görə də istər-istəməz hamıdan artıq gözəl nəğmələrin, gözəl dram əsərlərinin müəllifi Hüseyn Cavidin ölümünə yanıram. “Mənim tanrım gözəllikdir, sevgidir”

yazan bir insana yalnız cəlladlar əl qaldıra bilərdi. Mən şəxsən tanıdığım, təpədən-dırnağa kimi səmimiyyət mücəssəməsi olan Mikayıl Müşfiqin ölümünə yanıram!..

Məhkəmə sədri Ceyran xanımın sözünü nəzakətlə kəsdi:

– Vətəndaş Eldarlı, siz gördüklərinizi deyin, ittihamnaməni təkrar eləməyə ehtiyac yoxdur.

Ceyran xanım duruxdu. O, yəqin ki, sədrdən bu sözləri heç gözləmirdi. Bundan sonra onun nitqinin daxili hərarəti xeyli azaldı. Mənə elə gəldi ki, o bir daha əvvəlki qədər alovlu danışa bilməyəcək. Ancaq mən düşünən kimi olmadı. Bir-iki dəqiqədən sonra o, elə bil sözlərinin təsirinin azalmağına dözməyib məhkəmə üzvlərinə yox, salona müraciət elədi:

– Mən prokuror deyiləm, amma ittihamçıyam. Mən bu caniləri xalqın ən müqəddəs duyğularına, ən saf arzu və istəklərinə xəyanətdə təqsirləndirirəm!..

Kim isə əl vurdu. Alqış səslərindən bütün salon sarsıldı.

Ceyran xanım sözünü bitirəndən sonra gərək sədr və üzvlər ona suallar verəydi. Ancaq salonun tufanı andıran alqışlarından sonra həm məhkəmə üzvlərinin, həm də müqəssirlərin heç biri səsini çıxarmırdı. Mollayevin rəngi ölü rəngindən də betərdi. Zəfər də, yəqin buna işarə eləyib dedi:

– İndiyəcən heç bir şey onun halına təfavüt eləmirdi. Dünən hətta prokurorun da bir neçə dəfə sözünü kəsdi. Özünü elə aparırdı ki, guya müttəhim o deyil, onu təqsirləndirməyə cəsarət eləyən məhkəmədir. Adın nədir, – Daşdəmir, yumşalısan, yumşalı buna deyiblər, ha!.. Bu günəcən özünə çox arxayın idi, yəqin elə fikir eləyirdi ki, burda oturanların çoxu onun tərəfindədir. Ceyran xanımın sözlərini camaat alqışlayandan sonra, elə bil onun bel sütununu sındırdılar. Gör bir necə büzüşüb!..

Mən bir neçə şahidin də istintaqını dinlədim. Onların hər biri Mollayevin cinayətlərindən yeni-yeni faktlar göstərir, amma Ceyran xanım kimi rəvan, səlis danışa bilmirdilər. Bir qadın, səhnəyə çıxdığı ilk dəqiqədən qəhərlənib, hönkürtü ilə ağlamağa başladı:

– Gecdir, möhtərəm hakimlər, – dedi. – Bunlara nə qədər ağır cəza versəniz də mənim yaram sağalan deyil. Bunlar mənim oğlumu güllələyib!..

Salonda yaylıqlar ağarışdı. Mən daha dözməyib, foyeyə çıxdım. Burda yenə Elmanla qarşılaşdım.

– Siz ağlamısınız? – deyə o, qolumdan tutub, kənara çəkdi. – Əgər mənim əlimdə ixtiyar olsaydı, onları güllələməzdim, ölüm nədir ki? Ölən adam biryolluq əzab-əziyyətdən canını qurtarır. Bunları gərək min dəfə öldürüb dirildəsən ki, bəlkə ürəyin az da olsa soyuya...

– Yox, – dedim. – Elman qardaş, bu xəbisləri güllələmək lazımdır, ancaq minlərcə, minyonlarca camaatın qarşısında!.. Qoy bu günün də, gələcəyin də mollayevlərinə ibrət dərsi olsun. Qoy onlar bilsin ki, xalq heç bir cinayəti unutmur, heç bir xəyanətin qisasını yerdə qoymur!..

Kamranla mənim layihəmi bəyənmişdilər. Fəhlə briqadası və mexanizm vermişdilər. Üç-dörd gündən bəri həyətimizdə qızğın iş gedirdi. Fəhlələr zirzəmidən dənizə qədər su kəməri çəkmək üçün yer qazırdılar. Bizim planımıza görə evimizin özülünü ovub-korlayan yeraltı sular bir daha zirzəmidə yığılıb qalmayacaq, bir metr dərinliyində maili şəkildə basdırılan borularla öz-özünə aramsız axaraq, dənizə töküləcəkdi.

Hər gün axşamüstü mən işdən qayıdan zaman, həmişə fəhlələrlə salamlaşır, briqadanın başçısı ilə görüşür, gözümə dəyən qüsurları göstərirdim. Cəmşid dayı yenə də motorunu işlədib, yeraltı suları küçəyə axıtdığı üçün, həyəti palçıq basmışdı. Qonşularımızdan bəzilərinin, ən çox da təzə modalı, iynə kimi nazik, uzun dabanlı tuflilər geyən nazlı xanımların ara bir acı istehzalarını və qaba söyüşlərini eşidirdim. Onların fikrincə bir xeyir əvəzinə, zərər verirdik. Məndə, briqadir də bizim ünvanımıza deyilən sözləri cavabsız qoymağa məcburduq, çünki hələ doğrudan da gəlib-gedənlərin hamısı əziyyət çəkirdi. Bu günlərdə dinməz-söyləməz işləyən Cəmşid əmi qaba təhqirlərə dözməyib, bəzən bizi müdafiə eləyirdi. Mən onu başa salmışdım, planımızı açıb söyləmişdim.

– Sən fikir vermə, qızım, – deyirdi, – bunlar Kufə camaatıdır, bu yekəlikdə imarətin korlanmağına razı olurlar. Amma beş-on manatlıq xeyirlərindən ötrü yava-yava danışırlar... Neyliyəsən, avam adamdırlar. Findi – firuş geyinməklə deyil ki?.. – O, mənə lap yaxın gəldi, düşüncəli və duru gözlərini üzümə dikdi. – Ancaq sən bir mənə de görüm, evin özülünü sudan qorumaq üçün nə tədbir tökmüsünüz?

– O barədə fikirləşmişik, Cəmşid əmi, – dedim, – zirzəmini başdan-başa sement plita ilə döşəyəcəyik. Divarları da bir metr hündürlüyündə yenə plita ilə örtəcəyik. Bundan sonra su divara da nüfuz eləmiyəcək...

Cəmşid əmi mənim nə vaxtsa dediyim sözləri yadıma saldı:

– Bəs özün demirdin ki, yeraltı sular sementi də yarıb keçər?

– Düzdür, demişəm, ancaq biz bu sementi betonla qarışdıracağıq, yəni yüksək atmosfer təzyiqi altında betonla əla keyfiyyətli sement məhlulu vuracağıq... Mən təcrübədən keçirmişəm, Cəmşid əmi, bu cür plitalar çox möhkəm olacaq, o qədər möhkəm olacaq ki, lap yüz əlli atmosfer təzyiqi ilə vurulan su şəlaləsinin həmləsinə də dözə biləcək.

– Yox, qızım, çox qəliz danışdın, başa düşmədim...

Bir az səbir elə, Cəmşid əmi, öz gözünlə görəndə, mən izahat vermədən də başa düşəcəksən...

– Kor nə istər iki göz, biri əyri, biri düz. Təki sən deyən olsun, qızım. – Cəmşid əmi məndən aralandı və hansı pəncərədənsə qışqıran arvadın söyüşünə cavab vermədən, ikinci mərtəbənin pəncərəsinə qədər ucalan fəvvarəni yatırdıb, küçəyə doğru yönəltdi.

Bu anda qızım Kəmalə mənə yanaşdı, qolumdan tutub kənara çəkdi və kiminsə bizi eşidəcəyindən ehtiyat eləyirmiş kimi, dodaqlarını qulağıma yapışdırıb, pıçıldadı:

– Atamı gördüm, anacan... Səninlə danışmaq istəyir.

Mən qızıma heç nə demədim, yəni əslinə baxsan, ona cavab verməyə taqətim yox idi: Müdhətlə görüşün bütün dəhşətini indidən hiss eləyirdim...

Kamran onun qayıtdığını bildiyi halda, hələ bu barədə bir kəlmə də danışmamışdı. Görünür heç danışmaq fikrində də deyildi. O dinməsə də, mənim fikrimi soruşmasa da, mən onun dərdini ürəyinə saldığını, məndən nə isə eşitmək istədiyini, zahirən çox sakit, amma əsil həqiqətdə gərgin bir həyəcanla gözlədiyini tutqun baxışlarından açıq-aydın duyurdum. Mən ondan xəbərsiz Müdhətlə görüşməyə getsəydim, bu onun üçün təbii ki, ağır bir travma olacaqdı. Hər halda bunu əvvəlcədən bilsəydi, daha yaxşı idi:

– Gedim, Kamran, bəlkə bir sözü var, – dedim.

Qəribədir: Kamran özü israr elədi:

– Mütləq!.. Mən nə qədər köhnə fikirli adam olsam da, qızlarını Müdhətdən ayırmağa haqqım yoxdur... Bəlkə sənə qızları barədə bir sözü var?.. Ümumiyyətlə...

Bu son kəlməni deyərkən, o, nəfəsi daralmış kimi ayağa qalxıb, otaqda var-gəl eləməyə başladı.

– Ümumiyyətlə, – nə Kamran? – dedim.

– Ümumiyyətlə... – O, yenə duruxdu, mənim də səbrimi tükətməmək üçün, çox gözlətməyib, fikrini tamamlamağa tələsdi: – Ümumiyyətlə tək onun üçün yox, elə özün üçün də, mənim üçün də çətin günlər başlanır. Hər halda getməlisən, danışmalısan!...

Mənə bu cür inanmağı onu mənim nəzərimdə bir daha ucaltdı. Mən getdim. Müdhət də bizim kimi təzə evdə mənzil almışdı. Bədirnisa xala mətbəxdə xörək hazırlayırdı. Müdhət məni süfrəyə dəvət elədi. Mən ac deyildim, "sağ ol" dedim. Söhbəti o başladı:

– Hə , Səmirə, bilirəm ki, bura gəlməyin sənin üçün o qədər də asan deyil. Düzmü deyirəm?

– Düz deyirsən, Müdhət... Ancaq mən gəldim. Bunu Kamrana da dedim.

– Dedin?!

– Niyə təəccüb eləyirsən?

– Aydındır. Belə görünür ki, o çox alicənab adamdır.

– İstehza eləyirsən, yoxsa ürəkdən deyirsən?

– Yox, istehza niyə? Mən belə adamları az görməmişəm.

Mən Bədirnisa xalanı çağırdım, çantamı açıb onun gəlinlik üzüyünü çıxartdım:

– Çox sağ ol, xala, – dedim, – bu hədiyyəni geri al. Ehtiyac məni boğanda da bu üzüyü satmaq fikrinə düşmədim. Götür, bu sənin bəxt üzüyüdür!..

Bədirnisa xala Müdhətlə mənim aramda nə isə çox xoşagəlməz ağır, söhbət olduğunu hiss eləmişdi. Ancaq o, nə oğluna bir söz dedi, nə də mənə...

– Qızları götürüb apardın, xətrinə dəymədim, axı, onlar mənim də canım-ciyərimdir. Onları sən qoymursan, yoxsa özləri gəlmir? – deyə gileyləndi.

– Yox, xala, – dedim. – Mənim nə haqqım var ki, onları qoymayım? Əsil anaları sənsən!.. İnan ki, hər ikisində sənə də, Müdhətə də yalnız məhəbbət oyatmışam...

Mən ana və oğulla halallaşıb çıxdım. Ürəyim daş kimi ağırlaşmışdı. Ayaqlarımı güclə tərpədirdim. Evə yetişənə kimi azı iyirmi-otuz yol dayanıb dincimi aldım: "Yəqin son dəqiqələrimi yaşayıram" – deyə düşündüm. Ancaq nə üçünsə buna təəssüf eləmirdim...

Evə gəldim, uşaqları gördüm, yenə hər şey yadımdan çıxdı.

– Ay qızlar, – dedim, – gedin, atanızla, nənənizlə görüşün!..

Kamran təəccüblə mənə baxdı. Ayağa qalxıb o biri otağa keçdi:

– Yorğunam, Səmirə, – dedi. – Qoy yatım, qalxanda nahar eləyərəm...

Ancaq nə qalxdı, nə də nahar elədi.

Mən də yorulub yatdım. Gecə yarıdan xeyli keçmiş Kamran məni oyatdı:

– Ona açarı sən vermişdin? – deyə soruşdu.

– Kimə?

– Müdhətə!..

– Mən Müdhətdən həmişəlik ayrılıb gəlmişəm, – dedim. – Əlbəttə, bu çox çətin, çox ağır bir görüş idi. Biz artıq başqa-başqa adamlarıq...

– O, bu saat burdaydı, uzun-uzadı şikayətləndi, birdən də yox oldu, – deyə Kamran yerindən qalxdı və o biri otağın qapısından baxıb, yenə mənə yanaşdı. – Hara getdiyini görə bilmədim...

– Necə yəni burdaydı, Kamran? Sən nə danışırsan?

– Gəlmişdi, dedi ki, sən mənim məhəbbətimi oğurlamısan!

– Müdhət dedi?

– Bəli, Müdhət... Mənə əl qaldırdı, sonra nə fikir elədisə, əlini aşağı saldı, məni vurmaq fikrindən daşındı...

– Sən bunları yəqin yuxuda görmüsən, – dedim.

– Yox, o bu saat burdaydı. Necə gəldiyini də, necə getdiyini də bilmədim... – Kamran birdən qollarını açaraq, mənə sarıldı, açıq çiyinlərimdən öpməyə və ağlamağa başladı.

– Kamran, əzizim, – dedim, – sən ağlayırsan? Səni mən belə aciz bilmirdim.

– Mənə əzizim deyirsən? – O, birdən ağlamağına ara verdi. – Doğru deyirsən, mən acizəm... Məni bağışla, üzr istəyirəm. Görünür məni qara basıbmış...

– Axı, sən məndən niyə üzr istəyirsən?

– Ona görə ki, açar barədə soruşub, səni təhqir elədim... Bağışlayırsanmı?

– Bağışlayıram, Kamran... Biz xoşbəxt olacağıq, deyilmi?

– Əlbəttə, əlbəttə!.. Biz çalışacağıq. Daha heç kəs bizi işimizdən, sevimli sənətimizdən ayıra bilməyəcək... Yox, bizi heç kəs ayıra bilməz!..

Kamranın bədənindən xoş bir ətir qoxusu gəlirdi, elə bil bağda-bağçada torpaqla əlləşmişdi...

Yarım ay keçdi. Şəhər Sovetindən gəlmiş Sədi Kamal bizim tikintimizi təhvil alırdı. O nə qədər arıqlayıb qocalmış olsa da, heç ruhdan düşməmişdi.

– Belə de!.. Bu kəməri sənin layihənlə çəkiblər? – deyə məni bir ata məhəbbəti ilə bağrına basdı.

– Bəs Rəcəb əmi hardadır? Mollayi Kəbir sağ-salamatdır? – deyə soruşdum.

– Rəcəb ömrünü sənə bağışladı. Biz onu Rudəki kolxozunun qəbristanında dəfn elədik... Mollayi Kəbir qayıtmadı... Kolxozda briqadir oldu... İşləyir...

– Bəs şişman arvad?

– O burdadır... Belələri çox bic olur, hələm-hələm ölməz... – deyə Sədi Kamal qəmli bir təbəssümlə güldü...

Bir neçə dəqiqədən sonra Cəmşid əmi dəniz sahilindən gəldi:

– Çay elə axır ki, kefin istəyən kimi. Sağ ol, qızım... Daha mən sabahdan pensiya üçün ərizə verə billəm, – dedi.

*Bakı, 1961-1964*

# KİTABDAKILAR



HEKAYƏLƏR



ROMAN

